*Bu kitab "**İsmayıl Şıxlı.** Dəli Kür."* (*Bakı, Yazıçı, 1982*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.3613 - dc 21**
**AZE**
**İsmayıl Şıxlı. Seçilmiş əsərləri. İki cilddə. II cild.** Bakı, "Şərq-Qərb", 2005 , 400 səh.

Görkəmli yazıçı İsmayıl Şıxlının oxucular arasında geniş şöhrət qazanmış "Dəli Kür" romanı XIX əsrdə tarixi qanunauyğunluqların Azərbaycan xalqının həyatına daxil olma prosesini, adamların yaşayışında, mənəviyyatında əmələ gətirdiyi köklü dəyişiklikləri realist inandırıcılıqla göstərən bir əsərdir. Xalqımızın milli oyanış dövrü Göytəpə kəndində baş verən mürəkkəb və ziddiyyətli hadisələr fonunda qələmə alınmışdır. Əsər qollu-budaqlı qəhrəmanlarına, ehtiraslar toqquşması və bədii boyaların zənginliyinə görə haqlı olaraq milli tarixi roman janrının kamil nümunələrindən sayılır.

Sovet dövrü Azərbaycan ədəbiyyatında həqiqi milli xarakterin, realist zadəgan-kübar (mülkədar) obrazının ilk dolğun, tutumlu örnəyi məhz "Dəli Kür" romanının qəhrəmanı Cahandar ağadır.

...İsmayıl Şıxlı zaman-zaman oxunacaq bir kitabdır – "Dəli Kür"dür.

**ISBN 9952-418-34-2**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# BİRİNCİ HİSSƏ

## 1

Göytəpə kəndinin yastı qazma daxmaları Kürün sahilinə qədər səpələnmişdi. Bu il yağınlıq olduğundan, otlar vaxtından əvvəl göyərmiş, yazın ılıq nəfəsini duyandan sonra isə püskürüb qalxmışdı. Hələ aprel sona çatmamış bu çal-çəpərsiz kəndin həyətləri, xırman yerləri, tövlə və samanlıqların üstü, hətta evlərin damları da yaşıllaşmışdı. Həyətləri birləşdirib torpaq yola çıxan, sonra da sahildəki çəmənliyi çalın-çarpaz doğrayıb Kürə enən cığırları ot basmış, kəndin üst tərəfindəki təpələrin rəngi dəyişmişdi. İl quraqlıq keçəndə bahar gəlməmiş saralıb-solan dəmyələr bu il gül-çiçəyə qərq olmuşdu. Yalnız kəndin yaxınından ötüb Tiflisə doğru uzanan xır yolu əvvəlki kimi ağarır, bəzi yerlərdə daşların arasından ot cücərsə də təbiətin bu ümumi ahənginə tabe olmaq istəmir, dərəli-təpəli yamacları aşıb üfüqdə gözdən itirdi. Hər şey əvvəlki kimi idi. Həyət-bacalarda ocaq tüstülənir, mallar haylanıb Kürə tökülür, qız-gəlinlər suya enirdilər. Haçaquyruq qaranquşlar süzüb sinələrini çiçəklərə toxundurur, Kürə baş vurub su götürür, sonra da civildəşə-civildəşə balalarının yanına qayıdırdılar. Torpaqdan güclə seçilən qara damların arasında təkəm-seyrək gözə dəyən daş evlərin kirəmitli damındakı sığırçınlar yenə əvvəlki kimi dimdiklərini şaqqıldadıb oxuyurdular.

Zərnigar xanım bunların heç birini görmürdü. O, başını göy məhəccərli eyvanın direyinə söykəyib için-için ağlayırdı. Tez-tez kəlağayısının ucu ilə gözünün yaşını silir, “mən bu dərdə necə dözüm, kimdən imdad istəyim?” – deyə inildəyirdi.

Havada süzən iri bir çalağanın kölgəsi çəpərin üstündən aşıb, həyətin ortası ilə tövləyə doğru süründü. Zəncirdəki itlər dartınıb mırıldaşdılar. Toyuq-cücə qorxudan samanlığa doluşdu. Zərnigar xanım bunların heç birinə fikir vermədi, kəlağayısını düzəldib eyvandan endi, cığırla sahilə doğru addımladı.

Gün xeyli qalxmışdı. Axşamdan kəndin üstünə çökən duman çəkilmiş, səhərə yaxın yağış da çiləmişdi. Torpaq yolların və cığırların

tozu xal-xal olmuşdu. Çəmənliyin şehi parıldayırdı. Kürün ləpədöyənindən bir az aralı, çaylaqda qaynar asmışdılar. Tumançaq uşaqlar yarğanın dibi ilə qaçışırdılar. Camışları haylayıb suya tökən cavanların hay-küyü sıldırım yarğanlarda əks edir, bu yarğanların ovuqlarındakı quşlar hürküşüb bölük-bölük havaya qalxırdılar. Lakin Zərnigar xanım heç nəyə fikir vermirdi. Bütün gecəni yatmayıb səhərəcən ağladığından arvadın gözləri şişmiş, kirpikləri bir-birinə yapışmış, göz yaşı quruyub, müşəmbə kimi yanağında qalmışdı. Qulaqları güyüldəyirdi. O, hara getdiyini bilmirdi. Öz evindən baş götürüb uzaqlaşmaq, bir anlığa da olsa, dərdini unutmaq istəyirdi. Ancaq bacarmırdı. Dil desə də ürək razı olmur, ayaqları sözünə baxmayıb, sürünürdü. Zərnigar xanım özü də hiss etmədən gəlib yarğanın qaşına çatdı. Qarşısındakı uçurumu, ayağının altındakı yarıq-yarıq olmuş torpağı görmədi. Əgər bir az irəlidə yarğan gurultu ilə uçmasaydı, o, ayaq saxlamayacaq, bəlkə də torpağa qarışıb birbaş Kürə düşəcəkdi. Gurultunu eşidən kimi qeyri-ixtiyari geri çəkildi, toz yatandan sonra isə uçurumun dibi ilə axan qıjıltılı boz-bulanıq suya dəhşətlə baxdı. “Bir parça çörəyim ovsanata keçdi. Yoxsa balalarım yetim qalacaqdı”, – deyə salamat qurtardığına şükür elədi. Bu hal uzun sürmədi. O yenidən gözünü Kürə zillədi. O taydakı qalın meşənin ətəyini, boz qumsallığı yalaya-yalaya axan, bəzi yerlərdə isə burulub, kolları araya alan Kür şaxələnib qollara ayrılır, balaca adaların ətrafında fırlanıb bəri üzə, hündür yarğanların üstünə cumurdu. Sular sarı torpağı yalayıb geri çəkilir, lillənə-lillənə uzaqlara gedirdi. Yarğanın dibi görünmürdü. Oraya düşənin heç sümüyü də ələ gəlməzdi. Zərnigar xanım ehtiyatla yarğana yaxınlaşdı. Bəlkə birdəfəlik özünü atsın? İkicə addım qabağa getsə, torpaq ayağı altından ovxalanıb töküləcək, uçuruma necə düşdüyündən özünün də xəbəri olmayacaqdı. Bəs sonra? Eşidən-bilən nə deyər?

Bu fikirlər Zərnigar xanımı dəhşətə gətirdi. Bədəni üyüşdü. Suyun soyuq havasını üzündə hiss edib geri çəkildi. İxtiyarsız olaraq dönüb evlərinə baxdı. Ətrafına yulğun kollarından hündür çəpər çəkilmiş birmərtəbə daş evin pəncərə şüşələri səhər günəşinin şəfəqlərini əks etdirib parıldayırdı. Darvaza açıq idi. Eyvanın məhəccərindəki naxışlı taxtalar, mavi rəngli dirəklər, göy qapılar, üstündə bir cüt qabaq-qarşı xoruz çəkilmiş divar, bir az o yandakı samanlıq, çardağının üstünə ilanyalı ot tayası yığılmış tövlə, həyətdə eşələnən toyuq-cücə aydınca görünürdü. Axı bunların çoxunu o özü düzəltmişdi. O, buraya gəlin

gələndə ərinin var-dövləti olsa da, əməlli-başlı bir otağı da yox idi. Bunların hamısında onun, Zərnigar xanımın əməyi vardı.

O özünə toxtaqlıq verdi. Heç yana getməməyi, əksinə, onun yurduna su salmaq istəyəni evdən qovmağı qərara aldı. Yarğanın kənarında oturub oğlunu gözləyəsi oldu. "Şamxal bu işləri belə qoymaz, – deyə özünə təsəlli verdi. – Harada olsa gəlib çıxacaq. Kimin anasının mələr qaldığını onda görərik..."

* * *

...Kürün o tayında, hündür qovaqların seyrəlib yulğunluğun başladığı yerdə beş-altı qaraltı görünürdü. Zərnigar xanım dikəldi. Əlini gözünün üstünə qoyub diqqətlə baxdı. Gələnlərin, qayığı yuxarıdan salıb, suyun axarı ilə bəri üzə keçmək istədiklərini anladı. Arvadın ürəyi atlandı. Oğlu Şamxalın da orada olduğunu yəqin etdi. Qaraltılar bir-bir atılıb qayığa mindilər. Sahildən aralanan kimi kürəyi işə saldılar. Çəpin təkanı ilə şütüyən uzun qayıq ləpələri yara-yara irəlilədi. Onlar çayın ortasına yaxınlaşdılar. Arvad oğlunu tanıdı. Şamxal qabaqda oturub kürək çəkirdi. Kürün suyu bulanmışdı. Yəqin yuxarılara yağmışdı. Qayıqdakılar nə qədər çalışsalar da, istiqaməti düz götürə bilmir, su qayığı əyirdi.

Zərnigar xanım qayığın suyun axarı ilə gedib, çiləkənə çırpılacağından qorxdu. Ancaq əbəs yerə həyəcan keçirirdi. Çəpin güclü təkanı qayığı suyun axarından çıxartdı. Onlar bəri üzə şütüdülər. Zərnigar xanım əllərini yanına salıb dərindən nəfəs aldı. Qayıq sahilə yanaşdı, burnu xırdaca daşları şaqqıldatdı. Şamxal quş kimi sıçrayıb kənara atıldı. Təkandan silkələnən qayıq ləngərləndi və sahildən aralandı. Şamxal əlindəki heybəni çiyninə atdı. Kərəntiyə dirənib suvadağı çıxdı. Qayığı suyun axarına buraxıb yarğanın dibi ilə gedən yoldaşlarının arxasınca baxdı. Onlar bir az aşağıdan, kəndin ucqarındakı qazmaların bərabərindən sahilə çıxacaqdılar.

Şamxal üst-başını çırpıb, kəmərini daraltdı. Gümüş dəstəkli xəncərini yana çəkdi. Kərəntini çiyninə alıb, pəncərəsi Kürə baxan evlərinin qənşərindəki cığırla asta-asta yuxarı qalxdı. Zərnigar xanım oğlunun qabağına gəldi. Ana-oğul dikdirdə qabaqlaşdılar. Şamxal anasını gözüyaşlı görüb, evdə bədbəxt bir hadisə baş verdiyini zənn etdi. Yoxsa arvad bircə gecənin içində bu qədər qocalıb, yumaq kimi büzüşməzdi. Onun beli də bükülmüşdü. Zərnigar xanım yaman günə düşmüşdü.

Şamxal anasına yaxınlaşdı. Qolundan tutub, diqqətlə üzünə baxdı:

– Yenə nə olub, niyə gözüyün on yerindən ələyirsən?

Arvad daha da kövrəldi. Önlüyünün ətəyi ilə gözlərini silib, hikkəsindən boğula-boğula:

– Gördünmü, ay bala, – dedi, – atan mənim başıma nə oyun açdı?

Şamxal bir az sakitləşdi. Hətta ürəyində anasını yamanladı da. Onun kərənti çəkib, ot çalmaqdan qolları gizildəyirdi. Bu saat doyunca yemək, qılçalarını uzadıb, əzalarının sızıltısı kəsincəyə qədər uzanmaq, rahat nəfəs almaq istəyirdi. Anası isə səhər-səhər onu vay-şivənlə qarşılayırdı.

O, anasının yanından sakitcə ötüb qabağa keçdi. Zərnigar xanım uzun donunun ətəyi ilə gözlərini silə-silə Şamxalın arxasınca cığıra düşdü və oğlunun enli kürəyinə yapışmış tərli köynəyinə, belindəki sallamalı kəmərinə, Kürdən keçəndə islanmış zər baftalı dolağına, suya batmış quşburun çarığına baxdı. Belə bir oğulun onu darda qoymayacağını yəqin edib, özünə toxtaqlıq verdi. Şamxal isə iki yanını basa-basa gedir, yeridikcə çiynindəki kərənti sağa-solaləngər vururdu. Kərəntinin ovxarlanmış və ora-burasında yaşıl ot qırıntıları ilişib qalmış iti ağzı parıldayırdı. Şamxalın üst-başından təzəcə çalınmış ot iyi gəlirdi.

Zərnigar xanım yenidən kövrəldi. Anasının bu halı Şamxalı darıxdırdı. "Görəsən yenə nə olub? Bu zalım qızının da göz yaşı ovcunun içindədir. Bir şey olan kimi gözünü yumub tökür," – deyə öz-özünə düşündü.

Oğlunun gəlişindən sonra həm ürəklənən, həm də kövrələn Zərnigar xanım yenidən dilləndi:

– Mənim hayıfımı ondan almasan, südümü sənə halal eləmərəm, oğul! Qiyamətəcən ahu-naləm səni yandırar, bala!

Şamxalın səbri tükəndi. Cəld geri dönüb, anasının üstünə qışqırdı:

– Bəs deyilmi, səhər-səhər nə çərənləyirsən?

– Belə, atan ölmüş təzə eşqə düşüb, ay bala – deyə, Zərnigar xanım göz yaşına ara verib səsini ucaltdı. – Bizi el içində biabır edib. Heç ərlik-boyluq qızı olan, sənin kimi oğul böyüdən kişi də belə iş tutarmı?

Şamxal dinmədi. O bu cür sözləri birinci dəfə eşitmirdi. Atası hər dəfə bir yana gedəndə, toydan-mağardan qayıdanda evdə belə söhbətlər olurdu. Anası həmişə kişinin üstünə düşüb dava-dalaş salar, ağlayıb-sızıldayar, sonra da sakitləşərdi.

Şamxal həyətə girdi. Xalxalın yanından ötüb çardağa yaxınlaşdı. Kərəntini dirəkdən asdı. Heybəni çiynindən götürdü. Üstünə boz ki-

lim salınmış taxtda oturub, əlini çarığın bağına uzatdı. Oğlunun sakitcə əyləşib, çarıqlarını və corabını soyunmaq istədiyini görən Zərnigar xanım irəli gəldi, əllərini belinə qoyub Şamxalın qabağında dayandı.

– Deyəsən, mənim dediklərimi qulaqardına vurursan?! Atan ölmüşün tərəfini saxlayırsan?! Yoxsa inanmırsan, hə? Gəl, yaxın gəl, gör atan sənə nə yaxşı ana gətirib? Hər yanı bir gəmi boyda. Yeriyəndə yırım-yırım yırğalanır. Gəl, yaxın gəl, tamaşa elə!..

Zərnigar xanım oğlunun əlindən yapışıb çəkə-çəkə ağ daşdan tikilmiş imarətə doğru apardı. Şamxal anasının hirsindən əsdiyini görüb, bu dəfə dinməz-söyləməz onun ardınca astanaya qədər gəldi. Arvad təpiklə vurub qapını taybatay açdı. İçəridə taxtın üstündə büzüşüb oturan gəlini göstərdi:

– İndi gördünmü tərifli atan nə iş tutub? Xalqın halal-kamal kəbinli arvadını gətirib, mindirib mənim boynuma! – O, saçını yolub üzünü cırmağa, şappıltı ilə dizlərini döyməyə başladı. – Haradasan, ay gözü tökülmüş tanrı, bu zülmü niyə götürürsən?!

Anasının fəryadı bu dəfə Şamxala yaman təsir etdi. Doğrudan da atası nə iş tutmuşdu? Oğluna toy eləyib gəlin gətirmək əvəzinə, özü eşqə düşmüşdü? “Yaxşı, deyək ki, atam kişidi, gözü qızışıb, bəs bu nə üçün evini-eşiyini buraxıb arvad üstünə gəlib?!”

Şamxalın rəngi qaçdı. Yenicə uzatdığı bığlarının ucunu ağzına salıb çeynəməyə başladı. Bayaqdan qorxu içində, küncə qısılıb titrəyə-titrəyə qardaşının hərəkətlərinə göz qoyan Salatın özünü Şamxalın üstünə saldı, əllərini tutub yalvardı:

– Qurbanın olum, ay qağa, evimizə qan salma. Amanın bir günüdü, əlini qana bulama!

Şamxal bacısını itələyib kənara yıxdı. Əlini sallamalı kəmərindən asdığı xəncərin gümüş dəstəyinə yetirdi. Salatın yenə özünü qardaşının üstünə saldı.

– Dərdin alım, ay qağa, farağat dur. Başına dönüm, evimizi yıxma. Amanın bir günüdü, bizi yazıq eləmə. Dədəm hamımızı tikə-tikə doğrayar.

Qızının dizin-dizin sürünüb əl çəkmədiyini görən Zərnigar xanım:

– Bircə belə dur, gədənin əl-ayağına dolaşma, – deyə Salatının hörüklərindən tutub dartışdırdı. – Qoy bu həyasız köpək qızını tikə-tikə doğrasın. Onun ovuc-ovuc qanını içəcəm. Qoy bilsin ki, qızışıb adam üstünə gəlməyin axırı necə olur.

– Ana, oğlun, qızın var, günahsız qana bais olma.

– Nə, günahsız?! – Zərnigar xanım elə qışqırdı ki, Salatın özünü itirdi.

Gəlin yavaşca ayağa durdu. Onun ətli sinəsi qalxıb endi. Dodaqları səyridi. Əlini xəncərin dəstəyindən çəkməyən Şamxal onun yalın ayağına, topuğuna enən gen, beli büzməli qırçın donuna, sürüşüb çiyninə düşmüş nimdaş kəlağayısına, qulağındakı yumru sırğaya, tən ortadan ayırdığı qara saçlarına, koftasının yaxasını didişdirən titrək barmaqlarına baxdı. Gəlinin iri qonur gözləri yaşarmışdı.

Şamxal qorxusundan uçum-uçum uçunan bu gəlinin öz tərəflərindən olmadığını dərhal bildi. Görünür, atası onu haradansa, Kürün aşağısındakı uzaq kəndlərin birindən gətirmişdi. Gəlinin gözəlliyi Şamxalı yumşaltdı. Onun qolları boşaldı. Bunu hiss edən Zərnigar xanım oğlunun üstünə qışqırdı:

– Hə, niyə durdun? Yoxsa, bu cindar köpək qızının qaş-gözü sənin də ağlını başından aldı? Atan kimi sən də suyuldun? Bu saat onun saçını biləyinə dolayıb sürüməsən, kişi deyilsən! Di tez ol!

Ani olaraq fikrə gedən Şamxal anasının sözlərindən sonra gəlinə yaxınlaşdı.

– Dur, şələ-küləni yığışdır, rədd ol buradan! – Yolun altı ilə gəlibsən, üstü ilə qayıt xarabana!

Gəlin sapsarı saralsa da, özünü sındırmadı. Gözünü qırpmadan qarşısında dayanan ucaboy oğlanın sarışın sifətinə baxdı. Onun qanı qaçmış dodaqları aralandı:

– Məni sən gətirməyibsən ki, evdən qovursan?

Gəlinin belə sakit, təmkinli cavabı Şamxalın qulaqlarında ildırım kimi şaqqıldadı. Ev başına dolandı, yer ayağının altından qaçdı. Üzünə isti qan vurdu, qulaqları güyüldədi. Anasının səsini güclə eşitdi:

– Gördün bu çərhəya, qızışmış köpək qızını?! Sənə demədimmi bir az da burada qalsa başımıza minəcək?! Ədə, sal ayağıyın altına, sürü bu itin balasını!

Hirsindən rəngi ağappaq ağarmış Şamxal gəlinin üstünə yeriyib boğuq bir səslə qışqırdı:

– Bu saat rədd ol burdan, yoxsa bağırsaqlarını ayağına dolayaram!

Gəlin gözünü də qırpmadı.

– Qeyrətli kişi qadına əl qaldırmaz. Hünərin varsa, get atanla haqq-hesab çək!

Artıq Şamxal dözə bilmədi. Gicgahlarındakı damarlar gömgöy göyərib şişdi, az qaldı ki, partlasın. O, ayaqlarına döşənib sürünən bacısının üstündən keçib irəli şığıdı. Gəlinin saçını biləyinə dolayıb yerə yıxdı. Təpiyinin altına salıb döyəclədi...

Arvadların qışqırtısı bir-birinə qarışdığından, ovdan qayıdan Cahandar ağanın həyətdə dayandığını heç kəs görmədi.

Gözünü qan örtmüş Şamxal isə getdikcə qızışır, gəlini sürüyüb evdən bayıra atmaq istəyirdi. Birdən gəlin var gücünü toplayıb ayağa durdu. Qabarıq sinəsini irəli verib Şamxalın üstünə qışqırdı:

– Vur, niyə durubsan? Əlin-ayağın niyə titrəyir, arvadı öldürməyə nə var ki? Vur!

Şamxal xəncəri siyirdi. Polad tiyə havada parıldadı. Ayağını üzəngidən yenicə çəkən Cahandar ağanın gözü pəncərəyə sataşdı. Şamxalın xəncəri gəlinin başına endirmək istədiyini gördüyü ilə tüfəngi hərləməyi bir oldu. Güllə açıldı. Pəncərənin şüşəsi cingilti ilə ətrafa səpələndi. Şamxalın əlindəki xəncərin polad tiyəsi iki bölünüb evin ortasına düşdü. Bir anlığa hamı daş kimi donub qaldı. Artıq ölümünü gözü qabağına gətirən gəlin evin ortasında heykəl tək dayandı. Zərnigar xanım əlləri üzündə dəhşət içində quruyub qaldı. Salatının ürəyi keçdi. Vəznəli çuxasının ətəyini belinə sancmış Cahandar ağa ağır bədəninə yaraşmayan bir çevikliklə atılıb içəri keçdi və hələ də özünə gələ bilməyən oğlunun üstünü aldı. Otağa gur və zəhmli bir səs yayıldı:

– İtil burdan, küçük!

Şamxal bir əlindəki dəstəyə, bir də hələ də lüləsindən tüstü çıxan tüfəngə baxdı. Cahandar ağa oğlunun yaxasından yapışıb qapıya tərəf itələdi. Hirsindən nə etdiyini bilməyən Şamxal atasının qolundan tutub dartındı:

– Burax deyirəm sənə!

– Kəs səsini, qancığın balası!

– Ağzını təmiz saxla, dədə!

– Kəs səsini, qancıqdan süd əmən!

– Südümə söymə.

– Ə, qoduq, mənim üstümə şeşələnirsən?!

Cahandar ağa qolunu hərləyib oğluna bir şillə çəkdi. Şamxal gözləmədiyi bu zərbədən dik atılıb bir pişik cəldliyi ilə geri sıçradı. Onun gözlərində qığılcım oynadı. Ata ilə oğul döyüşə hazırlaşan buğalar kimi qabaq-qabağa dayandılar.

Başı az qala tavana dəyən, pəhləvan cüssəli Cahandar ağanın qara sifəti tunc kimi bozardı, iri həbəşi dodaqları titrədi, qalın, qıllı çatma qaşlarının arası düyünləndi. O az qala yerlə sürünən iri qollarını irəli uzadıb oğluna doğru əyildi. Şamxal quzğun kimi üstünə gələn atasından əvvəlcə qorxdu. Onun nəzərində kişi getdikcə böyüdü və nərildəyərək ov üstünə atılmağa hazırlaşan heybətli bir pələngə döndü. O gördü ki, atası iri pəncəli əlləri ilə bu saat onu yaxalayacaq, sonra da qabarıq sinəsinin altına salıb xurd-xəşil edəcəkdir. Lakin o özünü ələ aldı və birdən atasının üstünə atıldı.

Oğlunun qəfil hücumunu gözləməyən Cahandar ağa tüfəngin qundağı ilə Şamxalın sinəsindən vurub yerə sərdi. Sonra da təpiklə döyəcləməyə başladı.

Zərnigar xanım özünü kişinin qabağına atdı. Dili dolaşa-dolaşa yalvarmağa başladı:

– A kişi, ağlını başına yığ. Ə, uşaqdan əl çək. Onda taqsır yoxdur, öldürürsənsə məni öldür. Ayə, qurbanın olum, vurma, yazığam, evimi yıxma. – Ərinin sakitləşmək istəmədiyini görəndə isə qarğamağa başladı: – Əlin çürüsün, ona necə qıyırsan? Qolun qurusun, uşaqdan əl çək! Ay Allah, ay camaat, hardasınız, qoymayın, balamı öldürdü!

Salatın yavaş-yavaş özünə gəldi. Sürünüb atasının ayaqlarına döşəndi. Üzünü torpağa sürtdü.

Bir göz qırpımında hadisədən çaşıb qalan gəlin yerindən tərpənə bilmədi. Üst-başı cırılıb, saçları üzünə dağılan bu cavan qadın heyrətlə Cahandar ağaya baxırdı. Kişi onun nəzərində getdikcə böyüyüb dağa dönürdü. O, sehrlənmiş kimi yerindən tərpənmir, əri olacaq bu adamdan gözünü çəkmirdi. Lakin Şamxalın yumaq kimi evin ortasında fırlandığını, hirsindən gözü ayağının altını seçməyən Cahandar ağanınsa getdikcə qızışdığını görəndə, elə bil yuxudan ayıldı. Gəlinin bədənini üşütmə götürdü. "Bəlkə kişi birdən uşağı xəsarət etdi, ya da əlindən bir xəta çıxdı, evə qan düşdü, onda necə olar? Bütün günahlar mənim boynumda qalmazmı? Elə Cahandar ağanın özü də sonradan, – qaradabansan, gələn kimi evimə qan saldın, – deyə mənim üstümə atılmazmı? Yox, mən qana bais ola bilmərəm".

O, irəli atılıb iri bədənini qabağa verdi. Cahandar ağanın ağır yumruqları kürəyinə dəysə də, diz çöküb kişinin ayaqlarını qucaqladı:

– Bəsdir, ay insafsız, yazıqda tutar qalmadı. Onu yox, mən başıbatmışı öldür ki, biryolluq canım qurtarsın.

Cahandar ağa onun hönkürtüsünə baxmayıb, yenə də oğlunun üstünə yeridi...

Nökərlər səs-küyə tökülüşüb gəldilər. Kürün sahilində qaynar asmağa gedən qulluqçulardan da özünü haraya yetirənlər oldu. Tapdıq hamıdan qabaq gəldi. O gördü ki, ağanın təzə arvadı kişinin ayağını qucaqlayıb irəli buraxmır, Şamxal isə namusa boğulub atasının qabağından qaçmaq istəmir. Bircə an keçsə yenə hər şey təkrar olacaq, kişi oğlunu təzədən yaxalayacaqdı. Tapdıq bir sıçrayışla özünü araya saldı. Cahandar ağa onun enli kürəyinin arxasında qalan Şamxalı görə bilmədi.

– Əl-ayağıma dolaşma!

– Ağa, ayıbdır, yoldan ötən, keçən olar.

– Qabağımı kəsmə, deyirəm sənə!

– Ağa...

– Burax məni, o it küçüyünü tikə-tikə doğrayacağam!

– Ağa, səbrin olsun.

Tapdıq Cahandar ağanın başını qatdı. O biri nökərlər isə Şamxalın dartınmasına fikir vermədilər. Çəkə-çəkə onu çardağın yanına apardılar. Papağını yerdən götürüb tozunu çırpdılar, hələ də özünə gəlməyən Şamxala verdilər. Eyvanda nərildəyib, Şamxalın ardınca söyüş söyən Cahandar ağanın gözündən birtəhər uzaqlaşdırdılar.

Hər şey bir-birinə qarışmışdı. Toyuqlar qorxusundan tara çıxıb qaqqıldaşırdılar. Küllükdə eşələnən ana toyuq sirkanların arasına dolub civildəşən balalarının başına bir iş gələcəyini zənn edib, tüklərini pırpızlaşdıraraq çığırırdı. Hətta talvarın altına bağlanmış itlər belə zəncirini dartıb qırmaq və hadisə yerinə cummaq istəyirdilər...

## 2

Şamxal birbaş sahilə endi.

Göyün üzü tərtəmiz idi. Yalnız o tayda, meşədən uzaqlarda, üfüqlə birləşmiş kimi görünən boz dağların başı üstündə topa-topa ağ buludlar dolaşırdı. Laylanmış buludların qalın kölgələri boz təpələrin, dərələrin üzərində qanadını gərmiş nəhəng bir quş kimi sürünürdü. Bu kölgələr uzanıb bərilərə, meşənin ətəklərinə qədər gəlirdi.

İndicə baş verən əhvalatın təsirindən yaxasını qurtara bilməyən Şamxal yarğanın kənarında oturdu.

Hündür boz təpələri yarıb uçurumlara çevirən Kür meşənin yaxası boyu uzanıb gedirdi. Tez-tez köpüklənib daşan, yaz aylarında yatağına sığmayıb, gah sol sahildəki meşəyə soxulan, gah da bəri üzdəki hündür yarğanları, biçənəkləri, yulğunluqları yuyub aparan Kür bu il daha coşqun idi. O, nəhəng palıd ağaclarını kökündən qoparıb bir yumaq kimi bürmələyir, özü ilə uzaqlara – aşağıdakı kəndlərin bərabərinə qədər aparırdı.

Şamxal əlini gözünün üstünə qoyub Kürün şaxələnmiş qollarına, eninə-uzununa yayılan bu nəhəng çayın ortasındakı xırdaca adalara tamaşa etdi. Həmin adaların bəziləri zaman keçdikcə böyümüşdü. İllərdən bəri suyun lilləndiyi bu adalarda balaca pöhrələr əmələ gəlmiş, get-gedə qalınlaşıb meşəyə dönmüşdü. Gecələr o taydan üzüb keçən və kəndə soxulub, toyuq-cücə oğurlamağa çalışan ac çaqqallar çox zaman bu adadakı cələyə toplaşır, qaranlıq qarışan kimi səs-səsə verib ulaşırdılar.

Şamxal həmişə yarğanın qaşında oturub, bunlara tamaşa etməkdən doymazdı. Ancaq indi onun gözünə heç nə görünmürdü. Bir az bundan əvvəl baş verən hadisələr yenidən xəyalında canlanırdı.

Əvvəlcə o heç bir şey ayırd edə bilmədi. Atası hardan gəlib çıxdı? Kim-kimə qabaqca əl qaldırdı? Bəs necə oldu ki, Mələk sağ qaldı? Bəs onun əlindəki xəncər niyə iki bölündü? O heç nə anlamırdı. Beyni uğuldayırdı. Qulaqları elə bil tutulmuşdu, güy-güy güyüldəyirdi.

Şamxal hadisələri təkrar-təkrar yadına saldı. Anasını, yerə döşənən Salatını, qorxusundan rəngi ağarıb dodaqları titrəyən Mələyi, atasının heybətli, qorxunc sifətini gözünün qabağına gətirdi. Hadisələr getdikcə aydınlaşmağa, lilli su kimi çöküb durulmağa başladı. Şamxal hər şeyi başa düşdü. O, atasına əl qaldırmışdı. Hələ indiyə qədər onların evində belə hadisə olmamışdı. Nə Şamxal atasının üzünə ağ olmuş, nə də atası ona güldən ağır söz demişdi. Cahandar ağa həmişə onun boyunu sevər, səhər-səhər atı minib Kürə sulamağa aparanda samanlığın üstünə çıxıb arxasınca baxardı. Şamxal atasının onun yelinə uçduğunu, hər yerdə, hər evdə oğlundan danışdığını çox gözəl bilirdi. O neçə dəfə atasının anası ilə söhbətini eşitmiş, kənd qızlarının adını çəkib gəlin seçdiyini bilmişdi. Atası onu çox sevirdi. Bəs indi?..

Cahandar ağanın heybətli nəriltisi yenidən onun qulaqlarında səsləndi. “Yox, mən bir də onunla üz-üzə gələ bilmərəm. Yəqin kişinin indi məndən zəhləsi gedir. Harda görsə, yenə üstümə cumacaq. Bəs

anamın taqsırı nədir? Axı niyə onun üstünə günü gətirir? Bundan sonra anamın günü ah-vayla keçməyəcəkmi? Mən onun göz yaşına necə dözəydim? Arvad bircə gecənin içində büzüşüb yumağa dönməmişdimi?..”

Şamxal düşündükcə daha uzaqlara gedir, ürəyində Mələyi asıbkəsirdi. O heç bir vəchlə Mələyə haqq verə bilmirdi. Bu cavan arvadın nə üçün ev-eşiyini buraxıb, özündən yaşlı kişiyə qoşularaq gəldiyini anlaya bilmirdi. “Axı o istəsəydi, gəlməzdi. Atamın sözünə baxmazdı. O gəlməsəydi, bizim evdə bu dava-dalaş da olmazdı. Taqsırın hamısı ondadır”.

Düşüncələr bir burulğan kimi onu qoynuna alıb fırladırdı. Şamxal yarğanın qaşından ayağa durub üstünün tozunu çırpdı. Suvadağdan düşüb yarğanın kölgəsinə endi.

Uşaqlar qızıl tozu səpələnmiş kimi par-par parıldayan qumluqda uzanmışdılar. Bəziləri özünü suya atıb çimir, bəziləri də yastı daşları suyun üzündə sürüşdürürdülər. Narın ləpələrə toxunub şütüyən daşlar şıldır yerdə qurulamış qovaq ağacına qədər gedirdi.

Şamxal daş atmaqda bəhsə girən uşaqlara, budaqları lillənib qalan çiləkənə, ağacı yerindən tərpədə bilməyən boz-bulanıq sulara baxdı. Elə bil gücsüzlüyünü hiss edən sular hirslənib kötüyün ətrafında fırlanırdılar. Bunlara əhəmiyyət verməyən çılpaq bir uşaq isə ağacın üstündə oturub suya qarmaq atırdı.

Şamxal ixtiyarsız olaraq köksünü ötürdü. Axı o da cəmi altı-yeddi il bundan əvvəl, bu uşaqlar kimi çimib, qumsallıqda eşələnirdi. Yoldaşları ilə birlikdə üzə-üzə Kürü keçib meşəyə adlayardı. Axşama qədər moruqdan, cır meyvələrdən yeyər, qaranlıq qarışanda isə sal bağlayıb, bəri üzə qayıdardılar. Bəzən də istilənmiş qara camışları suya töküb çimizdirər, sonra da şığıyıb Kürdən keçirərdilər. Fınxıra-fınxıra üzən kəllərin quyruğundan yapışıb Kürü adlamaq onlara ləzzət verərdi.

Şamxal birdən-birə qocaldığını hiss edən adamlar kimi uşaqlığını xatırlayıb kədərləndi. Onu qəhər boğdu. Bayaq yad adamların yanında biabır olmamaq üçün ağlamağını saxlaya bilmişdisə də, indi bacarmadı. Gənclik qürurunun tapdalandığını hiss edib kövrəldi. Onu atasının hərəkətlərindən daha çox Mələyin mərhəməti daha yandırırdı. Şamxal Mələyin diz çöküb yalvardığını, “A kişi, yazıqda tutar qoymadın”, – deyə ona tərəf durmasını xatırlayanda dözə bilmədi. Hirs onu boğdu. “Gör nə günə qalmışam ki, mənim döydüyüm adam mənə qəhmər çıxır, mənə yazığı gəlir. Məni atamın əlindən almaq istəyir. İndi mən

nə üzlə geri qayıdım? Bundan sonra Mələk mənə yazıq, yetim bir uşağa baxan kimi baxmazmı? Sonra da qarşımda dayanıb, “Hə, necəsən, o sənin kişiliyin, bu da mənim arvadlığım” – deməyəcəkmi? Bəlkə də lağa qoyub güləcək! Mənə məsxərə edəcək! Atam da indiki kimi ona yan basacaq. Yox, mən bir də o evə üz tutmaram. Çıxıb gedəcəm. Harda olsa, bir parça çörək taparam. Bəs anamın, Salatının axırı necə olacaq?”

Şamxal ağzı üstə uzanıb çənəsini qollarına söykədi. Onun çiyinləri qalxıb-enir, bütün bədəni titrəyirdi. O ağlamırdı. Ağzı üstə uzanıb eşələnir, daxildən qopan nəriltini boğmaq istədikcə titrəyib çalxalanırdı...

Axşamtərəfi boğuq bir gurultu qopdu. Hündürlüyü on sajenə yaxın olan yarğan uçub suya töküldü. Qatı duman suyun üzünü bürüdü. Yarğan uçanda qabağı kəsilib göllənən su özünə yol açıb, yenə əvvəlki kimi sarı torpağı yalaya-yalaya, qıjıltı ilə axıb getdi.

Şamxal diksinib qalxdı. Gözünü yarğan uçan tərəfə zillədi. Sonra da əlini üzünə çəkdi. Yanağında laxtalanmış qanı ovxalayıb tökdü. Əyilib axar suda əl-üzünü yudu. Üst-başının tozunu çırpıb papağını düzəltdi. Lap yaxında, suyun dayaz yerinə qonmuş balaca, caydaq bir quş cikkildədi. Şamxal dönüb baxdı. Uzun quyruqlu quş balıq axtarırdı.

Şamxal bir dəstə qızın yarğanın qaşı ilə suya endiyini görüb ayağa qalxdı. Başqa vaxt olsaydı, o, yerindən durmazdı. Əksinə, bəlkə də, yaxındakı yulğun kollarının arasına girib, nağıllarda söyləndiyi kimi, suya tökülüb çimişən bu mələk qızların ağ bədəninə, sinələrinə dağılan uzun, qara saçlarına oğrun-oğrun tamaşa edər, onların ördək kimi suya baş vurub üzmələrinə, zarafatlaşıb bir-birilərini suya basmalarına, sonra da balıq kimi şütüyüb adaya qədər getmələrinə göz qoyardı. Bəlkə də balaca vaxtı elədiyi kimi, qızlardan birinin paltarını götürüb gizlədərdi də. Lakin indi onun ortaya çıxası halı yox idi. Üst-başı cırılmış, ağız-burnu əzilib gömgöy edilmişdi. Hələ indiyə qədər kənddə heç kəs onu bu kökdə görməmişdi. Kürü üzüb o üzə keçməkdə birincilik qazanan, at çapıb xəncər oynatmaqda heç kəsə aman verməyən, yaba, yumruq davasında dəfələrlə qalib gələn Şamxal buradan uzaqlaşmağı qərara aldı. Dərhal paltarını soyundu. Qızların qaqqıltısı və ayaq tappıltıları yarğanda səslənincə, paltarını başına dolayıb, özünü suya atdı. Bir göz qırpımında üzüb cələyə keçdi. Qızlar sahilə enəndə qarşıdakı adada tərpənən yulğun kollarından başqa heç nə görmədilər.

## 3

Günbatan çağı Kürün üstünü bürüyən duman ətəyini sallayaraq, asta-asta ətrafa yayıldı. Gün qərbə doğru əyiləndən sonra yuxarıdakı boz dağlardan xəfif meh əsdi. Otların, dəmyələrdə əkilmiş sinəsi laləli taxılların üstündən keçib gələn bu axşam küləyi sahilə enib Kürün üzərinə duvaq kimi çəkilmiş ağ, nazik dumanı qovub uzaqlara – aşağıdakı kəndlərə doğru apardı. Getdikcə suyun səthinə yatan çiskinli duman cələdəki yulğun kollarına toxunaraq parçalanır, sürünə-sürünə o taya – meşəyə doğru gedir, orada isə ağacların başına dolanıb yox olurdu. Örüşdən qayıdan mallar buynuzlaşa-buynuzlaşa sahilə enib doyunca su içir, o taydan, odun qırmaqdan qayıdan kənd cavanları isə sal bağlayıb bəri üzə keçirdilər.

Səhərki hadisədən sonra atını minib meşəyə gedən Cahandar ağa da sahildə idi. O bütün günü hirsli-hirsli meşədə gəzmiş, dərdini dağıdıb, başını qatmaq üçün qabağına çıxan quşlara, vəhşi donuzlara güllə atmışdı. Nəhayət, axşamüstü Qarasuyun yaxası boyu keçib gedən maralların izinə düşüb Kürün sahilinə qədər gəlmişdi. Cahandar ağa su içən maralların üstünü almış və sərrast atdığı güllə ilə iri bir maralı vurub yıxmışdı. Atdan düşüb ovunu kənara çəkmiş, cələdə dalda bir yerdə gizlətmişdi.

Cahandar ağa Kürün kiçik qolunu keçib cələyə çatdı. Qarşı sahildəki kənd evlərini görən at bərkdən kişnədi. Cahandar ağa iki barmağını ağzına salıb fit çaldı. O həmişə evdən qayıdanda bu yolda Kürdən keçər və cələyə çatanda iki dəfə fit çalardı. Evdəkilər dərhal onu başa düşər, vurulmuş ovu gətirmək üçün araba qoşub sahilə enərdilər.

Bu dəfə də belə oldu.

Cahandar ağa atını girmədən salıb sahilə çıxanda enişdən gələn araba ilə qabaqlaşdı. Həmişə ovdan qayıdanda onu oğlu Şamxal qarşılayırdı. İndi isə arabanın boynunda oğlu yox, nökərlərdən biri əyləşmişdi. Maralı vurandan sonra kefi bir qədər açılan Cahandar ağanın qaşqabağı yenə tutuldu. O, kəllərin qabağını saxlayıb cavab gözləyən nökərə üzünü belə çevirmədən dilləndi:

– A bala, a Tapdıq, arabanı yuxarıdan, girmədən sal. Qız qayasının alt tərəfindəki cələyə sür. Oradakı içi ovuq qovağı görmüsənmi? Həmin ağacın dibində maral var. Arabaya qoy gətir.

Oğlan horultu ilə su içən kəlləri çubuqlayıb arabanı suya saldı. Təkərin dəmir şini xırda daşları əzib qıcırdadı. Su əvvəlcə təkərin topunu, sonra da cağları batırıb tara çıxanda təkərlərin qıcıltısı da çəkildi. Atını mahmızlayıb dikdirə qalxan Cahandar ağa qanrılıb geri baxdı.

– Ayə, yuxarıdan sür, yoxsa arabanı çiləkənə vurub döndərərsən. – Araba qarşıdakı cələdə gözdən itəndə, sahildən düz həyətlərinə çıxan cığırla birbaş evlərinə gəldi. Atdan düşüb nökərləri səslədi: – Ay uşaq, kim var, gəlin, atın yəhərini alın!

O, tüfəngi eyvanın dirəyindən asıb samanlığın üstünə çıxdı. Gözünü günbatan tərəfə, çəmənliyə zillədi. Mallar Kürün yaxası boyu qatarlaşıb gəlirdilər. Yelini dolmuş inəklər balasına çatmaq üçün mələyir, yazabuğalar, düyələr bir-birini buynuzlayıb qovurdular. Naxırdan xeyli aralanıb nərildəyən iri bir buğa ayağı ilə yeri eşib tozu göyə sovururdu.

Cahandar ağa naxır Kürdən su içib yarğanın qaşına çıxana qədər samanlığın üstündən enmədi. Boğazı zınqırovlu maral erkəc kimi qabağa düşüb xalxala yaxınlaşanda nökərləri səslədi. Özü də onlarla bərabər naxırın qabağına getdi. Pərli-budaqlı buynuzunu şax tutub yeriyən maral onu görən kimi yaxınlaşıb əlini iylədi. Heyvanın soyuq və nəm burnunun təmasından kişinin qıdığı gəldi. Cahandar ağa heyvanın başını, qulaqlarının və buynuzunun dibini qaşıdı. Üç il bundan əvvəl meşədən tutub gətirdiyi və əldə böyüdüb naxıra qatdığı bu maral həmişə onun dərdini dağıdardı. Ancaq bu dəfə belə olmadı.

Nökərlər heyvanları yerləşdirdilər. Qulluqçular inəkləri sağıb rahatladılar. Zəncirdən açılmış itlər mırıldaşa-mırıldaşa yallarını içdikdən sonra evin ətrafına dolanmağa başladılar.

Həyətə sakitlik çökdü. Bu sükut getdikcə gücləndi və bütün şenliyi bürüdü. Sahilboyu səpələnmiş kənd evlərinin solğun işıqları, həyətlərdə qalanan ocaqların közərtiləri də yavaş-yavaş söndü. Kürün qıjıltısı gücləndi. Əsən asta külək biçilmiş otların qoxusunu kəndə doldurdu. Hamı evə çəkildi. Cahandar ağa isə qapıda hərlənir, pəncərəsindən zəif işıq gələn otağa yaxınlaşa bilmirdi. İndi o nə etməli idi? Öz hərəkətlərinə necə bəraət qazandırmalı idi?..

İki gün bundan əvvəl, şəhərdən qayıdarkən, Kürün sahilində Mələyə rast gələndə o heç nə fikirləşməmişdi. Cavan, ətli-qanlı gəlini su kənarında görəndə sönməkdə olan ehtirası birdən-birə quduz kimi oyanmışdı. Hələ keçən il, dağa köçəndə, Cahandar ağanın gözü bu gəlini almışdı. Göytəpəlilər dağ yolunda, çay kənarında arabalarını aç-

mışdılar. Kürün aşağısındakı obaların köçü isə gəlib keçirdi. Bir dəstə qız-gəlin atla, arabalardan qabaq yola düşmüşdü. Onlar bulaq başında cilovu çəkib atlarını suladılar. Elə bu vaxt Cahandar ağanın gözü yəhərin üstündə şəstlə oturmuş Mələyin açıq buduna sataşdı. Gəlin ətəyinin çirmənməyindən xəbərsiz olsa da, bir qadın sövq-təbii ilə kiminsə ona baxdığını duydu və ətrafına göz gəzdirəndə bulağın üst tərəfində tüfəngini qucaqlayıb otluğa uzanmış Cahandar ağanı gördü. Gəlin öz gözəlliyini dərk edən bir qadın qürurundanmı, yoxsa ona gözünü zilləyən kişinin ağayanalığını xoşladığındanmı, nədənsə, gülümsündü. Bunu hiss edən Cahandar ağanın iri dodaqları aralandı. Ancaq Mələk ani şaşqınlıqdan sonra özünü ələ aldı. Pul kimi qızardı. Kəlağayısını gözünün üstünə çəkib atını mahmızladı. Donunun çirmənmiş yerini düzəldib budunu örtdü. Bir göz qırpımında qarşıdakı döngədən burulub yox oldu. Cahandar ağa arabaçılardan bu köçün hansı obanın olduğunu öyrənsə də, nə gəlinin adını, nə də kimliyini heç kəsdən soruşa bilmədi.

...İndi bir ildən sonra təsadüf onları yenə qabaqlaşdırmışdı. Cahandar ağa çoxdan bəri xəyalından çıxmayan gəlini görəndə atının başını çəkib saxlamış və donunun ətəyini dizindən yuxarı qaldırıb paçasının arasında bürmələmiş gəlinin suda daha gözəl görünən maya kimi ağ baldırlarına həsrətlə, oğrun-oğrun baxmışdı. Mələk axşamüstü günəşin son şüalarını əks etdirib parıldayan Kürün qızılı sularında əl-üzünü yuyurdu.

Cahandar ağa atını yaxın sürüb:

– Ay bacı, atan ehsanına bir qab su ver, içim, – demişdi.

Mələk səsə diksinib geri dönmüş və başının üstünü kəsdirən enlikürək kişinin bığının altından gülümsədiyini görmüşdü. Gəlin əlləri titrəyə-titrəyə iri mis parçı doldurub qabağa uzadanda Cahandar ağa Mələyin biləyindən yapışıb özünə doğru çəkmiş və bir göz qırpımında atın qucağına almışdı. Onun çırpınmasına baxmayaraq atı Kürə salmış və birbaş o taya, meşəyə keçmişdi. İki gün binələrdə gecələdikdən sonra öz qələbəsindən məst olan Cahandar ağa Mələyi götürüb birbaş evə gəlmişdi. Onsuz da taleyindən narazı olan Mələk isə bu şir ürəkli kişinin iradəsinə tabe olub susmuşdu.

Cahandar ağa hər şeyin sakit keçəcəyini, Zərnigarın bir az deyinib susacağını zənn etmişdi. Ancaq səhərki hadisə onu sarsıtmışdı. Əksinə baxsan, Cahandar ağa gözü qızıb Mələyi gətirəndə uşaqlarını heç yadına salmamışdı.

... İndi o, qapıda hərlənir, içəri girməyə cəsarət etmirdi. Qorxurdu ki, qapını açan kimi yenə hay-küy düşəcək, kim bilir, bəlkə də əlindən bir xata da çıxacaqdır.

Nəhayət, göyün üzünə ulduzlar səpələnib, hava tamam soyuyanda Cahandar ağa içəri girdi. Gözlədiyinin əksinə olaraq onu sükutla qarşıladılar. Əksinə baxsan, heç onun qabağına çıxan olmadı. Şamxal evdən gedəndən sonra Zərnigar xanım küncün birinə çəkilib ağlayır, Salatın isə qorxusundan gözə görünmürdü. Yalnız Mələk evdə idi. O, taxtın ayaq tərəfində divara qısılıb oturmuşdu.

Tavandan asılmış çırağın fitilini qaldıran olmadığından, otaq güclə işıqlanırdı. Bu zəif və solğun işıq onu daha da darıxdırdı. Əlini uzadıb fitili yuxarı çəkdi. Yalnız bu zaman dönüb Mələyə baxdı. Əli qoynunda dayanmış gəlin gözünü pəncərəyə zilləmişdi. Paltarı bir neçə yerdən cırılmışdı. Yanağında və alnında qara ləkələr vardı.

Cahandar ağa xeyli nə edəcəyini bilmədi. Ona yaxınlaşıb könlünümü alsın, yoxsa qışqırıb "səsini kəs"mi desin. Sükut xeyli çəkdi. Mələyin sakit axan göz yaşı gücləndi. Otağı hıçqırıq bürüdü. Taxtın üstündə mütəkkəyə dirsəklənən Cahandar ağanın səbri tükəndi.

– Di yaxşı, axşam-axşam gözünün yaşını az axıt. Dur, bəri gəl görüm.

Mələk yavaşca ayağa durdu. Taxta yaxınlaşıb kişinin qabağında dayandı.

– Məni niyə bədbəxt elədin? Yurduma-yuvama niyə su saldın?

Mələyin kədərli görkəmi kişini qəhərləndirdi.

– Axı sənə nə olub? – deyə soruşdu.

– Daha bundan artıq nə olacaq, el içində biabır oldum. İndi mən hansı üzlə geri qayıdım? Mənim böyük tikəmi qulağım boyda eləməzlərmi?

– Sarsaq-sarsaq danışma. Sən bu evdən heç yana getməyəcəksən!

– Bəs Şamxal?

– Kim? O nə qoduqdur? – Kişi qalxıb dik oturdu. – Bir də onun adını mənim yanımda çəkmə!

– Bəs arvadın, qızın?

– Az danış, onların sənə dəxli yoxdur. Bu evin sahibi mənəm, mən də nə elədiyimi bilirəm.

O nə qədər hirsli olub Mələyə susmağı əmr etsə də, qəlbinin dərinliklərində haqsızlığını duyurdu. Bu hadisənin belə sakitcə gəlib keçməyəcəyini, evdə hər gün dava-dalaş düşəcəyini aydınca görürdü. Ancaq o, evinin əmin-amanlığını saxlamaq, necə olur-olsun, dil tapıb

hər şeyi sahmana salmaq istəyirdi. Axı, Zərnigar da yazıq idi, neçə il idi ki, onunla bir yastığa baş qoyurdular. Yetişmiş oğlu, qızı vardı. İndi necə olsun? Onu bu evdən qovmaq olarmı? El-oba buna nə deyər? Bəs Mələyin təqsiri nədir? Bu yazığı da yerindən-yuvasından o oynatmayıbmı? Bəs onun əri? Bu gün-sabah meydana çıxıb qan-qan deyə, at oynatmayacaqmı?

Düşüncələr getdikcə güclənir, ağır yük kimi onu əzirdi. Cahandar ağa gah hirslənir, nahaq yerə başını cəncələ saldığını duyub peşmanlayır, gah da özünə ürək-dirək verirdi. "Əşi, nə olub, eldən çıxarı bir iş tutmamışam ki? Elə dədə-babadan iki arvad saxlamaq peşəmiz deyilmi? Bu işi bir mən ha görməmişəm. Heç nə olmaz, arvad tayfasının qaydasıdır, bir az çığır-bağır salacaqlar, sonra da qınlarına çəkilib susacaqlar. Bəs Əşrəf?.. Yoxsa o da qardaşı Şamxal kimi mənim üstümə düşəcək? Anasına qəhmər durub məni bihörmət edəcək?".

Kişi lap darıxdı. Ona elə gəldi ki, bu saat Qori müəllimlər seminariyasında oxuyan oğlu qapını açıb içəri girəcək, qaşlarını çatıb "Ata, eyib deyilmi, bu nə işdir tutmusan?" – deyəcəkdir. Sonra da baş götürüb evdən gedəcək, bir daha buralara üz çevirməyəcəkdir...

Həyətdə səs-küy çoxaldı. İtlər zingildəyib susdular. Araba təkərinin cırıltısı və kəlləri haylayan Tapdığın səsi eşidildi. Cahandar ağa pəncərədən həyətə, nökərlərin köməkləşib maralı arabadan necə düşürdüklərinə göz qoydu. Az sonra onun dalınca gedən Tapdıq əlindəki tənək çubuğunu oynada-oynada pəncərəyə yaxınlaşdı.

– Ağa, maralı gətirdim.

– Aparın bişirin. Uşaqları da çağır.

– Bəs siz?

– Bir-iki şiş kabab gətirsəniz, bəsimdir.

Tapdıq eyvandan aralandı. Xırman yerində maralın yanını kəsdirən nökərlərə yaxınlaşdı:

– Ay uşaqlar, bir yaxşı ocaq çatın. Deyəsən, bu axşamkı kabab bizə qismət olacaq.

Onun sözünü gizli sevinclə qarşıladılar. Arvadlar əl-ayağa düşüb, tələsik qara damlara qaçdılar. Qab-qacaq gətirib kişilərin yanını kəsdirdilər. Heç beş dəqiqə keçməmiş şaqqalanan maralın əti doğranıb sinilərə dolduruldu. Bozartmalıq ətlə kabablıq ayırd edildi. Ocaq alovlandı. Pəncərə şüşələri elə bil alışıb yandı. Kəndin üstünə çökən qaranlıq qorxurmuş kimi, Cahandar ağanın həyətinə yaxın gəlmədi.

Tapdıq qolunu çırmayıb göstəriş verməyə, özündən cavanları buyurmağa başladı. O, ağanı hirsləndirməmək üçün həmişəki kimi kababı özü bişirməyi qərara aldı.

Ocağın ətrafında hərlənənlərin kölgələri tez-tez çarpazlaşıb həyətə sərilir, bəzən də uzanaraq çəpəri aşır, kənardakı ot tayalarının üstündə dolandıqdan sonra qaranlığa qarışırdı. Ocaq çatıldadıqca qığılcımlar ətrafa sıçraşır, yavaş-yavaş köz düşürdü.

Zəncirdən açılmış itlər də ət iyini duymuşdular. Bir-ikisi ocaqdan bir az aralı başını biləklərinin üstünə qoyub uzanmışdı. Qalanları isə çöməlib əti gözdən qoymur, fürsət tapan kimi sinib irəli sürünürdü. Əllərinə bir şey keçməyəndə isə geri çəkilib astadan zingildəyirdilər.

Tapdıq maralın içini təmizlədikdən sonra bağırsaqları bir neçə yerə bölüb itlərin qabağına atdı. İtlər əvvəlcə bir-birinin üstünə cumdular, sonra bağırsaqları dartışdıra-dartışdıra həyətdən uzaqlaşdılar.

Nökərlər palıd odununun sürüşüb düşən közlərini bir az da irəli çəkdilər. Şişləri yan-yana düzdülər. Ətrafı köz üstündə bişən yağlı ət iyi bürüdü...

Gecədən xeyli keçmişdi. Mələyin nəfəsindən məst olan Cahandar ağa pıçıltı ilə təzə arvadını oxşayırdı:

– Özün bilirsən ki, səni heç yerə buraxan deyiləm. Kişi tüpürdüyünü yalamaz. Sən həmişə, qəbrəcən mənim olacaqsan. Ancaq o da yazıqdı. Birtəhər dilə tutub, yola gətirmək lazımdır. Necə olsa uşaqlarımın anasıdır. Yanına get, əl-ayağına düş, yalvar, de ki, bir qəzadı başıma gəlib, yazığam, keç günahımdan, elə bil mən də sənin qulluqçun. Qabağında dillənib üzünə ağ olmaram. Xasiyyətini bilirəm. Ürəyi yumşalıb barışacaq. Elə mən özüm də onu dilə tutacağam. Sonra da bir-birinizə isinişəcəksiniz. Hər şey düzələcək, fikir eləmə.

Mələk bir pişik mehribanlığı ilə Cahandar ağanın sinəsinə qısılıb xumarlanır, onun dediyi sözlərə qulaq asdıqca ürəyindəki şübhə və qorxu yoxa çıxırdı. Tüklü sinəsində mehriban bir əlin gəzdiyini hiss edən Cahandar ağa hər şeyi unudub Mələyin ətli bədənini qucaqlayır, cavan qadının hərarətli təmasından məst olurdu...

Əslinə baxsan, Mələk bu evə gəlməyindən narazı deyildi. O, Kürdən xeyli aralı olan dağ kəndlərindən idi. Təmiz havası, sərin diş göynədən bulaqları, güllü-çiçəkli çəmənlikləri olan bu kəndin bütün qızları kimi Mələk də ayaqyalın, başıaçıq böyümüşdü...

O, balacalıqdan yetim qalmışdı. Hələ beş yaşı tamam olmamış dağda onların evini sel aparmışdı. Ata-anası da dayə ilə birlikdə yox

olmuşdu. Xoşbəxtlikdən gündüzdən əmisigilə, qızlarla oynamağa gedən Mələk geri qayıtmamış, beləliklə də salamat qalmışdı.

Əmisi arvadı onu yanından buraxmamışdı. Binəyə köçəndə, yaylağa qalxanda onu özü ilə aparmışdı. O, çox qoçaq qız idi. Yaşının az olmasına baxmayaraq dərədən dörd-beş səhəng bulaq suyu gətirərdi. Kənddə hamı onun qoçaqlığından danışırdı. Səhər tezdən suya gələn arvadlar, atını sulamağa enən cavanlar Mələyin cığırla dərədən çıxdığını görürdülər. O az qala özü boyda olan mis səhəngi dalına alıb dodaqaltı zümzümə edə-edə yoxuşa dırmaşırdı.

Mələyin dörd əmisi qızı vardı. İllər keçdikcə onlar böyüyür və bir-bir nişanlanıb ərə verilirdi. Hər dəfə toy olub qızlar cehizlə köçürüləndə Mələk uşaq kimi sevinir, nəhayət, ona da növbə çatacağını, onun da belə bir şad günü olacağını fikirləşirdi. O, əmisinə, əmisi arvadına inandığı üçün heç nə düşünmür, vaxtı çatanda ona da cah-cəlalla toy olacağını gözləyirdi... Ancaq bir gün Mələk gözünü açdı və gördü ki, onun tay-tuşları, hətta özündən kiçik olan qızlar belə ərdədirlər, ev-eşik sahibi olublar.

Mələyi fikir götürdü. "Bəs mən? Yoxsa eybəcərəm? Qaş-gözümdə şikəstlik var? Niyə mənə yaxın duran yoxdur?"

Bir gün evdə heç kəs olmayanda, divardan asılmış balaca, üstü çil-çil güzgünün qabağında dayanıb, boy-buxununa xeyli baxdı. Qaşları çatma idi. İri gözləri bulaq kimi qaynayırdı. Yanaqlarından az qala qan damırdı. Qabarıq sinəsi elə bil köhnə koftasını partlatmaq istəyirdi. Qızın özündən xoşu gəldi. "Yox, deyəsən, pis deyiləm", – deyə xəyalından keçirib qımışdı. Otaqda bir neçə dəfə fırlanıb, kürəyinə tökülmüş saçına, qırçınlı donunun içində quzu quyruğu kimi yırğalanan əndamına baxdı. Sonra da küncdəki badyanın ağzını açıb bir qaşıq süd üzü götürdü. Yanaqlarına, saçlarına çəkdi. Elə bil qız birdən şam kimi alışıb yandı. Mələk güzgüdə bir də özünə baxdı. Hürkmüş kimi geri çəkildi. Aynada qaş-göz oynadıb şaqqıldadı. Qaça-qaça bayıra çıxdı.

Əmisi arvadı Mələkdə baş verən dəyişikliyi hiss etsə də, üstünü vurmadı. O belə bir qızı tezliklə əldən vermək istəmirdi. Bulaq başında, çay kənarında, qaynarda ondan söz soruşub ağzını arayan olanda cavab verirdi ki, qız nişanlıdır, qardaşım oğluma alacam. Mələyin də qulağı bu sözü çalmışdı. Lakin həftələr keçib, aylar dolandısa da, ortaya çıxan olmadı. Nəhayət, bir qızlıq sövq-təbiilə hiss etdi ki, onun ən gözəl günləri gəlib keçir. Atını sulamağa gətirən kənd cavanları onu

bulaq üstündə görəndə daha əvvəlki kimi həsrətlə baxmırlar. Ondan daha cavan, yeniyetmə qızlara söz atıb mahnı qoşurlar.

Nəhayət, bir gün Mələyi Kürün aşağı tərəfindəki kəndlərdən birinə ərə verdilər. Kişi ondan xeyli yaşlı idi. Deyilənlərə görə, kəndin varlı adamlarından olan Allahyar yeddi dəfə evlənmişdi. Sonuncu arvadını boşayandan sonra heç kəs ona qız verməmişdi. "Nə olsun, dövləti varsa da, arvad saxlayan deyil. Bəlkə heç kişiliyi də yoxdur", – deyə onun arxasınca ağız əymişdilər.

Allahyar aldığı arvadla altı-yeddi aydan artıq yaşamırdı. Hərəsində bir eyib tapır və evdən qovurdu. Əslində isə onun dərdi, uşaq dərdi idi.

O, sonuncu arvadı ilə haqq-hesabı kəsəndən sonra öz kəndlərindən evlənə bilməyəcəyini başa düşüb, birbaş yuxarı dağ kəndlərinə getmiş və orada Mələyi görüb elçi düşmüşdü. Cəmi bir neçə həftəyə hər şeyi həll edib qızı evə gətirmişdi.

Onsuz da taleyindən küskün olan Mələk elə ilk gündən ərinə boyun əymiş, onun dediyi ilə oturub durmuşdu. Allahyar da ilk günlər ona pis olmamışdı. Mələyi geyindirib-kecindirmiş, "Yetimliklə böyümüsən, qoy əynin sevinsin", – demişdi. Ancaq bir ildən sonra yavaş-yavaş kürlüyə başlamış, Mələyin yediyini-içdiyini burnundan tökmüşdü. Hər gün bir bəhanə ilə onu danlayıb söymüş, "Niyə uşağın olmur, sonsuz arvad mənim nəyimə lazımdır", – deyə evdə dava-dalaş salmışdı.

Mələk şam kimi ərisə də, dərdini heç kəsə açmırdı. Bir də bu qərib kənddə onun dərdini söyləyəsi bir adamı da yox idi. Mələk sirrini çölə salmamaq üçün qonum-qonşuya belə getmirdi. Tez-tez eyvanda dayanıb yuxarılara, dolama yolların uzanıb getdiyi təpələrin o üzündəki dağ ətəyində güclə görünən kəndlərinə baxırdı. "İndi yəqin ki, oraların otu hələ solmayıb. Çiçəklər də yazın əvvəlindəki kimi tərtəzədir. Bulaqların suyu görəsən yenə sərindirmi? Yenə qayaların arasından sızdıqca şırıldayırmı? Ah, Allahın altında bircə günlüyə qanadlı quş olaydım, uça-uça gedib bacamızdan içəri düşəydim, əmimə, evimizə doyunca baxaydım, sonra da bulaq başına qaçaydım. Otların üstünə sərilib, göydəki buludların dağların başına necə qonduğuna baxaydım. Çiçəklərimizin, kəkotumuzun iyindən ötəri burnumun ucu göynəyir. Görəsən məni heç yada salan varmı? Suya gələn qızlardan, atını sulayan oğlanlardan məni anan olurmu? Yoxsa yaddan çıxmışam?" – deyə düşünür, örpəyinin ucu ilə dolmuş gözlərini silirdi. O, bir an belə kəndlərini, döşlərdə mal otaran uşaqları, atını çapıb çəmənliklərdə

gəzən oğlanları unuda bilmirdi. Tez-tez yarpızlı dərələr, dolama cığırlar yuxusuna girirdi. Onu qınayan olmasaydı, ya piyada, ya da yuxarı gedən arabaların biri ilə evlərinə qayıdardı. O, hiss edirdi ki, burada, Allahyarın evində qəfəsə salınmış quş kimi yaşayır. Əri o yana dursun, qayınanası da ona göz verib, işıq vermir. Ancaq hələlik səbr edir, bütün bu işlərin sonuna çatmaq istəyirdi. Bərk ayaqda əmisinə sifariş edib yanına çağırmağı və dərdini ona açmağı qərara almışdı. Əgər o, Mələyi eşitməsə onda...

Mələk axır vaxtlar tez-tez Kürün sahilinə çıxır, əlini gözünün üstünə qoyub çiləkənlərə, yarğanların dibindəki burulğanlara, lap aşağılarda suların birləşdiyi yerdəki qayalıqlara baxırdı. O, cana doysa da, hələ qəti qərara gələ bilmirdi.

Bax elə bu vaxtlar Cahandar ağa peyda oldu və ley cücə götürən kimi, onu caynağına alıb birbaş evinə gətirdi.

## 4

Gecədən xeyli keçmiş kəndin aşağısında itlər hürüşdü. Ucqardakı qara damdan kiminsə səksəkəli səsi eşidildi.

– Ayə, a adam, kimsən?

Şamxal Çərkəzə cavab vermədi. Yavaş-yavaş evə yaxınlaşdı. Qara damın qabağındakı çardağın dirəyini özünə dalda edən Çərkəz qaraltının kim olduğunu bilənə qədər əlini tüfəngin tətiyindən çəkmədi. Şamxal çaxmaq şaqqıltısını eşidib dinləndi:

– Ə, mənəm, nə səs-küy salıbsan?

Çərkəz gözlədi. Qaraltı ona yaxınlaşandan sonra dirəyin dalından çıxdı:

– Ə, xeyir ola, gecə vaxtı qəbirdən xortdamış kimi hardan gəlirsən?

Şamxal həmyaşıdı Çərkəzin xasiyyətinə bələd idi. O, yeri oldu-olmadı, həmişə zarafat edib adamlara sataşmağı sevərdi. Şamxal da dil altında qalan deyildi. Ancaq bu dəfə ona cavab verməyə həvəsi yox idi. Çərkəz hələ də çaxmağın dabanını endirməmişdi. Bunu görən Şamxal sakit dayana bilmədi:

– Ə, düşmənli adamlar kimi tüfəngi niyə hazır tutubsan?

– Nə çoxdu anasının əmcəyini kəsənlər. Ehtiyatlı oğulun anası ağlamaz.

Onlar sakitcə içəri keçdilər. Dirəkdən asılmış qara çıraq qazma damın divarlarını güclə işıqlandırırdı. İçəri his dolmuşdu. Orta bacanın altındakı ocaq yerində iri bir kötük yanırdı. Qorun altında qara aftafa vardı. Çırağın hisindən kərənlər qapqara olmuşdu. Divarın torpağı quzulayıb tökülürdü. Küncə-bucağa dolmuş qarafatmaların qəmli cırıltıları çöldəki böcəklərin səsinə qarışmışdı. Hisli çırağın başına dolanan pərvanələrin iri kölgələri gah divarda sürünür, gah da torpaq döşəməyə sərilirdi.

Bu qərib sükutdan Şamxal elə bil vahimələndi, gözucu mitil yorğan-döşəkdə yatana baxdı. Güləsər yumaq kimi büzüşüb yuxuya getmiş, uzun hörükləri sürüşüb torpağa düşmüşdü. Nəfəs aldıqca sinəsi mitil yorğanı titrədirdi. Onun nazik burun pərələri səyriyir, yarımaçıq dodaqları arasından dişləri parıldayırdı. Şirin yatan qızın mışıltısı evə yayılmışdı.

Damın küncündə, arakəsmənin o üzündə inək oxrandı. Sonra da şırıltı və şıppıltı səsi gəldi. Evi kəsif miz iyi bürüdü. Çərkəz küncə sarı gedib donquldandı:

– Damazlığı kəsilmiş elə bil buranı gözləyir. İçəri girən kimi aləmi murdarlayır.

Şamxal həm mal damı, həm də ev olan qazmada darıxdı. Çərkəz bunu duydu.

– Gəlsənə eşiyə çıxaq, elə çardağın üstündə yer salıb uzanarıq.

– Heç nə lazım deyil. – Şamxal vaxtsız gəlməyinə bir bəhanə tapmaq məqsədi ilə əlavə etdi: – Balıq tutmağa gedəcəksənmi?

– Gedəcəyəm. Necə məgər?

– Mən də gedəcəyəm.

– Hələ tezdir, qoy ay doğsun. Həm axşamdan atdığım qarmaqları yoxlarıq, həm də təzə qarmaq atarıq.

– Yaxşı, qoy sən deyən olsun.

– Ay qız, ay Güləsər, dur çardağın üstünə palaz sal.

– Ə, qızı niyə oyadırsan?

Güləsər durub yerində oturdu. Gözlərini ovuşdurub gərnəşdi. Onun hələ də yuxulu olduğunu görən Çərkəz yenidən dilləndi:

– Tez ol, eşikdə gözləyirik.

Yalnız indicə evdə yad adam olduğunu bilən Güləsər qızarıb yorğanını başına çəkdi. Onlar eşiyə çıxan kimi ayağa durub donunu əyninə keçirdi. Küncdəki boz kilimi və döşəyi götürdü. Çardağın üstündə onlara yer düzəltdi. Sonra da kənara çəkilib sakitcə dayandı. Çərkəz bacısının "daha mənimlə işin yoxdur ki?" demək istədiyini anladı.

– Get, gör yeməyə bir şey taparsanmı, acından ürəyim doğranır. Yəqin Şamxal da mənə yoldaşlıq edəcək.

– Çox sağ ol, toxam.

– Yaxşı, yemir-yeməsin, sən mənə bir şey tap gətir. Qaşığı da iki elə. Bəlkə sonradan iştaha gəldi.

Çərkəz Cahandar ağagildə olan hadisəni bilsə də, üzə vurmadı. O özünü elə aparırdı ki, guya heç nədən xəbəri yoxdur.

Güləsər yalın ayaqlarını şappıldada-şappıldada çardaqdan endi. Evə keçib iri bir mis camı qatıqla doldurdu. Təzəcə bişirdiyi arpa fətirinin üç-dördünü büküb camın ağzına qoydu. Cəld damın üstünə çıxdı. Çərkəz camı qabağına çəkdi:

– Di get yat, gör sənin toyunda qardaşın nə qiyamət eləyəcək!

Güləsər yeniyetmə kənd qızlarına xas olan bir qəmzə ilə boynunu bükdü və dinməz-söyləməz çardaqdan endi.

Çərkəz arpa çörəyini ovcunda ovxalayıb qatığın içinə tökdü. Ağac qaşıqla qarışdırıb doğramac etdi. Bir qaşıq götürüb ağzına aldı. Ləzzətlə damağını şaqqıldadıb başını buladı.

– Qatıq deyil ki, baldır, bal, şəkərə təpik atır. Adamın beyninə işləyir. Bir qaşığı əlinə götür, gör nə dadıyır.

O, camı irəli itələdi. Şamxal könülsüzcəsinə qaşığı götürdü...

Bir azdan Çərkəz mitil yorğanı başına çəkdi.

– Yaxşı, mən yatdım. Gecə keçir. Sən də uzan. Ay doğanda gedərik.

O, yorğana bürünən kimi xoruldadı. Şamxalın isə gözünə yuxu getmədi, arxası üstə uzanaraq əllərini başının altında daraqladı.

Göyün üzü tərtəmiz idi. Ulduzlar titrəşirdi. Karvan yolu haçalanıb göy qübbəsində göz işlədikcə uzanırdı. Kənd yuxuda idi. Cələdəki çaqqalların vaqqıltısı, tənbəl-tənbəl hürən itlərin yuxulu səsi, bir də Kürün qıjıltısı bir-birinə qarışmışdı. Şamxal gözünü səmadakı ulduzlara dikmişdi. Yata bilmirdi. Elə bil yuxusu ərşə çəkilmişdi.

O, bir daha evə qayıtmayacağını qərara alsa da, hələ nə edəcəyini müəyyənləşdirə bilmirdi. Birdəfəlik kənddən çıxıb getsə necə olar? Bəlkə, dayısıgilə getsin? Görəsən onlar bu işə necə baxarlar? Bəlkə, "Kişi də anasını, bacısını atıb gələrmi?" – deyib onu danlayacaqlar. Doğrudan da, ora getmək olardımı? "Atamın bu işindən sonra kim mənim üzümə baxar? Bir də, qoltuqda yaşamaq heç kişilikdən deyil. Dayım da olsa, minnətnən çörək yemərəm. Heç kəsə yalvaran deyiləm. Özümə bir daxma düzəldəcəyəm. Kənddəki qızlardan birini də

gətirib qoyacağam evə. Atamın acığına cah-cəlalla da toy edəcəyəm. Bəs xərc-xəracat?"

Şamxal durub yerində oturdu. Cibindən gümüş tütünqabını çıxardıb papiros eşdi. Yanıqlı-yanıqlı sümürüb tüstülətdi. Yenə fikir onu götürdü. "Atamın mal-dövlətində mənim də payım var. İlxıdan at, naxırdan mal ayırıb gətirəcəyəm. Görüm qabağımda necə durur?! Bəlkə birdən atam razı olmadı? "Hələ ölməmişəm ki, malımı-dövlətimi dağıdırsan?" – deyə qabağıma çıxdı, onda necə olsun? Doğrudan da, mal-dövlətin hamısı onun idi. Mən ki, hələ bir iş görməmişəm? Bir də ki, Əşrəf də var idi".

Qardaşı yadına düşəndə Şamxalın həm ürəyi kövrəldi, həm də qəzəbi artdı. O, Əşrəfi çox istəyirdi. Əşrəf, necə deyərlər, canlara dəyən oğlan idi. Amma atasının iki qardaşın arasında ayrı-seçkilik saldığını xatırlayanda tutuldu. Atası burada da insafsızlıq etmişdi. Əşrəfi keçən il Qori müəllimlər seminariyasına oxumağa göndərmiş, Şamxalı isə yanında saxlamışdı. "Evimizdən biri oxusa bəsdir, – demişdi, – sən qal. Bu cah-cəlal kimindir? Qardaşın məktəbi qurtarandan sonra Allah bilir hara çıxıb gedəcək. Mənə sən qalacaqsan".

– İndi də belə. "Yox, atam da olsa, boyun əyməyəcəm. Onun bir çöpü də mənə lazım deyil. Təzədən onun qapısına getsəm, üzümə vurmasa da, ürəyində "Urvan məndən olmasa, kündən küt düşər" – deyəcək. Heç nə lazım deyil, heç atamın seçdiyi qızlara da yaxın getməyəcəm. Kimi ürəyim istəyir, onu da alacağam. Nə çoxdur kəndimizdə gözəl-göyçək qızlar. Elə biri Çərkəzin bacısı Güləsər. Kimdən pisdir? Nə olar atası gəmiçi olanda? Özünün də deyəsən mənə meyli var".

Şamxal papirosunu sümürüb çardağın üstündən yerə atdı. Közərən papiros havanı cızıb otluğun arasında xeyli qızardı. İri bir ağcaqanad vızıldayıb Şamxalın başına dolandı. Qulağının dibindən sancıb uzaqlaşdı. Şamxal bayaqdan bəri onu yoran dolaşıq fikirlərdən yaxasını qurtarmaq üçün yorğanı başına çəkdi. Ancaq yenə sakit ola bilmədi. Bir yandan da bədəninə daraşan birələr onu qor kimi daladı. Yata bilməyəcəyini görən Şamxal yorğanı kənara atıb oturdu. Hardasa xoruz banladı. Aşağıdakı təpələrin arxasından çıxan ay yuvarlana-yuvarlana yuxarı qalxdı. Kəndin üstünə solğun bir işıq çiləndi. Kürün şaxələnmiş suları parıldadı. Gecə böcəkləri səs-səsə verib ötür, çəmənlikdəki yaşıl qurbağalar quruldaşırdılar.

Ay doğandan sonra ulduzlar solğunlaşıb titrəşdi. Asta, olduqca mülayim bir bahar küləyi əsdi. Şamxalın burnunu çəmən çiçəklərinin qoxusu qıcıqlandırdı.

Çərkəzin xorultusu mışıltıya çevrilmişdi. Şamxal qibtə ilə ona baxırdı. Ay doğanda onu oyatmalı olduğunu belə unutmuşdu.

Birdən Çərkəz hövlnak oyanıb, başını yorğanın altından çıxartdı:

– Aya, a Şamxal.

– Nədi?

– Deyəsən, hava aydınlaşıb?

– Hə, dur, ay çoxdan doğub.

Çərkəz yorğanı üstündən atıb ayağa durdu. Qollarını açıb gərnəşdi. Sərin havanı ciyərlərinə çəkib bərkdən əsnədi.

– Deyəsən, yatıb qalmışıq.

– Yaman şirin yuxuya getmişdin, özüm qaldırmadım.

Çərkəz yorğanı kilimə büküb çardaqdan endi. Həyətdən içəri atdı. Bir az kənarda onu gözləyən Şamxalın papirosu işıldayırdı.

Onlar kəsə cığırla birbaş sahilə yollandılar. Ətraf səssiz idi. Kükrəyib daşan Kürün qıjıltısı daha aydın eşidilirdi. Cələdəki çaqqallar ulaşırdı.

Yarğanın qaşına çatdılar. Suyun sərin havası onların üzünə çırpıldı. Şamxalın bədəni üşürgələndi. Çərkəz Ay işığında parıldayan qol-qanadlı Kürə baxdı:

– Deyəsən, su daşıb?

– Yəqin yenə yuxarıya yağıb. Axşamdan dağların başında şimşək çaxırdı.

Çərkəz köksünü ötürüb uzaqda qaralan qayalıqlara baxdı.

– Yazıq kişi hələ də gəlib evə çıxmayıb.

– Kim, Qoca dayımı?

– Hə, – deyə Çərkəz cavab verdi. Sonra köksünü ötürüb əlavə etdi:
– Kişi yaman qocalıb. Daha əvvəlki kimi deyil, əldən-ayaqdan düşüb.

– Qoyma getsin. O yaşda adama gəmiçilik etmək çətindir.

– Əlacımız nədir? Bir də, onu ölənəcən gəmidən ayırmaq olmaz. Srağagün gəminin başını aldırırlar. Kişi çəpi dayayıb gəmini saxlayır. Suyun ortasına gələndə çəp yerə çatmır. Özü də suya düşür. Birtəhər üzüb çıxır. İndi neçə gündür evə gəlmir.

Şamxal susdu. Çərkəz də dinmədi. Tozlu araba yolunu keçib sahilə endilər.

– Su yaman bulanıb.

– Onda bəxtimiz kəsib.

– Asmaları su aparmaz ki?
– Ağlım kəsmir. Ancaq sən de ki, su daşıb adanı basmamış ola.
Səs eşidən şələquyruq bir tülkü gözləri parıldaya-parıldaya qaçıb, özünü yarğanın altındakı yulğunluğa verdi. Çərkəz zil səslə qıy çəkib onu daha da qorxutdu.
– Gərək tüfəngi götürəydim.
– Ə kişi, sən balıqdan danış, tülkünü neyləyirsən?
– Tülkülərlə mənim haqq-hesabım çoxdur. Köpək oğlunun malı qapıda toyuq-cücə qoymayıb.
Çərkəz suyun qırağına çatan kimi paltarını soyundu. Bir neçə gün əvvəl su daşanda əmələ gələn gölməçəyə yaxınlaşdı.
– Ə, hara gedirsən?
– Qurbağa tutmağa. Qarmağa keçirəcəyəm.
O özünü şappıltı ilə suya atdı. Bir az bundan qabaq səs-səsə verib suyun üzündə süzən qurbağalar susdular. Çərkəz balaca gölməçədə xeyli əlləşdi. Bir-iki dəfə əlinə toxunan soyuq və sürüşkən qurbağaları qaçırtdı.
Şamxal dolaqlarını açıb ayaqlarını soyunana qədər Çərkəz qayıtdı. Onun əlində beş-altı qurbağa vardı. Çərkəz onları başıaşağı sallamışdı. Qurbağaların qarnı ağarırdı.
– Al, qarmağa keçir. Özün də əlli tərpən.
– Əlimə ziyil düşməz ki?
– Boş sözdür. Amma qarmağa elə keçir ki, ölməsinlər.
Onlar paltarlarını soyunub, yarğanın dibində, iri bir daşın altında gizlətdilər. Şamxal suya girməzdən əvvəl dönüb Çərkəzin üzünə baxdı.
– Hansı tərəfə gedəcəyik?
– Adanın o üzündəki çiləkənlərin alt tərəfinə. Orada həmişə balıq olur.
Kürün üstünü qatı duman bürümüşdü. Xırdaca və köpüklü ləpələr yarğanın dibini yalayır, ağac qırıntılarını və çör-çöpü kənara atırdı.
Onlar sahilboyu qalxdılar. Bir azdan Şamxal dayandı.
– Ə, hara gedirsən, gəl elə şığanıb buradan keçək.
– Yox, bir az da gəl. Yuxarıdan düşək ki, birbaş adanın üstünə çıxaq. – O, dayanıb Şamxala baxdı. – Yoxsa üşüyürsən?
– Niyə sən üşümürsən, mən üşüyürəm?
– Mənə baxma, rəiyyət balasının canı bərk olur. – O, sözünün dalını demədən şappıltı ilə suya atılıb üzməyə başladı. – Gözlə ha, qurbağaları axıdarsan.
Su soyuq idi. Ancaq bunu nə Şamxal, nə də Çərkəz hiss edirdi. Onlar bir-birinin bəhsinə üzüb adaya çatdılar. Yalnız burada bədən-

lərinin soyuqdan qızardığını hiss etdilər. Çərkəz yaxşı tanıdığı cığırla yulğunluğu keçib, qarmaq atdığı yerə gəldi. Qarmağın biri yerli-dibli yox idi. Bunu görən Çərkəz özünü saxlaya bilmədi.

– Vay, köpək uşağı!

– Nə olub? – deyə ona yaxınlaşan Şamxal soruşdu. – Bəlkə balıq kəndiri qırıb?

– Yox... Dayan, dayan, ayaq izi var. Vay sizin... Özü də indicə aparıblar. Yəqin balıq düşübmüş.

Adanın o tərəfindəki qamışlıqdan səs gəldi. Çərkəz birbaş oraya yüyürdü. Şamxal onu tək buraxmadı.

– Anasının əmcəyini kəsənlər, hara qaçırsınız? Əyə, dal tərəfdən qabaqlarına keç, qoyma bunları, – deyə Çərkəz qışqırıb, ayağına batan çökürlərə fikir vermədən irəli cumdu.

Onlar qamışlığa çatanda heç kəsi görmədilər. Duman daha da qatılaşmışdı. Ancaq o taydan, yarğanın qaşından səs gəlirdi. Xısın-xısın danışıb gülürdülər.

– Gəl qayıdaq, heç kəs yoxdur.

– Görmürsənmi səs gəlir?! Yəqin Sadıqlının uşaqlarıdır. Yaxşı, borc olsun!..

Onlar geri qayıtdılar. Atılan qarmağın birini də balıq aparmışdı. Çərkəz daha da əsəbiləşdi. Elə bu vaxt sudakı qarmağın zərblə dartıldığını gördülər. Çərkəz hər şeyi unudub, birbaş çiləkənin yanına qaçdı. Balıq çırpınıb suyun üzərinə çıxır, quyruğunu şappıldadıb dartınır, sonra da suyun dibinə cumurdu. Kəndir az qalırdı ki, üzülsün.

– Əyə, tez özünü yetir, deyəsən yaman zırpı balıqdır, gücüm çatmır.

Çərkəz kəndirdən tutub var gücü ilə dartır, balıq isə onu sürüyüb aparırdı. Şamxal onun köməyinə çatmasa idi, Çərkəz axıracan tab gətirə bilməyəcəkdi. Naqqa bir anlığa suyun üzünə qalxdı. Sanki düşmənlərinin kim olduğunu bilmək istəyirmiş kimi onlara baxdı və birdən quyruğunu suya elə çırpdı ki, onların hər ikisi səksənib geri sıçradı. Balıq yenə suya cumdu. İslanmış kəndir dartınıb onların əlini kəsirdi. Balıq onları addım-addım su aşağı aparırdı.

– Əyə, tez kəndiri bir yerə bağla, – deyə Çərkəz qışqırdı. Şamxal güc-bəla ilə ipi yulğun koluna dolayıb dayandı. Onlar nəfəslərini dərdilər. Görünür, balıq da dincəlirdi.

– İndi ipi yavaş-yavaş yığ!

Onlar güc-bəla ilə kəndiri çəkdilər. Naqqa yavaş-yavaş təslim olurdu. Nəhayət, onu çəkib çıxartdılar. Çərkəz sahildə, qumluqda, ça-

palayıb çırpınan balığı əldən qaçırmamaq üçün iri bir ağac götürüb var gücü ilə naqqanın başına endirdi. Gicəllənən balıq bığlarını oynadıb rahatlaşdı. Çərkəz onu candan eləməmiş əl çəkmədi.

– Belə eləməsəm suya düşən kimi diriləcəkdi. İtlərin Allahı verdi, köpənəcən yeyəcəklər, – deyə Çərkəz naqqanı ayağı ilə arxası üstə çevirdi.

Dayanıb bir-birinin üzünə baxdılar. Bədənlərindən buğ qalxırdı.

– Hə, üşümürsən ki?

– Yox.

– Onda gedək, çiləkənin alt tərəfinə qarmaq ataq.

– Yəni orda balıq var?

– Var. Qızıl balığın əsl məkanı oradır.

Şamxal etiraz eləmədi. Yulğunların arası ilə Çərkəzin göstərdiyi səmtə doğru addımladılar.

... Onlar paltarlarını geyinib sahilə qayıdanda artıq dan yerinə səda düşmüşdü. Səba nəsimi Kürün səthinə çökmüş dumanı qovub uzaqlara aparırdı. Sahildəki yulğun kolları, yaşıl otlar, hətta cığırlar belə şehə bulaşmışdı. Kənd itləri səs-səsə verib hürüşür, at kişnəməsi və mal-qara səsi ətrafa yayılırdı.

Çərkəz yarğanın kənarındakı dikdirdə ayaq saxladı. Yenicə tutduqları pullu balıqları irəli uzatdı.

– Al, evə apar. Mən yenə tutaram.

– Yox, – deyə Şamxal etiraz etdi. – Gedək sizə. Güləsər bişirsin.

– O nə qanır balıq bişirməyi?

– Elə demə, çox ləzzətli balıq bişirir.

Çərkəz qaşlarını çatdı. Təəccüblə Şamxalın üzünə baxdı:

– Sən hardan bilirsən?

– Bilirəm, – deyə Şamxal sakitcə cavab verdi.

Çərkəz heç nə demədi. Şamxal onun evə doğru könülsüz addımladığını hiss etdi.

## 5

Qaranlıq qarışıb əl-ayaq yığışandan sonra Zərnigar xanım yan otağa çəkildi. Səhərdən dilinə bir şey dəyməsə də qulluqçuların gətirdiyi çay-çörəyə əl vurmadı. Anası ilə bərabər, göz yaşı axıdan Salatın nə qədər yalvardısa da, arvad inadından dönmədi. Evə qaranlıq çökdü. Qızının lampanı yandırmaq istədiyini görəndə acıqlandı:

– Yıxıl, öl bir yerdə! Mənim çırağımı fələk özü söndürüb.
– Ana, dərdin alım, adamın ürəyi darıxır.
– Bəs mənim ürəyim darıxmır?
– Qoy yandırım.
– Sənə dedim otur bir yerdə. Mən bu evin ocağını kor qoyacağam.
– Sən qağamın canı.
– Qağan da ölsün, sən də. Əl çək məndən.
– Ana, necə qıyıb qağama elə dedin?

Arvad hirsli olduğundan nə danışdığını bilmirdi. Salatın səsini kəsib təəccüblə onun üzünə baxanda Zərnigar xanım elə bil yuxudan ayıldı. Hələ də evə qayıtmayan oğlunu xatırladı.

– Allah atan Cahandar ağanın əlifini yanıltsın, ay bala, məni elə çaşdırıb ki, nə danışdığımı da bilmirəm.

Salatın anasının boynunu qucaqlayıb, üz-gözündən öpdü:

– Dərdin alım, ay ana, qağama qarğama.

Həmişə mal-qara örüşdən qayıdanda həyətə çıxıb, əli belində, qulluqçulara göstəriş verən, inəklərin südünü bir yana yığdırıb eyməyə çəkdirən, toyuq-cücəni rahatlayıb, itlərin yalına belə göz qoyan Zərnigar xanım indi yerindən tərpənmədi. Yarğanın qaşında at kişnəyəndə ərinin gəldiyini hiss etdi. Otaq onun başına fırlandı. Arvadın bədənini titrətmə götürdü. O, pəncərədən hər şeyi görürdü. Əlində çatı buzov dalınca qaçanları da, malları xalxala dolduranları da, itlərin zəncirini açıb yal tökənləri də gözündən qoymurdu. Onun həyatı dünənə qədər nə yaxşı sakit keçirdi. Şamxal bir tərəfdə hərlənər, hamıdan çox istədiyi, boynunu oxşayıb "mənim yaranal ərim" – dediyi Cahandar ağa samanlığın üstündə oturub nərildəyərdi. Zərnigar xanım da ortada hərlənərdi. Amma indi!..

Onun fikri bayırda qalsa da yerindən tərpənmir, canını dişinə tutub dayanırdı. Hətta xalxaldan çıxan təpəl buzov anasını əməndə arvad hər şeyi unudub "ay qız!" – deyə çığırdı da. Salatın anasından nə olduğunu soruşanda Zərnigar xanım "heç" – deyə köksünü ötürdü. Onun gözü yolda idi. Bu gün-sabah kiçik oğlu oxumaqdan qayıdacaqdı. Ona nişan aparacaqdılar. Zərnigar xanım düz iki il idi ki, kənd qızlarını gözündən qoymurdu. İstər Qaynarda, istərsə də Kürdə çimişəndə onlara baxır, toyda, nişanda özünə gəlin seçirdi. Əşrəf onun istəklisi idi. Özünün dediyi kimi, ilk ovunun balası idi. Onun özünə layiq bir qız axtarıb tapmaq, sonra da cah-cəlalla toy etmək Zərnigar xanımın arzu-

su idi. Axı, Əşrəf hər oğulun tayı deyildi. Hələ bu mahalda onun kimi gözəl-göyçək, qanacaqlı, mərifətli bir oğul yox idi. Zərnigar xanım elə bilirdi ki, göy çat eləyəndə Əşrəf yerə düşüb. O hər yerdə, hər məclisdə oğlundan danışar, onun boyunu sevərdi. Buna onun haqqı da var idi. Doğrudan da, bu mahalda iki savadlı vardısa, onun biri Əşrəf idi. Əlbəttə, kitab-dəftərin nə olduğunu bilməyən Zərnigar xanım oxumağın da nə olduğunu başa düşmürdü. Ancaq bircə şeyi bilirdi ki, oğlu deyəsən hamıdan, hətta doğma qardaşı Şamxaldan da seçilir.

Bir ay bundan əvvəl onlar qazının qapısına getmiş və qız "hə"sini almışdılar. Onlar Əşrəf gələnə qədər hər şeyi hazır etmək istəyirdilər. Elə bu məqsədlə də Cahandar ağa şəhərə, həftəbazarına getmişdi. Geri qayıdanda parça-paltar əvəzinə Mələyi gətirmişdi. Zərnigar xanımı da elə yandıran bu idi. Bunları düşündükcə onun başından tüstü çıxır, ünü göyə qalxırdı. "Səni görüm el içində xəcil olasan, ay kişi, oğul-uşaq yanında üzün qara olsun", – deyə ərinə qarğayırdı.

Həyətdə ocaq qalanıb maralın dərisi soyulanda arvad yenidən hirsləndi. "Səni görüm gora sağ baş aparmayasan! Təzə eşqə düşdüyün yerdə tanrı belini qıraydı. Gör nə tezcə də ova gedib? Gül kimi balamı evindən didərgin salıb, hələ utanmır, iştahından maral əti də keçir. Görüm yediyiniz boğazınızda qalsın. Bilirəm ki, elə də olacaq. Təzə bardağın suyu sərin olar. İndidən xanımına maral əti yedirdir. Qoy olsun. Mənim ahım sizi tutmasa, daha heç nə bilmirəm".

Salatın anasının vəziyyətini başa düşsə də, bir şey deyə bilmirdi. Axı o nə edə bilərdi? Anasına təsəlli vermək üçün bir sözü yox idi...

Tapdıq qapını ayağı ilə itələyib, yavaşca araladı. Əlindəkiləri yerə salmamaq üçün çiynini qabağa verib, otağa keçdi. Yenicə qalaylandığından par-par parıldayan iri mis sinini taxtın üstünə qoydu. Sacdan götürdüyü isti yuxaları qatlayıb göy soğanla birlikdə camın yanına düzmüşdü.

Tapdıq sinini ehmalca irəli itələdi.

– Xanım, özüm bişirmişəm. İsti-isti yeyin.

İstiot və kəkotu səpilmiş kababın xoş ətri dərhal otağa doldu. Salatın tez ayağa durdu. O, birtəhər anasının könlünü almağa çalışdığından, qabı irəli çəkdi. Ancaq anası ona imkan vermədi. İlan çalmış kimi yerindən dik atılıb camı götürdü və vıyıltı ilə bayıra atdı. Tikələrin hərəsi bir tərəfə dağıldı. Mis cam daşa dəyib danqıldadı, sonra da otluğa diyirləndi. Otağı əsəbi bir səs bürüdü:

– Apar, ver ağana, qoy təzə xanımının gözünə soxsun.

Tapdıq nə isə demək istədi. Lakin Zərnigar xanım ayağını yerə döyüb onun üstünə qışqırdı:

– Bu saat rədd ol burdan! Yoxsa, ağanı sənə, səni də ağana qataram.

Nökər dinməz-söyləməz bayıra çıxdı. Arvadı yenidən hirs götürdü. "Yox, bu evin altını üstünə çevirəcəyəm. Onun yurduna od vuracağam. Bu hayfı onda qoymaram. Mən çöldə-zadda qalmamışam. Mənim də sahibim var. Yerlər qulaqlıdır. Bu gün-sabah gəlib çıxarlar".

O doğrudan da qapını açıb həyətə çıxmaq, ərini Mələyə, Mələyi də ərinə qatmaq istədi. Ancaq səhərki əhvalatı xatırlayanda susdu. Büzüşüb bir küncdəcə oturdu. Əli hər yerdən üzüldüyündən, gözlərinə dəm verdi.

Salatın yük yerindən yorğan-döşək götürüb yer saldı. Sakitcə anasına yaxınlaşdı.

– Dur, ana, qurbanın olum, canına yazığın gəlsin.

Zərnigar xanım bu dəfə dinmədi. Elə pallı-paltarlı yerinə uzandı. Salatın anasının böyrünə qısıldı. O, bu saat anasının fikrini dağıtmaq üçün çox şey söyləmək istəyirdi. Ancaq nədən başlamağı bilmirdi. Qardaşından söz salıb Şamxalın harda olduğunumu soruşsun, yoxsa Əşrəfdən danışıb qardaşına almaq istədikləri qızımı tərifləsin? İki gün əvvəl Kürün qırağında onu gördüyünümü söyləsin? Anasına desinmi ki, qız Əşrəfi soruşurdu? Onun qaş-gözünü tərifləyib, şirin gülüşündən, çənəsindəki qara xalından sözmü salsın?

Salatın çox fikirləşdi, çox düşündü və özünün də xəbəri olmadan yuxuya getdi. Qızının bir quzu kimi böyrünə qısıldığını görən Zərnigar xanım ehmalca onun üstünü örtdü. Salatın şirin-şirin mışıldayırdı. Arvad bir anlığa hər şeyi unutdu. Onun qəlbindəki analıq hissi qadınlıq duyğusuna, kin-küdurətə və qısqanclığa üstün gəldi. "Mən bunu hara qoyum gedim? – deyə düşündü. – Tutalım, sifariş elədim, qardaşlarım gəlib məni apardılar, bəs sonra? Onlar dinc duracaqlarmı? Araya qan düşməyəcəkmi? Kim bilir, dilim-ağzım qurusun, bəlkə də uşaqlardan birini öldürdülər. Ya da ki, bizim kişini vurdular, onda necə olacaq? Elə də olsa, belə də olsa, yenə mənim evim yıxılmayacaqmı? Oğlum-qızım düzdə qalmayacaqmı? Nə bilim vallah, heç özüm də bu işlərdən baş açmıram. Kaş yaranmayaydım. Allah məni bura gətirən günə daş yağdıraydı".

Artıq ətraf sakitləşmişdi. Ay solğun işığını pəncərədən içəri salmışdı. Kürün qıjıltısı aydınca eşidilirdi. Zərnigar xanım gözünü pəncə-

rədən bayıra zilləyib fikrə getdi. Xəyal onu uzaqlara, bu yerlərə gəldiyi ilk günlərə aparıb çıxardı...

Zərnigar üç qardaşın tək bacısı idi. Evin körpəsi, anasının sonbeşiyi olduğuna görə hamı onun başına pərvanə kimi dolanırdı. Evdəki gəlinlər onu əzizləyir, özlərinə bir don tikəndə, ona ikisini biçirdilər. Zərnigar qayğısız bir həyat keçirirdi. Kənddə bir toy, nişan olanda gəlinlər onu da aparır, qardaşları, bu tək bacını dönə-dönə oynadıb əllərini şabaşla doldurur, yorub taqətdən salmamış ondan əl çəkmirdilər. İllər keçdikcə Zərnigar yaşa dolur, nazik, ucaboy bir qıza dönürdü. Artıq nişanlı qızlar onu öz cərgələrinə qatır, bəy gəzəndə onu da özləri ilə aparırdılar. Zərnigar belə yerlərdən çox vaxt əlləri və dırnaqları xınalı qayıdırdı.

Qardaşları onu belə görəndə sataşır, "A xınalı kəklik, çox dağa-daşa çıxma, naqafil ovçuya rast gələrsən", – deyirdilər. Zərnigar bu atmacaların mənasını o qədər də yaxşı başa düşməsə də, qızarıb evdən bayıra qaçırdı.

Bir gün yenə kəndlərində toy vardı. Cavanlar cıdıra çıxmışdılar. Qızlar, gəlinlər damların üstünə toplaşıb qoşalaşan atlara baxırdılar. Nəməri kimin alacağı hamını maraqlandırırdı. Zurnaçılar cuşa gəlib daha da zilə çəkirdilər. Atlılar uzaqlaşır, xır yolunu keçib o tərəflərə, təpələrin ətəyindəki düzənliyə gedirdilər.

Onlar kənddən aralanıb döngədə görünməz oldular. Az sonra geri qayıtdılar. Qabaqda göy buxara papaqlı, kəhər atlı bir oğlan gəlirdi. At quş kimi süzür, xəndəklərin üstündən yüngüllüklə atılırdı. Çərkəzi paltarlı bu oğlan atın yalına yataraq qamçını oynadırdı. Onun başlığı ağ göyərçin qanadı kimi havada çırpınırdı. Hamı təəccüblə cıdırın qalibinə baxırdı. Camaatın arasına pıçıltı düşmüşdü:

– Bu kimin oğludur?

– Vallah, tanımıram.

– Heç biz tərəfin adamına oxşamır.

– Deyəsən qonaqdır.

– Qonaq ürək eləyib bizim cavanların qabağında at oynatmaz.

– Ciyərli oğul özünü hər yerdə göstərər.

Adamlar atlının qabağına yüyürdülər. Qərib oğlan nəməri göydə alıb atının boynuna doladı. Gümüş döşlüklü kəhərin yalı, qırmızı kəlağayının altından qız teli kimi axıb töküldü. Oğlan arxada qoyduğu cavanları gözləmədən atını birbaş zurnaçıların qabağına sürdü. Kəhər şaxə

qalxıb kişnədi. Dəfin ahənginə uyğun olaraq qabaq ayaqlarını yerə döydü. Oğlan birdən yəhərdə başı üstündə dayandı. At qaçaraq onu xeyli uzağa apardı və geri dönüb dördnala çapdı. Oğlan görünməz oldu. Arvadların çoxu, elə Zərnigar da içini çəkib qışqırdı. At qaçıb camaata yaxınlaşanda kəhərin böyrünə yatan oğlan sıçrayıb ayaq üstə atın belinə qalxdı. Zurnaçıların bərabərinə çatanda atılıb yerə düşdü.

Hamı heyran qalmışdı. Ancaq, deyəsən, kənd cavanlarının çoxu qəzəbli idi. O, atı yedəkləyib kənara çəkilən kimi, kimsə xəncərin dəstəyindən yapışıb irəli çıxdı.

– Ə, toy toğlusu kimi nə atılıb-düşürsən! Yoxsa bizi arvad hesab eləyirsən?

Oğlan çiyni üstündən dönüb saymazyana ona baxdı.

– Özün arvad adını üstünə götürürsənsə, mən bir şey demirəm.

Xəncərin havada parıldaması ilə qəribin oğlanın biləyini göydə tutması bir oldu.

– Vaxtsız banlayan beçənin başını tez kəsərlər, bala, ağır otur, batman gəl.

Cavanlardan bir neçəsi irəli çıxanda Zərnigarın qardaşları qırğı kimi atılıb ortaya keçdilər və qəribi araya aldılar.

– Kimi əcəl hərləyirsə, qabağa çıxsın, – deyə xəncərlərini hazır tutdular. Elə bu vaxt zəhmli bir səs eşidildi:

– Rədd olun burdan, haramzadalar! Adam da qonağa əl qaldırarmı?

Cavanlar xəncərlərini qınına qoyub geri çəkildilər. Toy sahibi qonağın kürəyinə döydü.

– Ananın südü sənə halal olsun, a bala, sən onlara baş qoşma, yandıqlarından elə eləyirlər.

Zərnigar camaatdan aralanıb qardaşlarının yanına qaçdı. Qərib oğlana diqqətlə baxdı. Ev sahibi yenə oğlana müraciət etdi:

– A bala, kimlərdənsən?

– Göytəpədənəm.

– Bəs burada bir simsarın varmı?

O dillənənə qədər Zərnigarın böyük qardaşı cavab verdi:

– Bizə qonaq gəlib, qohumumuzdu, ay Murad dayı.

Kişi diqqətlə onları süzüb gülümsündü.

– Olsun, a bala, ət yeyən quş dimdiyindən bilinir.

Zurnaçılar susmuşdular. Hamı məsələnin nə ilə qurtaracağını gözləyirdi. Murad kişi çiynindən sürüşüb düşən əbasını düzəldib qışqırdı:

– Əyə, niyə kiridiniz, çalın görək. Qoyun qızlar oynasın!

Zurnaçılar oyun havası çaldılar. Yenə hər kəs öz işinə başladı. Yalnız bu zaman qonaq dönüb Zərnigara baxdı. Qız hər şeyi unutmuşdu. Oğlanın cəsarəti, bu yad yerdə qorxmaması onu heyran etmişdi. Oğlan nədənsə gülümsündü, sonra da üzünü Zərnigarın böyük qardaşına tutdu:

– Bu qız kimdir?

– Bacımdır.

Oğlan ani fikrə getdi və birdən atın boynundan kəlağayını açıb Zərnigarın çiyninə atdı:

– Al, qoy sənin olsun.

Zərnigarın qardaşları azca pərt oldular. Ancaq bir şey demədilər. Yalnız kiçik qardaşı qızın üstünə acıqlandı:

– Çənəmizin altını niyə kəsdiribsən, çıx get!

Zərnigar cəld qızların yanına qaçdı.

– Ay qız, o kim idi?

– Ay batmış, gözlə ha.

– Yamanca şeysən, şeytandan üç gün qabaq yaranmısan.

– Kəlağayı hanı, göstər görək.

– Nəməri niyə sənə verdi?

– Pis oğlan deyil, amma yaman qaradır.

Qızlar onu sərçə kimi didişdirib suala basdıqca, Zərnigarın yanaqları qıpqırmızı olub, boynundakı kəlağayının rəngindən seçilmədi. Nəhayət, o, sinəsini qabardıb qızlara qürurla cavab verdi:

– Belə öz qohumumuzdur, sizə nə var?

Toy qurtardı. Oğlan bir gecə qonaq qalıb getdi. Ancaq Zərnigar onu unuda bilmədi. Oğlanın bağışladığı qırmızı kəlağayını qatlayıb sandıqda, ala-bəzək parçalardan tikdiyi boğçanın içində gizlətdi. Hərə bir tərəfə dağılıb, evdə sakitlik olanda Zərnigar boynundan asdığı açarla sandığı açıb pal-paltarını tökər, kəlağayını çıxarıb baxar, tərli at qoxusunun gedib-getmədiyini yoxlayar, sonra da keçən yay dağda dərdiyi sarı boğça çiçəyinin arasına qoyub yenə sandıqda gizlədərdi. Qız oğlanı unuda bilmirdi. Hətta bir gecə işığı söndürüb anasının yanına uzananda səbr edə bilməyib:

– O oğlan kim idi? – deyə soruşdu.

– Hansı, dərdin alım?

– Mənə kəlağayı bağışlayan.

– Qohumumuzdur, dərdin alım, atan tərəfdən qohumuq.

– O ki, bizim kənddən deyil, hardan qohum olduq?

– Axı qızım, bizim də əslimiz o tərəfdən, Kürün aşağısındakı Göytəpədəndir. Sonra köçüb buraya gəlmişik.

– Niyə?

– Eh, neylirsən, qızım, onları soruşub? Bu, uzun əhvalatdır.

Zərnigar israr etmiş, anası da demişdi ki, rəhmətlik babanın əlindən xata çıxıb, araya qan düşüb. Kənddə ikitirəlik olub. Axırda baban cana doyub, gecənin birində arvad-uşağını arabaya doldurub, kənddən qaçıb. İndi biz burda olsaq da kökümüz-nəslimiz ordadır, dərdin alım. Cahandar ağa da babayın nəslindədir.

Zərnigar o gündən sonra oğlanı daha intizarla gözlədi.

Bu hadisədən düz bir il sonra qıza elçi gəldi. Nişan taxdılar, sonra da toy oldu. Zərnigarı Cahandar ağaya verdilər...

... Gözünü pəncərəyə zilləyib dayanan Zərnigar xanım hər şeyi indiki kimi xatırlayırdı. Düz üç gün, üç gecə toy çaldılar. Sonra da qumrovlu fayton gətirdilər. Qardaşları kövrəlmişdi. Deyəsən, bacılarından ayrılmaq onlara ağır gəlirdi. Zərnigar onların boynunu qucaqlayıb ağladı. Gəlini evdən çıxartdılar. Kimsə "gəlin oynasın", – dedi. Zərnigarı ortaya çəkmək istədilər. Ancaq qızın böyük qardaşı irəli yeridi. "Mənim bacım öz toyunda oynamayacaq". Mübahisə qızışdı. Axırda yengə ortaya çıxdı. "Gəlində işiniz olmasın", – dedi. Faytonlar qatarlaşdılar. Zərnigar evlərindən ayrıldı. Kimsə "yola çıxan kimi faytonları dayandırıb gəlini oynadacağıq", – dedi. Zərnigar, qardaşının hirsli səsini eşitdi: "Beşaçılanı doldurub damın üstündə gözləyəcəyəm. Kimin hünəri varsa, oynatsın!".

Qumrovlu faytonlar yola çatıb dayandı. Zurnaçıları düşürdüb oyun havası çaldırdılar. Gəlini oynatmaq istədilər. Elə bu vaxt başlarının üstündən dalbadal üç güllə vıyıldayıb keçdi. Dönüb baxdılar. Zərnigar da üzündən duvağı araladı. Damın üstündə əli tüfəngli dayanan qardaşını gördü. Ağsaqqal bir kişi cavanlara acıqlandı:

– A bala, höcət eləməyin, görmürsünüzmü tərs damarına düşüb?!

Faytonların qumrovları yenidən zınqıldadı. Atlılar qaçıb qabağa keçdilər.

Bütün bunlar düz iyirmi il qabaq olmuşdu. O zaman Zərnigarın on altı yaşı vardı. İndi o, üç uşaq anası idi. Əri həmişə onu "Zərrim, Zərrim", – deyə əzizləyərdi. "Bəs indi nə oldu? Niyə birdən-birə üzü döndü? Yox, kişiyə cadu yazdırıblar. Üstünə qurd yağı sürtüblər. Allah mər-

dimazarın evini yıxsın. Paxılın goru çatlasın. Məni gözü götürməyənin gözünə nar şaxı batsın”.

Bayırda külək qalxdı. Həyətdə dirəkdən asılmış tənəkə ləyən yerə düşüb danqıldadı. Tardakı toyuqlar qığıldaşdılar. Talvarın üstündəki ot tayası uçub yerə töküldü. Zərnigar xanım küləyin otu bir yumaq kimi büküb xırman yerinə qədər apardığını gördükdə yerindən tərpənmədi. “Qoy Allah hər şeyin altını üstünə çevirsin”, – deyə öz-özünə pıçıldadı. Nökərlərin samanlığın yanında qaladıqları ocaq yerindəki kösövlər közərdi. Külək şiddətləndikcə ocaq qorlanır, qığılcımlar göyə sovrulurdu.

Zərnigar xanım yerin içində dirsəkləndi. “Belləri qırılmışlar, elə yeyib yatmağı bilirlər. Ocağı da söndürməyiblər. Bu saat samanlığa od düşəcək”. O, həyəcanlandı və bir az bundan əvvəl dediyi sözləri unudub yerindən qalxdı. Qapıya yaxınlaşdı. Nə qədər hirsli olsa da, ərinə qarğayıb söysə də, var-dövlətinin yanıb kül olmasını istəmirdi. Necə deyərlər, dil desə də, ürək razı olmurdu.

Zərnigar xanım qapını açıb bayıra çıxdı. Nökərləri qaldırıb danlamaq, sonra da ocağı söndürməyə göndərmək istədi. Pəncərənin qabağından keçərkən gözucu içəri baxdı. Fitili aşağı çəkilmiş otuzluq lampanın solğun işığında ərini və onun qolu üstündə yatan Mələyi gördü. Arvadın gözünə qaranlıq çökdü. Ona elə gəldi ki, eyvanın dirəkləri əyildi, tavan onun üstünə uçdu. Arvad divara söykənib güc-bəla ilə ayaq üstündə dayandı. Hər şey – közərən ocaq da, vıyıldayan külək də, alışıb yanan od da onun yadından çıxdı. O, qaranlıqda yol itirən adamlar kimi divardan tuta-tuta birtəhər sürünüb özünü evə saldı. İniltili səsi otağa yayıldı:

– Gözün tökülsün, ay tanrı, məni niyə bu günlərə qoydun?

## 6

Mələyin yoxa çıxması xəbərini eşidəndən yarımca saat sonra Allahyar yola hazırlaşdı. Qumar yoldaşlarını və karvansara sahibini duyuq salmamaq üçün əhvalatı açmadı. Onların sualına “daha bəsdir, evdə işim-gücüm tökülüb qalıb”, – deyə təmkinlə cavab verdi.

Onun atını gətirdilər. Bu neçə gündə arpa yeyib kökələn ət yüyənini çeynəyir, həndəvərinə hərlənən adamları dişləyib gəmirmək istəyirdi. Allahyar kəhərin qoltuqaltısını yoxladı, qarın qayışını çəkib bər-

kitdi. Sonra gümüş döşlüyünü sahmana saldı. Ayağını üzəngiyə qoyub, atın belinə qalxmazdan əvvəl mehtərin haqqını verdi.

At, sahibinin süvar olduğunu duyan kimi, başını dik tutub kişnədi. Allahyar üstü çadırlı furqon və arabalarla dolu karvansara həyətindəki atların, ulaqların arasından keçib küçəyə çıxdı.

O əvvəlcə heç yerdə dayanmamaq, atını dördnala çaparaq, bu kiçik qəza şəhərindən uzaqlaşmaq istədi. Amma dükançıların "axşam bazarıdır, ay müştəri, özünü yetir, yaxşı zəncəfil, darçın, mixək var. Əklə düyüsü, İrəvan qaysısı, könlün nə istəsə, tapılar", – deyə çağırdıqlarını eşidəndə tərkindəki boş xurcun yadına düşdü. Küçənin yanlarında qatarlaşan uca çinarların kölgəsi ilə atını astaca sürdü.

Kənarlarına iri, yastı daş döşənmiş küçənin hər iki tərəfi dükan idi. Səkilərin yaxası boyu balaca arx çəkilmişdi. Sular ağacların dibi ilə şırıldayıb axırdı. Çinarların başı qarğa yuvası ilə dolu idi. Baqqallar, xırdavatçılar və dükançılar nə qədər çalışsalar da, quşları qova bilmirdilər. Qarğalar höcətə düşmüş kimi budaqlara qonub qarıldaşır, bəzən hay-küylə uçub, yerə yapışmış kimi görünən birmərtəbəli şəhər evlərinin üstündə fırlanır, kirəmit damlara qonur, sonra yenə də yuvalarına toplaşırdılar. Dükançıların cəhdinə baxmayaraq, səkilər zibillənirdi. Onlar gündə üç dəfə dükanın qabağını sulayırdılar. Kimi özü xəkəndaz götürüb, kimi də dükanların qabağında boynunu büküb dayanan yetim uşaqlara bir-iki qəpik verib səkini suladırdı.

Allahyar küçəyə çıxanda dükançılar adətləri üzrə yenə səkiləri sulayırdılar. Balaca uşaqlar, dəlləklər, künclərdə dükan açmış yamaqçılar, çəkməsilənlər elə bir yarışa girmişdilər. Onlar bir-birini həvəsə gətirirmiş kimi "Ay başına dönüm, qoyma gəldi", – deyə qışqırır, tozu yatırmaq üçün yola da su çiləyirdilər.

Allahyar atdan düşdü. Kəhəri ağaca bağlayıb, xurcunu götürdü. Dükana yaxınlaşdı. Alverçilər onu – köhnə və tanış müştərini mehribanlıqla qarşıladılar. Allahyar beş-on girvənkə düyü, kişmiş, qaysı aldı. İki kəllə qənd götürdü. Çəkməçilərdən anasına bir cüt məst aldı. Xurcunun ağzını bağlayıb, yenə atın belinə qalxdı.

Artıq gün əyilmişdi. Ağacların kölgələri uzanıb çarpazlaşmış və küçəyə sərilmişdi. Tənəkəçi dükanlarının qabağındakı dəmir sobalar, qab-qacaqlar günün altında parıldayırdı. Ustalar çəkiclə tənəkələri döyəclədikcə danqıltı şəhəri başına götürür, dəmirçixanalardakı zindan səsini belə batırırdı.

Allahyar çilingər və qalayçıların yanından ötdü. Tanış nalbəndlə salamlaşıb, yoluna davam etdi. Tələsmək lazım idi. Bir azdan gün batacaq, axşam qaranlığı çöllərin üstünə çökəcəkdi.

O, atı mahmızladı. Şəhərin kənarındakı dəmir körpüyə yaxınlaşdı. Selləmə yağışlardan sonra yatağına sığmayan boz-bulanıq sulara, körpünün dirəklərini döyəcləyən hirsli çaya belə baxmadı. Atını dördnala çaparaq, şəhərdən uzaqlaşdı. O, qaranlıq qarışana qədər yolun qorxulu yerlərini keçmək və işıq gözünə özünü evlərinə çatdırmaq istəyirdi. At da sahibinin fikrini başa düşmüş kimi tələsir, az qala qanadlanıb uçurdu. Allahyar yenicə nallatdığı, ayağından qığılcım qopan atını gah xır yolla sürür, gah da sünbüllənmiş taxıl zəmilərinin arasındakı torpaq yola salırdı. O sakitləşə bilmirdi. Şəhərdə ləngidiyinə və bir həftədən bəri karvansarada qumara başı qarışdığına görə özünü danlayırdı. “Zəhrimara yaman şirnikmişdim. Gərək elə cümə ertəsi, əlim tutan günün səhərisi qayıdaydım. Evə tez dönsəydim, bəlkə də bu iş baş verməzdi”.

Allahyar Mələyin evdən baş götürüb getməsini heç cür ağlına sığışdıra bilmirdi. Axı o, Allahın dilsiz-ağızsız heyvanı idi. Neçə dəfə döyülüb-söyülmüş, hətta evdən də qovulmuşdu, ancaq heç cınqırını da çıxarmamışdı. Həyətdə bir küncə qısılaraq yatmış, səhər tezdən isə heç nə olmamış kimi qolunu çırmalayıb işə başlamışdı. İndi o birdənbirə hara gedə bilərdi? Bəlkə, acıq edib əmisinin yanına qaçıb? Daha geri qayıtmaq istəmir?

Sahibinin fikrə getdiyini duyan at yerişini yavaşıdıb yorğaladı. Ətrafa axşam sərinliyi çökmüşdü. Dağların dalında gizlənən günəşin son sarımtıl şüaları qərb tərəfdəki buludları çəhrayı rəngə boyamışdı. Silsilə təpələrin bəzi yerlərinə qatı kölgə çökür, bəzi yerləri isə hələ də günəşin şüaları altında qızılı rəngə çalırdı. Taxılların və bahar havasının təsiri ilə yaşıllaşan dəmyə çallarda, otların arasında gəzişən quşlar ağız-ağıza verib oxuyurdular. Gölməçələrdəki qurbağalar da səs-səsə vermişdilər.

Allahyar qucağında tutduğu zağlı tüfənginin tətiyindən barmağını çəkmirdi. Atın dırnağı altından parıltı ilə qalxan quşlar onu diksindirdikcə fikirdən ayılır, qamçını çəkib atı yenə səyirdirdi.

Mələyin əmisi evinə getməsi ehtimalı onu o qədər də həyəcanlandırmırdı. Əslinə baxsan, bu elə onun ürəyindən idi. Son günlər evdə kürlük etməsi, tez-tez dava-dalaş salıb Mələyi yamanlaması məhz bunun üçün deyildimi? O elə bu arvadı da bezikdirib evdən qovmaq istə-

mirdimi? Hətta əlaltından özünə yeni arvad axtarmırdımı? Bəs belə isə nə üçün təşvişə düşmüşdü?

Allahyar kəndə çatan kimi Mələyin əmisigilə adam göndərib, məsələni öyrənməyi qət etmişdi. Əgər çıxıb əmisigilə gedibsə, onda özündən küssün. Heç kəs ona minnət etməyəcəkdi. Əgər getməyibsə?! Elə məsələ də bunda idi. Allahyarı narahat edən də bu idi.

At döngələri buruldduqca qulaqlarını şəkləyib fınxırır, bəzən də tırıldayıb dayanırdı. Allahyar yoldan kənara çıxıb gizlənir, atın başını çəkib ətrafı dinləyirdi. Ala-toranda çökəklərdə adam olub-olmadığını yoxlayırdı. Ancaq axşam küləyinin dərə boyu otları yalaya-yalaya ötüb keçdiyini gördükdə ürəklənib atını mahmızlayırdı. O qorxurdu. Əgər şəhərdə namus ona güc verməsəydi, bəlkə də heç yola çıxmaz, gecə yenə qumar oynayar, səhər tezdən işıq gözünə, atın belinə qalxardı. Ancaq artıq gec idi. Birtəhər kəndə çatmaq lazımdı.

Allahyar ürəyindəki xofu dağıtmaq və dərələrin birində qarşısına çıxa biləcək qaçaq-quldurun yolunu kəsməsi ehtimalını unutmaq üçün yenə də Mələyi düşünməyə başladı. “Bəlkə özünü Kürə atıb? Axı son vaxtlar onun söyülüb, danlanmadığı gün olmurdu. Hər gün qapazlanırdı. Bəlkə elə canı boğazına yığılıbmış, indi də əlinə fürsət düşüb, özünü yarğandan atıb?”.

Allahyarın dodaqları qaçdı. Ürəyində, “əgər belə edibsə, lap ağılsız arvadmış”, – deyə düşündü və yüngülləşmiş kimi atını mahmızladı.

Qarşıdakı hündür təpənin üstündə üç-dörd qaraltı göründü. At yenə nədənsə fınxırıb qulaqlarını qırpdı. Allahyar tüfənginin qayışını qoluna dolayıb ətrafı dinlədi. Sol tərəfdə yolun altındakı dərədən axan suyun şırıltısı aydınca eşidilirdi. Qamışlıqda quruldayan qurbağalar tez-tez səslərini kəsib şappıltı ilə suya atılırdılar.

Allahyar ən çox qorxduğu yerə çatmışdı. Burada dərənin ətrafındakı təpələr ağız-ağıza gəlib daralırdı. Yol burulub çayın içindən keçir və sonra düzənliyə çıxırdı. Buranı salamat ötmək evə çatmağa bərabərdi. İndiyə qədər bu Acı dərədə çox adamın qanı axıdılmışdı.

Deyilənə görə, qarşıdakı dərədə bir gecədə yeddi qardaşı xəncərdən keçirib, yarğandan atıblar. Yaralılar səhərəcən “qardaş vay”, – deyə bir-birini çağırıb inildəmişdilər. Elə o vaxtdan buranın adı “Qardaş vay” dərəsi qalmışdır.

Allahyarın həmişə olduğu kimi, indi də bu dərəyə çatanda sümüyü eyməndi.

O, sol tərəfdəki təpədə də qaraltılar gördü. Özünü lap itirdi. Atın başını qanırıb dönmək və birbaş şəhərə qayıtmaq istədi. Ancaq gec idi. Çaxmağı yavaşca hərləyib gülləni lüləyə verdi. Atı xır yoldan torpaq yola saldı. "Allaha pənah", – deyə irəlilədi. Təpələrin ağız-ağıza qovuşduğu yerə çatanda gözünü yumub atın yalına yatdı. Kəhər götürüldü. Allahyar dərəni burulub çayı necə keçdiyini, dördnala çapıb düzənliyə nə vaxt çatdığını bilmədi. Bir xeyli qulağı səsdə, səksəkəli halda irəlilədi. Ancaq dalınca heç kəsin gəlmədiyini yəqin etdikdən sonra atı yavaşıtdı. Qanrılıb geri baxdı. Təpədəki qaraltılar daha aydın görünürdü. Allahyar yalnız indi, qorxduğu yerdən dörd-beş verst aralandıqdan sonra məsələni başa düşdü. Təpələrdəki qaraltıların çox qədim zamanlarda salınmış qəbristanlıqdakı başdaşıları olduğunu görüb, nəfəsini dərdi. Dəsmalını çıxardıb alnını basmış soyuq təri sildi.

Artıq kəndin işıqları görünürdü. Deyəsən kəhər də sakitləşmişdi. Bayaqdan balaca bir qaraltı görəndə fınxırıb dayanırdısa, indi gözləri yana-yana yolu o üz-bu üzə keçən tülkülərə belə əhəmiyyət vermədən irəliləyirdi.

Təpələrin dalından ay boylandı. Ətrafa solğun ay çiləndi. Uzaqda şaxələnib axan Kürün suları ağarışdı. İlbizlər səs-səsə verdilər. Allahyar kənd itlərinin boğuq səsini eşidib ürəkləndi. Əlini atın boynuna çəkdi. Kəhər suyun içində idi. "Bir az da belə sürsəm, atı çatladardım", – deyə düşündü və cilovu dartdı...

O, darvazaya yaxınlaşanda itlər hürüşürdülər. Bir az bundan əvvəl kəndin aşağısında səs-küy qalxanda oyanıb yol gözləyən nökər gələnin kim olduğunu bilib qapını açdı. İtlər sahiblərini tanıyıb atın ətrafında atılıb-düşdülər, sonra da Allahyara şırvandılar.

O sakitcə atdan endi. Tüfəngin çaxmağını hərləyib gülləni lülədən çıxartdı. Atın tərkinə bağladığı xurcunu götürdü. Onun hərəkətlərinə göz qoyan nökərə üzünü belə çevirmədən:

– Atın yəhərini al, həyətdə bir az gəzdir, – dedi, – tərlidir.

O heç bir şey olmamış kimi ağır addımlarla pilləkəni qalxıb göy məhəccərli eyvana çıxdı. Neçə gündən bəri əli qoynunda, səksəkəli qalan anasına "xoş gördük" – deyib içəri keçdi. Arvad oğluna nə cavab verəcəyini düşünə-düşünə onun ardınca getdi. Allahyar xurcunu taxtın üstünə atdı. Tüfəngi yuxarıda, buxarının yanında, divara söykəyib qoltuqaltısını çıxartdı. Anasının kömək etməsinə razılıq verməyib, uzun-

boğaz çəkmələrini özü soyunmalı oldu. O, sağ ayağındakı dar xrom çəkməsinin dabanını sol çəkməsinin burnuna dayayıb dartdı və heç nədən xəbəri yoxmuş kimi gözünü otaqda gəzdirib:

– Mələk hanı? Çağır gəlib çəkmələrimi çıxartsın, – dedi.

Arvad dinmədi. Gözləri oğlunun üzünə zilləndi. Deyəsən, gədənin heç nədən xəbəri yoxdur. İndi mən nə edim? Başıma haranın daşını salım? – deyə öz-özünə söyləndi. – Bəlkə heç açıb-ağartmayım? Qoy rahat yatsın, sabah onsuz da eşidəcək. Bir də, axşamın xeyrindən sabahın şəri yaxşıdır.

– Nə bilim, yenə hansı cəhənnəmdəsə yıxılıb yatır. Qoy özüm soyundurum.

Allahyar razı olmadı. Birtəhər çəkmələrini çıxartdı. Yuxarı başa keçib, mütəkkəyə dirsəkləndi.

– Aclığın varmı, dərdin alım? Ürəyin nə istəyir, gətirim.

– Heç nə lazım deyil. Bəs gəlin hanı?

– Dedim ki, bilmirəm.

– Neçə gündü yoxa çıxıb?

Arvad ancaq indi məsələni başa düşdü. Demək, oğlu hər şeyi bilirmiş. Bəlkə elə ona görə də gecə ikən atı çapıb kəndə qayıdıb.

– Elə sən gedəndən.

– İzi-tozu qalmayıb?

– Nə bilim, ay bala, axşamüstü səhəngi götürüb suya getdi. Qaranlıq qarışdı, gəlmədi. Mal-qara örüşdən qayıtdı, əl-ayaq yığışdı, heyvanları rahatlayıb, itlərə yal verdim, yenə qayıtmadı. O gecə səhərəcən eşiyə çıxıb, içəri girməkdən yoruldum. Yolu qara gəlmiş cımbata çəkildi. Heç gördüm deyən olmadı. Obaşdan gədəni Kürün qırağına göndərdim. Səhəngi tapıb gətirdi.

Aralığa sükut çökdü. Hardasa lap yaxında, deyəsən buxarının yanında, divardakı yarıqlardan birində gizlənmiş qarafatma kəsik-kəsik oxumağa başladı. Bu hüznlü səs otağı başına götürdü. Allahyar öləziməkdə olan lampaya baxıb daha da darıxdı.

– Bəlkə, atasının dağılmışına qaçıb?

– Nə bilim vallah, adamın gümanı hər yerə gəlir. Sən də ki, evin tikilsin, getdiyin yerdən qayıtmaq bilmirsən. Qalmışam evdə tək. Qonum-qonşuya da çıxa bilmirəm. Açıb-ağardılası dərddimi ki, deyəsən! – Arvad oğlunun bərk tutulduğunu görüb sözünü dəyişdi.

– Elə sən deyən olacaq. Yıxıl yat. Sabah öyrənərsən.

Anası ona yer saldı. Allahyar özünü sakit göstərməyə çalışsa da, səhərə qədər yata bilmədi. Gözünü qaranlıqda tavana zilləyib dayandı. Başının altındakı yastıqdan Allahyara tanış bir qoxu gəlirdi. O, Mələyin sinəsindən və saçından gələn mixək iyinə bənzər rayihəni hələ də unuda bilmirdi. Əslinə baxsan, Allahyarı əvvəlki arvadlardan Mələyə daha çox bağlayan qızın bədəninin ətri idi. Ənlik-kirşan çəkməyən, üstünə gül suyu çiləməyən bu gəlinin bədənində onu ən ağır dəqiqələrdə belə məst edən, xoş bir qoxu vardı.

Mələyin ətri yorğan-döşəyə hopmuşdu. Allahyar əvvəllər buna o qədər fikir verməmişdi. Amma indi, arvadının xəbərsiz-ətərsiz yoxa çıxdığı bir vaxtda, yastığa çökmüş tanış və bir qədər də doğma bir insanın ətri ona rahatlıq vermirdi. Allahyara elə gəlirdi ki, Mələk onun yanındadır. Yanaşı uzanıbdır. Arvadının saçı onun üzünə toxunur.

İnsan çox zaman qiymətli bir şeyi əldən verəndən, onun qədrini bilməyib itirəndən sonra ayılır. Hər gün görsə də, qəlbinin duymadığı, nəfəsinin ətrini hiss etmədiyi bir adam ondan uzaqlaşandan sonra, qəlbindəki boşluğu görür və gecə-gündüz xiffət çəkir. İndi Allahyar da belə idi. O, ömründə ilk dəfə doğma bir adamın yoxluğunu duyurdu. Əgər bu saat Mələk yanında olsa, onunla bir yastığa baş qoysa, nə gözəl olardı! Allahyar onun saçını sığallayıb, sinəsini qoxulamazdımı? Səhər şəfəqləri pəncərə şüşələrində oynayana qədər onun mışıltısına qulaq asmazdımı?!

Allahyar yerin içində çevrilir, öz-özünü tanıya bilmirdi. Ona nə olmuşdu? İndiyə qədər qəlbinə yad olan bu hisslər hardan gəlib çıxmışdı? Nə üçün o titrəyirdi? Məgər Mələyi azmı döymüşdü? Onun gözünün yaşını azmı axıtmışdı? Azmı onun sinəsini yumruqlamışdı? Bəs indiyəcən onun ətrini niyə duymamışdı? Hələ şəhərdən arvadının yoxa çıxması xəbərini eşidəndə dişini-dişinə sıxıb söyüş söyən, "əlimə keçən kimi səni tikə-tikə doğrayacağam", – deyən o deyildimi? Elə bircə saat bundan əvvəl yol uzunu onu asıb-kəsmirdimi? İndi birdənbirə ona nə oldu? Yoxsa Mələyi sevirdi? Yoxsa indiyəcən qəlbinin harasındasa mürgüləyib yatan hisslər çılğın bir ehtirasla oyanıb baş qaldırmışdı?

Allahyar heç nə anlamırdı. Gözünü tavana zilləyib xəyalən arvadını axtarırdı. Gah onu sağ-salamat tapıb gətirir, gah da çiləkənlərin altından, burulğanlardan dartıb çıxardırdı.

Ətraf səssiz idi. Onun qulaqları güyüldəyirdi. Arabir buxarının yanındakı qarafatmaların cırıltısı eşidilirdi.

* * *

Allahyar səhər tezdən, nökəri yola salandan sonra, atı minib Kürün sahilinə endi. Yarğanların dibini, çiləkənlərin ətrafını, yulğun kolluğunu saymazyana axtardı. Atını sürüb çay aşağı uzaqlara getdi. Balaca adacıqları, suyun şıldır yerində qurulayan qaraltıları nəzərdən keçirdi. Tez-tez atının başını saxlayıb, göyün üzündə fırlanan quşlara baxdı. Qarğa-quzğunun bir yerə toplanıb-toplanmadığını yoxladı. O hələ heç kəsə heç nə açmaq istəmirdi. Bəzən öz-özünü danlayır, nahaq bu fikrə düşdüyünə söylənirdi. O, arvadının ölümünə inanmırdı. Axşamüstü nökərin geri qayıdacağını və Mələyin əmisigildə olduğu xəbərini gətirəcəyini gözləyirdi. “Yaxşı, bəs niyə belə xəlvəti gedib! Nə üçün anama bir şey deməyib? Əgər gedibsə, bəs niyə evinə qayıtmır?”. Şübhələr yavaş-yavaş onun qəlbinə hakim olurdu. “Yəqin başı əlində deyil. Yoxsa bir xəbər çıxardı. Bəlkə heç özünü suya atmayıb? Birdən ayağı sürüşüb? Axı o üzmək bilmirdi. Axmış olsa bir yerdə qurulamazdımı?”

Allahyar atını sürür, o tərəf-bu tərəfə boylanırdı. Suda çimib, qumluqda eşələnən uşaqların yanında bəzən ayaq saxlayıb, onları dilləndirirdi. Uşaqlar axan meyit görsəydilər, dərhal deyərdilər.

Allahyar axşama qədər bəri üzü axtarmağı qərara aldı. “Əgər nökər əliboş qayıtsa, sabah o biri sahili də gəzərəm”, – deyə düşündü. Günün qulağı əyilib axşama dönəndə Allahyar geri qayıtdı. Birdən yulğunluqların o tərəfində, yarğanın dibində, qarğa-quzğun dolaşdığını gördü. Ürəyi az qaldı ki, oynayıb yerindən qopsun. Rəngi saraldı. Atını mahmızlayıb Kürdən ayrılan balaca qoldan keçdi. Yulğun kollarını yara-yara quşların fırlandığı yerə yaxınlaşdı. Qarğalar onu görüb kənara qaçdılar. İri bir quzğun isə özünü suya çırpır, yenə də havaya qalxırdı. Allahyar atdan düşdü. Ürəyi əsə-əsə gölməçəyə yaxınlaşdı. Orada nə isə qaralırdı. Quşlar dimdiklədikcə çırpınıb, suyu şappıldadırdı. Allahyar iri bir naqqanın quruladığını görüb sakitləşdi. Görünür, su daşanda balaca qola gəlib bu gölməçəyə düşən naqqa geri qayıda bilməmişdi. Quşlar onun belini didib parçalamışdılar.

Allahyar atını minib uzaqlaşdı. Qarğa-quzğun yenidən balığın üstünə töküldü...

O, nökərlə bir vaxtda evə çatdı. Eşitdiyi xəbərdən məyus oldu. Dinməz-söyləməz içəri keçib üzüqoylu taxtın üstə döşəndi.

* * *

Üç gündən sonra Kürün lap aşağısında, binələrin bərabərində, bir qadın meyitinin qurulaması xəbəri kəndə yayıldı. Deyilənə görə, malı sulamağa aparan uşaqlar heyvanların böyrüşüb geri qaçdığını görmüş və hürküşən mallardan qabaq özləri təngnəfəs halda binəyə qaçmışdılar. Onların söylədiklərinə qulaq asan qocalardan bir neçəsi sahilə gəlmiş və köpüklü suyun kənarında uzanan meyitə baxmışdılar. Ləpələr cəsədi kənara atmışdı. Suda çox qaldığından qaralan və şişən meyit tanınmaz hala düşmüşdü. Əynindəki paltardan nişanə qalmamışdı. Sualtı daşlar baş-gözünü əzmişdi. Qadının ayaqları hələ də suda idi. Ləpələr onu tərpətdikcə cəsəd yırğalanırdı.

Qocalar bu kimsəsiz meyiti kənara çəkmiş, elə oradaca, qumun içinə basdırmışdılar. "Bir gün sahibi gəlib çıxar", – deyə arxayınca evlərinə dağılışmışdılar.

Bu xəbər şenliyə yayılan kimi pıçıldaşmalar başladı. Allahyar nə qədər çalışsa da sirr açılmış, Mələyin yoxa çıxması hamıya məlum olmuşdu. Əlində çatı, buzovu mala qatan arvadlar bir-birini görən kimi xosunlaşırdılar.

– Mələyin başına gələni eşidibsənmi?

– Eşitmişəm. Deyirlər yazıq özünü yarğandan atıb.

– Heç ağlım kəsmir.

– Bəs nə olar?

– Kim bilir?

– Yəni deyirsən...

– Olar, olar. Elə kişidən hər nə desən çıxar.

– Allah, sən saxla, hələ çox şey görəcəkmişik.

– Yazığın heç kimi yoxdur.

– Elə həmişə yetimin başı qapazlı olar.

– Barı meyitini gətirib basdıraydılar.

Çay kənarında, qaynar başında da bu cür söhbətlər olurdu. Bu xəbər şenliyə yayılan günün axşamı kəndin ağsaqqallarından biri Allahyarı kənara çəkib danladı:

– Ay bala, namusu itə atıblar, it yeməyib, bəs sənin qeyrətin hanı? Niyə gedib arvadını axtarmırsan?

– Gəzmədiyim yer qalmayıb, – deyə Allahyar sakitcə dilləndi.

– Deyilənə görə, aşağılarda bir meyit tapılıb. Get yoxla, bəlkə elə sənin arvadındır.

Allahyar ertəsi günü tezdən binələrə yola düşdü. Qocalar cəsədi basdırdıqları yeri ona nişan verdilər. Allahyar qumu qazdı. Meyit indi daha da tanınmaz olmuşdu.

Yarım saata qədər cəsədi diqqətlə nəzərdən keçirən Allahyar arvadına oxşar bir nişanə tapa bilmədi. Nə əynindəki paltar paltara, nə də cəsəd insana bənzəyirdi. Amma boy-buxununa uyğun gəlirdi: görünür, qadın həm cavan, həm də ətli-əndamlı imiş. Nəhayət, onun barmağındakı üzük Allahyarı çaşdırdı. O, cəsədi aparmağı qərara aldı.

Allahyar evə çatıb meyiti gətirmək üçün araba sazladığı vaxt doqqazda bir atlı onu çağırdı. Onlar yarım saata qədər xısın-xısın söhbət etdilər. Atlı içəri keçmədi. Allahyar tələsik geri qayıtdı. Arabanı qoşan nökərə: "Heç nə lazım deyil, öküzləri aç, arabanı da yerinə çək. Tez ol, atı yəhərlə", – dedi. Özü isə evə keçib, tüfəngini və qoltuqaltısını götürdü. Atın belinə qalxdı. Sual dolu gözlərini onun üzünə dikən anasına heç nə demədi.

Atlılar kənddən uzaqlaşdılar. Allahyarın dodaqları astadan tərpənir, titrək barmaqları tüfəngin tətiyində oynayırdı.

## 7

Əlləri qoynunda, eyvanın dirəyinə söykənib selləmə bahar yağışına tamaşa edən Salatını fikir götürmüşdü. Şamxal evə qayıtmamışdı. Onun hara getdiyini dəqiq bilən yox idi. Atasının qorxusundan, bir də söz-söhbətdən xoşu gəlib ara qızışdıran arvadların üzünü görmək istəmədiyindən evdən eşiyə çıxmamışdı. Anası da o gündən bəri ağzı üstə döşənib qalmışdı. Ev suyu soğulmuş dəyirmana dönmüşdü.

Cahandar ağa ailəsini o taya, meşəyə, binəyə göndərmək istəmişdisə də, Zərnigar xanım: "Bircə onu görməyəcəksən, – deyə kişisinə cavab vermişdi. – Bizi başından eləyib, yerini xəlvətləmək istəyirsən, bacarmayacaqsan!"

Kişi hirsindən boğulsa da, heç nə deməmiş, dinməz-söyləməz çıxıb getmişdi. Salatın duyurdu ki, atası əziyyət çəkir, tutduğu işə peşmandır. Ancaq tüpürdüyünü yalaya bilmir.

Mələk də çıxılmaz vəziyyətdə qalmışdı. Dava-dalaşın səhərisi günü Zərnigar xanımın yanına getmişdi. Salatın onun qorxa-qorxa, ölümə gedən adamlar kimi, ayağını sürüyə-sürüyə necə içəri girdiyini unuda bilmirdi.

Mələyin bədəni əsirdi. Elə bil qızdırmadan yenicə durmuşdu. Salatın onların yenidən dalaşa biləcəklərindən ehtiyatlandı və Mələyin arxasınca sakitcə içəri girdi. Zərnigar xanım günüsünü görən kimi yerindən dik atıldı və naqafil üstü alınmış pələng kimi hücuma hazırlaşdı. Gəlin onun burun pərələrinin genişləndiyini, sinəsinin qalxıb-endiyini, gözlərinin oynadığını görsə də dinmədi, bir-iki addım irəli gəlib sakitcə arvadın qabağında dayandı. Otağa sükut çökdü. Salatın anasının fısıltısını aydınca eşitdi.

– Başını yuxarı qaldır!

– ...

– Sənnən deyiləm?!

– ...

– Ay həyasız, yoxsa utanırsan, gözümün içinə baxa bilmirsən?!

Mələk sinəsinə enmiş başını qaldırıb Zərnigar xanımın üzünə baxdı. Bir xeyli beləcə dayandılar. Salatın gördü ki, anası gözləri ilə gəlini yemək istəyir. Onun yanaqlarına, qaşlarına, hələ iz düşməmiş alnına, azca aralanmış dodaqları arasından parıldayan dişlərinə, genişlənmiş bəbəklərinə, qonur gözlərinin həlqəsində parıldayan yaşına, hirsini və daxildən qopub gələn hönkürtüsünü boğub göz yaşını saxlamaq istədikcə kənarı səyriyən dodağına, əzələləri büzüşən çənəsinin zənəxdanına hərisliklə baxır. Arvad elə bil onun sifətindəki hər bir cizgini yadında saxlamağa çalışır, gəlinin ürəyindən keçənləri göz bəbəyindən oxumaq istəyirdi.

Salatın anasının ani olaraq köks ötürdüyünü, qollarını yanına salıb dayandığını və beləliklə də Mələyin daha gözəl, daha cazibədar olduğunu dərk etdiyini duydu. Arvad sanki təslim oldu: hirsindənmi, acizliyini dərk etdiyindənmi, nədənsə, geri döndü və birdən gözü bədənnüma güzgüyə sataşdı. Mələk ona baxırdı. Onlar qarşı-qarşıya dayanmışdılar.

Zərnigar xanımın gözləri güzgüdə oynadı. Gah özünə, gah da Mələyə baxdı. Saçlarına dən düşdüyünü yenicə görürmüş kimi donub qaldı. Yalnız bir an, bircə an fikrə getdi. Zil qara, qıvrım saçlı Mələyin məzlum görkəmi onu daha da hirsləndirdi. Salatın anasının titrədiyini və birdən geri dönüb gəlini şillələdiyini gördü. Özünü irəli atmaq istədisə də bacarmadı. Anası onu döşündən geri itələdi. Elə Mələk də mane oldu. Astadan "işin yoxdur", – deyə pıçıldadı. Kirpiklərində titrəyən yaş yuvarlanıb, yanaqlarından süzülsə də, səsini çıxartmadı. Dodaqlarını dişləyib, hıçqırığını boğdu. Özünü şax tutdu. Zərnigar xa-

nım daha da hirsləndi. Gəlinin üzünə, gözünə döyəclədi. Saçlarını dartışdırdı. Çəkib donunun yaxasını cırdı. İtələyib yıxmaq istədi. Mələk tərpənmədi. Onun yorulub dayanmasını gözlədi. Zərnigar xanım əlləri ağrıyıncaya qədər onu döydü və birdən kökündən kəsilmiş ot kimi taxtın üstünə çökdü. Mələk də bunu gözləyirmiş kimi onun qarşısında dizi üstə düşüb başını Zərnigar xanımın sinəsində gizlətməyə çalışdı. Arvad əvvəlcə onu itələyib özündən uzaqlaşdırmaq istədi. Ancaq, nədənsə, dayandı. Salatın anasının öz günüsünün başını sinəsinə sıxıb hönkürtü ilə ağladığını gördü. Yalnız bu vaxt Mələk bayaqdan güclə saxladığı göz yaşını axıtmağa başladı. Onlar ağır fəlakətə düşmüş və dar gündə rastlaşıb, bir-birinə həyan olan doğma adamlar kimi qucaqlaşıb hönkürüşdülər.

Salatın da onlara qoşuldu...

Neçə gündən bəri sinəsini sıxıb, nəfəsini kəsən ağrılardan can qurtarıb yüngülləşən Mələk, nəhayət, başını yuxarı qaldırdı. Onun yanaqları islanmışdı. Pırpızlanmış saçından ayrılan qıvrım telinin bir qismi üzünə yapışmışdı. Kirpikləri yaş idi. O, əlini üzünə çəkib saçını geri elədi. Qızarmış gözünü Zərnigar xanıma zillədi. Körpə uşaq kimi hıçqırdı.

– Məni öldür, ancaq evdən qovma.

– ...

– Çevir balalarıyın başına, ömürlük qaravaşın ollam.

Zərnigar xanım heç nə demədi. Mələyin döşündən itələyib astaca özündən uzaqlaşdırdı.

– Çıx get, öz dərdim özümə bəsdir.

– Məndə nə taxsır var?

– Rədd ol, dedim sənə!

Mələk gəldiyi kimi də sakitcə qapıya yaxınlaşdı. Astanada qanrılıb çiyni üstündən Zərnigar xanıma baxdı. Arvad büzüşüb oturmuşdu. Onun məlul-müşkül görkəmi qurğuşun siqlətli daşları da əridərdi. Görünür Mələk buna dözmədi. Geri döndü. Qollarını açıb arvadın üstünə yeridi. Onu qucaqlayıb, əllərini öpməyə başladı.

– Kaş öləydim, səni dərdə salmayaydım...

Mələk gedəndən sonra Zərnigar xanım taxtın üstünə döşəndi. Hönkür-hönkür ağladı. Anasının yanını kəsdirən Salatın nə qədər çalışdısa da, onu ovundura bilmədi. O, başa düşə bilmirdi ki, Zərnigar xanımı bu saat sakitləşdirmək mümkün deyil. Arvad özünün itirilmiş gəncliyinə, gəlinkən saçlarına dən düşüb, eşqindən yarımadığına ağlayırdı. O nə qədər çalışsa da, ərini bir daha özünə ram edib, geri qaytara

bilməyəcəyini başa düşdüyündən, qovrulub yanırdı. Zərnigar xanım kişi üçün lazım olan gənclik təravətini itirdiyini böyük dəhşət hissi ilə dərk edirdi. Mələyin hər cəhətdən ondan üstün olduğunu, ərinin onun qoynundan çıxmayacağını, özününsə bu evə elə-belə, el üzünə, arvad olacağını duyurdu. Qəzəblənsə də, hirsindən ev-eşiyi bir-birinə qatmaq istəsə də olmur, qəlbinin dərinliyindən sanki bir səs baş qaldırıb ona "sakit ol, özünü yorma, atılan daş geri qayıtmaz" – deyirdi. Qocalıq öz kölgəsini onun üstünə salır, arvadın varlığını sıxırdı...

Salatın bu hadisədən sonra anasının qəlbindən keçənləri bilməsə də, onun sakitləşməsinə sevindi. Elə Mələyin də hərəkətlərindən xoşu gəldi. Deyəsən, arvadların susması Cahandar ağanın da qaşqabağını açmışdı. Daha o, evdə kabus kimi gəzmirdi.

Anası bir az dincələndən sonra Salatın qardaşını düşündü. Onun evə qayıdacağını gözlədi. Ancaq aradan iki gün keçdi. Şamxal qayıtmadı. Qız xəyallandı. Ağlına cürbəcür şeylər gəldi. Sıldırım yarğanlar, çiləkənli, burulğanlı sular, nərildəyib dəli Kürün şaxələnmiş qolları gözünün önündən keçdi. Diksinib fikirdən ayıldı. "Ağlıma gələn dağlara, daşlara, mən nə fikirləşirəm? Allah, mənə ölüm ver, gör necə sarsaq xəyallara düşürəm", – deyə özünə qarğış etdi. Evdə darıxdı. Elə bil onu qara basdı, qorxulu fikirlərdən yaxasını qurtarmaq üçün eyvana çıxdı.

Kəndin üst tərəfindəki təpələri qara bulud bürümüşdü. Üfüqdəki dağları, bir də bəridəki taxıl zəmilərini, döşlərdəki təkəm-seyrək ağacları görmək mümkün deyildi. Ətəyini sallayan duman yavaş-yavaş aşağı enirdi. Dalbadal şimşək çaxırdı. Elə bil göyün səthi çatlayıb aralanmışdı. Səmada göz qamaşdıran əyri-üyrü işıqlar oynayırdı.

Buludlar birdən-birə istiqamətini dəyişib kəndin üstünə yeridi. Tozanaqlı külək sahillə kənd arasındakı çəmən otlarının telinə daraq çəkib bəriyə doğru gəldi, qapı-bacalardakı toz-torpağı, ot qırıntılarını süpürüb apardı. O tayda sahilboyu uzanıb gedən qovaq ağaclarının yarpaqları tərpəndi. Yaşıl don geyinmiş meşənin üstünə elə bil birdənbirə qırov düşdü. Yarpaqların astarı göründü. Yulğun kolları uğuldadı. Yağış havasını duyan toyuqlar qaçıb talvarın altına doluşdular.

Göy inildəyib şaqqıldadı. Selləmə yağış başladı. Suyun üzü atılıbdüşdü. Elə bil Kürü daşa basdılar. Xırdaca ləpələr qırçınlaşıb sahilə axışdı. Kəndin üstündən keçən dolu suları döyəclədi...

Gurultu ilə başlayan yağış tez də ötüb keçdi. Səma yaralı nəhəng kimi bir neçə dəfə nərildəyib susdu.

Uşaqlar şalvarlarını çırmalayıb həyətə qaçışdılar. Gölməçələri yarıb, yalın ayaqlarını şappıldada-şappıldada bir-birilərini qovdular. Təpələrin o üzündən qalxan göy qurşağı ətəyini sallayıb kəndi qucaqladı.

Salatın bir az bundan əvvəlki ağır düşüncələrini unutdu. Onun dərdi də bahar yağışı kimi ötüb keçdi. Gözünü Kürün sahilinə enən cığıra zillədi. Suya gedən Güləsəri gördü. Talvarın altına yüyürüb, səhəngi götürdü və kəsə yolla Güləsərin dalınca yollandı. Otların şehi onun donunun ətəyini islatdısa da, fikir vermədi. Özünü qıza yetirməyə çalışdı. Güləsər isə xəbərsiz halda, sürüşüb yıxılacağından ehtiyat edərək, asta-asta enişdən enirdi. Yağışın yenicə yuyub islatdığı cığırda onun yalın ayağının ləpiri qalırdı.

Salatın addımlarını yeyinlətdi. Arxasındakı hənirtini duyan Güləsər qanrılıb baxdı. Onlar bir-birilərinə yaxınlaşdılar. Bir müddət heç biri dinmədi. Yanaşı dayandılar. Güləsərin yanaqları qızarmışdı. Salatın onun sorğu-suala başlayacağından ehtiyat edərək susdu. Hər ikisi dinməz-söyləməz yola düşdü. Salatın qabaqda gedirdi. Güləsər onun hörüklərinə, atlas koftasına, topuğuna enən qırçınlı ipək donuna diqqətlə baxdı. Bu gözəl paltarın ətəyi şehə və palçığa bulanmışdı. Güləsərin heyfi gəldi. Əgər onun belə paltarı olsa, boğçaya büküb saxlayar, gündəliyə geyinib bu kökə salmazdı.

Suvadağa çatanda yenə dayandılar. Su yolu sürüşkənləşmişdi. Güləsər qabağa keçdi.

– Qoy, mən düşüm, sənin də səhəngini doldurum.

– Yox, yox, özüm enərəm.

– Sürüşərsən.

– Eybi yoxdur, çəkməmi soyunaram.

– Hazır mən ayağı yalınam.

Salatın Güləsərin dərisi qaralmış balaca ayağına baxdı. Barmaqlarının arasına palçıq dolmuşdu. Xınası solmuş dırnaqları lilə batmışdı.

– Ayaqqabın yoxdurmu?

– Var. Palçıqdır deyən, geyinməmişəm.

Salatın sualının yersiz olduğunu başa düşüb xəcalət çəkdi. Güləsər aşağı endi. Kürün suyu bulanıb köpüklənmişdi. Ləpələr şıltaqlıqla atılıb-düşür, yarğanın sarı torpağını yalayırdı.

Güləsər əvvəlcə öz səhəngini suya basdı. Su poqquldadı. Səhəng ağırlaşıb aşağı batdı. Güləsər onu dartıb sudan çıxartdı və Suvadağın qaşında dayanan Salatına verdi. İkinci səhəngi də doldurandan sonra kənara çıxmaq istədi. Salatın aşağı əyilib əlini uzatdı:

– Biləyimdən yapış.

Güləsər onun köməyi ilə yuxarı çıxdı. Belini düzəldib nəfəsini dərdi. Sonra da səhənglərin palçığını silib, tıxacları taxdı. Salatına kömək elədi. Özü isə səhəngini dalına alıb, çatı ilə sarıdı. Cahandar ağanın evinin bərabərinə çatanda Güləsər sükutu pozdu:

– Heç görünmürsən?

– Özün başımıza gələni bilirsən ki?!

– Hə, eşitdim. Kişi yaman pis iş tutub.

– Tutduğu iş cəhənnəmə, qağam evdən didərgin düşüb.

Güləsər dinmədi. Qardaşı Çərkəzin sözlərini yadına salıb susdu. Xeyli sonra özünü bilməməzliyə vurub soruşdu:

– Haradadır ki?

– Nə bilim, – deyə Salatın doluxsunub cavab verdi. – Tərsin biri dir, yaman qorxuram...

– Heç nə olmaz, – deyə Güləsər onun sözünü kəsdi, – balaca ha deyil.

Salatın qanrılıb qızın üzünə baxdı. Güləsərin gözləri gülürdü. O, sözlü adama oxşayırdı.

– Deyəsən səndə xəbər var.

– Nə xəbər?

– Qağamı görübsənmi?

– Bıy, ay Salatın, mən onu hardan görərəm?

– Bəlkə Çərkəzin yanına gəlib?

Qız susdu.

– Səni and verirəm o qardaşın Çərkəzin canına, düzünü de, qağam sizdədimi? Niyə dinmirsən? Sənə nə oldu? Niyə qızardın?

– Heç, – deyə Güləsər silkələndi və qabağa keçdi.

Onlar yolayrıcıda dayandılar. Salatın gözünü Güləsərin üzünə zillədi.

– Heç kəsə deməzsən ki?

– Qağamın canı üçün yox.

– Dünən bizdəydi. Ancaq ağzından qaçırma ha. Mənə özləri tapşırıb, bircə sənə deyirəm.

– Arxayın ol. Sən Alllah, ona yaxşı bax. Bəlkə axşam qaranlıq qarışanda oğurlanıb xəlvəti sizə gəldim.

– Gəl, gözləyəcəyəm.

Güləsər ondan aralanıb evlərinə doğru yollandı. Salatın qızın dalınca xeyli baxıb köksünü ötürdü. Səhəngi çiynində rahatlayıb qolunu qulpuna keçirdi. Dönüb evlərinə sarı addımladı. O sevinirdi. Anasının bir az sakitləşdiyinə, qardaşının yerini bildiyinə görə az qalırdı ki, uşaq

kimi atılıb düşsün. O bu saat anasının yanına qaçacaq, Şamxalın heç yana getmədiyini, kənddə olduğunu ona xəbər verəcəkdi. Anası da sevinəcəkdi. Bəs sonra? Eh, sonrası Allah kərimdir.

Salatın xırmana yaxınlaşdı. Nə isə bir şey arı kimi vızıldayıb havada süzdü. Birdən elə bil onu daldan itələdilər. Çiynindəki səhəng ağırlaşdı. Qız nə qədər çalışdısa da müvazinətini saxlaya bilmədi. Təngildəyib qabağa yeridi. Ağzı üstə palçığa yıxıldı. Səhəng onun çiynindən düşüb üç-dörd addım qabağa dığırlandı. Qız qolunun siyrilmiş yerindən axan qana fikir vermədən durub səhəngi götürmək istədi. Gözünə inanmadı. Səhəng deşilmişdi. Su fışqırıb axırdı.

Salatın özünə gəlməmiş Güləsərin təlaşlı səsi eşidildi:

– Allah, mənə ölüm ver, Allah mənə ölüm ver. Ay qız, Salatın, bu nə idi?

O, dalındakı səhəngi yerə qoydu. Qızın qolundan tutub qaldırdı. Salatın ətrafına boylanıb çiynini çəkdi.

– Heç özüm də bilmirəm, niyə yıxıldım.

Güləsər kənara düşmüş səhəngə baxdı. Fikirli-fikirli başını buladı. Qızın qolundan tutub yaşlı qadınlar kimi ürək verdi.

– Allaha şükür, yaxşı qurtarıbsan.

– Nə olub ki?

– Görmürsən səhəngə güllə dəyib?

– Elə şey olmaz.

– Qağayın canı üçün düz sözümdür. Bircə bax, səhəngin ortası necə deşilib. Yəqin hansı ciyəri yanmışınsa çovutma gülləsi dəyib.

Nökərlər tökülüşüb gəldilər. Güllə səsi eşidən Cahandar ağa tüfəngi götürüb samanlığın üstünə çıxdı. Gözünü o taya, meşəyə zillədi.

Güləsər Salatını yıxıldığı yerdən qaldırandan sonra belini düzəldib sahilə baxdı. O tayda bir atlının meşəyə girərək, kolların arasında gözdən itdiyini gördü.

Cahandar üzünə qaldırdığı tüfəngini aşağı saldı.

## 8

Gəmiçi Qoca ağır-ağır yoxuşu qalxırdı. Əlindəki söyüd çubuğuna keçirdiyi balıqların pulları parıldayır və quyruqları açıq-çəhrayı rəngə çalırdı. Kişi yorulmuşdu. Tez-tez dayanıb nəfəsini dərir, çiynindəki islaq kəndirləri silkələyib kürəyinin ortasına atırdı. O, möhkəm

islanmışdı. Dizi yamaqlı şalvarı, arxalığının altından görünən boynu, qara sapla işlənmiş kirli alt köynəyi belə yaş idi. Çarıqlarını və iplik corabını soyunub əlinə almışdı. Gecəli-gündüzlü suda qaldığından ağap-paq olan dabanını və codlaşmış ayaq barmaqlarını qızmış tozlu torpağa basdıqca, bədəninə istilik yayılırdı. O, iri, saçaqlı papağını boynunun dalına itələmişdi. Qırxıq başından buğ qalxırdı. Sinəsinə düşən ağ saqqalının pərakəndə tüklərini səhər küləyi oynadırdı.

Kişi dayanıb nəfəsini dərdi. Bir xeyli Kürdə çimişən uşaqlara, yulğunluğa doluşan mal-qaraya baxdı. Öküzünün burada olub-olmadığını yoxladı. Sonra yenə yoluna davam etdi. Dikdirin qaşına çatanda bir dəstə uşaqla qarşılaşdı. Onların əllərində balaca qarmaqlar var idi.

Uşaqlar Qoca kişini araya aldılar. Hərisliklə onun əlindəki balıqlara baxdılar. Gözləri parıldayan balıqların içində hələ də nəfəs alanları var idi.

– Qoca dayı, bunları hardan tutmusan, yerini bizə də de!

– Demirəm.

– Niyə ki?

– Xeyri yoxdur.

– Nəyin xeyri yoxdur?

– Sizdən balıq tutan olmaz.

– Niyə olmur, ay Qoca dayı?

– Uşaqsınız, bala, gedin ağzınızın qatığını silin.

– Kim, biz uşağıq?

– Bəs nəsiniz, ay xalası göyçəklər?

– Xalamızda işin olmasın.

– Yaxşı, – deyə Qoca kişi dayanıb onları süzdü. Yanları qırış-qırış gözləri kiçilib balacalaşdı. – Xalanız olmasın, nişanlınız olsun. İndi məndən nə istəyirsiniz, ay nişanlısı göyçəklər?

– Ey-ey, – deyə uşaqlardan Əli adlı birisi dilləndi. – Elə eləmə ki, qızına...

– Qızıma nə deyəcəksən, ay sənin bacıyın məməsini yeyim...

Əli gözünü qıyıb kişini süzdü. Onun sinəsinə düşmüş saqqalına baxdı.

– Axı bacarmazsan.

– Niyə bacarmıram?

– Qocasan.

– Qoca olanda nə olar, ay qırışmal, bacını məndən artığına verəcəksən?

– Axı sənə yazığım gəlir.
– Niyə?
– Saqqalını yolar.
– Qırxdırram.
– Bəs bığların?
– Kəsdirrəm. Hə, indi sözün nədir?
Əli dayandı, sifətinə qayğıkeş bir görkəm verdi.
– Bacımın xasiyyəti pisdir. Qoca dayı, gəl bu işdən əl götür. Vallah, başına oyun açar.
– Məsələn, nə qayırar?
– Paçalama üstünə minib, tumanının bağı ilə səni boğar.
Uşaqlar qəhqəhə çəkib gülüşdülər. Qoca kişi də onlara qoşuldu.
– Ay haramzadalar, məni bağladınız. Gəlin, balıqları sizə verim, aparın nişanlınıza.
– Nişanlımız sənin balığına qalmayıb, özümüz tutarıq.
– Bəlkə, əliniz boşa çıxdı?
– Onda gəlib apararıq.
– İndi alın, sonra peşman olarsınız.
– Aldatmazsan ki?
– Mənim siznən zarafatım var?
Uşaqlar gülə-gülə ondan aralanıb eniş aşağı düşdülər. Qoca kişi sahilə enən uşaqların dalınca xeyli baxdı. Nəfəsini dərib yoluna davam etdi. İndi o daha cəsarətlə addımlayırdı.
Gəmiçi Qoca həmişə kəndin yeniyetmələri ilə zarafatlaşmağı sevərdi. Heç kəs kişinin bu şuxluğundan inciməz, əksinə, harda görsələr, başına toplaşıb ona sataşardılar. Kişi də söz altında qalmazdı. Deyib-güldükcə elə bil cavanlaşıb yüngülləşərdi. İndi də uşaqlarla zarafatlaşandan sonra özünü yüngül hiss etdi. Elə bil bədəninin ağrısı da azaldı.
Yoxuşu çıxıb qaşı aşandan sonra dayandı. Təpələrdən əsib gələn bahar küləyi onun üzünə vurdu. Kişi dayanıb kəndə doğru baxdı. Bu il havaların yaxşı keçməsi, tez-tez yağış yağması dəmyələri gömgöy etmişdi. Kəndin üst tərəfindəki təpələr yamyaşıl idi. Dəmyədə əkilmiş taxıllar qurşağa çıxırdı. Arpalar buğum verib sünbülləmişdi. Bir az bəridə, təpələrin döşündə isə quzular otlayırdı. Qarnı doyan çəpişlərin çəmənlikdə atılıb-düşməsi Kürün sahilindən belə görünürdü. Sarı çiçəklər, topa-topa bitən lalələr adamın gözünü oxşayırdı. Bir dəstə qız pencər dərirdi.

Gəmiçi Qoca ətrafını ot basmış cığırla kəndin ucqarındakı evinə doğru addımladı. Onun qara damı torpaqdan güclə seçilirdi. Damın ətrafındakı kalafalıqları, xırman yerini, çardağın yanını ot basmışdı. Hətta qazmanın üstündə belə ot cücərmişdi. Arvadı Züleyxa ölənə qədər ev səliqəli olardı. Ancaq iki il idi ki, qarı rəhmətə getmişdi. Bundan sonra kişinin əl-ayağı soyumuşdu. O, həftələrlə evə baş sala bilmirdi. Əgər qızı Güləsər olmasaydı, bəlkə də aylarla gəminin yanında qalar, heç evə qayıtmazdı.

O, düz bir həftə idi ki, evə gəlmirdi, binəyə köçənləri o taya, meşəyə, yaylağa hazırlaşanları isə bəri üzə, kəndə keçirirdi. Aldığı haqdan, pendirdən, çörəkdən yeyib, oralarda dolanırdı. Hərdənbir də uşaqlar ona balıq gətirirdilər. Əgər srağagün Güləsər onun yanına gəlməsəydi, bəlkə heç bu gün də evə qayıtmayacaqdı. Gəmiçi Qoca həm də heç olmasa, bir-iki gün dincəlməli idi. Axı bu gün-sabah el yaylağa qalxacaqdı. Meşədən köçüb gələn binələrin, qoyun sürülərinin, mal-qaranın sayı-hesabı olmayacaqdı. Onların çoxunu Qoca kişi öz gəmisində bəri üzə keçirməli idi.

Kəndin girəcəyində başını qaldırıb ətrafa baxdı. Güləsər taxılın içində pencər yığan qızlardan aralanıb atasına doğru gəlirdi. O, çit donunun ətəyini belinə sancmışdı. Ayaqları yalın idi. Yemlik yeməkdən əlləri və dodaqları bir az qaralıb, şabalıdı rəngə düşmüşdü. Çöllərin küləyi qızın yanağını cızmışdı. Dodaqları da qaysaqlanan kimi olmuşdu. Onun ətəyi dolu idi. Əlindəki bıçaq və dırnaqları nəm torpağa bulaşmışdı. Kişi qızını görəndə sevindi. Ayaq saxladı. Güləsər bərabərinə çatanda gülümsündü:

– Burda nə gəzirsən, a xalası göyçək?

– Sənə pencər dərirəm.

– Mən də gör sənə nə gətirmişəm.

– Bıy nə yaxşı balıqlardır, ay dədə, özünmü tutubsan?

Qoca kişi balığı gəmi ilə keçirdiyi uşaqlardan aldığını demədi. Başını tərpədib, qızının sözünü təsdiqlədi.

– Dedim, şeytanım qoy bu gün balıq yesin.

– Dünən də qağam tutmuşdu... Şamxal da bizdə idi.

– Kim?

Qız ağzından söz qaçırdığına peşman olub qızardı. Atası da bunu hiss etdi. Qızının xatirinə dəyməmək üçün araya söz qatdı.

– Nə dəribsən?

– İlanotu. Sənə pencər bişirəcəm.

– Yağın varmı?

– Dünəndən bir qaşıq saxlamışam. Yəqin neçə gündür dilinə isti xörək dəymir.

– Niyə dəymir, ay bala, özüm horradan-zaddan bişirirəm.

O, əlindəki balıqları qızına verib qabağa keçdi. Güləsər atasının çatlamış dabanlarına baxa-baxa onun izi ilə getdi.

Hər şey oyanmışdı. Yolun kənarındakı çiçəklərin üstünə qonan xallı kəpənəklər qanadlarını oynada-oynada şirə sorur, bəzən də havanın ətrindən xoşlanıb göyə qalxır və bir-biri ilə zarafatlaşır kimi çəmənlərin dərinliklərinə uçurdular. Onlarla bəhsə girən bal arıları güllərin başına dolanırdılar. Cığırlarda cığır salan qarışqalar harasa tələsir, əllərinə keçənləri daşıyıb yuvalarına doldururdular. Güləsər dayanıb baxdı. İki dozanqurdu mal təzəyini yumurlayıb aparırdı. Onlar başıaşağı durub, dal ayaqları ilə kürəciyi dığırlayırdılar. Bir-birini necə də başa düşür, necə də köməkləşirdilər! Arabir lap yaxından, Qoca kişinin az qala ayağının altından pırıltı ilə qalxan quşlar uçub qabağa düşür və bir xeyli cığırın ortasında səkirdilər. Bəli, yaz gəlmişdi. Bütün canlılar əlləşib işləyirdilər. Qəribə idi. Həmişə gül-çiçək içində üzən kəpənəklər necə də gözəl idilər. Onlar əziyyət çəkmir, səhərdən axşama qədər çiçəkdən-çiçəyə qonurdular. Amma qarışqalar, ya da təzək yuvarladan dozanqurdular əlləşirdilər...

Güləsər köksünü ötürdü və ondan xeyli aralanan atasının yorğun görkəminə tamaşa etdi. Kişi qocalıb əldən düşmüşdü. Güləsərin əlacı olsa, onu heç yana buraxmazdı. Özü qolunu çırmayıb ortaya atılardı. Amma neyləsin, qızın əlindən nə gələ bilərdi?

Onlar həyətə çatdılar. Qoca kişi talvarın altında eşələnən Çərkəzin yanına getdi. Adəti üzrə şuxluğa başladı:

– A xalası göyçək, burda nə əlləşirsən?

Çərkəz belini düzəldib tərini sildi. Atasının sualına zarafatla cavab verdi. Qabağındakı qırıq arabanı göstərdi:

– Ölü dirildirəm.

Qoca kişi toz-torpaq basmış boyunduruğa və təkərləri əyilən arabaya baxdı. Əvvəllər onun arabasının bir cağı da sınıq olmazdı. Dağ köçünə hamıdan qabaq hazır olardı. İnişil arvadı öldü, keçən il də əlləri aşağı oldu. Bu il isə heç araba qoşmamışdı. Heç Çərkəz də arabaya yaxın durmazdı. İndi oğlunun hərəkəti onu xeyli düşündürdü.

– Fikrin nədir, ay bala?

– Bəlkə, dağa köçdük.

Kişi oğlunun şini düşmüş təkərlə oynamasını əbəs zəhmət hesab etsə də, bir şey demədi. Arabanın cağları çürümüşdü. Təkərlərin əyrisi çatlayıb aralanmışdı. Deyəsən, ox da qacıyıb əyilmişdi. Belə bir arabanı sazlamaqdansa, təzəsini bağlamaq daha asan olardı. Bir də axı bu əziyyət nəyə lazımdır? Onlar ki, dağa köçən deyildilər.

Kişi çiynindəki kəndiri həyətə atdı. İslanmış corablarını talvarın üstünə tulladı. Çarıqlarını qızına verdi.

– A bala, elə yerə qoy ki, it-pişik aparmasın. Zəhrimar islanıb cılğıya dönüb.

Güləsər atasının altı deşilmiş çarığını gözdən keçirdi və içəri adladı. Orta ocaqda korun-korun yanan kötüyün ucunu vurub qorlandırdı, çır-çırpı yığıb üstünə tökdü. Ocaq tüstüləndi. Ətrafı boğaz acışdıran göyümsov bir tüstü bürüdü. Bu duman bir müddət laylanıb evin içinə çökdü və yavaş-yavaş orta bacadan burulub çıxdı. Qız bir-iki dəfə ocağı püflədisə, odun yanmadı. Güləsər göz yaşını və burnunu silib, uzun donunun ətəyi ilə ocağı yellədi. Kösövlər çatırdadı və birdən alışıb parıldadı. Tüstüdən nəfəsi kəsilən Güləsər eşiyə çıxdı.

– Ay dədə, sənə pencərmi bişirim, balıqmı?

– Pencər yaxşıdır. Heç bu il nübar eləməmişəm. İstəyirsən balığı da pörtdət.

Çərkəz fırladıb o üz-bu üzünə baxdığı təkəri əlindən buraxdı. Təkər həyətin ortasında dığırlanıb bir-iki dövrə vurdu və göy otluğa düşdü. Onun şini cingilti ilə çıxıb, təkərdən üç-dörd addım kənardakı çökəyə yuvarlandı. Çərkəz əlinin tozunu silib, taxtın üstündə oturan atasına yaxınlaşdı.

– Ay dədə, deyəsən, balıq tutmusan, hanı, göstər görüm?

– Sən tutduğun balığı mənə göstərdinmi, mən də göstərim?

– Sən mənim balıq tutduğumu hardan bilirsən?

– Bilirəm, ay xalası göyçək.

Kişi oğlunun üzünə baxıb, xırıltılı səslə güldü. Çərkəz əvvəlcə atasının qıyıq gözlərinə, sonra da ocağın kənarında eşələnən bacısına baxdı.

– Balığı kimnən tutmuşdun?

– Şamxalnan.

– O bizə gəlmişdi?

– Hə, – deyə Çərkəz cavab verdi və qaşqabağı tökülən atasına baxdı. – Nə olar ki?

– Heç, – deyə kişi sakitcə dilləndi.

Bir azdan yağda qızardılmış soğan iyi ətrafa yayıldı. Güləsər iri mis cama çəkdiyi pencəri atasının qabağına qoydu. Özü isə Çərkəzlə yanaşı oturdu. Sarımsaqlı qatığı irəli çəkib bir-iki qaşıq pencərin üstünə tökdü.

– Ay dədə, – dedi, – sarımsaqlı yaxşıdır. İştahan açılar. Balığa da su asmışam. Bu saat hazır olar. Soyutma bişirirəm.

Qoca kişi qızının bu mehribanlığına qarşı necə minnətdarlıq edəcəyini bilmədi. Ancaq onun üzünə baxıb gülümsəməklə kifayətləndi. Camı qabağına çəkib bardaş qurdu. Çörəkdən kəsib pencəri çömçələdi.

Kişi quru çörəyi dişsiz damağında övkələdikcə çənəsi şaqqıldayır, gicgahlarındakı damarlar oynayırdı. O, tez-tez əyilib fətir götürən qızını gözaltı süzürdü. Güləsər böyümüşdü. Heç bir il bundan qabaqkı arıq, quru qıza oxşamırdı. Elə bil rəngi də ağarmışdı. Döşləri nimdaş qoytasını dik tuturdu. Kişi bunun fərqinə indi vardığından, təəccüblə ona baxır, deməyə söz tapmırdı. O indiyə qədər Gülləsəri uşaq hesab edirdi. Amma bu gün elə bil yuxudan ayılmışdı.

Gülləsər qardaşı ilə bir qabda xörək yeyirdi. Tez-tez şitlik edir, Çərkəzin qabağındakı pencəri çömçələyib götürürdü. Qardaşını cinləndirib xısın-xısın gülürdü. Kişi görürdü ki, qızı şuxluq edir. Zarafatlaşmaq, əzilib-büzülmək istəyir. Gözləri oyur-oyur oynayır. Yanaqları rəngdən-rəngə düşür. Gülləsərdə ilk dəfə müşahidə etdiyi bu hal kişini hürkütdü. "Günü qara lap özünü açıb, – deyə xəyalından keçirdi, – indidən mazaqlaşmaq istəyir. Allah sizin damazlığınızı kəssin. Boyları bir qamçı olan kimi adamın belinə sıçrayırlar".

Onun iştahası qaçdı. Camı geri itələyib, əllərini şalvarının dizinə çəkdi. Gülləsər atasının dayandığını görüb təəccüblə soruşdu:

– Niyə yemədin, ay dədə, yoxsa xoşuna gəlmədi?

– Yox, qızım, çox sağ ol, ağzın şirin olsun. Doydum.

Gülləsər qabı götürdü.

– Bu saat balıq gətirim, – deyə ayağa durdu.

Kişi onun arxasınca baxdı. Qoşa hörükləri görəndə xəyalı uzaqlara getdi. Qız lap anasına oxşayırdı. Boyu, buxunu, yeriyəndə boynunu bir az yana əyməsi lap Züleyxa idi. O da bunun kimi ortaboylu, tökməbədənli idi. "Yox, qız lap yetişib, gözdə-qulaqda olmaq lazımdır".

Kişi taxtın üstünə uzandı. Gülləsər köhnə bir mütəkkə gətirib onun başının altına qoydu. Qoca kişi qəlyanını doldurdu. Arxalığının cibindən çaxmağını çıxardıb qovu alışdırdı. Qəlyanın üstünə qoyub sümürdü. Baş barmağı ilə közərmiş tütünü basıb, çubuğunu tüstülətdi. Kişini fikir götürdü...

## 9

Şamxal kəndin kənarında, biçənəklərin üst tərəfindəki təpənin qaşında özünə ev tikdi. Kənd cavanları ona kömək etdilər. Birləşib yer qazdılar. Meşədən dirək, kərən gətirdilər. Üç gün gecəli-gündüzlü işləyəndən sonra qazma daxmanın üstünü örtdülər.

Damın pərdilərini Şamxal özü örtdü. Enli qovaq ağaclarını doğrayıb ortadan yardılar. Səliqə ilə yonub yan-yana qoydular. Şamxal evin dal tərəfindən balaca bir pəncərə açdı. Uşaqların hardansa tapıb gətirdikləri bir parça şüşəni ora saldı. Qara damın həyətində iri bir çardaq da tikdilər. Şamxal özü çardağın ətrafını yulğun çubuğu ilə hördü, torpağın süzülüb axmasının qabağını aldı. Həyətdəki ot-ələfi təmizlədi. Harda xırman açacağını, samanlığı, tövləni harda tikəcəyini indidən müəyyənləşdirdi.

Kənd camaatı əvvəlcə bu işə təəccüb etdi. Şamxalın yanına gəlib onu danlayan ağsaqqallar da oldu. Ancaq o, sözündən dönmədi.

Bu xəbər Cahandar ağanı təəccübləndirmədi. “Tərs oğlu tərs, südünə çəkib, – deyə ürəyində onu yamanladı. – İnadın biridir. Bilirdim ki, axırı belə olacaq”. O bu işə bir tərəfdən sevinir, oğlunun öz atasına belə boyun əymədiyini, kişi kimi sözünün üstündə durduğunu bəyənirdi. O biri tərəfdən də onun, Cahandar ağanın oğlunun qara damda yaşamasını şəninə sığışdıra bilmirdi. “Bir gün ağıllanar, başı əlhəd daşına dəyib geri qayıdar” – deyirdi. Ancaq onun gözlədiyi kimi olmadı.

Bir dəfə ilxıçılar xəbər gətirdilər ki, Şamxal çəmənliyə gəlib ayağı səkil qaşqa atı aparmışdır. O heç kəsə heç nə demədən birbaş ilxının içinə girib atı yallamış və quş kimi sıçrayıb belinə qalxmışdı. Dikdiri çıxıb kəndə doğru gedən atlının qabağına heç kəs keçə bilməmişdi. Bu xəbər Cahandar ağanı hirsləndirsə də dinməmişdi.

Əri ilə küsü saxlayan Zərnigar xanım da buna dözə bilməmiş, “Axırı ki, istəyinə çatdın. İndi ürəyin dincəlsin”, – deyə ərini sancmışdı. Cahandar ağa oğlunun yenə nə isə aparacağını gözləyirdi, ancaq Şamxal bir daha buralarda hərlənməmişdi.

Şamxal divarından nəm qoxusu gələn daxmada tək yaşayırdı. Onun nə yorğan-döşəyi, nə künc-bucağında yeməyə bir şeyi vardı. Əvvəlcə ayrı yaşamaq ona çox asan gəlirdi. Amma özünə ev tikəndən ikicə gün sonra belə yaşamağın çətinliyini dərk etdi. Hətta bir-iki dəfə qəsdləndi ki, atını minib dayısıgilə getsin. Sonra fikrindən daşındı. Çərkəzgilə getməyə də arlandı.

Əslinə baxsan, Şamxala ayrılıb ev tikməyi elə Çərkəz məsləhət görmüşdü: "Sənə nə var, dədəyin malı-dövləti aşıb-daşır. Əlində on beş-iyirmi kənd var. Biçənəklərinin ucu-bucağı görünmür. Torpağın gözü də sizindir. Yaman günündə beş-on tağarlıq yer götürüb əkib-biçərsən. Daha mənim kimi deyilsən ki, – demişdi. – Əgər evinizə qayıtmaq istəmirsənsə, belə məsləhətdir. Qonum-qonşunun qoltuğunda yaşamaqdan pis şey yoxdur". Şamxal çox fikirləşmiş və ona haqq vermişdi. Bu söhbətdən bir gün sonra Şamxal qərarını ona demiş və köməkləşib ev tikmişdilər.

Şamxal bir həftə beləcə yaşadı.

Bir axşam həyətdə oturmuşdu. Çardağın dirəyindən asılan qara çırağın başına dolanan pərvanələrin, xırdaca böcəklərin sayı-hesabı yox idi. Ətraf yaşıllıq olduğundan, uçub işığa gələn cücülərin ardı-arası kəsilmirdi. Dirəyə bağlanmış at qabağındakı göy otu xımırtladırdı. Şamxal həmişəki kimi bu axşam da atını Kürə sulamağa aparmış, qayıdanda biçənəkdən bur qucaq ot çalmışdı.

O, içəri keçib taxtın üstünə uzandı. Ulduzlar sayrışırdı. Cırcıramaların səsi bir-birinə qarışmışdı. Cələdəki çaqqallar səs-səsə verib ulaşdıqca kənd itləri hürüşürdü. Kimsə xır yolunda araba sürürdü. Təkərlər qıcıldayırdı.

Şamxalı fikir götürmüşdü. "Bəlkə Habil oğlu Qasımın yanına getsin? Onun dəstəsinə qoşulub çapqınçılığa başlasın? Maldan-qaradan oğurlayıb birbaş həftəbazarına sürsün? Bircə günün içində xırıd edib paltar-palazdan alsın, ev-eşiyini sahmana salsın? Axı, deyirlər, çox adam bu yolla varlanıb? Hərçənd bu yolda ölüm-itim də var. Ancaq nə olsun, yaranan bir gün ölməyəcəkmi?"

O, yanı üstə çevrildi. Papiros eşib-yandırdı. Dalbadal sümürüb tüstünü kənara üfürdü. Yenə fikrinə davam etdi. "Yox, nahaq bu xəyallara düşürəm. Haramçılıqdan bir şey çıxmaz. Adam öləndə də bir şey üstündə ölər. Yoxsa oğurluq üstündə ölmək heç kişilikdən deyil. Camaat adamın cəmdəyinə tüpürər".

Şenliyin aşağısından səs-küy qalxdı. Kimsə damın üstünə çıxıb bərk qıy çəkdi. Dalbadal güllə atıldı. İtlər səs-səsə verib ulaşdılar. Şamxal qalxıb oturdu. Şirin-şirin ot yeyən at qulaqlarını şəkləyib fınxırdı. İtlər nəyi isə qovub cələyə doğru apardılar. Beş-on dəqiqədən sonra hər şey sakitləşdi. Cırcıramaların səsi, Kürün qıjıltısı aydınca eşidildi.

Şamxal yaxında hənirti duyub qulaq kəsildi. Göy otluqda araba sürürdülər. Təkərlərin otları əzməsi və öküzlərin arabir fısıldayıb ot

qoparması eşidilirdi. Arabaçı tez-tez çubuğunu şaqqıldadır, "ho-ho, hiş" – deyə heyvanları səsləyirdi. Görünür, o, qabağa düşmüş və yol-iz olmayan yerlərdə arabanı xəndəyə salmaqdan ehtiyat edirdi. Şamxal gələnlərin ötüb gedəcəyini zənn etdi. Ancaq səs-küy yaxınlaşdı. Araba düz işığa gəldi. Şamxal nökərləri Tapdığı tanıdı.

– Xoş gördük, ağa.

– Xoş gördük, hara belə?

– Heç hara, elə sənin yanına gəlmişəm.

– Bəs bu araba-zad nədir?

– Paltar-palazdır. Xanım göndərib.

– Qaytar geri, mənə heç nə lazım deyil.

İndiyəcən arabanın üstündən düşməyib, qardaşının nə deyəcəyini gözləyən Salatın dözmədi. Yerə enib onun yanına gəldi. Quş kimi qanadlanıb Şamxalın boynuna sarıldı.

– Qurbanın olum, ay qağa, nə təhərsən?

Bacısının onu duz kimi yalaması Şamxalı qəhərləndirdi. Qızın saçını sığallayıb üzündən öpdü. Kirimişcə:

– Anam nə təhərdir? – dedi.

– Yaxşıdı. Elə fikri-zikri sənsən. Evin də mübarək. Bəs təkcə darıxmırsan?

– Əlacım nədir? – deyə Şamxal sakitcə dilləndi.

Salatın onun kövrəldiyini hiss etdi. Fürsəti əldən verməyib üzünü Tapdığa tutdu:

– Tez ol, şeyləri boşalt.

– Heç nə lazım deyil.

– Bıy, dərdin ürəyimə, ə, nə danışdığındır? Quru yerdə ha yatmayacaqsan? Evdə palaz-paltar olmazmı?

– Özüm hamısını düzəldərəm. Onun mənə heç nəyi lazım deyil.

– O kimdir? – Salatın dayandı və qardaşının atasına işarə etdiyini başa düşdü. – Gətirdiyimiz şeylərin hamısı anamındır. Öz cehizindəndir.

Tapdıq bacı-qardaşın başı qarışdığından istifadə edib, arabadakı yüklərin bəzi qismini boşaltdı. Salatın Şamxala imkan vermədi. Çırağı götürüb qabağa keçdi.

– Gəl görüm, evin necədir?

Onlar çardağı keçib içəri adladılar. Salatın his verən qara çırağı yuxarı qaldırdı. İri və vahiməli kölgələr torpaq döşəmədə gəzdi, divarlara düşdü, bəzən də tavana qalxıb pərdilərdə dolaşdı.

Salatın boş evin ortasında dayandı. Divar nəm idi. Yaş kərən və pərdilərdən az qala su damırdı. Evin içi bomboş idi. Taxtın üstündə bir cırıq palaz da yox idi.

– A bacın ölsün, burda necə yatırsan?

– Birtəhər.

– Özümü öldürrəm, səni bu cür qoymaram.

Onlar ay doğana qədər əlləşdilər. Gətirdikləri şeylərin hamısını daşıyıb içəri doldurdular. Tapdıq geri qayıtdı. Salatın qardaşından ayrılmadı.

– Səni tək qoyub, heç yana gedən deyiləm.

Onlar elə həyətdə, çardağın altında yer saldılar. Ay yuvarlanıb yuxarı qalxmışdı. Təpələrin, çöllərin üzərinə solğun işıq çilənmişdi. Çəmənlərdən biçilmiş ot qoxusu gəlirdi. Onların gözünə yuxu getmirdi.

– Sabah evini silib-süpürəcəm. Divarlara kilim tutacam. Yorğan-döşəyini yük yerinə yığacam. Qab-qacaq da gətirmişəm. Anam hər şey göndərib. Görək indi sözün nə olacaq. Bizi tək qoyub qaçdın. Heç insafın yoxdur?

– Özün gördün ki?

– Gördüm. Ancaq nə olsun, atandır. Hirslənmişdi. Gəl qayıdaq.

– Az danış, ağzın yekə olar, – deyə Şamxal zarafata salıb bacısını susdurdu. Yorğanı çiyninə çəkib, kürəyini ona doğru çevirdi. Salatın qardaşını arxadan qucaqlayıb büzüşdü.

## 10

Güləsər gecikmişdi. Səhər tezdən ev-eşiyi süpürmüş, qızlarla pencərə getmiş, geri qayıdanda səhəngin boş olduğunu görmüşdü. Atası indicə gələcəkdi. Çərkəz də axşamüstü evə dönəcəkdi. Heç olmazsa onlara bir stəkan çay verməк lazımdı.

O, səhəngi götürüb birbaş Kürə yollandı. Gün yaxmışdı. Kəndin qərb tərəfindəki hündür təpələrin zirvəsi narıncı rəngə boyanmışdı. Sahildəki söyüd ağaclarının budaqları qızılı rəngə çalırdı. Güləsər hündür yarğanın yanından sola burulub cığırla aşağı endi. Çəmənlikdə oynaşan uşaqlar malları qabağına qatıb kəndə doğru haylayırdılar. Lap uzaqda bir oğlan at çapırdı. Ətrafa sərinlik gətirən kölgə çökürdü. Güləsər addımlarını yeyinlətdi. Suyun yaxası boyu uzanan yarğanın qaşı ilə

getdi. Göyün üzündə süzən saysız-hesabsız qızlarquşunun səsi bir-birinə qarışmışdı. Suların şırıltısı, cələdəki salxım söyüd yarpaqlarının xışıltısı, çəmənlərdən küləyin qovub gətirdiyi çiçək qoxuları Güləsəri məst etmişdi. O hərdənbir ayaq saxlayır, Kürün balıq qoxusu verən nəm havasını ciyərlərinə doldururdu.

Yarğanın kölgəsi suya düşmüşdü. Onun qaşı ilə gedən Güləsərin də kölgəsi xırda ləpələrin üzəri ilə irəliləyirdi. Qız, çiynində səhəng, suyun axarının əksinə gedən kölgəsinə tez-tez dönüb baxırdı. Sular çəhrayı rəngə boyanmışdı. Yaxındakı adacıqları bürüyən çiçəkləmiş yulğun kollarının uclarının rəngini sulardan seçmək olmurdu. Elə bil günəş yaxan zaman hər yer – axar sular, yaşıl təpələr, sünbüllü zəmilər od tutub yanırdı. Güləsər Kürün gur yerinə şəfəq saçan günəşə baxdı. Yarısı təpənin dalında gizlənən günəşin əksi şəffaf sularda parıldayırdı. Yerlə səma birləşmiş kimi görünürdü. Sanki günəş Kürün başında, təpələrin ağız-ağıza qovuşduğu yerdə aşağı enmiş və axşam-axşam axar sularda çimirdi. Onun qızılı saçları suyun üzünə dağılıb qıvrılırdı.

Güləsər Suvadağa çatanda sahilə qatı bir kölgə çökdü. Qız başını qaldırıb üfüqə baxdı. Günəş gizlənmişdi. Təpələrin dalından qızartı görünürdü. Elə bil kimsə orada nəhəng bir tonqal qalamışdı. Ocağın şəfəqləri səmada əks edib ağ buludları alovlandırırdı.

Güləsər səhəngi suya basıb doldurdu. Kənara çəkib ağzını tıxacladı. Tələsik üzünə su çırpıb saçını sığalladı. Tezcə də yola düşmək istədi.

Birdən onun bədəninə üşütmə gəldi. Sinəsində göyərçin kimi çapalayan ürəyi koftasını titrətdi. Qız vahimələnən kimi olub səhəngin qulpundan yapışdı. Elə bu an sahildəki yulğun kollarının arxasından bir qayıq çıxdı. Qız cəld səhəngini çiyninə alıb yarğanın qaşına dırmanmaq istədi. Kimsə onu çağırdı. Güləsər tanış səs eşidib geri dönəndə Şamxalla qarşı-qarşıya dayandı. Bir müddət heç biri dinmədi. Güləsər gözlənilməyən bu təsadüfdən özünü itirdi. Axşamüstü çay kənarında onları bir yerdə görsələr, nə deyərlər? El içində biabır olmazdımı? Qız başını qaldırıb Şamxalın üzünə baxdı. Onun dinmədiyini, tez-tez nəfəs aldığını gördü. Gözucu yarğanın aşağısında sahilə yan almış qayığa və orada intizarla Şamxalı gözləyən Tapdığa baxdı. Qızın gözlərinə Kürün üstünə enən kölgədən də qatı bir kölgə endi. Aralanmaq istədi, ancaq Şamxal onun biləyindən yapışdı. Səhəng yerə düşdü. Dığırlanıb sahilə qədər getdi. İri daşa toxunub dayandı. Tıxac sıçrayıb çıxdı. Səhəngin suyu loqqultu ilə süzülüb sahil daşlarını islatdı.

Güləsər qışqırmaq istədisə, güclü bir əl onun ağzını qapadı. Şamxal qucağında titrəyən qızın çapalamasına baxmadı. Üz-gözünün cırılmasına da fikir vermədi. Ac canavar quzu götürən kimi qızı basmarlayıb qayığa saldı. Tapdığa "tərpən" – dedi. Özü isə dal tərəfdə oturub, paçasının arasına saldığı qızı sinəsinə sıxdı. Onun çapalayıb qayığı çevirməsinə, ya da suya atılmasına imkan vermədi. Lal suları yarıb şütüyən qayıq Kürün ortasındakı adanın arxasında görünməz oldu...

Mal otaran uşaqlar hay-harayla kəndə qaçdılar. İki oğlanın bir qızı zorla qayığa qoyub qaçırdıqlarını söylədilər. Qızın tez-tez çırpınıb özünü suya atdığını, oğlanınsa onu tutub gəmiyə basdığını və üstəlik bir-iki şillə çəkdiyini elə yarğanın qaşından gördüklərini danışdılar. Qız ağlayıb çırpınırmış. Ancaq onun səsini eşidən olmayıb. Qayıq o taya, meşəyə keçib.

Malı sulamağa aparan naxırçılar boş səhəngi tapıb gətirdilər. Arvadlara göstərdilər. Güləsərin olduğunu bilib Qoca kişiyə xəbər yolladılar. Bacısının qaçırıldığını eşidən Çərkəz tüfəngi götürüb başı alovlu sahilə qaçdı. Ətrafa boylandı. Yalandan havaya bir-iki güllə atdı, ancaq heç nə tapa bilmədi. Qatı qaranlıq ətrafı bürümüşdü. Kürün qıjıltısı, yulğun kollarının uğultusu adamı vahimələndirirdi. Cələdəki çaqqallar isə səs-səsə verib ulaşırdılar.

Bir xeyli sahildə vurnuxan Çərkəz əlacsız qalıb geri, kəndə qayıtdı. Dikdiri çıxanda dayandı. Kəndin işıqları yanmışdı. Qapılarda ocaq qalamışdılar. Bağdan açılan itlər yal üstündə boğuşurdular. Yalnız onların, Çərkəzgilin ucqarındakı evlərdən işıq gəlmirdi. O, köksünü ötürüb ağır-ağır qaranlıq daxmaya doğru addımladı.

* * *

Güləsərin könlü Şamxalı inişil, dağ köçündə tutmuşdu... Göytəpəlilərin arabaları ağız-ağıza qovuşan sisli-dumanlı dağların arasındakı dərə ilə qıjıldayıb çayın sahilində dayanmışdı. Hamı arabanın yanına, elə göy otluğun üstünə gəbə salmışdı. Kəndin mötəbər adamları mütəkkəyə dirsəklənib dincəlir, qız-gəlin bulaqdan su gətirib çay tədarükünə başlayırdı. Üstü dəyəli arabaların böyründə ocaq tüstülənirdi. Qoyun kəsib alışma edənlər də var idi.

Gəmiçi Qocanın arabası həmişəki kimi köçün lap axırında getdiyindən, düşərgədə də hamıdan sonra, bir az aralı dayanmışdı.

Güləsər atasının fikirli-fikirli arabanın yanında dolaşdığını, anasının, əli qoynunda, ocaqlara asılmış qazanlara, buğlanan ağ samovarlara tamaşa etdiyini gördü. Arvadın gözü yol çəkirmiş kimi intizarlı idi. Sifətində məlul-müşkül bir ifadə var idi. Güləsər bircə an fikrə getdi. Sonra arabanın içindən boz kilimi götürüb yerə saldı. Üstünə balaca döşəkçə atdı. Sarı samovarı çıxartdı. Arvad qızının qab-qaşıq tədarükünü görüb təəccübləndi:

– Bala, fikrin nədir?

– Heç, – deyə sakitcə cavab verən Güləsər üzünü atasına tutdu.

– Ay dədə, gəl uzan, dincəl. Mən də ocaq qalayacam.

O, səhəngi götürüb bulağa getdi. Yarımca saatdan sonra Qoca kişinin də arabası yanında ocaq tüstüləndi. Qazanda nə isə dığıldamağa, sarı samovar poqquldamağa başladı. Güləsər hələ də təəccüblə ona baxan anasının boynunu qucaqladı:

– Ay ana, kimdi gəlib sənin qazanına baxan? Qoy hamı elə bilsin ki, biz də ocağa xörək asmışıq, çay dəmləmişik.

– Ay bala, köçün işini nə bilmək olar, birdən qonaq-zad gələr, biabır olmarıqmı?

– Olanda da olarıq, neyləyək.

Doğrudan da aradan bir az keçməmiş Çərkəzlə Şamxal onların arabasına yaxınlaşdı. Çərkəz gözaltı qaynayan samovarı, ocaqdakı qazanı, kilimin üstünə uzanmış atasını süzdü. Özünü sındırmamaq üçün Şamxalı süfrəyə dəvət etdi. O, Şamxalın təşəkkür edib gedəcəyi və burada dayanmayacağı zənnində idi. Amma Çərkəzin gözlədiyinin əksinə Şamxal:

– Bir stəkan çay içərəm, – deyə onun təklifini qəbul etdi.

Çərkəz anasının təlaş içində qaldığını, Güləsərin onsuz da dağ havasından allaşmış yanağının daha da qızardığını və lal baxışlarla nə isə demək istədiyini anladı. Ancaq gec idi. Şamxal Qoca kişi ilə salamlaşıb yanını yerə qoymuşdu.

Güləsər sakitcə samovarın yanında oturdu. Aylarla sandıqda saxladığı və indicə əyninə keçirdiyi qırçınlı qırmızı donunun uzun ətəyi ilə yalın ayağını örtdü. Stəkan-nəlbəkini yuyub silməyə başladı.

Şamxal gələndən sonra pərtləşən Qoca kişi nəhayət dilləndi:

– A bala, kasıblığın üzü qara olsun, indi səni nəyə qonaq edək?

– Heç nə lazım deyil, Qoca dayı, elə Güləsər bir stəkan çay versə pis olmaz.

– Çayımız var, amma...

Kişi dayandı. Sualedici nəzərlərlə arvadına, sonra da qızına baxdı. Güləsər atasının və anasının vəziyyətini başa düşdü, özü də hiss etmədən dilavərliyə başladı:

– Qəndimiz yoxdur.

– Niyə yoxdur, ay bala, ancaq farmaşdadı. Bu saat gətirərəm.

Züleyxa arvad yerindən qalxmaq istədi. Şamxal Çərkəzin qaşqabağından məsələni anladı və onları çıxılmaz vəziyyətdən qurtarmaq üçün gülümsündü.

– Əziyyət çəkməyin, Züleyxa xala, sizin çayınız qəndsiz də şirin olar.

Güləsər süzdüyü çayı Şamxalın qabağına qoydu və nə üçünsə başını qaldırıb onun üzünə baxdı. Qızın dodaqlarındakı təbəssüm donub qaldı. Üzünə zillənən gözlərdə həm mehriban, həm də qəlbə nüfuz edən qəribə bir ifadə oxudu. Qız ömründə ilk dəfə duyduğu və mənasını başa düşmədiyi bir hissin təsiri ilə sarsıldı. Ona elə gəldi ki, üzünə zillənən gözlər köz kimi onu yandırıb qarsadı. Deyəsən, özü də hiss etmədən bir xeyli beləcə dayandı. Yoxsa atası öskürüb bərkdən içini arıtlamaz, Çərkəz də qaş-göz oynatmazdı.

Güləsər atasının "taxsırın hamısı bu xalası göyçəkdədir," – deyə oğlunu göstərdiyini və onu xəbərsiz qonaq gətirməkdə məzəmmət etdiyini eşidəndən sonra əlini stəkandan çəkdi. Onun qulaqları güyüldədi. Samovarın istisi vurduqca qızarmış yanaqları daha da pörtdü. Kişilərin söhbətini güclə eşitdi. Ayağa durub uzaqlaşmaq istədisə də bacarmadı.

Şamxal çox oturmadı. Çayı içən kimi ayağa durdu. "Ağzınız şirin olsun", – deyə təşəkkür etdi. Çərkəzlə bərabər arabadan uzaqlaşmazdan əvvəl dönüb bir də Güləsərə baxdı. Qız onun Çərkəzə:

– Maşallah, bacın lap böyüyüb, – dediyini aydınca eşitdi.

Güləsər dağların kölgə saldığı cığırla güneyə doğru addımlayan Şamxalı və qardaşını xır yoluna qədər gözdən qoymadı. Anası onu səsləməsəydi, bəlkə də axşama qədər beləcə dayanacaqdı.

O, süfrəni və stəkan-nəlbəkini yığışdıranda da Şamxalın sözləri qulağından getmədi. "Sizin çayınız qəndsiz də şirin olar". Bu nə demək idi? Necə yəni çayınız qəndsiz də şirin olar? Yoxsa o başqa söz demək istəyirdi? Amma qəribə gözləri var. Adamın düz ürəyinin içinə baxır.

Qız sonralar dağda olanda da, hətta arana köçəndə də bu sözləri unuda bilmədi. O, hiss etdi ki, qəlbində nə isə baş qaldırır, bu xatirələr

nə üçünsə onu sevindirir, özünə bir həmdərd axtarmağa, ürəyindən keçənləri kimə isə danışmağa sövq edir. Ancaq bu sirri kimə söyləyə bilərdi? Onu məsxərəyə qoymazdılarmı? “Gör qızın iştahından nə keçir?” – deyə ələ salmazdılarmı?

O, bəzən qara damda mitil yorğan-döşəyə bürünüb gözlərini his basmış kərənə zilləyir, torpaq divarın yarıqlarında cırıldaşan gecə böcəklərinin səsini dinləyir, bəzən göyün üzünə səpələnmiş ulduzlara orta bacadan tamaşa edərək xəyala dalırdı. Bacadan seyr etdiyi səmanın bir parçası onun xəyalı tək gah tərtəmiz olur, gah da küləyin qovub gətirdiyi dumana bürünüb tutqunlaşırdı. Bacadan evin ortasına düşən ay işığı azalır, onsuz da qaranlıq olan qazmaya ürəksıxıcı bir kölgə çökürdü. Güləsər gözünü yumub yuxulamağa çalışsa da bacarmır, yerinə qor dolmuş kimi səhərəcən qovrulurdu. Qız özünün də ayırd edə bilmədiyi hallar keçirirdi. Bəzən “o hara, mən hara?” – deyə özünü danlasa da, Şamxalın sözləri yenə qulaqlarında səslənir, xəyalı gözünün önündən getmirdi. Şamxal atını sulamağa aparanda bir bəhanə ilə səhəngi götürüb Kürə enir, uzaqdan da olsa oğlanı görməklə təsəlli tapmağa çalışırdı. Səhərlər yorğan-döşəyi salmaq adı ilə çardağın üstünə çıxıb hərlənir, Cahandar ağagilin həyətinə boylanmaqdan yorulmurdu. Hərdən təsadüf onları qarşılaşdıranda isə Güləsər yolunu dəyişdirib, Şamxaldan qaçır, özünü elə aparırdı ki, guya heç nə onu maraqlandırmır. Ancaq kürəyinə zillənən baxışları duyur, düz yolda ayaqları dolaşır və az qalırdı ki, büdrəyib yıxılsın. Belə hallarda Güləsər indicə ürəyinin partlayacağından qorxurdu. Bu iztirab və məchul hisslər ona əzab versə də, xoş və ləzzətli idi. Gənclik qəlbinin sirlərini məgər axıra qədər başa düşmək olurmu? Orada cücərən meyllərin, parıldayan qığılcımların, kül altında qalmış köz kimi işıldayıb sönən arzuların sayını-hesabını bilmək, hansının alovlanıb parıldayacağını, hansının vaxtsız sönəcəyini əvvəlcədən demək olurmu?!

* * *

Şamxal elə o gecə kəndə qayıtdı. Güləsəri meşəyə aparmadı. Qayığı birbaş Kürün ortasındakı balaca adaya sürüb, yulğun kolluğunda gizləndi. O, iz itirmək, camaat yatandan sonra şenliyə dönmək istəyirdi.

Güləsər əvvəlcə çox çırpındı. Adaya çatan kimi qaçıb özünü suya atdı. Üzüb keçmək istədi: Şamxaldan əvvəl Tapdıq qabağa keçdi. Qızı

dartıb sudan çıxartdı. Güləsərin bədəni tir-tir əsməyə başladı. Qız qorxdu. İllərdən bəri ürəyində bəslədiyi arzuların puç olduğu qənaətinə gəldi. Şamxalın onu özünə yox, nökərlərinə götürüb qaçırdığını yəqin etdi. O, yenidən çırpındı. Canını qurtarmaq üçün var-qüvvəsini toplayıb dartındı. Oğlanın onu buraxmayacağını hiss etdikdə isə gözləri ilə Şamxalı axtardı, onu köməyə çağırmaq istədi. Şamxal bunu duymuş kimi qabağa keçib axşam ayazında tir-tir əsən Güləsərin qolundan tutdu. Qızın baxışlarında acizanə yalvarışla bahəm dərin bir məzəmmət, dil anlamaz, mərhəmətsiz bir adama qarşı coşan kin qarışıq giley-güzar var idi.

Tapdıq çəkilib kənarda dayanandan sonra Güləsər bir az sakitləşdi. Şamxal qızı çəkib yulğun kollarının qalın yerinə apardı. Güləsərin canını yenidən titrətmə götürdü.

– Qurban olum, mənə dəymə. Üzüm ayaqlarıyın altına, ay Şamxal, məni biabır eləmə.

Qız qorxusundanmı, yoxsa imdad axtardığındanmı, nədənsə, heç özü də bilmədən onun qoynuna qısıldı. Şamxal islaq paltarı bədəninə yapışan qızın əzalarının titrədiyini hiss etdi. Yazıq qız çırpınır, həm qorxudan, həm də soyuqdan çənəsi şaqqıldayırdı.

Şamxal ələ keçirdiyi ovu yırtıcı bir ehtirasla parçalamaq fikrində deyildi. O, Güləsəri evinə aparmaq və həmişəlik özünə arvad etmək istəyirdi. İndiyəcən atasının bu işə qol qoymayacağını bildiyindən, sirrini heç kəsə açmamışdı. Ancaq indi işlər tərsinə dönmüşdü. Görünür, insan öz taleyindən qaça bilməzmiş!

On yeddi yaşı yenicə tamam olan Güləsər isə başına gələn əhvalatdan heç nə anlamır, elə buradaca, kolun dibində dəhşətli və eyni zamanda cazibədar bir maraqla gözlədiyi əhvalatın baş verəcəyindən qorxurdu. Hələ indiyə qədər bir oğlan əli toxunmayan bədəni Şamxalın təmasından daha şiddətlə titrəyirdi. Oğlan onu qucaqlayanda sudan kənara atılmış balıq kimi çapalayır, əl-qolu tutulanda isə dartınıb çırpınırdı.

Şamxal onun özünü həlak edəcəyini görüb, ehtiras və həyəcandan boğulan bir səslə dilləndi:

– Ay dəli, özünü niyə öldürürsən?

– Qurbanın olum, məni qaytar evimizə.

Qız onun sinəsinə qısılıb belindən qucaqladı. Şamxalı tutub saxlamaq, əl-qol atmağa qoymaq istəmədi. O da bunu hiss edib tərpənmədi.

Çuxasının ətəyi ilə Güləsəri bürüyüb özünə doğru çəkdi. Qızın islaq koftasına yapışmış yumru döşlərinin, ürəyi çırpındıqca titrədiyini hiss etdi. Onun nəfəsi darıxdı. Qızın ayaqlarını yerdən üzüb yuxarı qaldırdı. Təpimiş dodaqlarını onun yanaqlarında, üzündə gəzdirdi. İlk öpüşdən başı gicəllənən Güləsər sustaldı.

– Mən səni biabır eləmək istəmirəm ki, niyə qorxursan?

– Ölüm ayaqlarıyın altında, mənə dəymə.

...Gecə yarıdan keçib, şenlik sakitləşəndən sonra onlar yenə qayığa oturdular. Bu dəfə Güləsər çırpınmadı. Şamxalın çuxasına bürünüb sakitcə əyləşdi. O, oğlanı yola gətirdiyinə və bir azdan evlərinə qayıdacağına sevinirdi. Şamxal insaflı imiş. Güləsər götürülüb qaçırılan qızların döyüldüyünü, zorla başlarına oyun gətirildiyini çox eşitmişdi. Hətta onları aylarla gizlədib ortaya çıxarmırdılar da. Ancaq Şamxal ona güldən ağır acı bir söz də demədi. Bu sarıdan qızın ürəyi sakitləşmişdi. Görəsən gecədən çoxmu keçib? Dədəm evə gəlibmi? Çərkəz hardadır? Mən qapıdan içəri girəndə nə deyəcək? Yəqin boynumu qucaqlayıb "Nə yaxşı gəldin, ay Güləsər, – deyib üzümdən öpəcək. – Sənsiz lap darıxmışdım". Bəlkə, döşümdən itələyib heç içəri buraxmayacaq?!

Qızı dəhşət götürdü. Ağlına gələn qara fikirlər ildırım kimi çaxıb onu sarsıtdı. Axı, onun qolundan yad kişi yapışmışdı! Yəqin ki, bu saat şenliyin adamları onun götürülüb qaçırıldığını bilirlər. Ağıllarına cürbəcür fikirlər gəlir. Aman Allah, nə böyük rüsvayçılıqdır! İndi mənə kim inanar? Üzümü qaralayıb, eşşəyin belində tərsinə oturdub, kəndin içində gəzdirməzlərmi?

Qız hıçqırdı. Ancaq onu eşidən olmadı. Kürək çəkildikcə şütüyən qayıq xırdaca ləpələri yarıb suyu şappıldadırdı. Şamxal qabaq tərəfə keçdi. Qayığın burnu sahil daşlarına dəyib xırçıldayanda, atılıb kənara çıxdı. Qarışıq fikirlərdən hələ də özünə gələ bilməyən Güləsəri astadan səslədi. Əlindən tutub sahilə çıxartdı. Qayıqda oturan Tapdıq pıçıltı ilə dilləndi:

– Mən də gəlimmi?

– Yox, özümüz gedərik.

– Birdən yolda-zadda...

– Heç nə olmaz, sən qayıt.

Tapdıq qayığı itələyib sahildən aralandı, suyun axarı ilə aşağıya doğru getdi. O, yarğanların kölgəsində gözdən itəndə Şamxal Güləsərin qolundan yapışdı. Qız yenə də titrədi.

Onlar kənd itlərini duyuq salmamaq üçün çəmənliyin ortasındakı cığırla getdilər. Güləsər qabağa düşmüşdü. Şamxal isə ağır-ağır addımlayırdı. Qız az qala qaçır, qurşağa çıxan otların arasıyla kölgə kimi irəliləyirdi. Sürüdən ayrı düşən qoyun da belə, müti halda canavarın qabağınca qaçır.

Onlar dəyirmanın üst tərəfindən keçib qaşdakı tut ağacının yaxınlığında dayandılar. Kənd zülmət içində idi. Cırcıramalar səs-səsə vermişdilər. Arabir sudan sıçrayan iri balıqların şappıltısı eşidilirdi. Dəyirmanın novuna tökülən suların şırıltısı arasında çaxçağın qulağa dəyən boğuq taqqıltılarına qarışırdı.

Şamxal təpələrin dalından yenicə doğan ay işığında qızı başdan-ayağa süzdü.

– İndi fikrin nədir? Hara getmək istəyirsən?

Qız dinmədi. Yerindəcə silkələnib dayandı. Danışmaq istədisə də bacarmadı. Yaş onu boğdu. Yaylığının ucunu ağzına salıb didişdirdi.

Şamxal onu evlərinə buraxan deyildi. Əgər qızı qaytarsa, sabah baş qaldırıb, şenliyin arasında gəzə bilməzdi. Cavanlar onu məsxərəyə qoyub gülər, kənd arasında, doqqazda oturan kişilər salamını da almazdılar, "bivec, – deyə ələ salardılar, – gül parçası kimi bir qızı da özünə ram edə bilməyib. Daha o nə kişidi?" Qaçırılan qızın bəkarətinin pozulmadan geri qayıtması oğlan üçün ölüm sayılırdı. Ona görə vəhşilik dərəcəsinə gəlsə də, heç kəs qaçırdığı qızı salamat buraxmaq istəmirdi. Burada ikinci bir cəhət də vardı. İsmətini itirmiş qız, ömürlük işgəncə də olsa, həmin adamla qalıb yaşayır, bir də geri, atasının evinə qayıtmırdı. Şamxal bunları çox yaxşı bilirdi və dediyindən də dönən deyildi. Ancaq Güləsəri də incitmək istəmirdi. Bir də, qızın ona meylli olduğunu duymuşdu. Elə buna görə də bir az arxayın tərpənirdi.

– Özün bilən yaxşıdır. Tərtəmizsən. Əlim-ayağım dəyməyib. Ancaq sənə kim inanacaq?

Elə Güləsəri də sarsıdan bu idi.

Şamxal onun tərəddüd etdiyini görüb, qələbəsinə əmin oldu və heç nə soruşmadan qızı kirimişcə qabağına salıb evə gətirdi.

Qara damda təkcə oturub, vahimə içində qardaşını gözləyən Salatın gecə yarıdan sonra şıqqıltı eşidib, həyətə çıxdı. Səksəkəli halda:

– Adam, kimsən? – Deyə soruşdu.

Şamxal astaca dilləndi:

– Mənəm.

– Ay qağa, adam da...
– Səs salma!
Salatın qardaşının yanında başqa bir adamın da gəldiyini görüb susdu. Onlar çardağın qabağında dayandılar.
– Tez ol, çırağı yandır, bunu içəri apar. Yazıq tir-tir əsir. Üst-başı sudur.
Salatın çuxaya bürünüb kölgədə dayanan qızı tanımadı.
– Bu kimdir?
– Güləsər.
– Güləsər? Ay qağa, nə elədiyindir?
– Uzun danışma. Nə deyirəm ona bax!
Salatın çırağı yandırıb qabağa keçdi. Şamxal yerindəcə donub qalan qızı itələyib içəri saldı. Sonra bacısını səslədi:
– Quru paltarın varsa, ver dəyişsin.
Onlar içəri keçdilər. Salatın soyuqdan gömgöy göyərmiş qıza baxdı. Güləsər uçum-uçum uçunurdu. Lakin soyuqdan çox, qarşıdakı məchulluq onu titrədirdi.
– Ay qız, bu nə işdi?
Güləsər uşaq kimi kövrəldi və birdən Salatının boynuna sarılıb hönkürdü. Onlar xeyli beləcə dayandılar. Güləsər ağlayıb ürəyini boşaltdı.
– Qurban olum, mənə bir yol göstər.
– Nə yol? Daha gəlib çıxıbsan.
– O mənə heç nə eləməyib. Bəlkə gec deyil, evimizə gedim?
Salatın həyadan qızardı. Qızlıq ismətinin bakirəliyini saxlamağın çox çətin olduğunu bildiyindən, Güləsərin halına acıdı. Bir də, o geri qayıtsa daha pis olmazdımı? "Kasıb qız idi, bir gecə saxlayıb buraxdılar", – deyə yazığı daşqalaq etməzdilərmi? Aralığa qan düşməzdimi? Bir düşmənçilik də bu yandan başlamazdımı? Bunları fikirləşən Salatın yaşlı qadınlar kimi Güləsərə öyüd-nəsihət verməyə başladı:
– Heç yana getmək lazım deyil. Şenliyi özünə güldürməkmi istəyirsən?
Salatın hirslənmişdi. Qardaşının heç kəslə məsləhətləşməyib, özbaşına arvad alması ona yaman toxunmuşdu. "Bu gədə lap ağlını itirib. Axırda kişinin ürəyi partlamasa yaxşıdır", – deyə xəyalında onu asıbkəsirdi. Digər tərəfdən, ürəyinin lap dərinliyində baş qaldıran bir hiss onu sevindirirdi. Qardaşı evlənirdi. Məgər o bu günü çoxdan arzulamırdımı? Tez-tez Şamxala sataşıb "nə vaxt gəlin gətirirsən?" – deyən

o deyildimi? Bəs indi niyə hirslənir? Gülüb oynamaq əvəzinə niyə qaşqabağını tökür? Bu suallara Salatın özü də cavab tapa bilmirdi. Bəlkə qardaşının belə xəlvəti evlənməyi, cah-cəlalla toy etməyib, qız götürüb qaçması ona toxunurdu? Axı, Salatın Şamxalın toyunda doyunca oynamağı əhd etmişdi! Onun arzuları niyə puç olurdu? Bəlkə Güləsəri bəyənmirdi? Yox, Güləsər onun çoxdan xoşuna gəlirdi. Onlar az-az görüşsələr də, bir-birinə çox yaxın idilər.

– Yaxşı, bəsdi. Yad yerə ha gəlməyibsən?

– Axı mən belə istəmirdim.

– Nə bilirsən, bəlkə bu yaxşıdır.

– Qurban olum, məni danlama.

Salatın birdən-birə ayılan kimi oldu. Dolaşıq fikirlərdən yaxasını qurtarıb, Güləsərin üzündən öpdü.

– Belə xoş gəlibsən. Qədəmin yüngül olsun. Allah sizi qoşa qarıtsın! Bir də ki, ay şeytan, naz eləmə, özüyün ürəyindəndir. Pişiyin könlü samanlıqdaydı, it də vurdu samanlığa saldı. Daha nə istəyirsən?

Elə bil Salatını birdən-birə dəyişdirdilər, azca bundan əvvəlki donuq qız haraya isə çıxıb getdi. Əvəzinə şıtıx, qaş-gözünü oynadıb gülən ayar bir qız gəldi. O tez sandığı açdı. Quru paltar çıxartdı.

– Aman Allah, gör necə də titrəyirsən? Aaz, gömgöy kəsilibsən. Tez ol, əynindəkini soyun. Al, Allah eləməmiş naxoşlayıb-elərsən, biabırçılıq olar. Tez-tez.

Bu yüngüllük və şıtıxlıq Güləsərə də təsir etdi. Onun da çöhrəsi açıldı. Qaşlarını oynadıb gülümsündü. Salatın çırağın işığında onun yaşlı gözlərinin dərinliklərində parlayan qığılcımları duydu. Qız koftasını soyunanda Salatın Güləsərin alt paltarının da islaq olduğunu gördü. Onun yenicə ətə dolan ağ sinəsinə baxdı. Yaş köynək qızın yumru döşlərinə yapışmışdı. Bəzi yerlərdə ətlə paltar arasında hava qalmışdı. Ağ zolaqların arasında açıq-çəhrayı rəngə çalan bədəni görünürdü.

Salatının ürəyi çırpınırdı. Gicgahlarındakı damarlar nəbzinin ahənginə uyğun olaraq vurmağa başladı. Elə bil qızın sifətinə isti buğ verdilər. Yanaqları allanıb pörtdü. Birdən Güləsər də dayandı. Əlindəki donu sinəsinə tutub geri çəkildi.

– Sən Allah, üzünü o yana tut. Qoy köynəyimi dəyişdirim.

Onlar bir-birinin bədənini çox görmüşdülər. Elə uşaqlıqdan Kürdə yan-yana çimir, bir-birindən çəkinmədən soyunub suya atılırdılar. Hətta bəzən bir-birini suya basanda zarafata salıb döşlərini sıxırdılar. Amma

indi Salatın qıza baxanda qardaşı Şamxalı gözünün qabağına gətirdi və özünü itirdi.

– Yaxşı, soyun, – deyə ondan aralanıb yük yerinə yaxınlaşdı.

Dəhlizdə ayaq tappıltısı eşidildi. Salatın yüyürüb qardaşının qabağını kəsdi:

– Gəlmə, qoy qız paltarını dəyişsin.

O, qardaşını geri qaytarıb taxtın üstünə yorğan-döşək saldı. Yastıqları qoşalayıb yan-yana qoydu. Küncdə dayanıb ona tamaşa edən Güləsərin üzündən öpdü. Çıxıb getmək istədi. Qız buraxmadı. "Getmə, qorxuram", – deyə titrədi. Salatın onu taxtın üstündə oturdub, qoşa yastıqlara baxdı:

– Heç nə olmaz, – deyə qımışdı və qızın üzündən bir də öpdü, cəld otaqdan çıxdı.

Şamxal içəri girəndə Güləsər özünü elə itirdi ki, zifaf gecəsində necə hərəkət etməli olduğu haqqında vaxtı ilə gəlinlərin ona öyrətdiklərini unutdu. Durub Şamxalın ayağını basdalamadı və beləliklə də bütün ömrü boyu evdə "üstünlük qazanacağı" ehtimalını əldən verdi. Şamxal onun titrəməsinə, qısılıb küncə çəkilməsinə əhəmiyyət vermədi. Sakitcə:

– Soyun yat, ayaq üstə niyə durmusan? – dedi.

Güləsər yorğanın arasına necə və nə vaxt girdiyini bilmədi.

Çıraq söndü.

Bacadan süzülən ay işığı torpaq döşəmənin ortasına ağ bir ləkə saldı. Güləsər yad və isti bir bədənin təmasından diksinib titrədi...

Dan yeri sökülürdü. Şenliyin xoruzları səs-səsə verib banlaşırdılar. Şərq tərəfdə üfüq ağarışır, göyün üzü qızarırdı. Bu qızartı getdikcə çoxalır, Kürün sularını belə alovlandırırdı. Çəmənliklərdə və yolların kənarında səkən quşlar yeni bir səhərin açıldığını duyub oxuyurdular...

## 11

Salatın bütün gecəni narahat yatdığından, yalnız səhərə yaxın şirin yuxuya getdi. Xoruzlar banladı, toyuqlar tardan töküldü, qapılarda mal-qara mələşməyə başladı, ancaq o oyanmadı. Həmişə dan yerinə səda düşəndə ayaq üstündə olub qapı-bacada hərlənən qız, yatıb yuxuya qaldı. Çardağın bacasından süzülüb, üzünə düşən işıq da onu oyada bilmədi. Bacısını birinci dəfə belə yorğun görən Şamxal daya-

nıb qıza xeyli tamaşa etdi. Salatın yorğanı üstünə çəkib paltarlı yatmışdı. Saçları yastığa dağılmışdı.

– Qalx, çaydan-çörəkdən hazırla.

Salatın gözünü açsa da, heç nə başa düşmədiyindən, maddım-maddım qardaşının üzünə baxdı. Yerin içində gərnəşib bərkdən əsnədi. Ancaq yenə çevrilərkən, ot tayasının bərabərindən ona boylanan günəşin şüaları düz gözünün içinə düşdü. Əzik donunun ətəyini aşağı çəkdi. Saçını gözünün üstündən geri elədi.

– Qıza da baş çək.

Yalnız bundan sonra məsələni başa düşən Salatın diqqətlə çiyni tüfəngli qardaşına baxdı.

– Tezmi qayıdacaqsan?

– Bir az fırlanıb gəlirəm.

Şamxal hələ də yuxudan tamam ayılmamış bacısını başdan-ayağa süzüb gülümsündü və tüfəngini çiyninə aşırdı. Salatın cığırla uzaqlaşan qardaşının arxasınca baxdı. Ona elə gəldi ki, Şamxalın kürəyi dünənkindən xeyli enlənmiş, elə boyu da uzanmışdır. Hətta, deyəsən, səsi də dəyişmişdir. Amma nədənsə bir az süst kimidir. Yerişində bir ağırlıq var. Dünənəcən qırğı kimi süzən Şamxal indi ağır-ağır addımlayır, bircə gecənin içində yaşa dolub toxtamış kimi görünürdü. Qardaşında hiss etdiyi bu dəyişiklik həm onu sevindirdi, həm də nədənsə qüssələndirdi. Elə bil qız, uzaq, əlçatmaz bir aləmlə vidalaşdı. O, kəlağayısının ucu ilə yaşarmış gözlərini quruladı. "Boyuna qurban olum, ay qardaş, lap kişi həddinə dolubsanmış", – deyə xəyalından keçirdi. Sonra da ocaq yerindəki kösövü qorlandırıb alışdırdı. Qazan asıb, samovara od saldı. Çalğını götürüb, qapı-bacanı süpürdü. Ancaq içəri, Güləsərin yanına gedə bilmədi. Bir-iki dəfə ayaqlarının ucunda qapıya yaxınlaşdısa da, ürəyinin çırpındığını hiss edib geri qayıtdı. İndiyə qədər bir yerdə oynayıb güldükləri Güləsərin üzünə necə baxacağını təsəvvürünə gətirə bilmədi. "Axı mən ona nə deyəcəyəm? Qız gözümün qabağında duranda ətim çimçişir. İçəri getsəm danışmağa söz də tapmaram".

Güləsərin də səsi-səmiri gəlmirdi. Görünür, o da utandığından eşiyə çıxa bilmirdi.

Gün xeyli qalxdı. Sığırçılar malları haylayıb apardılar. Salatın qaynatdığı çayı təzədən isitməli, düşürdüyü qazanı yenidən ocağa asmalı oldu. Şamxal gəlmədi. Qız darıxdığından, doqqaza doğru getdi və gözləmədiyi halda Şahnigarla qarşılaşdı.

– Səndən nə əcəb, ay bibi?
– Mən sizin kimi etibarsız deyiləm.
Şahnigar qucaqlayıb qızın yanaqlarından, alnından öpdü. Dinməz-söyləməz çardağın yanına qədər gəldilər. Arvad xeyli ocaqdakı qazana, hələ əl dəyməmiş stəkan-nəlbəkiyə, taxtın üstündəki yorğan-döşəyə, sonra da bağlı qapıya baxdı.
– A-a-a-z, bu viranın uşaqları hələ durmayıblar? Günorta olub, bu qədər də yatmaq olarmı?
– Kimi deyirsən, ay bibi?
– Necə yəni kimi, təzə bəylə gəlini.
– Bunu sən hardan bilirsən?
– Yerlər qulaqlıdır.
Salatın əli üzündəcə quruyub qaldı. Qorxu və həyəcanla bibisinə baxdı. Bu xəbərin belə tezliklə yayılacağını gözləmədiyindən özünü itirdi. Ona elə gəldi ki, bu saat bibisinin ardınca şenliyin camaatı bura töküləcək, hamı onları daşqalaq edəcək. Qız hamıdan çox atasından qorxurdu. Oğlunun tutduğu işdən kişinin qəzəblənəcəyini yaxşı bildiyindən, Salatının ürəyi uçurdu. Qızdırmalı adamlar kimi titrəyib saraldı. “Bəlkə bibim elə al dillə bir xəbər tutmağa gəlib? Əhvalatı öyrənəndən sonra hay-haray salacaq? Bəs Şamxal niyə ləngidi? Allah, sən özün saxla”.
Qızın bu halı Şahnigarın gözündən qaçmadı.
– A-a-a-z, sənə nə oldu, rəngin niyə saraldı?
– Qurbanın olum, ay bibi, dədəm bilirmi?
– Biləndə nə olar?
– Qorxuram araya qan düşə.
– Heç nə olmaz. Bir də, bu sirri hələ məndən başqa heç kim bilmir.
– Bəs sən hardan?..
– Tapdıq dedi.
– Ağzından söz qaçırmaz ki?
– Tapşırmışam.
– Bilmirəm bu işlərin axırı necə olacaq?
– Bəd-bəd danışma. Get uşaqları qaldır, bəsdir yatdıqları.
– Qağam yoxdu.
– Haraya gedib?
– Kürün qırağına.
– Belə de... Bə burada niyə durmuşuq, gedək.

– Yazıqdı... Qoy qız yatsın.

– Bıy-bıy, başıma xeyir, ay qız, deyəsən bizi bəxtəvərə salacaqsan, yatmaq nədi? Bəri gəl görüm.

Şahnigar incə bir şuxluqla qaş-gözünü oynadıb güldü. Yanaqlarında qırmızı ləkələr əmələ gəldi. Dingəsindəki qızıl pullar titrəyib cingildədi. Xırdaca çənəsi buxağın içində itdi. Sıx dişləri parıldadı. Salatın, həmişə deyib-gülməkdən xoşu gələn bibisinin yenə də şitlik edəcəyini bilib qızardı. İçəri getmək istəyən arvadı saxlamağa çalışdı.

– Yaxşı deyil, qoy qağam gəlsin.

– Belə dur görüm, qağan kimdir?

Şahnigar yenə qəhqəhə çəkdi. Sonra Salatını ehmalca kənar edib, qabağa düşdü. Ləngərlənə-ləngərlənə qapıya yaxınlaşdı. Onun zər baftalı, qırçınlı atlas donunun qırçınları dalğalandı. Arvad dəhlizdə ayaq saxlayıb, arxasınca gələn Salatına göz vurdu.

– Gedək görək nə qələt qarışdırıblar.

O, yenidən uğunub keçdi...

Güləsər yorğan-döşəyi yığıb, taxtın küncündəcə oturmuşdu. Elə bil kiçilib gözdən gizlənmək istəyirdi.

Şahnigar gözü alışana qədər qapının ağzında dayandı. Sonra səliqə ilə süpürülmüş evə, yük yerindəki yorğan-döşəyə, taxtın üstünə salınmış palaza baxdı. Təzə gəlinin tezdən durub evi yığışdırması onun xoşuna gəldi. Qapını taybatay açıb irəlilədi.

Güləsər nə edəcəyini bilmədi. Elə əvvəlki kimi büzüşüb otursunmu, yoxsa ayağa durub Şahnigarın qabağında dizmi çöksün? Görəsən arvad ona nə deyəcəkdi? Saçından tutub bayıramı atacaqdı, yoxsa qucaqlayıb öpəcəkdi?

Güləsər fikrini toplayana qədər Şahnigar onun başının üstünü kəsdirdi. Əlini belinə qoyub, daha da büzüşən gəlinə baxdı. Arvadın səsi qazma evin divarlarında cingildədi:

– Bir ayağa dur görüm, qardaşım oğlu sənin nəyinə aşiq olub?

Güləsər sürüşüb taxtdan düşdü. Verilən sualın mahiyyətini anlamadığından başını aşağı saldı. Bundan daha ağır, təhqirli sözlər gözlədi. Şahnigar isə qızın ətrafında dolanıb, ağzını marçıldatdı:

– Hm... pis deyilsən. Bir belə fırlan görüm... Qəşəngsən. Vallah, düz sözümdür. Meymun ağzının dadını bilirmiş... ha...ha...ha... Başını niyə aşağı salırsan? Üzümə bax, utanma. Hamımızın başına gələn iş deyilmi? Eh, kaş qız olub, təzədən ərə gedəydim.

– Ay bibi, bəsdi.

– Nə olub, ay qız, ərə getmək pisdir? Vallah, hamınızın ürəyi zoqquldayır. Bığıburma bir oğlan qabağına çıxsa getməzsən? Hə, niyə irişirsən? Deyəsən xoşun gəlir?

– Sən Allah, ətimizi tökmə.

– Tökülməz. – O, üzünü yenidən Güləsərə çevirdi. – Sən ona qulaq asma, qızım, cavanlıq gözəl şeydir. İllaha da ərin qəşəng olanda. Gecələr ki, qucaqlaşıb nəfəs-nəfəsə yatırsan, su da töksən ayırmaq olmur. İstəyirsən ki, qollarıyın arasındakını beçə balı kimi sorub yeyəsən. Amma neyləyim ki, mənim bəxtim gətirmədi... Hə, belə işığa gəl görüm... Sir-sifətinə diqqətlə baxmaq istəyirəm. Boy, gözləriyin altı nə yaman qaralıb? Yəqin qırışmal səni yamanca yorub, hə, eləmi? Qoy bircə qayıtsın, gör başına nə oyun açacam!

– Bibi, bəsdir, qızı utandırma.

– Nə utanmaq, ay bala, ərə getməyi bilən adam utanmaz.

Şahnigar qəşş edib, taxtın üstündə oturdu. Güləsəri də çəkib yanında əyləşdirdi. Gəlinin utanıb büzüşdüyünü görəndə daha da şaqqıldadı:

– Niyə qısılırsan, pis oğlana gəlibsən? Yoxsa qorxursan?

– Vallah, nə bilim?

– Ürəyinə heç nə gətirmə, bir qız bir oğlanındır. Yaxşı eləyibsən.

– Kaş hamı sənin kimi olaydı.

– Olmurlar olmasınlar. Ağrım ürəklərinə. Təki məni ərim çox istəsin... hə... ürəyini sıxma, yeməli şeysən, Şamxal səndən əl çəkməz. Ancaq sən də gərək bir az usta olasan, kişini əldə saxlaya biləsən. Kişi ki, var, pişik kimi şeydir, sığallayıb qılığına girdin, qurtardı. Olmaya-bilməyə kəcinə çəkəsən, eşitdinmi?.. Yaxşı, de görüm qardaşım oğlu naz-zad qanırmı? Sənin kimi telli-toqqalı gəlinin işvəsinə dözə biləcəkmi?

– Ay bibi, sən Allah, üzümüzün suyunu tökmə.

– Üzünüzün suyunu niyə tökürəm, ay bala, düz sözümdür. Kişi ki, naz-qəmzə bilmədi, ondan bir uzunqulaq yaxşıdır. Bircə qulaq as.

O, çiyninin üstündən sürüşüb düşən hörüyünün ucunu əlinə aldı. Sinəsinə basıb saz kimi çaldı. Evin ortasında aşıqsayağı fırlana-fırlana astadan, lakin məlahətli səslə oxumağa başladı:

İşvə bilməz, qəmzə bilməz, naz bilməz,
Sevgi bilməz, söhbət bilməz, saz bilməz.

Söz eşitməz, qaş anlamaz, göz bilməz,
Ana, məni bir nadana verdilər,
Günahıma, babalıma girdilər.

Qoyun deyil qoyunlara qatam mən,
Öküz deyil çodarlara satam mən,
İgid deyil qucaqlaşam, yatam mən,
Ana, məni bir nadana verdilər,
Günahıma, babalıma girdilər.

Mahnını qurtaran kimi yenə qəhqəhə çəkdi. Fırlana-fırlana gəlib taxtın üstündə oturdu. Güləsərin qəlbinə çökən qurğuşun ağırlıqlı kədər elə bil yoxa çıxdı. Salatın da uğunub getdi.

– Sən lap aşıqsanmış ki, ay bibi, nə yaman oxuyursan?!

– Məni dərd oxudur, a bala, dərd. Qıraqdan baxan da adımı arsız qoyur.

– Allaha şükür, sənə nə olub ki, ay bibi, varın, dövlətin.

– Eh, neyləyirəm varı, ay bala, bir bığıburma ərim olsaydı, onların hamısına dəyərdi.

– Qabağına duran ha yoxdur.

– Ağzın isti yerdədi deyin, ərə getmək sənə asan gəlir. Elə bilirsən hər papaq geyinənlə bir yastığa baş qoymaq olar? Ağrım ürəklərinə, onların çoxunun elə qaraltısı var. Kişi gərək axır nəfəsinə qədər qırğı kimi şövqlü ola, qucaqlaya, dişləyə, sən də ləzzət alasan. Kürt toyuq kimi yanını kəsdirib oturan yatağan öküzdən nə çıxar?

– Ay bibi, acığın tutmasın, – deyə Salatın çəkinə-çəkinə çoxdan ürəyində dolaşan sualı verdi. – Rəhmətlik Əbil dayını özün sevib-seçmişdin?

– Yox, ay bala, – deyə arvad dərindən köksünü ötürdü. – Mən istəyən oğlan dədəyin qorxusundan heç papağının ucunu göstərə bilmədi. Sıxma-boğmaya salıb, mənciyəzi Əbilə verdilər. Rəhmətlik pis kişi deyildi, birtəhər dolanırdıq. Allah onu da mənə çox gördü, apardı qara torpağın altına. İndi qalmışam qara damın altında tək. Bilmirəm dulam, yoxsa gəlin.

Salatın bibisinin kövrəldiyini və bu saat uşaq kimi doluxsunub ağlayacağını duydu. Araya söz qatmaq və onun fikrini yayındırmaq üçün arvadı qucaqladı.

– Sənə nə olub, qocalmayıbsan ha?!

– Düz deyirsən, amma eşitməyibsənmi “Ömür keçir, gün keçir, cavan olmaram bir də mən”. Cavanlıq gözəl şeydir, onun qədrini bilin. Nə qədər bacarırsınız kefinizi sürün, sonra peşman olarsınız.

Şahnigar gözünün yaşını silib, gülümsəməyə çalışdı. Onun nəm bəbəkləri parıldadı.

– Məni danışdırıb, dərdləndirdiyiniz bəsdir. Başımı qatmayın. Mən buraya vacib iş üçün gəlmişəm.

O, taxtın yuxarı başında, küncə yığılmış yorğan-döşəyə ötəri nəzər saldı. Sonra da ehmalca Güləsərin böyrünə toxundu.

– Üz ağlığını göstər görüm.

– Bibi!..

– Sən işində ol, mən nə elədiyimi bilirəm. Niyə durursan?

Güləsər həyadan yerə girəcək olsa da, arvadı şübhəyə salmamaq üçün gözünün ucu ilə taxtın yuxarı tərəfinə doğru baxdı. Salatın üzünü çevirib, qapıya sarı getdi və dayandı. Şahnigar yorğan-döşəyin arasındakı mələfəni tapdı və birdən uşaq kimi evin ortasında oynadı. Güləsər üzünü əlləri ilə qapadı. Ancaq Şahnigar onun qolundan yapışıb, bacadan süzülən işığa gətirdi. Qızı qucaqlayıb marça-marçla öpdü.

– Üzün ağ olsun, qızım, indən sonra sənə canımı da qurban eləyərəm.

O, yenicə görürmüş kimi qızın əynindəki nimdaş paltarlarına, yalın ayaqlarına baxdı. Dərindən köksünü ötürdü. Qardaşıgildə olub-keçənləri unutmağa çalışıb gülümsündü. Əvvəlcə barmağındakı yaqut qaşlı üzüyü çıxartdı. Sonra da ağ buğumlu biləyindən bilərziyi açdı.

– Yaxın gəl, görüm. Bax bu sənin nişan üzüyün, keçirt barmağına, bu da bilərziyin, bibi payıdır, götür. Sonra nəyin çatışmır?

Salatın özünü sındırmaq istəmədi. Həm də qardaşının evdə dava salacağından qorxduğu üçün verilən şeyləri Güləsərdən alıb, geri qaytarmaq fikrinə düşdü.

– Ay bibi, özünün üzüyünə nə gəlib, hər şeyi var.

– Hər şeyi var, bəs niyə bu kökdədir, hanı gəlinin paltarı? Tez ol, sandığı aç.

Salatından qabaq özü yük yerinin yanındakı sandığa yaxınlaşıb qapağını qaldırdı. Qardaşı qızının ipək paltarlarından bir dəst çıxarıb Güləsərin üstünə atdı.

– Tez ol, geyin. İkiniz də bir boydasınız.

– Lazım deyil.

– Götür, götür, – deyə Salatın sözə qarışdı. – Mənim ya sənin, nə təfavütü var?

Şahnigar özü Güləsəri soyundurdu. Təzə paltar, ayaqqabı geyindirdi. Bilərziyi qoluna taxdı. Barmağına üzük keçirtdi. Belindəki qızıl suyuna çəkilmiş enli gümüş kəməri də açdı.

– Al, bağla görüm necə yaraşır? Bax belə. İndi oldun nazənin sənəm. Dayan, dayan. Al, bu da baş qızılın. Üç qatardı. Rəhmətlik kişi Tiflisdən, bir ləzgi zərgərindən almışdı. Qara məxmərin üstündə lap qəşəng görünür. Kəlağayının altından bağla. Bəh-bəh, lap gül kimi açıldın. Hanı, qulağını göstər görüm. Deşdirməmisən? Niyə? Belə şeyləri adam atası evində deşdirər. Yoxsa sırğasız gəzmək istəyirsən? Qoymaram, hər şeyi özüm düzəldəcəyəm. Bu saat qulağını da deşəcəyəm, sırğa da taxacağam. Ay Salatın, kömək elə, mənə iynə-sap, bir az da kömür gətir.

– Ay bibi, başımıza oyun açma.

– Dedim ki, əl-ayağıma dolaşma.

Güləsərin etirazına fikir vermədən iynəni sapladı. Gəlinin qulağını deşdi. Kömür sürtüb, qanı kəsdi. Dərhal da sırğalarını çıxarıb, Güləsərin qulağına keçirtdi.

– Ağrımadı ki?

Gəlin üz-gözünü turşutmuş olsa da, gülümsəməyə çalışdı.

– Yox, ağrımadı.

– Ay Salatın, bir az sürmə ver.

– Hardan alım?

– Yoxundu? Özümdə tapılar.

– Ay bibi, sən Allah, qızın üz-gözünü qaralama.

– Sən belə şeyləri başa düşməzsən, kənara dur. Bax belə. İndi oldun sudan gələn sürməli qız. Bəh-bəh... Qoy indi qardaşım oğlunun hünəri var, qabağında dursun.

Təzə paltar və zinətdən sıxılan Güləsər həyadan puçur-puçur tər tökdükcə, Şahnigar onun ətrafına fırlanıb çırtıq çalır, gah oxuyur, gah da şaqqıldayıb gülürdü.

– Vallah, sənin işlərindən baş açmaq çətindir, ay bibi.

– Nə baş açacaqsan, a-az, tez ol çaydan, çörəkdən gətir... Bə bu qırışmal harda qaldı?

– Burdayam, ay bibi.

– Bıy, boyuna qurban, gəlibsənmi? Bə niyə dinmirsən? Qapının ağzındaca durub bizi pusursan?

Şahnigar quş kimi qanadlanıb Şamxalı qucaqladı. Onun əlindəki qırqovulu taxtın üstünə qoymağa imkan vermədi. Uşaq kimi qardaşı oğlunun boynundan asıldı. Salatın Şamxalın vurduğu quşları və tüfəngi qardaşının əlindən aldı. Güləsər ayağa qalxdı. Şahnigar bəzəndirdiyi gəlini qardaşı oğluna göstərdi.

– Hə, necədir, xoşuna gəlirmi?

– Bu nədir, ay bibi?

– Görmürsənmi, təzə gəlinimizdir. Yoxsa arvadını tanıya bilmədin? – O əlini əlinə vurub şaqqıldadı. – Deyəsən, gözün qamaşdı? Siz kişilərə belə lazımdır. Bura bax, qardaşoğlu, gəlin gərək tovuz kimi bəzəkli olsun, bildinmi? Yoxsa bu nədir, qızı çılım-çılpaq gətirib soxubsan qara dama. Əynində abırlı bir paltarı da yoxdur.

– Alacam.

– Alacam? Bə nə vaxt? Toydan sonra nağara? Yox, xoşuma gəlmirsən. Adam bir iş görəndə əməlli-başlı fikirləşər, böyük-kiçiyə məsləhət elər. Niyə əvvəlcə mənim yanıma gəlmirdin? Allaha şükür, bibin hələ sağdır.

– Özün ki, hər şeyi bilirsən?

Şamxalın qaşqabağı töküldü. Şahnigar nahaq yerə onun üstünə düşdüyünü dərk etdi. “Deyib-gülmək əvəzinə köhnə yaraları təzələməyin nə mənası var?” – deyə düşündü. Vəziyyətdən çıxmaq üçün yenə zarafata başlamağı münasib bildi. Özünəməxsus bir şuxluqla gözünü qıyıb, qardaşı oğlunu barmağı ilə hədələdi:

– Bax, gəlini incitmə ha, yoxsa dostluğu pozarıq. Yaxşı, de görüm belə tezdən cavan arvadı qoyub hara getmişdin? Ova? Göstər görüm nə vurmusan? Qırqovul? Bax buna varam. Vallah, xoşuma gəldin. Deyəsən, arvadın qədrin bilən olacaqsan. – O, Salatının əlindən qırqovulları alıb diqqətlə baxdı. Düz gəlinin yanına gəldi. Quşları yuxarı qaldırıb, parıldayan zərli lələklərini, yaşılı rəngə çalan xınalı boynunu sığalladı. – Daha nə istəyirsən, ay Güləsər, ərin indidən səni qırqovul əti ilə yemləmək istəyir. Gərək sən də onun əməyini itirməyəsən. Qırqovula dönüb ortada süzəsən. Buğum-buğum cığa tökəsən. Hə, niyə durubsunuz? Tez olun, ocağa qazan asın.

Şamxal bibisinin yanında oturdu. Salatın quşları götürüb həyətə çıxanda Güləsər də getmək istədi. Şahnigar qızın qolundan tutdu:

– Sən hara? Təzə gəlin bir-iki həftə evdən bayıra ayaq basmaz. Sən gərək bu saat heç gərdəkdən çıxmayasan. Otur yanımda.

Güləsər Şahnigarın böyrünə qısıldı.

Aralığa sükut çökdü. Şamxal söhbətə başlamaq üçün münasib söz tapa bilmədiyindən əllərini ovuşdurur, tutduğu bu işə camaatın, ələlxüsus atasının nə deyəcəyini bibisindən soruşmağa cəsarət etmirdi. Şahnigar da bir anlığa çətinlik çəkdi. Qızların yanında özünü nə qədər sərbəst aparsa da, Şamxalla o qədər açıq danışa bilmirdi. Necə deyərlər, cavan da olsa kişi idi. Kişinin zəhmi isə həmişə ağır olur. Qazma evin yoxsul və ürəksıxıcı görkəmi onları daha da darıxdırdı. Bir anlığa elə bil hava da çatışmadı. Şahnigar qardaşı oğlunun tutqun çöhrəsinə baxıb, köksünü ötürdü:

– Sənnən küsmüşəm.

– Niyə?

– Bunun niyəsini soruşmazlar, çox etibarsızsan. Başına and olsun, düz sözümdür. Özümə söz vermişdim ki, səni qiyamətəcən dindirməyim. Amma neyləyim, yenə ürəyim tab gətirmədi.

– Mən ki, sənə bir pislik eləməmişəm.

– Eləmisən.

– Vallah, yadıma gəlmir.

– Gəlmir, salaram. Əvvəla, de görüm, bu nədir? Heç sənə, Cahandar ağa kimi bir kişinin oğluna, qara damda yaşamaq yaraşarmı? Hə? Niyə dinmirsən?

– Nə eləyəydim?

– Bibin ölmüşdü? O eyvanlı qoşa otaqları sənin əlindən alan vardı? Niyə gəlmirdin? Yoxsa qorxursan, yerimi dar eləyərsən? Görünür, sən bibini hələ yaxşı tanımırsan, qardaşoğlu, mənim varım, dövlətim, nəyim varsa, hamısı sənə qurbandır. Heç bilirsən sənin qapına nədən ötəri gəlmişəm?

– Gələndə nə olar, öz evindir.

– Orası elədir. Ancaq mən sizi köçürməyə gəlmişəm?

– Hara?

– Öz yanıma. Ə, insafın yoxdur? Qalmışam qu quşu kimi damın altında tək. Nə olar mənim yanıma köçəndə? Otağın biri sənindir. Divarda xalısı, asma lampası, qab-qacağı, hər şeyi var. Sənə öz əlimlə gərdək də qurmuşam. Heç o yan, bu yanı yoxdur, gedəcəksən. Başını tərpətmə, zornan da olsa aparacam. Salatınla mən bir otaqda qalaram, siz də bir.

– Çox sağ ol, ay bibi, kişi gərək qoltuqda yaşamasın.

– Bərəkallah, qardaşoğlu, yaxşı cavab verdin. Ə, mən yadammı ki, belə söz danışırsan? Mənim sizdən başqa kimim var? Ərim yox, uşağım yox, bir sizsiniz. İndi bu nə cavabdır, mənə verirsən?

Arvad kövrəldi. Şamxal dediyi sözə peşman oldu. Əslinə baxsan, o, bibisinin könlünə toxunmaq istəmirdi.

– İncimə, bibi, elə-belə, sözgəlişi dedim.

– Gərək deməyəsən. Mən sidq ürəklə sənə söz danışıram, sən də... – O, gözünü quruladı. – Bax heç o yan, bu yanı yoxdur. Qaranlıq qarışıb, əl-ayaq yığışdırılanda arabanı qoşursan, evində nə var doldurub birbaş gəlirsən bizə. Eşidirsənmi?

– Hələ axşama çox var, fikirləşərik.

– Heç nə fikirləşmək lazım deyil.

Salatın ehmalca içəri girdi. Bir xeyli tərəddüd içində qardaşının üzünə baxdı. Onun saralmış sifəti yarıqaranlıq evdə daha da solğun görünürdü. Şamxal bacısının nə isə bir söz demək istədiyini, ancaq qorxudan dillənə bilmədiyini anladı. O da həyəcanlandı. "Yoxsa atası bu xəbəri eşidib gəlmişdi? Yenə ata-oğul üz-üzə dayanacaqdır?" O ehmalca ayağa durdu. Dirəyə söykənən bacısına yaxınlaşdı.

– Nə olub?

Salatının dodaqları güclən tərpəndi.

– Səni çağırırlar.

– Kim?

– Çərkəz...

## 12

Şamxal ayağa durub kəmərini daraltdı. Boğazı qaytanlı köynəyinin qırışlarını arxaya tərəf yığdı. Yüngül addımlarla qapıya yaxınlaşdı. Əlini cəftəyə uzatmazdan əvvəl dönüb geri baxdı. Şahnigar xanımın sinəsi qalxıb-enir, Salatın isitməli adamlar tək titrədir, Güləsər isə cəsəd kimi yerindən tərpənə bilmirdi. O bunları görsə də dinmədi, sakitcə divara söykədiyi tüfəngə yaxınlaşdı. Beynində ildırım sürətli fikirlər gəlib keçdi. "Tüfəngi götürsünmü? Yoxsa Çərkəzin qabağına elə-belə, saymazyana, əliboş çıxsın? Onun yanına yaraqlı getmək qorxaqlıq deyilmi? Arvadlar, illah da Güləsər buna nə deyərdi? Elə ilk gündən arvadının gözündən düşməzdimi? Yox, elə-belə, əliboş

gedəcəm. Bəlkə onun silahı var? Qapıya çıxan kimi sinəmi nişan alacaq? Heç əl-ayaq tərpətməyə qoymayacaq? Kimi, məni? Çərkəz mənə, Cahandar ağanın oğlu Şamxala əl qaldıracaq? Vallahi onların külünü torba ilə daşıtdıraram. Hünəri var, tərpənsin!"

O, ehmalca tüfəngi götürüb əlində hərlədi. Şahnigar xanım qardaşı oğlunun ürəyindən keçənləri üzündən oxudu. Onun iki su arasında qaldığını və qəti bir qərara gələ bilmədiyini başa düşdü. Sakitcə Şamxala yaxınlaşdı. Gözlərini onun üzünə zillədi.

– Ehtiyat igidin yaraşığıdır, oğul, kişi kişinin qabağına yaraqsız çıxmaz.

Bu sözdən sonra Şamxal tüfəngin çaxmağını çevirdi. Xəzinənin boş olduğunu görüb, taxtın üstündəki qoltuqaltıdan bir daraq patron götürdü və tüfəngi doldurdu. Çaxmaq şaqqıltısı kəsəndən sonra evdə kiminsə təlaşla nəfəs aldığını duydu. Dönüb Güləsərə baxdı. Onun kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Şahnigar xanımın yenicə qulağına taxdığı sırğalar titrəşirdi. Boynundakı damarlar şişib göyərmişdi. Hər dəfə nəfəs aldıqca sinəsi körük kimi qabarırdı. Gəlin boğulurmuş kimi tez-tez udqunurdu. Şamxal Güləsərin lal baxışlarındakı məzlumluqla bərabər, məzəmmət və yalvarışı da duydu. Geniş açılmış gözlərinin ətrafında həlqələnən yaş gah çoxalıb bəbəklərinin üstünü örtür, gah da geri çəkilib kirpiklərinin dibində titrəşirdi. Şamxal hiss etdi ki, Güləsərin başı hərlənir, hər şey onun gözlərində tor görünür. Bir az da belə keçsə, bəlkə də ürəyi sıxılıb yerə sərələcəkdir. O, arvadının qarşısında acizlik edəcəyini duyduğundan, yönünü çevirdi və getmək istədi. Ancaq Güləsərin yaşarmış gözlərini xəyalından çıxarda bilmədi. Ona elə gəldi ki, kürəyinin ortasını nə isə yandırır, köz kimi deşib ürəyinə keçir və bütün əzalarını sızıldadır. Elə bil güclü əl onu yerindəcə fırlatdı. Birdən özü də hiss etmədən geri çevrildi. Arvadının üzünə baxdı, yenə lal baxışlarındakı yalvarışı gördü. Astaca addımlarla evin ortasındakı dirəyə yaxınlaşdı, tüfəngi mismardan asdı. Arvadların üzünə baxmadan qapını açıb, ağır-ağır həyətə çıxdı.

Çərkəz təzə düşmüş cığırın ortasında dayanıb papiros çəkirdi. Burnunun deşiklərindən fısqırıb çıxan tüstü uzun qoşa zolaq kimi qabağa vurur, sonra isə bir-birinə qarışır və süd rəngli havada əriyirdi.

Şamxal Çərkəzin fısıldaya-fısıldaya papiros çəkdiyini və çiynindəki tüfəngin qayışını barmaqları ilə didişdirdiyini görəndə, silahsız gəldiyinə peşman oldu. Əlini xəncərin dəstəyinə qoyub, "ölmək öl-

məkdir, xırıldamaq nədir, əgər bir balaca əl tərpətsə, sıçrayıb üstünə cummaqdan başqa əlacım yoxdur" – deyə düşündü və səksəkəli halda irəlilədi, həyəcanını gizlətmək üçün təmkinini pozmamağa çalışdı.

Çərkəz yerindən tərpənmədi. Şamxal ona yaxınlaşanda belə başını qaldırmadı. Dostlar xeyli sakitcə dayandılar.

– Xeyirdimi?

Çərkəz hərisliklə sümürdüyü papirosu yerə atıb, tüfəngin qayışını çiynində düzəltdi. Yalnız bundan sonra Şamxalın üzünə baxdı.

– Tüfəngin hanı?

– Neyləyirsən?

– Lazımdır.

– Nəyə lazımdır?

Şamxal Çərkəzin bu saat "Mən yaraqsız adama əl qaldırmaram. Get tüfəngini gətir, sonra danışarıq. Özünü də bilməməzliyə vurma", – deyəcəyini gözlədi. Amma Çərkəz suala sualla cavab verdi.

– Başımıza gələni eşitməyibsənmi?.. Qızı götürüb qaçıblar.

Şamxal dərindən nəfəs aldı. Əlini xəncərin dəstəyindən çəkib, papiros qutusunu çıxartdı. Barmaqları əsə-əsə tütün eşdi. Çərkəzin heç nədən xəbəri olmadığını biləndən sonra daha da həyəcanlandı.

– Yaxşı, indi fikrin nədir?

– İşin yoxdur ki?

– Nədir ki?

– Gedək qızı axtaraq.

Şamxal sakitcə papirosunu sümürüb, tüstünü göyə üfürdü.

Çərkəz dostunun da həyəcan keçirəcəyini, bu xəbəri eşidən kimi əl-ayağa düşəcəyini və onun dərdinə şərik olacağını gözləyirdi. O, elə zənn edirdi ki, Şamxal dərhal tüfəngi götürəcək, yerin altında da olsa, Güləsəri axtarıb tapacaqlar. Çərkəz xeyli vaxtdan bəri Şamxalın Güləsərə meyl saldığını duyduğundan, buna daha çox əmin idi. O, üzdə bir söz deməsə də, bunu etiraf etməyə məcbur olur, elə ona görə də dar ayaqda Şamxala dərdini açıb kömək istəyirdi. Ancaq Çərkəzin gözlədiyinin əksinə bu xəbər Şamxalı narahat etmədi. O, sakitcə papirosunu sümürdü, sonra da xəncərini yana çəkib çöməldi. Çərkəz də tüfəngini dizinin üstünə qoyub, onun yanında sallağı oturdu. Aralığa sükut çökdü. Çərkəz ondan cavab gözləyir, həm də bir az tələsmək lazım olduğunu söyləmək istəyirdi. Şamxal isə tüstünü ciyərlərinə doldurur, heç nədən xəbəri olmayan Çərkəzə nə deyəcəyini, qızı özü götürüb

qaçdığını necə xəbər verəcəyini bilmirdi. Əsl həqiqəti ondan gizlətsinmi, yoxsa "bacın burdadır, görüşmək istəyirsənsə dur, evə gedəkmi" – desin? Bu xəbəri Çərkəz necə qarşılayacaq?

Şamxal papirosunu sümürüb kənara atdı. Səbirsizliklə cavab gözləyən Çərkəzin üzünə belə baxmadan sakitcə dilləndi:

– Hansı tərəfə getmək fikrindəsən?

– O taya. Deyirlər qızı Kürdən keçiriblər.

– Gümanın kimə gəlir, qızı kim aparmış olar?

– Nə bilim?

Onlar yenə susdular. Şamxal mümkün qədər səbirli olmağa çalışdığından, Çərkəzi sakitləşdirmək üçün münasib söz axtarırdı. O hələ də elə etmək istəyirdi ki, Çərkəz vaxtından əvvəl şübhələnməsin. O, "işim var" – deyə boyun qaçırda bilərdi. Ancaq bunu kişiliyinə sığışdırmırdı. O istəmirdi ki, Çərkəz onu qorxaqlıqda ittiham etsin, məsələnin əslini biləndən sonra isə təzədən üstünə gəlib, dava-qalmaqal salsın: "Qızı götürüb qaçmağı bilirsən, amma boynuna almağa kişiliyin çatmır?" – deyə onu yamanlasın.

Aralıqdakı sükut Çərkəzi darıxdırdı. O tələsir, bir quş kimi qanadlanıb, gümanı gəldiyi yerlərə baş vurmaq istəyirdi. Başqa vaxtda bircə işarəyə bənd olan dostu isə indi karvanı batmış kimi daşa dönüb dinmirdi. Ona nə olduğunu başa düşmək çətin idi.

– Nə yaman fikrə getdin?

Çərkəzin səsini eşidəndən sonra Şamxal başını qaldırıb ürkək nəzərlərlə müsahibinin üzünə baxdı.

– Gec deyilmi?

– Nə gec deyilmi?

– Deyirəm, qızı axtarmaq gec deyilmi?.. Dünən aparıblar... İndi yəqin iş işdən keçmiş olar... Təzədən...

– Mənim bacıma heç kəs əl vura bilməz!

Şamxalın dodaqları qaçdı. Bığının altından astaca qımışdı. Çərkəz güclə sezilən bu təbəssümdə özündən razı qalan arxayın bir adam istehzasını gördü.

– Niyə əl vura bilməz?

– Onun anasını ağladaram!

Şamxal nə qədər səbirli olmağa çalışsa da, son sözə dözmədi. Çərkəzə toxunmalı bir cavab verməsə, sakitləşə bilməyəcəyini duydu.

– Çox sinənə döymə, gecikmisən.

– Bura bax, – deyə Çərkəz hirslə ayağa durdu. – Getmək meylin yoxdursa, açıq de, çərən-pərən danışma.
– Ə, nə odlu-odlu danışırsan? Tutaq ki, qızı tapdın, baş kəsəcəksən?
– Niyə kəsmirəm.
– Əlinə nə keçəcək?
– Heç olmasa, ürəyim soyuyar.
– Bacın da qalar ortalıqda, eləmi?
– Bə nə olsun deyirsən, qızın başından keçim?
– Keçmə, niyə keçirsən?
Şamxal yenə qutusunu çıxartdı. Əvvəlcədən bükdüyü papiroslardan birini götürdü. Çərkəz onun alışqanı yandırarkən barmaqlarının titrədiyini gördü. Əgər Şamxalın baxışlarındakı ürkəklik olmasaydı, Çərkəz onun həyəcanlanmasına fikir verməzdi. Ancaq Şamxalın hərəkətləri onu ayıldan kimi oldu. Səhərdən dostunun bir dəfə də olsun onun üzünə şax baxa bilmədiyini, nəzərlərini yayındırıb, yan-yörəsinə boylandığının fərqinə vardı. "Niyə suçlu adamlar kimi gözlərini məndən gizlədir? Söz danışanda gah yerə baxır, gah da çiynimin üstündən o yana boylanır? Heç boynunu da dik qaldırmır. Pələ camış kimi yalmanıb fısıldayır. Yoxsa bu işdən xəbəri var? Onun üçün də dilini sürüyür?"
Çərkəzin sinəsi qabardı. Gözləri ilə Şamxalı yeyəcək oldu.
– İndi nə məsləhət görürsən?
– Bir az gözlə.
– Gözləyə bilmirəm. Heç olmasa qızı hansı köpək oğlunun apardığını öyrənməliyəm, ya yox?!
Şamxal dik atıldı. Əlini xəncərin dəstəyinə aparması ilə yarıya qədər siyirməsi bir oldu. Sinəsini qabağa verib, səsini ucaltdı:
– Ağzını təmiz saxla!
– Nə deyirsən?!
– Deyirəm artıq-əskik danışma!
– Bura bax, sən niyə özündən çıxırsan? Soğan yemiş adamlar kimi için niyə göynəyir?
Şamxal qabağa yeriyib, Çərkəzlə üzbəüz dayandı. O, qəsdən aradakı məsafəni qısaltdı və söhbət müddətində ilk dəfə şəstlə müsahibinin gözlərinin içinə baxdı. Elə bil zəhmli baxışları ilə qarşısındakını sarsıtmaq, ürəyindən keçənləri üzündən oxumaq və eşidəcəyi sözdən sonra onun necə hərəkət edəcəyini əvvəlcədən öyrənmək istədi. Döyüşə hazırlaşan xoruzlar kimi dimdik-dimdiyə dayananların nəfəsi

bir-birini vurdu. Şamxal, bir şey olsa, dərhal rəqibinin əl-qolunu tutmaq üçün özünü bir az irəli verdi və təmkinlə dilləndi:

– Dağa-daşa düşmə, qız məndədir.

Çərkəz yalnız bircə anlığa susdu. Qarşısında dayanan Şamxalın sifətində quyruğunun üstünə qalxıb, adamı çalmağa hazırlaşan şahmar ilan soyuqluğunu duydu. Ona elə gəldi ki, üzünə zillənən gözlərdə ovunu əvvəlcə ovsunlayıb, sonra yeyən bir yırtıcı sehrkarlığı var. Şamxalın üzündəki tüklər də ona zəhərli tikanlar kimi görünürdü. Əgər bircə an da keçsə, Çərkəz fürsəti əldən verəcək, gözünün içinə fısıldayıb qıvrılan Şahmar atılıb boynuna dolanacaqdı. O doğrudan da qəfildən zəhərli ilanı tapdalayan adam kimi dəhşətlə geri atıldı və dərhal da tüfəngi hərlədi. Bir göz qırpımında gülləni lüləyə verdi. Barmağını tətiyə uzadana qədər Şamxal ov güdən pişik cəldliyi ilə irəli şığıdı. Tüfəngdən yapışıb, lüləni yuxarı qaldırdı. Onlar süpürləşməyə başladılar. Şamxal bir əli ilə qundaqdan, bir əli ilə də lülədən yapışıb, tüfəngi həm özündən uzaqlaşdırır, həm də vurub Çərkəzin əlindən almaq istəyirdi. Çərkəz isə var gücü ilə müqavimət göstərir, necə olursa-olsun silahı əldən verməməyə çalışırdı.

Şamxal ayağını Çərkəzin qarnına dayayıb, tüfəngi geri çəkdi. Rəqibinin qolunu qanırıb, silahı qoparmaq istədi. Ancaq bacarmadı. Belə olduqda qundağı yuxarı qaldırıb, lüləni torpağa doğru çevirməyə çalışdı. Çərkəz onun fikrini duyduğundan, var gücünü topladı və barmağını tətiyə yetirdi. Güllə Şamxalın qulağını yalayıb keçdi. Çiynini qarsaladı. Kəsif barıt qoxusu burunlarına doldu. Bundan sonra onlar tüfəngdən daha möhkəm yapışdılar. Hər ikisinin dizi yerə gəldi. Bir anlığa dayanıb, nəfəslərini dərdilər. İkisi də qan-tərə batıb, taqətdən düşmüşdü. Köynəklərinin yaxası açılmışdı. Şamxalın sinəsindən tər axırdı. Çərkəzin islanmış saçı dağılıb, alnına yapışmışdı. Nəfəs aldıqca sinələri qalxıb-enir, genişlənmiş burun pərələrindən nəfəsləri fısqırırdı. Onlar son dəfə güclərini sınayırdılar. Bu ani sükutdan sonra qəti hücumun başlanacağı şübhəsiz idi. Şamxal arada tüfəngi buraxıb, xəncəri siyirməyi ağlından keçirtdi. Lakin ürək eləmədi. Çərkəzin dərhal ayağa durub, çaxmağı yenidən hərləyəcəyindən qorxdu. Bəs nə etməli? O birdən var gücü ilə tüfəngi özünə tərəf çəkib burdu. Çərkəz bunu gözləmədiyi üçün səndələdi. Müvazinətini itirdiyindən, başı çatıltı ilə Şamxalın alnına dəydi. Gözlərindən qığılcım qopsa da, tüfəngi buraxmadılar. Buynuzlarını bir-birinə keçirdib, kəllə-kəlləyə

gələn kəllər kimi yenidən tutaşdılar. Səhər şehinə çilənmiş göy otlar dizlərinin altında əzildi. Torpaq eşim-eşim oldu.

Qardaşı oğlunun ehtiyatsızlıq etdiyindən narahat olan Şahnigar xanım evdə qərar tuta bilmədi. "Gədənin təşəxxüslüyünə bir bax, xalqın qızını gətirib evə, amma qardaşını saya salmır. Bu saat Çərkəz qızıl ilana dönüb, rastına kim gəlsə tas-tas eləməyə hazırdır, bu da tüfəng götürüb onun qabağına çıxmağı şəninə sığışdırmır. Bütüncə dədəsidir", – deyə ürəyində Şamxalı asıb-kəsdi. Qazma damın qulaqları cingildədən sükutu içərisində ürək çırpıntılarını duydusa da, özünü o yerə qoymadı. Ehmalca tüfəngi götürdü. Qapını açıb bayıra atılmağa hazırlaşan Güləsərin qabağını kəsdi. Salatının qolundan tutub geri itələdi. "Oturun yerinizdə!" – deyə onlara acıqlanıb, gözünü ağartdı, həyətə çıxdı. Çardaqda ayaq saxlayıb, dirəyə söykəndi. Cavanlar əlbəyaxa olsa, harayçılığa çatmaq üçün hazır dayandı. Ancaq onların çöməltmə oturub, yanaşı söhbət etmələri, arxayın-arxayın papiros çəkmələri Şahnigar xanımı bir az sakitləşdirdi. "Allah eləyə, hər şey elə-belə, davasız-şavasız qurtara", – deyə öz-özünə düşündü. Hətta qabağa yeriyib onların söhbətinə qulaq asmaq, hər şeyi zarafata salıb, qurtarmaq belə istədi. Ancaq cavanların birdən-birə əlbəyaxa olduğunu görəndə özünü itirdi. Güllə açılanda isə bir sıçrayışla irəli atılıb, tüfəngi üzünə qaldırdı. Göy otluqda eşələnənlərin başının üstünü kəsdirdi. Onun qəzəb dolu cingiltili səsi eşidildi:

– Aralanın deyirəm sizə! Eşidirsinizmi? Yoxsa ikinizi də qanınıza boyayacam.

Çərkəzlə Şamxal onun sözünü eşitmədilər. Tüfəngi əldən verməkdən qorxduqlarına görə dartışmalarında davam etdilər. Şahnigar xanım çaxmağı hərləyib, yenidən qışqırdı.

– Sizə aralanın demirəmmi?!

Onun sözü yenə cavabsız qaldı. Şahnigar xanım tətiyi çəkdi. Vıyıldayıb gedən güllə dalaşanları diksindirdi. Çərkəz sinəsinə tuşlanmış tüfəngin boz üzünü gördü və nəhayət inadından əl çəkən dalaşqan uşaqlar kimi qollarını boşaldıb tüfəngi buraxdı. Şamxal bunu gözləmədiyindən təngildədisə də tez özünü ələ aldı. Sıçrayıb ayağa durması ilə tüfəngi hərləməsi bir oldu. Şahnigar xanım özünü irəli salıb sinəsini güllənin qabağına verdi. Çardağın altından qışqırıq qopdu.

– Narahat olmayın, xanım, – deyə yerindən tərpənməyən Çərkəz sakitcə dilləndi. – Ata bilməz, çaxmağı çıxartmışam.

Şamxal yalnız bundan sonra əbəs yerə atılıb-düşdüyünü anladı və tüfəngi hirslə yerə atdı. Şahnigar xanım da dərindən nəfəs alıb, qundağı üzündən araladı.

Çərkəz əyilib tüfəngini götürdü. Çaxmağı yerinə saldı. Üzünü Şamxala çevirdi:

– Namərd!.. Burada da özünü bildirdin.

– Adam dostuna elə söz deməz, – deyə Şahnigar dilləndi.

– Gördüm dostluğunu.

– Yaxşı, ağıllı ol. Bir qız bir oğlanındır, elə şeydən ötəri dava salmazlar. Gəlin barışın. Atamın goru haqqı, əl çəkən deyiləm.

– Mən elə namərdnən üz-üzə durmaram.

– Qoy rədd olsun, ay bibi.

– Səsini kəs, sənə söz düşmür.

Çərkəzin gözü çardağın altında dirəyi qucaqlayıb, için-için ağlayan bacısına sataşanda ağlı başından çıxdı. Gözlərinə qaranlıq çökdü. Hirsindən və acizliyini dərk etdiyindən daxildən qopub gələn hönkürtünü güclə boğub dişini-dişinə sıxdı. Qızarıb qan çanağına dönmüş gözlərinin həlqəsində yığışan yaş damlalarını geri qaytarıb udqundu. Onun hülqumu bir neçə dəfə qalxıb-endi.

– Niyə durdun? Gedək bacınla görüş.

Çərkəz Şahnigar xanıma cavab vermədi. Qəzəbdən alışıb yanan gözlərini Şamxala zillədi. Sözlər dişlərinin arasından fısıltı ilə çıxdı:

– Kökünüz kəsilsin!

Şamxal xəncəri siyirib, yenidən irəli atılmaq istədi. Şahnigar xanım qardaşı oğlunun sinəsindən geri itələdi. Çərkəzin son sözünə əhəmiyyət verməməyə çalışdı.

– A qırışmal, bilirəm acıqlısan, amma sarsaqlama. İndiyəcən dost idiniz, indi də qohum oldunuz, daha nə istəyirsən?

Çərkəz heç nə demədi. Tüfəngi çiyninə keçirib, ağır-ağır uzaqlaşdı.

## 13

Şamxalın Güləsəri götürüb qaçması xəbərini eşidəndə Cahandar ağa üç gün, üç gecə ağzı üstə yatdı. Hirsindən gözləri qan çanağına döndü. Onsuz da boğuq olan sifəti daha da qaralıb, tunc kimi bozardı. Dişinin arasından su da keçmədi. Kişinin həndəvərinə hərlənmək olmadı. Mələk qorxa-qorxa, barmaqlarının ucunda, otağa girib, onun üstünə

yorğan salanda, ərinin kürəklərinin titrədiyini, iri və cod barmaqlarının gəbənin ilgəklərini didib tökdüyünü gördü, amma cıqqırını da çıxartmadı, söz deməyə cəsarət etmədi. Kişinin əlindən xata çıxa biləcəyini düşünəndə evdəki arvadlar yarpaq kimi əsdilər.

Hər biri bir ilə qədər sürən üzücü günlər gəlib keçdi. Cahandar ağa bir axşam div yuxusundan ayılan kimi ayağa durdu. Dinməz-söyləməz paltarını geyindi. Qoltuqaltısını götürdü. Darağı xəzinəyə basıb çaxmağı hərlədi, gülləni lüləyə verdi. Bunlar azmış kimi xəncəri də belinə bağladı. Hava isti olsa da, dəvə yunundan toxunmuş ağ başlığını boynuna doladı. Yenə heç kəs dinib-danışmadı. Zərnigar xanım qorxusundan cəsədə dönmüşdü. Yazığın nəfəsi güclə gedib-gəlirdi. Necə deyərlər, diri gözlü ölmüşdü. O, ərinin nə isə dəhşətli bir iş düşündüyünü yəqin etmişdi. Bir analıq sövq-təbiisi ilə oğlunun başında qaranlıq olduğunu duyurdu. Amma nə dinir, nə də ərinə bir söz deyə bilirdi. Arvad lap özünü itirmişdi. Mələk də Cahandar ağanın daş kimi lal və qaradinməz olduğundan təşvişə düşdü: “Acıqlı başda ağıl olmaz”, – deyə fikirləşdi. Əvvəlcə Zərnigar xanımı hərəkətə gətirmək, “kişinin əl-ayağına düş, getməyə qoyma”, – demək istədi. Amma onun dilinin gödək olduğunu yadına salıb dayandı. Əslinə baxsan, Zərnigar xanım özü də Şamxaldan narazı idi.

Birdən Zərnigar xanım Mələyin qolundan yapışdı. Nə isə demək istədi. Dili söz tutmadı. Arvadın gözü onun üzünə dikilib qaldı. Bu baxışda nələr yox idi?! Ətrafı qırışmış gözlərin işığı sönmüşdü. Didələr öləziməkdə olan qara çıraq kimi titrəyib soğulurdu. Yalnız bəbəklər geniş açılıb, şüşə kimi parıldayırdı. Mələyə elə gəldi ki, arvadın gözünün ağı həddindən artıq böyüyüb, qarası isə tən ortada, balaca bir nöqtə kimi işıldayır. Əgər bir azca da belə getsə, arvad ayaq üstündə keçinəcəkdi. Mələk eyni zamanda bu gözlərin dərinliyində müti bir qul kimi diz çöküb yerə döşənmək istəyən aciz bir insanın yalvarışını da gördü. Zərnigar xanım imdad istəyirdi.

Mələk dözə bilmədi. Asta-asta qapının ağzına yeridi. İçəridən çıxmağa hazırlaşan ərinin qabağında dayanıb, üzünə baxdı. Kişinin sifətindən qan damırdı.

– Belə bivaxt hara gedirsən?

Cahandar ağa qəfil zərbə almış adam kimi təngildəyib yerində dayandı. Geniş açılmış heyrətli gözləri ilə az qaldı qarşısında dayanan arvadı yesin. Səsi xırıldayıb boğazında qırıldı.

– Nə vaxtdan kişinin işinə qarışırsan?!

– Qarışmıram, soruşuram. Mən nəkarayam ki, sənə söz deyəm, amma ürəyim uçunur. Səni and verirəm o balalarıyın canına, ətəyindən daşı tök.

Cahandar ağa yolu kəsib, qapının ağzında dayanan və onu bayıra buraxmaq istəməyən Mələyin döşündən itələdi.

– Çəkil yolumdan!..

Gəlin tərpənmədi. Qollarını gərib qapının çərçivəsindən yapışdı. Cahandar ağa bir an nə edəcəyini bilmədi. Hələ indiyə qədər onun qabağını kəsən, getdiyi yoldan qaytaran olmamışdı.

– Cəhənnəm ol, deyirəm sənə, yoxsa o it küçüyünün hayıfını səndən alaram!

– Al, neylək, al. Vallah, düz sözümdür.

– Qanını üstümə tökmə!

– Halal eləyirəm, tök.

Cahandar ağa onu kənara eləyib keçmək istədi. Mələk qapını örtüb, arxasını söykədi. Kişinin beyninə qan sıçradı. Qıllı qaşların tükləri biz-biz olub pırpızlandı, arası düyünləndi, qırışlar sıxlaşdı, yanaqlarında göyümsov ləkələr oynadı. Qolunu hərləyib var gücü ilə arvada bir şillə çəkdi. Otağın divarları cingildədi. Mələk gözlərinə qan çökdüyünü və qulaqlarının uğuldadığını hiss etdi. Ona elə gəldi ki, evin divarları çökəlib, aşağı yatdı. Ayağının altından yer qaçdı. Tavandan asılmış otuzluq lampa sağa-sola gedib löngərləndi. Arvadın yanağı alışdı, gözlərinə qor doldu.

Cahandar ağa arvadın çıraq kimi sönüb yerə çökdüyünü görəndə ayaq saxladı. Onun geri çəkilib yol verəcəyini gözlədi. Amma Mələyin ətli bədəni divar boyu ağır-ağır sürüşdü və birdən kəsilmiş ağac kimi yerə sərildi. “Lənət sənə şeytan, işə düşmədik”, – deyə söylənən Cahandar ağa onun üstündən adlayıb keçmək istədi. Amma arvadın sifətinin kağız kimi ağardığını, ağız-burnundan qan fışqırdığını görəndə həyəcanlandı. Aşağı əyilib onu yerdən qaldırdı. Taxtın üstünə uzatdı. Arvadı soyuq tər basdığını görüb, özünü lap itirdi:

– Ay uşaq, kim var, tez olun, su gətirin.

Bayaqdan o biri otaqda qorxudan titrəyə-titrəyə bu işlərin nə ilə qurtaracağını gözləyən Salatın özünü içəri saldı. Zərnigar xanım da sürünə-sürünə gəldi. Mələyin ağarmış sifətini, ağız-burnundan axıb laxtalanmış qanı görəndə üzünü cırıb, dizinə döydü:

– Allah sənə insaf versin, ay Cahandar ağa, bu yazığı niyə öldürdün? Yetimin günahı nəydi?

– Günahın hamısı sənin küçüyündədir. Sümüyümüzü it sümüyünə caladı.

Onun nəriltisi otağı başına götürdü. Zərnigar xanım "niyə mənim olur, elə sənin də küçüyündür, adımızı batırdı", – demək istədisə də, qorxusundan dinmədi. Mələyin üzünə su çiləyən qızına kömək etdi.

Cahandar ağa tüfəngi taxtın üstünə atıb eşiyə çıxdı. Əlləri əsə-əsə papiros eşdi. Həyətdə fırlandı. O, qəfəsə salınmış yaralı pələng kimi dolandıqca, göyümsov tüstü boynunun ardında burulur, sonra da duman kimi çöküb, enli kürəyinin ortasında yatırdı. O vurnuxurdu. Əlinin bu qədər ağır olduğunu, bir şapalaqla o boyda arvadı yerə sərə biləcəyini ağlına gətirə bilmədiyindən indi əzab çəkirdi. Qəribə idi: elə bil üç gündən bəri ürəyinin başında qurğuşun kimi çöküb dayanan ağrılar yox olmuş, bütün hirsi elə o şillə ilə çıxıb getmişdi. Cahandar ağa sinəsində bir boşluq, qollarında yorğunluq hiss edirdi. Beyni güyüldəyir, gözləri alacalanırdı. Mələyin başına gələn əhvalat ona hər şeyi unutdurmuşdu. Öldürmək istədiyi oğlunu da, tikə-tikə doğrayacağını qət etdiyi gəlinini də yaddan çıxartmışdı. Axşam qaranlığında həyətdə dolaşan nökərləri, örüşdən qayıdan malları görmür, dana-buzov səsini, qoyun-quzu mələşməsini də eşitmirdi. Özünü zahirən laqeyd göstərsə də, fikri evdə, Mələyin yanında idi. İçəri girib arvadının halını öyrənməyə üzü gəlməsə də, gözünü örtülüb-açılan qapıdan çəkmirdi. Tez-tez eşiyə çıxıb, içəri girən Salatın atasına heç nə demir, başıalovlu ora-bura qaçırdı.

Nəhayət, əl-ayaq yığışdırılanda kişi içəri girdi. Mələyi yorğan-döşəyə uzatmışdılar.

O heç kimdən heç nə soruşmadı. Ağır addımlarla evin yuxarı başına keçib taxtın üstündə əyləşdi. Zərnigar xanım belə vaxtda ərinin gözünə görünməkdən ehtiyat etdiyindən, bir kölgə kimi çəkilib səssizcə öz otağına keçdi. Salatın atasına xörək gətirdi. Kişi əl vurmadı.

– Mənə yer sal! – deyə astaca dilləndi.

Qız taxtın üstünə yorğan-döşək atdı, sonra da sakitcə otaqdan getdi.

Cahandar ağa gecə yarıya qədər gözünü tavana zilləyib, yata bilmədi. Öləziməkdə olan otuzluq lampanın ətrafında fırlanan xırdaca cücülərin evin divarlarında tərpənən kölgələrinə fikir verdi. Otağa qulağı güyüldədən bir sükut çökmüşdü. Arabir isti şüşəyə toxunan, ya da

içəri düşüb fitilin alovunda qarsalanan pərvanələrin çırpıntıları, tozlu qanadların pırıltısı sükutu pozurdu. Cahandar ağa hərdənbir başını yastıqdan azca yuxarı qaldırıb Mələk yatan tərəfə baxır, onun nəfəs alıb-almadığını bilmək istəyirdi. Kişi fikrini toplayıb, müəyyən qərara gələ bilmirdi. Oğlu onu odsuz-ocaqsız yandırırdı. Cahandar ağa Şamxalın küsməyinin bu qədər ciddi olacağını heç güman etmirdi. Onun gec-tez geri qayıdacağını gözləyirdi. Amma indi tamam əlini üzdü. Artıq hər şeyin bitdiyini qərara aldı. "Öləndə vəsiyyət edəcəm, üstümə qoymasınlar, mənim o adda oğlum yoxdur".

Kişi yorğanı başına çəkib, üzünü divara çevirdi. Hər şeyi unudub yatmaq, ağır düşüncələrin pəncəsindən yaxasını qurtarmaq istədi. Amma mümkün olmadı. Şamxal gözünün qabağından çəkilmədi.

Birdən-birə Cahandar ağanın qəlbində qəribə hisslər baş qaldırdı. Şamxalın balacalığı, anadan necə olması yadına düşdü. El yaylaqda olanda peşqurtdan gələn Cahandar ağanın gecə arvadı ilə dəyədə yanaşı uzanması, Zərnigar xanımın utana-utana "deyəsən uşağa qalmışam" – deməsi, onun "oğlum olsa səni təpədən dırnağadək qızıllayacağam", – deyə cavab verməsi elə bil dünən olmuşdu. Şamxalın iməkləməsi, dəyələrin qabağında tumançaq qaçması, arabir anasının gözündən oğurlanıb nəmiyə girməsi, camdakı süd üzünü başına çəkib tejənlərin ağzını açması məgər yaddan çıxardımı?! O, yaman dəcəl idi. Hində yumurta qoymaz, əlindən təknədə çörək qalmazdı. Daşıyıb itlərə tökərdi. Anası hirslənib onu döyəndə Cahandar ağa qabağa keçər, Şamxalı qucağına alıb atın belinə qoyardı. O da yıxılacağından qorxaraq, bərk-bərk atasından yapışardı. "Bəs indi niyə belə olsun? Onun əzizlədiyi, boynunda gəzdirib dizinin üstündə oynatdığı uşaq niyə dönük çıxsın? Kim? Uşaq?"

Cahandar ağa gülümsündü. Birdən-birə son dəfə uzaqlaşıb, Kürün sahilinə doğru enən oğlunun enli kürəyi gözünün qabağına gəldi. Kişi onun köynəyinin cırıq yerindən qaralan zolaqları, öz əlinin nişanələrini görür kimi oldu. Şamxalın kürəyi enləndi və bir az bundan əvvəl tumançaq gəzən uşaq əvəzinə bığ yeri tərləmiş cavan bir oğlan dayandı. O nə qədər də yaraşıqlı idi! Belə oğlun atasının nə dərdi ola bilərdi? Qəribə bu idi ki, Şamxal evlənmişdi. Qız götürüb qaçmışdı. Cahandar ağa onun bu saat qara damda necə yatmasını, arvadı ilə necə qucaqlaşdığını gözünün qabağına gətirməyə çalışdı. Demək, Şamxal kişi həddinə dolmuşdu? Ev-eşik sahibi idi. Ola bilməz. Dünənki uşaq nə tez

böyüdü? O bunlara inana bilmirdi. Qəlbində baş qaldıran hissləri ayırd edib, beynində oyanan suallara cavab tapmaqda çətinlik çəkirdi. O, bir tərəfdən oğlunun böyüməsini dərk edib qəlbində fəxr edir, bir ata kimi qürurlanır, bir tərəfdən də gülməyi tuturdu. Dünənki uşaq indi kişi olmuşdu! Ancaq necə kişi? Atasının üzünə ağ olan, özbaşınalıq edib, nəslinə yaramayan qızla evlənən biqeyrət kişi!

Cahandar ağa yenidən əsəbiləşdi. Şamxalı yaddan çıxartmaq üçün o biri oğlunu xatırladı. "Görəsən Əşrəf bu saat nə edir? Evdə olanları eşidibmi? Odamı məndən üz döndərəcək? Yox, Əşrəf ağıllı baladır. Şamxalın tayı deyil".

Kişi yerin içində qurcalanır, gah yorğanı başına çəkir, gah da o üz-bu üzə dönürdü. Nə qədər çalışırdısa da, yata bilmir, karvan-karvan üstünə cumulan fikirlərlə əlləşirdi. O, Mələyi vurduğuna peşman olsa da sevinirdi. "Bəlkə də belə olması yaxşıdır. Kim bilir, bəlkə də o, qabağıma keçməsə idi, gedib bir xata çıxardacaqdım. Vallah, Mələk yaxşı arvaddır. Bununla iki dəfədir yolumu kəsir, məni oğul qanı tökməkdən saxlayır". Birdən-birə Cahandar ağanın arvadına yazığı gəldi. Hələ də əli ağrıdığını xatırlayıb, özünü danladı. Yerin içində dirsəklənib, ehmalca o yatan tərəfə baxdı.

Mələyin də gözünə yuxu getmirdi. Üzünün bir tərəfi od tutub yansa da, ağrı ötüb keçmişdi. Nə yuxusu gəlir, nə də bir şey fikirləşə bilirdi. Elə bil zehni, düşüncəsi də hissləri kimi kütləşmişdi. Başı ağrıyırdı. Amma bircə şeyi, Cahandar ağanın evdə olduğunu, silahlanıb getmədiyini xatırlayırdı. Ona da bu lazım idi. Deməli, döyülsə də, ürəyi keçib huşsuz qalsa da, onu yoldan saxlamış, xatadan qurtarmışdı. O, istədiyinə çatmışdı. Mələk taxtın üstündə, ondan bir az aralı uzanan ərinin yatmadığını bilsə də səsini çıxartmır, onun sonra nə edəcəyini gözləyirdi. Mələk Cahandar ağadan incimişdi. Lakin ərinin onun ayağına gələcəyini, könlünü alacağını gözləmirdi. Axı hansı kişi arvadını döyəndən sonra peşmançılığını boynuna alıb üzr istəyir? O handa da Cahandar ağa ola. Elə onun evdə qalmağı bəsdir, hələlik qələbə Mələyindir. O bu saat yerindən sürünüb, ərinin yanına gedə bilərdi. Onu sakitləşdirmək üçün söz tapardı. Axı o da yazıqdı! Oğlunun hərəkəti kişini odsuz-ocaqsız yandırırdı! Amma qorxurdu. Mələk balaca bir hərəkətlə Cahandar ağanın ovqatını təlx edəcəyindən ehtiyatlanır, ona görə də susurdu. "Qoy dincəlsin, Allah istəyən yaxşıdır. Sonra qaş qayırdığım yerdə vurub gözünü tökərəm".

Mələk ərinin yerindən qalxıb ona doğru gəldiyini görəndə təəccüblənsə də dinmədi. Kişi yorğanı qaldırıb yanına girəndə də tərpənmədi. Bir xeyli beləcə uzandılar. Hər ikisi oyaq olduğunu bilir, amma qabaqca danışmağa söz tapmırdı. Mələk onun hansı duyğuların hökmü ilə gəldiyini bilmək istəyir və əri bir söz soruşarsa, nə cavab verəcəyini fikirləşirdi, həm də ürəyində sevinir, özünün bu cür nər ürəkli kişidən güclü olduğunu dərk edib qürurlanırdı.

Cahandar ağa peşmançılığını bildirmək, həm də arvadına minnətdarlığını söyləmək üçün nə qədər fikirləşsə də, münasib söz tapa bilmirdi. O, hələ indiyəcən arvad yanında şirin söz işlətdiyini xatırlamırdı. Əslinə baxsan, buna ehtiyac da duymamışdı. Lazım olanda qartal kimi qanad çalıb, ovunu götürmüşdü. Amma indi Mələyə nə isə könül oxşayan bir söz demək zərurətini hiss edirdi. Bunun səbəbi Cahandar ağa kimi kişilərin o qədər də yaxşı dərk edə bilmədikləri məhəbbət idimi, yoxsa atalıq duyğusunun minnətdarlığı idimi, aydın deyildi.

Sükut xeyli çəkdi. Bir yastığa baş qoyduqlarından, həyəcanlı nəfəslərini və ürək çırpıntılarını aydınca eşidirdilər. Cahandar ağanın dodaqları tərpəndi.

– Bərkmi vurdum?

– Əlin yaman ağır imiş.

Kişi iri ovcunu onun yanağında gəzdirdi. Mələyin sifətinin islaq olduğunu duydu. Dinmədi. İri, cod barmaqları ilə bulaq kimi səssizcə qaynayan gözlərdən axan suyu qurutmaq istədi. Mələk uzun müddət qaşlarında gəzən barmaqların təmasını hiss etdi...

## İKİNCİ HİSSƏ

### 1

Göytəpə kəndinin ucqarında, xır yolunun üst tərəfində üçotaqlı bir bina var. El arasında buraya “Zayej” (“Zayezjiy dom” sözünün el arasında işlənən şəkli) deyirlər. Qocaların söylədiyinə görə, bu evi vaxtilə xır yolunu çəkənlər tikiblər. Onlar gündüzlər yolda işləyir, axşamlar isə burada yatırmışlar.

Göytəpəlilərdən bu yolun necə çəkilməsini xatırlayanlar az deyil. Hətta onların çoxu yola döşəmək üçün Kürün sahilindəki çaylaqdan araba ilə xır daşıdıqlarını indi də unutmamışdır.

Pristavın əmri ilə kəndin mötəbər adamları qabağa düşüb qapı-qapı gəzmiş, evlərdə nə qədər araba varsa hamısını qoşdurub birbaş xır daşımağa göndərmişdilər. Ətraf kəndlərdən də gələnlər çox idi. Arabaların bir ucu yoldan üzülməmiş, o biri ucu Kürün sahilindən geri qayıdırdı. Hörükdəki öküzlər dizini yerə qoyur, kəllər boyunduruğun altında ləhləyirdilər.

Təkərlər əvvəlcə xam torpaqda iz saldı, bircə həftədən sonra isə əməlli-başlı yola düşdü. Qatarlaşan arabalar həmin yolla qarışqa kimi irəli-geri gedirdi. Hamı gecəni gündüzə qatıb çaydan daş, qum daşıyırdı.

Göytəpəlilərin vəziyyəti nisbətən yaxşı idi. Alatoranlıqdan işə çıxsalar da, qaranlıq qarışan kimi evlərinə dağılışırdılar. Ancaq başqa kəndlərdən, xüsusilə dağ ətəyindəki obalardan gələnlər elə yolun kənarındaca gecələyəsi olurdular. Onların qaladıqları ocaqların şöləsi uzun zaman sönmür, səhərin sazağı başlayana qədər korun-korun yanıb qorlanırdı. Ulaqları təpələrin ətəyindəki çəmənlikdə növbə ilə otaran arabaçılar həm də yatanların keşiyini çəkirdilər. Onları heç olmasa həftədə, ya da yarım ayda bir evlərinə də buraxmırdılar. Əgər dallarınca çörək gətirən olmasaydı, burada yeməyə bir şey də tapmazdılar.

Pristav günaşırı atlı kazaklarla gəlib yola baş çəkirdi. Gözlərində yanları qapalı iri eynək, yolun kənarında oturub, dizə qədər sarıdıqları ayaqlarının pəncəsi arasındakı qara çay daşlarını çəkiclə ovxalayan dustaqların başının üstünü kəsdirirdi. Daşqıranlar nəfəslərini dərmədən çəkici endirir, arabaçıların gətirib qatar-qatar tökdükləri daşları dəyirman kimi üyüdüb ovxalayırdılar. Dəmir cingiltiləri ətrafa səpələnən qəlpələrin vızıltısına qarışırdı. Bəzən daş parçalanmır, çəkicin

altından qığılcım qalxırdı. Elə bil daşlar üzə durub, əzilmək istəmirdi. Fəhlələr qaranlıq qarışana qədər bellərini qaldırmadan başıaşağı işləyirdilər. Daş ovxantısı onları qurşağa qədər basırdı.

Kənd arasında pıçıltı gedirdi ki, hökumət bu yolu tez çəkmək, Tiflisi İrəvanla, İrəvanı da Gəncə ilə birləşdirmək istəyir, dağların o tərəfindən aşıb gələn qoşunlarına yol açmağa çalışır. Elə ona görə də ayağı qandallı dustaqları bura töküblər. Görünür, kəndin üst tərəfindəki silsilə təpələrin ətəyi ilə uzanan torpaq yol daha işə yaramırdı.

Yaşlı kişilər həmin torpaq yolla çox karvanların gəlib keçdiyini söyləyirdilər. Onların dediyinə görə, Şah Abbas da, Qacar da Tiflisi talamağa bu yolla gediblər. Elə gürcü padşahı İrakli də bu yolla gəlib Kür boyundakı obalara basqın etmişdir.

Göytəpə kəndinin yuxarısında qədim bir körpü də var. Kürlə Xramın ağız-ağıza qovuşduğu dar keçidi birləşdirən bu körpü sarı kərpicdən hörülmüşdü. Hətta körpünün aşağısında sudan qalxan enli kərpic tağların içində otaqlar da var. Ətrafında ot cücərən dəmir barmaqlıqlı şüşəsiz pəncərələr çuxura düşmüş gözlər kimi qaralır. İndi otaqların içinə quşlardan başqa heç kəs girmir. Əslinə baxsan, oranın yolunu bilən də yoxdur.

Deyilənə görə, körpünün harasındasa pilləkən varmış. Vaxtsız yola çıxıb, axşam qaranlığına düşən müsafirlər elə buradaca, körpünün qarnındakı karvansarada gecələyərlərmiş. Bu fikrə etiraz edənlər, oranın keşikçilər üçün tikildiyini söyləyənlər də var. Mübahisə çox olsa da, körpünün nə vaxt və kim tərəfindən tikildiyini dəqiq bilən yoxdur.

Körpü möhkəmdir. Mühəndislər də buna inandıqları üçün yeni çəkilən xır yolunu körpü ilə birləşdirirlər. Axı hazır körpüdən kim qaçar?

Qocalar deyirlər ki, düz bir il gecəli-gündüzlü işləyəndən sonra yol hazır oldu. Yolbasanlar, qandallı dustaqlar, təkərli otaqda yaşayan saqqallı kişilər çıxıb getdilər. Yolun kənarındakı ev isə sahibsiz qaldı. Hətta gecələrin birində əli dinc durmayan dəcəllər qapı-bacanı da söküb apardılar. Amma bir gün şəhərdən yeni adamlar gəldilər. Evin qapı-pəncərəsini, döşəmənin çürümüş taxtalarını dəyişib otaqları sahmana saldılar. Eyvanın divarından dəmir qutu asdılar. Yolun kənarındakı bu binadan gecələr solğun işıq göründü. Bu boş otaqlarda qoca bir qarı ilə kişi yaşadı. Onlar Tiflisdən İrəvana, Gəncəyə keçən faytonların qabağına çıxır, kağız verib, kağız alırdılar. Bəzən də atlı kazakların müşayiət etdiyi qumrovlu faytonların dayanması və yolçuların dincəlməsi

üçün əllərindən gələni edirdilər. Axşam qaranlığına düşənlər burada gecələyirdilər. Göytəpəlilərdən neçə dəfə atlı kazakların tökülüşüb gəldiklərini və "Zayej"də gecələdiklərini görənlər az olmamışdır. Hətta həmin kazakların ətraf kəndlərdən, eləcə də Göytəpənin özündən adamları tutub döydüklərini, sonra da atın döşünə salıb siyirmə-qılınc altında şəhərə apardıqlarını xatırlayanlar, onları unutmayanlar çoxdur. Göytəpəlilər onu da xatırlayırdılar ki, birdən-birə bu yolla gedib-gələnlər azaldı, qoca ilə qarı da çıxıb getdi. Otaqlar yenə boş qaldı. Ancaq bu uzun sürmədi. İki il bundan əvvəl buraya iyirmi dörd, iyirmi beş yaşlı bir oğlan gəldi.

Onun kim olduğunu heç kəs bilmirdi. Sifətindən, saçının, gözünün qaralığından müsəlmana oxşayırdı. Amma geyimi camaatı çaşdırdı. Ayağında soldat çəkməsi vardı. Boynu işləməli uzun köynəyinin belinə sallamalı qotaz bağlayırdı. Saçını, saqqalını rus qaraçıları kimi uzatmışdı. Deyilənə görə, dünya malından bir sandığı, bir dəst yorğan-döşəyi və yekə bir kürkü vardı. Adı Əhməd idi. Danışanda sözləri qəribə şivə ilə tələffüz edirdi. Bu isə ona qarşı şübhəni artırırdı. Əhməd nə qədər çalışsa da, müsəlmanlığını sübut edə bilmirdi. Hamı onun rus olduğunu zənn edir, poçta boş-boşuna göndərilmədiyi qənaətinə gəlirdi. Camaat arasında bir müddət ona "poçt Əhməd", sonra isə şapka geydiyinə görə "rus Əhməd" dedilər.

Rus Əhməd guşənişin bir həyat keçirirdi. Bütün günü evin ətrafında dolaşır, əlini gözünün üstünə qoyub, xır yoluna baxır, gəlib-gedən olmadığını yəqin etdikdən sonra bel götürüb qapı-bacanı sahmana salırdı. Əvvəllər ona heç kəs yaxın durmazdı. "Xaçpərəstlə nə işimiz var", – deyə uzaq gəzirdilər. Ancaq yavaş-yavaş ona isinişdilər. Əhməd özünə at aldı, araba düzəltdi, şəhərdən su çəlləyi gətirdi. Bundan sonra onun məşğuliyyəti də artdı.

Göytəpə kəndinin üst tərəfi dəmyədir. Xır yolunun ətrafına su çıxmır. Əhməd isə "Zayej"in dörd yanında ağac əkmək, gül basdırmaq istəyirdi. O, hər gün Kürdən iki-üç çəllək su gətirib, qapı-bacanı sulayırdı. "Zayej"in ətrafı yavaş-yavaş yaşıllaşırdı.

O hərdənbir ova getməyi, Kürdən balıq tutmağı da sevirdi. Göytəpəlilər kimi iri qarmaq atmaz, bir kötüyün üstündəcə oturub, balaca tilovla kiçik balıqlardan tutardı. Kənd uşaqları bəzən ona sataşar, bəzən də yaxın gəlib söhbətə girişərdilər. Yavaş-yavaş onların arasında ünsiyyət başlayırdı.

Rus Əhməd bəzən "Zayej"in eyvanında oturub kitab oxuyardı. Bəzən də uşaqları başına yığıb, məzəli söhbətlər edər, uzaq yerlərdən, qalın meşələrdən, izdihamlı şəhərlərdən, böyük çaylardan, boranlı-çovğunlu diyarlardan söhbət açardı. Donan sulardan, buzun üstü ilə arabaların keçməsindən və adamların keçə çəkmə geyib at qoşulmuş xizəklə gəzməsindən olan söhbətlər uşaqlara daha çox xoş gəlirdi. Bu uşaqların içində Cahandar ağanın kiçik oğlu Əşrəf də olardı.

Onların tanışlığı düşmənçiliklə başlamışdı.

Bir dəfə Əhməd Cahandar ağanın evinin bərabərində, Kürün yaxası boyu uzanan çəmənlikdə hərlənirdi. O, cığırla darılığa doğru gedir, rastına düşsə, Kürün o üzündən uçub dənlənməyə gələn qırqovullardan birini vurmaq istəyirdi. Yarğanların kölgəsi suya düşmüşdü. Yulğun kolları xışıldayırdı. Əhmədin ayağının lap altından pırıltı ilə bir bildirçin qalxdı. Ox kimi süzüb darılığa doğru uçdu. Əhmədin gülləsi ilə bir vaxtda kiminsə tüfəngi də açıldı. Qürub çağı nişana lap tez gələn quş, bir-iki dəfə qanad çalıb otluğa düşdü. Əhməd quşu yerdən qaldırdı. Elə bu vaxt qəzəbli və cingiltili bir səs eşitdi:

– Ey, rus Əhməd, bildirçini mən vurmuşam!

O dönüb əlində tüfəng, otluğun içində dayanan oğlana baxdı. Onun on dörd-on beş yaşı ancaq olardı. Əynində vəznəli, qara çuxası vardı. Göy buxara papağını geri itələmişdi. Zil qara saçının qıvrım teli alnına düşmüşdü. Sivri burnu pərələnir, sinəsi qalxıb-enirdi. Uşaq yaman həyəcanlanmışdı.

– Nədən bilirsən?

– Necə yəni nədən? Hələ mənim əlimdən bir quş qaçmayıb.

– Amma bu dəfə qaçıb.

– Ver deyirəm sənə!

– Verməsəm nə qayırarsan?

Oğlan tüfəngi hərlədi:

– Vuraram.

– Adam da bir quşdan ötrü dalaşarmı? İstəyirsən bildirçini sənə bağışlayım.

– Lazım deyil. Mən vurmuşam, qaytar özümə. Bir də ki bura bizim çəmənlikdir.

Əhməd gülümsünərək, hələ də acığı soyumayan Əşrəfi başdan-ayağa süzdü. Uşağın ağ sifəti alışıb yanırdı.

– Bütün bu yerlərin hamısı sizindir?

– Bəs nə?!
– O taydakı meşə də?
– Hamısı.
– Su da?
– Zarafatı burax, bildirçini bəri ver!

Əhməd quşu Əşrəfə uzatdı. Oğlan cəld bildirçinin qanadını gərdi. Tüklərini aralayıb, hardan yaralanmasına baxdı. Onun sifətindəki qəzəb yox oldu. Əhməd uşağın tutqun çöhrəsini məsum bir təbəssümün bürüdüyünü, gözlərində həm sevinc, həm də hüznlü bir kədərin olduğunu gördü. O, ovçudan çox, bir uşaq marağı ilə quşu süzürdü.

– Acığın soyudumu?

Əşrəf gülümsündü. Onun hərəkətlərində maraqla bərabər bir peşmançılıq da vardı. Ancaq onun quşu vurduğunamı, yoxsa Əhmədin əlindən almasınamı peşman olduğunu təyin etmək çətin idi.

– Bəs mən indi harada ov edim? Görürəm bunların hamısı sizindir. Yəqin Kürdən də balıq tutmağa qoymayacaqsan.

Əşrəf Əhmədin səsindəki mənanı, onun zarafat etdiyini başa düşmədi.

– Kürün suyu mənim ha deyil, Allahın balığında nə işim var?
– Bəs quş da Allahın deyildimi, əlimdən aldın?
– Onu mən vurmuşdum.
– Yəni deyirsən mahir ovçusan, məndən də ustasan?

Əhməd onu şitəndirmək istəyirdi. Əşrəf isə deyilən sözləri ciddiyyətlə qəbul edirdi. Birdən-birə onda bu yaşlı kişi ilə bəhsə girmək həvəsi doğdu. Oğlanın gözləri oynadı. Yanaqları qızardı. Mərcə hazırlaşan höcət uşaqlar kimi səsini ucaltdı.

– Mənim ovçuluğuma inanmırsan?
– Yox.
– Onda gəl mərcləşək. Görək kim yaxşı güllə atır.
– Axı bu çəmənlik sizindir, mənim ixtiyarım yoxdur.
– Heç nə olmaz, mən izn verirəm.
– Yaxşı, olsun.

Onlar qaranlıq qarışana qədər Kürün yaxası boyu dolaşdılar. Əhməd qəsdən ala-toranda nişana yaxşı gələn quşlara güllə atmır, ilk ovçuluq həvəsi ilə alışıb-yanan Əşrəfin qabağa düşməsinə imkan yaradırdı. Dizinə qədər şehə batan oğlan isə hər şeyi unutmuşdu. Hər dəfə vurub saldığı quşun qanadından yapışıb yuxarı qaldırır və qürurla "hə,

necədir?" – demək istəyirdi. Əhməd cavan dostunun sevincinə şərik olmaq üçün gülümsünürdü.

Onlar hiss etmədən kənddən xeyli uzaqlaşmışdılar. Əşrəfin geri qayıtmaq istədiyini görən Əhməd ayaq saxladı.

– Daha bəsdirmi, xallı oğlan? İndi inandım. Doğrudan da ovçusan.

– Sən də pis atmırsan, ay urus...

Onun səsi titrəyib qırıldı. Əhməd Əşrəfin qürubun son şəfəqində necə qızardığını, pis iş tutmuş adamlara məxsus peşmançılıqla boynunu büküb dayandığını aydınca gördü.

– Utanma, hamı mənə rus Əhməd deyir, sən də de.

O bir qədər susdu. Ov yoldaşını birinci dəfə görürmüş kimi dayandı.

– Sənə niyə belə ad qoyublar?

– Nə bilim?!

– Şapka geydiyinə görə?

– Yəqin.

– Axı sən niyə papaq geymirsən?

– Öyrənmişəm.

– Harada?

– Peterburqda.

– Peterburq haradır?

– Uzaq bir şəhərdir.

– Sən oraya nəyə getmişdin?

– Oxumağa.

– Bəs niyə qayıtdın?

– Eh, neyləyirsən onları. Bu, uzun əhvalatdır. Bir gün yanıma gələrsən, hamısını danışaram. Oxumaq bilirsənmi?

– Yox.

– Bəs öyrənmək necə, istəyirsənmi?

– Çətindir?

– Sənin kimi oğulun əlində nəmənədir, bir aya öyrənərsən.

Əşrəf nə deyəcəyini yəqinləşdirə bilmədi. Mat-mat Əhmədin üzünə baxdı.

– İstəsən lap rusca danışmağı da öyrədərəm. Razısanmı?

– Nə bilim? – deyə o, çiynini çəkdi.

Onlar dikdirə çıxdılar. Artıq göz-gözü görmürdü. Kəndin solğun işıqları titrəşirdi. Əşrəf cığırdan sola burulub Əhməddən aralanmaq istədi.

– Bunları da apar.
– Niyə ki? – Əşrəf təəccübləndi. Qaranlıqda iri gözləri parıldadı.
– Onları mən vurmamışam.
– Nə olar sən vurmayanda, bağışlayıram.
– Ovçu ovçunun şikarını əlindən almaz.
– Sən almırsan, mən özüm bağışlayıram. Bir də, onları kim bişirəcək?
– Evinizdə adam yoxdur?
Əhməd qəmli-qəmli başını buladı:
– Yox.
– Niyə ki?
– Yetiməm.
Əşrəf cingiltili səslə güldü:
– Sən boyda da yetim olar?
– Adam qəribliyə düşəndə olar. Di yaxşı, Əşrəf koxa, gecən xeyrə qalsın. Gözləyəcəyəm, havaxt könlün istəsə, gəl.
Elə həmin günün səhərisi poçtalyonun qapısı döyüldü. Əşrəf içəri girdi. Əlindəki böyük bağlamanı yavaşca pəncərənin qabağına qoydu. Stolun üstünə səpələnmiş kağızlara nə isə yazan Əhməd qanrılıb baxdı.
– Ay xoş gördük səni, demək gəldin. Çox yaxşı. Bəs bu nədir?
– Anam göndərdi, Əhməd lələ, dedi ki, adam qəribə hörmət edər. Bir az pendir, yağdır. Bir də ki, bax bunlar. – O, bağlamanı açdı. Qızardılmış bildirçinləri çıxardıb stolun üstünə qoydu. – Sənin payındır, hər şeyi anama danışdım. Məni yaman danladı. Bu təndir çörəyi də yenicə bişib. Elə isti-isti götürüb gətirmişəm.
Əhməd təzə çörəyin ətrini ciyərinə çəkib gülümsündü. Balaca oğlanın qayğıkeşliyi onun qəlbini riqqətə gətirdi. İllərdən bəri yaxın və doğma bir adamın nəvaziş və mehribanlığını görməyən, həmişə yad, soyuq baxışlarla qarşılaşan, uzun gecələri öz xəyalları ilə tək yaşayan, taleyin gərəksiz bir taxta parçası kimi köpüklü dalğalarla vurub kənara atdığı bu adam, nəhayət qəlbinə yaxın bir insan tapdığına sevinirdi. O qəhərləndi. Əşrəf alnına yenicə iz düşmüş Əhmədin gözlərinin həlqəsinin yaşardığının, kirpiklərinin titrədiyinin fərqinə vardı. Doğrudan da o kövrəlmişdi. Başqa cür də ola bilməzdi. Bu kəndə gələli heç kəsin isti çörəyini kəsməmişdi. Hamı ondan uzaq gəzirdi. O isə yolun kənarındakı kimsəsiz daxmaya çəkilir, gecələr kürkünəcə bürünüb yatırdı. İndi birdən-birə kimsə onun halına acıyırdı. Əhmədin qulaqlarında "qəribə hörmət etmək lazımdır" deyən qadının səsi canlandı.

Sonra da o, isti çörəkləri büküb oğluna verən adamın sir-sifətini xəyalən təsəvvürünə gətirməyə çalışdı.

– Çox sağ ol, qardaş, lap ürəyimi xarab elədin.

– Niyə ki, Əhməd lələ?

– Heç, – deyə o, köksünü ötürdü, sonra da çörəklərdən birini kəsdi: – Nə gözəldir! Çoxdandır bu cür ətirli, təzə çörək yemirəm. Əyləş, sən də ye.

– Toxam.

– Nə olar, bir yerdə yesək, sənin də iştahan açılar, mənim də.

Onlar yanaşı oturdular. Əşrəf gözaltı Əhmədi süzürdü. Onun bu qədər göyçək olduğunu dünən axşam sezə bilməmişdi. "Əgər o, saqqalını qırxdırsa, saçını vurdurub, bığlarını sahmana salsa, lap cavan görünərdi. Geyimini də dəyişsəydi pis olmazdı". Əşrəf dostlaşmağa başladığı bu adamın daha yaraşıqlı və cazibədar olmasını istəyirdi. Hətta onun evinin-eşiyinin də səliqəsi ilə qürrələnməyə çalışırdı. Əhməd oğlanın ürəyindən keçənlərdən xəbərsiz idi. İştaha ilə çörək yediyindən, Əşrəfin hər şeyə gözaltı baxdığını, küncdəki taxtın üstünə atılmış boz kilimin bir tərəfinə yığılan yorğan-döşəyi, bir az da bəridəki iri sandığı, divardan asılmış qoşalüləni, pəncərə qabağındakı kitabları, dəhlizdəki qab-qacağı, mismara keçirilmiş iri kürkü necə diq-qətlə süzdüyünün fərqinə vara bilmirdi.

Oğlan hər şeyi, hətta küncdəki süpürgəni, oraya yığılmış kağız qırıntılarını belə nəzərdən keçirdikdən sonra divardan asılmış şəklə baxdı. İri, çal papaqlı bir kişi qalın çatma qaşları altındakı gözlərini zilləyib Əşrəfə baxırdı. Onun bəbəklərinin işıltısı aydınca görünürdü. Oğlana elə gəldi ki, şəkildəki kişinin bir-birinə kip qapanmış dodaqları bu saat aralanacaq və nə isə mehriban bir söz deyəcəkdir. Şəkil Əşrəfin nəzərində böyüdü. O, kişinin eşmə bığlarının və sinəsinə düşən saqqalının tərpəndiyini zənn etdi. Onun vəznəli çuxası, belindəki sallamalı kəməri, xəncəri necə də yaraşıqlı idi! Əşrəf hər şeyi aydınca təsəvvür edirdi; hətta xəncərin ağ şirmayı dəstəsi üzərindəki gümüş düymələri belə sanki görünürdü. Bəs onun yanında oturan, başına ağ yelənli qara kəlağayı örtmüş arvad kim idi? Onların çiyni üstündən boylanan uşağın gözləri nə qədər tanışdır! Əşrəf onu harada görmüşdü?

Əhməd çörəyini yeyib qurtardı. "Çox sağ ol, ovçu qardaş", – deyə zarafatyana təşəkkür etdi. Ancaq Əşrəf onun sözlərini eşitmədi. Oğlanın diqqətlə şəklə baxdığını və hər şeyi unutduğunu görəndə əlini onun çiyninə qoyub astadan dilləndi.

– Xoşuna gəlir?

Əşrəf yad təmasdan diksinib fikirdən ayrıldı. Onun nəzərində böyümüş adam kiçildi, yenə də ətrafı qara çərçivəli şüşənin altındakı balaca şəklə çevrildi. Onun dodaqları qaçdı. Gözlərində günah qarışıq bir maraq oyandı.

– Çox yaxşı kişidir. Sənin nəyindir?

– Atamdır.

– Atan?

– Niyə təəccüb edirsən?

– Bəs sən rus deyilsən?

– Yox.

– Bəs o arvad kimdir?

– Anamdır. O da mənəm, oxşayırmı?

– Yaman oxşayır.

Əşrəf bu söhbətlərin xoşa gəlmədiyini, bir az bundan əvvəl qaşqabağı gülən, mehriban çöhrəli Əhmədin sifətinə qışın boz, çovğunlu ruzigarını xatırladan bir kədər çökdüyünü hiss etsə də, marağını boğa bilmədi. Bir uşaq sadəlövhlüyü ilə:

– Bəs onlar indi haradadırlar? – deyə soruşdu.

– Şuşada.

– Sənin yanına niyə gəlmirlər.

– Küsülüyük.

– Niyə küsülüsünüz?

Əhməd pis və acı bir xatirəni qovurmuş kimi əlini yellədi, zorla gülümsəməyə çalışdı.

– Keçənləri yada salmasaq yaxşıdır.

Onlar susdular. Əşrəf nəzərlərini divardakı şəkildən çəkib kitablara baxdı.

– Bunların hamısını oxumusanmı?

– Oxumuşam. Səni də öyrədəcəyəm. Rusca yazmağı da, oxumağı da biləcəksən.

– Mənim bir-iki dostum var, onları da öyrədərsənmi?

– Niyə öyrətmirəm, qoy gəlsinlər. Mən sizə hər şeyi: xəritəni də, şəkil çəkməyi də, şəhərlərin adını da, hesabı da öyrədəcəm. Ancaq gəlin. Elə otağın birini boşaldıb sinif edərik. Özümüzün məktəbimiz olar. Düz demirəmmi?

– Lap yaxşı olar. Molla Sadığın acığına hamımız gələrik. Ancaq sən sözündən dönmə.

O xeyli dayandı. Balaca dostunu sınayıcı nəzərlə süzdü. – Əşrəf, bilirsən nə var, gəl əməlli-başlı dost olaq. Sən yaman xoşuma gəlirsən. Gəl mənə qardaş ol. Razısanmı, hə?

Əşrəf sevinclə:

– Razıyam. İki qardaş idik, indi olduq üç.

**2**

Təpələrin ətəyindəki xır yolla irəliləyən fayton kəndə yaxınlaşırdı. Atlar yorulmuşdu. Faytonçunun cidd-cəhdinə baxmayaraq, yerişlərinə haram qatmaq istəmirdilər. Havada şaqqıldayan qamçının səsini eşitdikdə azca hərəkətə gəlib daş yola səs salsalar da, qaçmır, beş-on addımdan sonra yenə də yerişlərini yavaşıdırdılar. Faytonçu da yorulmuşdu. Görünür, uzun və kimsəsiz yol onu da taqətdən salmışdı. Ancaq həvəsdən düşmür, necə olursa-olsun axşama Tiflisə çatmaq istəyirdi.

Faytonda oturan müsafir isə heç nəyə fikir vermədən sakitcə ətrafı seyr edirdi. O, ayağını-ayağının üstünə aşıraraq, yanpörtü əyləşmişdi. Xırdaca gözlərini qıyıb boz təpələrə, lap uzaqdan güclə görünən Kürün sahilinə səpələnmiş kənd evlərinə, düzənliyə dağılmış mal-qaraya tamaşa edirdi. Hava isti idi. Təpələrin ətəyindən qalxan boğanaq toz-torpağı göyə sovurub, yay kimi burula-burula yuxarı qalxdı və yolun ortasında xeyli dayandıqdan sonra üzü aşağı, Kürə doğru süründü.

Faytonçu darıxdı. Uzun yolun yorğunluğunu unutmaq üçün söhbət etmək, maraqlı bir əhvalata qulaq asmaq istədi. Elə buna görə də dönüb, apardığı sərnişinə baxdı. O isə gözlərini qıyıb, dinməz-söyləməz oturmuşdu. Fayton tərpəndikcə astaca yırğalanırdı. Deyəsən mürgüləyirdi.

Gün şaxımışdı. Saralıb-solmağa başlayan çöllərdəki sirkanların arasında gizlənən cırcıramalar qərib-qərib oxuyurdular. Yolun ortasında özünü günə verən koramallar səs eşitdikdə sürünüb qalınlıqda gözdən itirdilər. Yol isə uzanır, düzənliyi bir xətt kimi kəsib üfüqə doğru gedirdi. "Zalım oğlu zalım elə bil ağzına su alıb", – deyə öz-özünə söylənən faytonçu birdən qamçını havada şaqqıldatdı. "Hey-hey, a başınıza dönüm, əlli tərpənin, axşama az qalır". Atlar qəfil hücumdan diksinib irəli atıldılar. Fayton bərk silkələndi. Fikirdən ayrılan müsafir gözlərini açıb, faytonçunun kürəyinə baxdı. Onun şapkasının altından çıxan sarışın saçları boynunun dalında qıvrılmışdı. Dərisinin qırışlarına qonan tozu tər islatmışdı.

– Hava istidir, atları çox qovmayın.

Faytonçu müştərisinin səsini eşidib geri döndü, üfüqə doğru əyilən günəşi göstərdi:

– Gecikərik.

– Eybi yoxdur, onsuz da bu gün Tiflisə çata bilməyəcəyik.

– Bəs harada gecələyəcəyik? Mən bilən, bu yollarda karvansara yoxdur.

– Kəndlərin birinə dönərik.

– Qorxmursunuz?

– Kimdən?

– Müsəlmanlardan.

Sərnişinin qaşları çatıldı.

– Onlardan bir pislik görmüsən?

– Yox.

– Bəs niyə qorxursan?

– Nə bilim, deyirlər bizi görməyə gözləri yoxdur.

– Bizi, yəni kimi?

– Rusları.

– Boş sözdür!

Faytonçu sərnişinin qəzəbləndiyini hiss edib ehtiyatlandı. "Deyəsən bir az artıq-əskik danışdım. Gərək əvvəlcə kim olduğunu öyrənəydim. Bəlkə elə özü də müsəlmandır. Onun üçün hirsləndi. Sir-sifətindən oxşamır. Müsəlmanlar bunun kimi üzlərinin yarısını qırxdırıb, çənələrində saqqal qoymurlar. Eh, bir də indiki adamları seçmək çox çətin olur. Müsəlmanların oxumuşları da qiyafələrini dəyişirlər".

O, atlara bir-iki qamçı çəkdikdən sonra geri qanrıldı.

– Bağışlayın, cənab, adınızı da bilmirəm...

– Aleksey Osipoviç.

– Demək, russunuz.

– Bəli. Necə məgər?

– Mən lap qorxuya düşdüm. Dedim, bəlkə müsəlmansınız.

– Müsəlman olanda nə olar?

– Heç. Deyəsən bir az artıq-əskik danışdım.

– Sizdə taqsır yoxdur.

Onlar susdular. Faytonçu belə bir adamla söhbətin tutmayacağını yəqin edib, cilovları dartışdırdı. Aleksey Osipoviç isə faytonun arxasına söykənib, gözünü səmadakı ağ buludlara zillədi...

“Bu nə şübhədir? Nə üçün insanlar bir-birindən qorxub hürkürlər? Məgər müsəlman olmaq ingilis, yaxud rus olmaqdan pisdirmi? Bütün insanları Allah yaratmayıbmı? Onlar hamısı təbiətin övladı deyilmi? Bəs bu ayrı-seçkilik nə deməkdir? Kim insanlar arasında ögey-doğmalıq salıb? Axı nə üçün səhərdən axşama qədər bir parça çörək üçün yollarda fayton sürən bu rus kəndlisi tanımadığı xalq haqqında belə danışır? Bu işlərdə müqəssir kimdir? Kim insanların beyninə bu zəhəri yeritmişdir? Bizim dərdimiz çox böyükdür. Bu cür axmaq fikirlər nəticəsində yerli xalqlar bizə şübhə ilə baxırlar. Elə ziyalılarımızda da taqsır çoxdur. Onların içində ağalıq iddiasına dü-şənlər, yerliləri öz evlərində rahat dolanmağa qoymaq istəməyənlər azdırmı? Elə bizim seminariyada belələri yoxdurmu?”

Aleksey Osipoviç hələ dörd il əvvəl Qori seminariyasının pedaqoji şurasında olan mübahisəni xatırladı. Seminariyanın direktoru Dmitri Semyonov (Uşinskinin tələbəsi və görkəmli pedaqoqdur (1834-1902), 1878-ci ildən 1883-cü ilə qədər Qori seminariyasının direktoru olub) müsəlman şöbəsinin açılması məsələsini irəli sürmüşdü. Şurada böyük mübahisə qalxmışdı. Yeni şöbənin açılmasına qəti etiraz edənlər var idi. Semyonovun müəllimləri sakit etdikdən sonra dediyi sözlər Aleksey Osipoviçin indi də yadındadır.

– Cənablar, bir fikir irəli sürəndə əvvəlcə ağıl və məntiqə müraciət etmək lazımdır. Əsrin, zamanın tələbini unutmaq olmaz. İndi əlahəzrət imperatorun özü də təbəələrinin savadlanmasını istəyir. Seminariyaların açılması haqqında atamız çarın özü fərman vermişdir. Bizim borcumuz isə deyilənləri yerinə yetirməkdir.

– Fərmanda müsəlman şöbəsinin açılması barədə qeydin olmamasını cənabınızın xatirinə salsam, qəbahət etmərəm.

– Diqqətinizə qarşı minnətdaram, cənab, – deyə Semyonov atmacaya sakit cavab verdi. Yerli şəraiti öyrənmək və əlahəzrətə kömək etmək bizim borcumuzdur. Bir də, unutmayın ki, Qafqaz müsəlmanları da böyük rus imperiyasının təbəələridir. Atamız çarın təbəələri arasında ayrı-seçkilik salmaq özü qəbahətdir. Bizim borcumuz onların savadlanmasına kömək etməkdir.

– Onların rus-tatar məktəblərində oxumaları kifayətdir. Yerlilərdən müəllim hazırlamağa nə ehtiyac var?!

– Bəs sizin dediyiniz məktəblərdə kim dərs deyəcək?

– Biz özümüz.

– Nə vaxta qədər?

– Həmişə.

– Yox, – deyə Semyonov müsahibinin sözünü qətiyyətlə kəsdi.

– Siz yanılırsınız, cənab, gec-tez yerli ziyalılar yetişəcəkdir. Zamanın hökmü belədir. Bizim tarixi borcumuz isə bu işə kömək etməkdir.

– Üzr istəyirəm, cənab Semyonov, yerli ziyalıların yetişməsindən sonra baş verə biləcək hadisələr Sizi narahat etmirmi? Onlar bizə meydan oxumayacaqlarmı?

– Elmin meydanı geniş, mənzili isə uzaqdır. Burada təhlükəli bir şey yoxdur. Qafqaz valisi də bu şöbənin açılmasına razıdır. Yerli müsəlmanların tələbini ödəmək lazımdır. Bizim borcumuz əməli tədbirlər görməkdir.

– Yaxşı, bəs bu şöbəyə kim rəhbərlik edəcək? Tatar dilini bilən müəllimi hardan tapaq?

– Narahat olmayın, – deyə Semyonov sakitcə gülüb Aleksey Osipoviçi təqdim etdi. – Cənab Çernyayevski (A.O.Çernyayevski (1840-1897) Qori seminariyasında Azərbaycan şöbəsinin inspektoru olmuşdur) bu işin öhdəsindən gələr. Mən onu Kuban seminariyasından tanı-yıram. Maarif sahəsində təcrübəsi çoxdur. Hərçənd "Tiflisski vestnik" qəzeti vaxtı ilə onun poçtda işləməsinə işarə edərək, Aleksey Osipoviçi "eks poçtalyon" adlandırmışdır. Amma zərər yoxdur. Bizim maarif cəbhəsində bu cür "eks poçtalyonlara" ehtiyac çoxdur. Həm də, cənablar, Aleksey Osipoviçin onların dilini və adətlərini mükəmməl bildiyini sizin nəzərinizə çatdırmalıyam. Mən onu müsəlman şöbəsinə inspektor və müəllim təyin edirəm.

Elə həmin axşam Semyonov Aleksey Osipoviçi yanına çağırdı. Olqa Konstantinovna onu mehribanlıqla qarşıladı, süfrəyə şirniyyat və çay qoyduqdan sonra küncə çəkilib tikiş tikməyə başladı. Semyonov mürəbbəli çaydan bir-iki qurtum aldıqdan sonra sakitcə sözə başladı.

– Siz elə sözlərə fikir verməyin, Aleksey Osipoviç, bizim borcumuz insanlara xidmət etməkdir. Müəllim el anasıdır. Maarif gözlərin ziyasıdır. Biz gözləri açmalı, ətrafa ziya saçmalıyıq. Yoxsa bu zülmət səltənətində yaşamaq olmaz.

– Mən Sizi anlayıram, Dmitri Dmitriyeviç, bu yolda çətinliklərin də olacağını indidən görürəm. Müsəlmanlara daha çox kömək etmək lazımdır. Mən onların həyatına yaxşı bələdəm.

– Çara və hökumətə yerli məmurlar lazımdır. Elə bunun üçün də məktəblər açırlar. Amma biz daha uzağa baxmalıyıq. Yeni məktəblərdən yeni məqsədlər üçün istifadə etməliyik.

– Aydındır. Mən yerli ziyalıların bəziləri ilə tanışam. Bizim Şamaxıda Seyid Əzim Şirvani adlı bir şair var. O çox güclü və gözüaçıq adamdır. Yeni üsulla məktəb açmaq istəyir. Onun nələr çəkdiyi mənə bəllidir. Bir yandan yerli ruhanilər onu incidir, digər tərəfdən köhnə məktəbin buxovlarından azad ola bilmir. Öz dillərində dərslikləri də yoxdur. Mənim arzularım çox böyükdür.

– Elə ona görə də Sizə məftun olmuşam, cənab eks poçtalyon,

– deyə Semyonov dostcasına əlini onun çiyninə qoydu. – Bu işdə fədakarlıq lazımdır. İlk illər çətinlik olacaq. Siz qorxmayın. Bizim seminariya müəllimləri içərisində təhkimçilik dövrünə qayıtmaq istəyənlər də var. Gələcəyi görməyənlər də çoxdur. Ancaq müsəlmanların özləri öz talelərini bizdən yaxşı anlayırlar. Bilirsinizmi, müsəlman şöbəsinin açılması fikrini kim ortaya atmışdır?

– Zənnimcə, Sizin təşəbbüsünüzdür.

– Yox, məndən qabaq bu fikri kapitan Axundov irəli atmışdır.

– Mirzə Fətəlimi?

– Bəli.

– Mən onun haqqında çox eşitmişəm. Əsərlərini oxumuşam. Böyük zəkadır.

– Elə bəzilərini də qorxuya salan budur. Çayınızı için. Olqa Konstantinovna, deyəsən, Aleksey Osipoviçin çayını təzələyəsi olacaqsınız. Hə, indi mən Sizə arxayınam. Əməli təkliflərinizi yazın, fikrinizi mənə bildirin. Hər şeydən əvvəl şagirdlərin haqqında düşünmək lazımdır.

– Taparıq, Dmitri Dmitriyeviç, kəndbəkənd gəzməli də olsam tapacağam.

Bu söhbətlər 1879-cu ildə olmuşdur. Şöbənin açılmasına rəsmi icazə verilməsə də, onlar sentyabr ayına qədər beş-altı tələbə yığa bilmişdilər. İndi isə şöbəni genişləndirmək mümkün idi. Artıq hökumətin rəsmi əmri alınmışdı. Elə bu məqsədlə də Aleksey Osipoviç səfərə çıxmışdı. O düz bir ay idi ki, yollarda idi. Təxminən üç min verst qət etmişdi. Bəzən kəndləri piyada dolanmış, Şamaxıda, Şuşada, Gəncədə olmuşdu. İrəvan quberniyasını gəzmişdi. İndi isə Qazaxdan keçib Tiflisə gedirdi...

Artıq gün yaxmışdı. Təpələrin kölgəsi uzanıb yolun üstünə sərilmişdi. Uzaqdakı kənd evlərinin pəncərə şüşələri qürub şəfəqlərini əks etdirib parıldayırdı. Atların təri soyumuşdu. Faytonçu bu axşam şəhərə çata bilməyəcəyini yəqin etdiyindən sakitləşmişdi. Xır yolunda asta-asta

irəliləyən fayton təkərinin qıcırtısı, bir də at nalının taqqıltısından başqa heç nə eşitmirdi.

Aleksey Osipoviç faytonun günlüyünü qatlamaq üçün ayağa durdu. Bunu hiss edən faytonçu qanrılıb geri baxdı.

– Sizə nə lazımdır, cənab?

– Artıq sərin düşüb.

– Bu saat.

O, cilovu çəkib atları dayandırdı. Yaşına uyğun olmayan bir cəldliklə atılıb yerə düşdü. Aleksey Osipoviç də faytondan endi. Onun paltarına narın toz qonmuşdu. Ayaqları üyüşmüşdü.

– Atları açın, dincəlsinlər. Özümüz də nəfəsimizi dərək.

Faytonçu bu dəfə etiraz etmədi. Aleksey Osipoviç yolun alt tərəfindəki dərə ilə axan balaca çaya yaxınlaşdı. Pencək və köynəyini çıxardıb otluğa atdı. Ayağını da soyundu. Xırdaca daşların üstü ilə yeriyib, çayın ortasında dayandı. Su isinmişdi. Balaca, yumru və sürüşkən daşlar ayağı qıdıqlayırdı. Aleksey Osipoviç ovcunu doldurub, ılıq suyu üzünə çırpdı. Böyük ləzzətlə yuyundu.

Faytonçu da atlarını çimizdirdi. Bədəni sərinləyən kəhərlər ayaqlarını suya çırpıb, daşları şaqqıldadırdılar. Elə bil uşaq kimi sevinir, köpüklü suları sıçradıb, ətrafa dağıtmaqdan zövq alırdılar.

Hava sərinləşmişdi. Amma əsən mehin nəfəsində hələ də istilik vardı. Adamı təndirin alovu kimi bürkü vururdu. Yuyunub qurtarandan sonra özünü yüngül hiss edən Aleksey Osipoviç göylükdə balaca bir süfrə açdı. Faytonçu isə atları suyun kənarındakı çəmənliyə buraxdı.

– Yaxın gəlin, çörək yeyək.

– Çox sağ olun, cənab.

– Sağ olunu sonra deyərsiniz, gəlin.

Faytonçu könülsüzcəsinə süfrəyə yaxınlaşdı. Kənardaca dizi üstə çökdü. Sulu əllərini əvvəlcə saçına, sonra da saqqalına çəkdi. Süfrədəki kolbasaya, pendir-çörəyə baxdı. Aleksey Osipoviç şərab şüşəsini açmaq istəyirdi.

– Verin mənə, Sizə çətin olar.

O, şüşəni götürdü. Cibindən iri bir bıçaq çıxardıb, tıxacı açdı. Stəkana şərab tökdü.

– Buyurun, cənab.

– Əvvəlcə Siz için.

– Yox, yox, Siz buyuracaqsınız. Mən içməsəm də olar.

– Yoldaşlıqda ayrı-seçkilik olmaz. Bağışlayın, adınız...

– İvan Filippiç, cənab.

– İvan Filippiç, Sizin sevmədiyiniz müsəlmanlarda belə bir məsəl var: Yoldaş yoldaşla tən gərək, tən olmasa gen gərək. İndi biz yoldaşıq.

Faytonçu özünü itirmişdi. Bir az bundan əvvəl haqqında çox pis fikirdə olduğu adamın sadə və səmimi rəftarı onu çaşdırmışdı. Aleksey Osipoviçsə artıq əlli yaşı keçmiş bu kişinin dizi üstə oturub, günahkar bir uşaq kimi, çəkinə-çəkinə süfrəyə əl uzatmasına, ətrafı qırışmış gözlərindəki məsumluğa, qalın saqqalına, üst dodağını örtmüş bığına, alnına tökülən saçlarına baxdıqca atasını yadına salırdı. O da belə idi. Ömrü boyu bir parça çörək üçün çalışmışdı...

Atası yay aylarında furqonla Şamaxıdan, Ağsudan Çuxuryurda və başqa yaylaqlara adam daşıyırdı. Bəzən həftələrlə evə qayıtmazdı. Taxıl biçini zamanı isə başqa kəndlilərlə birlikdə arvad-uşağını da yığıb, aran yerlərinə enərdi. Qatarlaşan furqonlar tozlu-torpaqlı yollarla bir neçə gün getdikdən sonra taxıl zəmilərinin ətrafında dayanardı. Sahibkarla biçinçilər arasında sövdələşmə başlanardı.

Atası ilə bir yerdə olduğu sonuncu yay Aleksey Osipoviçin yadından heç vaxt çıxmırdı. Onda onun altı, ya yeddi yaşı ancaq olardı. Həmin il Şamaxının ətrafındakı əkin yerlərini dolu döymüşdü. Onların taxılından heç əsər də qalmamışdı. Aclıq təhlükəsi vardı. Hamı kimi Osip də aran yerinə, biçinə getməyə hazırlaşırdı. Yola düşməzdən bir gün əvvəl balaca Alekseyi yanına çağırdı.

– Alyoşa, sən evimizdə qal, ananla mən gedim. Çox çəkməz, bir aya qayıdarıq. Oralar istidir, sonra xəstələnərsən.

– İstəmirəm, – deyə Aleksey ayaqlarını yerə döydü. – Məni də özünüzlə aparın. Sizə kömək edərəm. Atları otararam.

– Axı, istiyə dözməzsən.

Anası da ona tərəf çıxdı. Aleksey gedəsi oldu. Həmin gecə o yatmadı. Yola tədarük görən, çörək bişirib, yorğan, döşək hazırlayan anasına kömək etdi. Obaşdan, hələ dan ulduzu doğmamışdan yola düşdülər.

Aleksey atasının yanında oturmuşdu. Furqonun çadırını çəkmişdilər. Kənd xoruzları səs-səsə verib banlaşır, elə bil bir ağızdan qışqırıb: "Alyoşa, hara gedirsən?" – demək istəyirdilər. Ayazımaqda olan üfüqə tamaşa edən Aleksey sərin havanı ciyərlərinə çəkib, qürurlanır, qışqırıb hamıya "Artıq mən böyümüşəm. Atama kömək edəcəyəm", – demək istəyirdi. Atası isə gözaltı onu süzür, "Sənə soyuq olar, get

ananın yanına uzan", – deyirdi. Aleksey nəinki getmək istəmir, əksinə, cilovu atasının əlindən alıb, furqonu özü sürməyə, beləliklə də böyümüş olduğunu göstərməyə çalışırdı.

O yay çox gözəl keçdi. Şamaxıdan gələn biçinçilər çölün ortasında, taxıl zəmilərinin kənarında düşərgə saldılar. Furqonları yan-yana açdılar.

Biçinçilər ala-torandan qalxır, şehdən nəm çəkmiş zəmilərə doluşurdular. Alekseyin atası sünbüllənmiş taxılları qucaqlayıb oraqla biçir, anası isə onun arxasınca dərz bağlayırdı. Onlar işləyən zaman atları otaran, sonra da çay qaynadıb, süfrə açan Aleksey arabir anasına da kömək edirdi. Gah bafa bağlayır, gah da dərzləri pəncələyən atasına əl-ayaq verirdi. Günorta furqonun kölgəsinə uzanıb iştahla çörək yeyən ata-anasına tamaşa etmək ona ayrı ləzzət verirdi. Axı bu kartofları suda Aleksey bişirmişdi, çayı da o qaynatmışdı!

Gecəninsə ayrı ləzzəti vardı. Uşaqlarla bərabər atları otarmağa aparan Aleksey ağ çadırlı furqonların yanında alovlanan ocaqlara tamaşa etməkdən doymurdu. Gecənin qaranlığında şəfəqlər oynaşır, çuqun qazanlarda xörək bişirənlərin kölgəsi bir nəhəng kimi uzanıb zəmilərin ortasında gəzişirdi. Lakin səs-küy və canlanma çox çəkmirdi. Yarımca saat sonra bütün günü işləyənlər çul kimi döşənib, ağır yuxuya gedirdilər. Ətrafa qulaq cingildədən dərin sükut çökürdü. Alekseyin isə gözünə yuxu getmirdi. O çox vaxt arxası üstə uzanıb, aylı gecələrdə göyə səpələnmiş ulduzları saymaq istəyirdi. Onların nə üçün titrədiklərinin səbəbini öyrənməyə çalışırdı. Çölün üzərinə çökmüş gecənin sərinliyi onu üşürgələndirəndə yorğana bürünür, soyuqdan titrəşdiklərini güman etdiyi ulduzların halına acıyırdı. Hərdənbir ulduz axanda dik atılır, bu quyruqlu alovun onların zəmisinə düşüb, atasının biçdiyi dərzləri yandıracağından qorxurdu. Belə hallarda bəzən ata-anasını da oyatmaq istəyirdi. Ancaq onların bir-birinə qısılıb, ölü kimi yatdıqlarını görəndə fikrini dəyişirdi. Yenə yerinə uzanır, əllərini başının altında çarpazlayıb, buludları yaran aya tamaşa edirdi. Göy ot xımırtladan atların fınxırtısından və gecə böcəklərinin həzin səslərindən başqa heç nə eşidilmirdi. Arabir kövşənlər şaqqıldayırdı.

Bazar günü isə biçindən bir az tez qayıdırdılar. Çay-çörək yedikdən sonra ocağın ətrafına toplaşardılar. Hamının "Mişka" – deyə çağırdığı sarı telli oğlan qarmon çalardı. Aleksey də özünü kişilər cərgəsində hesab edir, cır səsi ilə mahnı oxuyanlara qoşulardı. Anası həm sevinər, həm də uğunub keçinərdi.

Düz bir aydan sonra biçini qurtardılar. Taxıl sahibləri gəldilər. Pencələri saydılar. Şərt üzrə hər on pencədən birini biçinçilərə verdilər. Aleksey atasının Allaha şükür elədiyini gördü. Kişinin rəngi durulmuşdu. Tez-tez arvadı ilə zarafat edirdi.

– Belə-belə işlər, Mariya, on pencə taxılımız var. Hər pencədən azı on çanaq buğda çıxacaq. Yüz çanaq üç tağardan da çox edir. Şükür, bu il çörəyimiz var. Hələ üstəlik bir-iki pud satıb Alyoşaya da zəhmət haqqı verərik. Yoxsa insafsızlıq olar. Axı o da işləyib. Belədir, ya yox, Aleksey Osipoviç? – deyə atası gülə-gülə ona müraciət etdi. – Sənə qırmızı çəkmə, bir də boynu işləməli ipək köynək alacam. İstəyirsən qotazlı kəmər də alım. Özünü də bu il necə olur-olsun məktəbə göndərəcəm.

Biçinçilər adət üzrə xırman açıb taxıllarını elə zəmilərin kənarındaca döyərdilər. Hazır buğdanı çuvallara doldurub furqonlara yükləyər və birbaş evlərinə qayıdardılar. Alekseygil də elə etdilər. İki gün gecəli-gündüzlü əlləşib taxıllarını döydülər. Furqon karvanı qatarlaşdı.

Şamaxıya gələn kimi atası dediyinə əməl etdi. İki pud taxıl satıb oğluna qırmızı çəkmə aldı. Amma məktəbə göndərə bilmədi.

Kəndə qayıdandan sonra da ot biçini başlandı. Alekseygilin biçənəyi yox idi. Dağların döşündə dalğalanan çiçəkli çəmənlik varlılarındı. Amma ot çalanlar yoxsullar idi. Alekseyin atası da bunların içində idi. Onlar yenə də muzdla işləyirdilər. Aleksey bu dəfə də atasını tək buraxmadı (Elə bil ondan həmişəlik ayrılacağı ürəyinə dammışdı). Atı yallayıb belinə qalxdı. Anasının bişirdiyi xörəyi çölə apardı.

Kəndlilər cərgə ilə kərənti çəkirdilər. Göy otlar yehrələnib uzanırdı. Elə bil dağların döşü zolaq-zolaq olmuşdu. Ovxarlanmış kərəntilərin ağzı parıldayırdı.

Aleksey atını çapıb, ot yığan qızların, gəlinlərin yanından ötürdü. Onların çoxu başına qırmızı qıymaça çəkmişdi. Bellərinə ağ işləməli önlük bağlamışdılar.

Havanın gözəlliyi Alekseyi sevindirirdi. Görünür, biçinçilər də ruzigarın xoş keçməsindən razı idilər.

Aleksey atasını tapdı. Gətirdiyi xörəyi ona verdi. Özü isə kənardaca oturub, onun necə iştaha ilə çörək yeməsinə tamaşa etdi. Kişi lap arıqlamışdı. Çirkli və tərli köynəyi kürəyinə yapışmışdı. Açıq yaxasından tüklü sinəsi görünürdü.

O, xörəyini yeyib qurtarandan sonra əli ilə ağzını sildi. Bığını, saqqalını sığallayıb, ayağa durdu. Boynundan sallanan zəncirli mis xaçı öpdü.

– Çox sağ ol, Aleksey Osipoviç.

– Nə üçün mənə belə deyirsən, mən ki, Alyoşayam.

– Yox, sən daha böyümüsən, Aleksey Osipoviçsən.

Atası onunla xeyli zarafat etdi. Sonra da göyün üzünə baxdı.

– Yaman bürküdür. Yağmasa yaxşıdır. Yaxşı, Aleksey, atını çap, get evə. Bir qucaq da göy ot apar. Anana da de hamamı qızdırsın, gəlib çiməcəm...

Amma o, arvadının hazırladığı hamamda çimə bilmədi. Elə həmin axşam selləmə yağış yağdı. Osip cücə kimi islanmış halda evə gəldi. Yer saldırıb birbaş yorğan-döşəyə uzandı. İki gün titrətdi. Bir həftədən sonra isə davasız-dərmansız sətəlcəmdən öldü.

... Ani fikrə gedən Aleksey Osipoviç gözünü faytonçunun üzündən çəkmədən köksünü ötürdü.

– Siz mənim atama yaman oxşayırsınız. O da Sizin kimi beləcə saç-saqqal qoyardı.

İvan Filippiç həyalı uşaq kimi qızardı. Nə deyəcəyini bilmədi.

– Cənab Aleksey Osipoviç, mən faytonçu babayam. Sizin atanız yəqin ki...

– Xalis kəndli idi. Bir parça torpaqdan və iki atdan başqa heç nəyi yox idi. Siz faytonçusunuz, o, furqon sürərdi.

– İnana bilmirəm, – deyə kişi təəccübləndi və süfrənin kənarında yerini rahatlayıb əyləşdi.

Aleksey Osipoviç onun bəbəklərində oynayan sevinc qığılcımlarını aydınca gördü. Elə bil kişini birdən-birə dəyişdilər. Qaşqabağı açıldı. Dodaqlarının yanı azca əyildi. Parlaq dişləri göründü. Atası da belə idi. O da sevinəndə bu cür qımışardı.

– İçin, – deyə Aleksey Osipoviç stəkanı onun qabağına qoydu. İvan Filippiçsə birdən-birə şüşəni başına çəkdi. Qırmızı şərabın damlaları saqqalına süzüldü. Stəkandakı şərabı Aleksey Osipoviç özü içməli oldu.

– Neçə uşağınız var?

– Allah verəndən çoxdur. Üçü evdədir. İkisini köçürmüşəm.

– Oxuyanı varmı?

– Hardan olsun? – deyə İvan Filippiç yanıqlı-yanıqlı söhbətə başladı. Artıq o çəkinmir, özünə həmdərd tapmış adam kimi ürəyini boşaldırdı. – Özünüz görürsünüz ki, qocalmışam. Külfət çox, faytondan başqa da bir şeyim yoxdur. Bununla da indiki zəmanədə arvad-uşaq saxlamaq çətindir. Kim istəməz balası oxusun? Amma neyləyim, ka-

sıblığın üzü qara olsun, oxuda bilməmişəm. Bircə kiçik oğlum dörd il məktəbə getdi.

– Bəs indi nə işdədir?

– Heç nə. Özünü ora-bura vurur, amma əlindən bir şey gəlmir. Bir həftə bundan qabaq Bakıya iş axtarmağa getmək istədiyini mənə dedi. Deyirlər orda, neft mədənlərində iş çoxdur. Amma uşaqdır, gözümdən qoya bilmirəm.

– Neçə yaşı var?

– Bu yaz on altıya keçəcək.

– Adı nədir?

– Vaska. Vasili.

– Onu ver mənə. Düz sözümdür, niyə təəccüb edirsiniz, özümlə apararam.

– Hara?

– Qoriyə, oxumağa.

– Vallah nə deyim, bunun xərci-xəracatı var.

– Heç nə lazım deyil. Mən onu pansiona düzəldərəm. Hər şey mənim boynuma.

İvan Filippiç eşitdiklərinə inana bilmirdi. Ona görə də cavab verməkdə çətinlik çəkirdi.

– Demək, danışdıq. Tiflisə çatan kimi məsələni həll edirik.

– Olsun, – deyə faytonçu sakitcə cavab verdi.

Onlar yola düşəndə artıq qaranlıq qarışmışdı. Qarşıdakı kənd evlərinin titrək və solğun işıqları görünürdü.

**3**

Gecədən xeyli keçmiş “Zayej”in qapısı döyüldü. “Bu zaman kim olar?” – deyə Əhməd təəccüblə çiyinlərini çəkdi. Qapı bir də döyüldü. Əhməd şüşəsi hislənmiş lampanın fitilini aşağı çəkib, işığı öləzitdi. Hər ehtimala qarşı qoşalüləsini götürüb, qapıya yaxınlaşdı. Səsini çıxarmadan bir xeyli dayandı. Həyətdən at fınxırtısı və xısın-xısın danışan kişi səsi gəlirdi. Əhməd ehtiyatlandı. Onun bu kənddə düşməni olmasa da, gecələr qapını möhkəm bağlayır, pəncərə taxtalarını da qapayırdı.

– Ay ev yiyəsi.

– Kimsən?

– Allah qonağı istəmirsənmi?
– Bu zaman nə Allah qonağı, ay kişi?
– Yol adamıyıq, gecəyə düşmüşük.
Əhməd cəftəni çəkib qapını araladı. İçəridən süzülüb düşən solğun işıqda eyvanda dayananı gördü. Onun qiyafəsindən başa düşdü ki, doğrudan da yol adamıdır. Bir az kənarda əlində qamçı dayanan iri bədənli kişi isə onun şübhələrini tamam dağıtdı.
– Şəhərəmi gedirsiniz?
– A kişi, qonağı qapı qabağında sorğu-suala tutmazlar. Qoy içəri keçək, bir az rahatlanaq, sonra danışarıq.
Əhmədi qonağın sözü bərk tutdu. “Doğrudan da, lap qəribə olmuşam”, – deyə xəyalından keçirdi və qapını taybatay açdı.
– Buyurun, buyurun.
– Çox sağ ol, bəs faytonu neyləyək?
– Həyətdə rahatlayarıq.
– İvan Filippiç...
– Siz keçin içəri, mən özüm ona kömək edərəm.
Əhməd qonağı qabağa salıb yol göstərdi. Tüfəngini küncdə divara söykəyib, lampanın fitilini qaldırdı. Evə çökmüş qaranlıq, işıqdan qorxan kölgə kimi geri çəkildi. İçəri aydınlaşdı. Aleksey Osipoviç içəri ötəri bir nəzər salan kimi ev sahibinin subay olduğunu anladı. Təklif edilən yerdə əyləşməzdən əvvəl pencəyini soyundu.
– Pəncərəni açsaq olmazmı, adam darıxır.
– Bu saat, – deyə Əhməd otağın Kürə baxan tərəfinə keçdi.
Taxtaları, sonra da pəncərənin özünü açdı. İçəri təmiz hava doldu.
– Fikrinizə başqa şey gəlməsin, adam tək olanda qapı-bacanı basdırır.
– Əlbəttə, təklik pis şeydir.
– Üstəlik də qəriblik. Gündüz yenə yaxşıdır, adamın başı işə-gücə qarışır. Amma gecənin biri bir ilə dönür. Yaxşı, Siz əyləşin, mən bu saat faytonçuya kömək edim.
– Hə, zəhmət olmasa, atları rahatlayın. Amma bilmirəm bir-birinizi başa düşəcəksinizmi?
– Dil taparıq.
Əhməd qapını arxasınca örtmədən həyətə çıxdı. İvan Filippiç faytonu eyvanın qabağına çəkib dayanmışdı.
– Atları açın.
Faytonçu ev sahibinin təmiz rusca danışdığını görüb sevindi.
– Siz russunuz?

– Xeyr.

– Lap qəribədir, – deyə İvan Filippiç gülümsündü. – Mənim sərnişinim tatarca danışır. Sizsə rusca. Adam çaşıb qalır.

– Burada çaşılası bir şey yoxdur. Atları açın, xalxala salaq. istəyirsiniz faytonu da o tərəfə çəkək.

– Yox, yox, elə buradaca, gözümün qabağında olsa yaxşıdır.

Əhməd onun ehtiyat etdiyini görüb gülümsündü.

– Heç nədən qorxmayın, siz qonaqsınız. Qonağa zaval olmaz.

Onlar atları xalxala saldılar. Əhməd Kürün kənarındakı çəmənlikdən biçib gətirdiyi göy otu qucaqlayıb faytonçuya verdi.

– Al, qoy hələlik yesinlər. Çatmasa, bir azdan gedib yenə gətirərik.

İvan Filippiç sakitcə keçib getmək və gecələmək istəmədiyi bu kənddə özünə həmdərd tapdığına sevinir və ev sahibinin mehribanlığını gördükcə, qəlbindəki şübhə azalırdı. O, atların ətrafında fırlanır, əli ilə bellərini ovxalayır, tərli tüklərini sığallayırdı. Uzun və ağır yolun yorduğu atlar isə sahibinin nəvazişindən xoşhallanır, qulaqlarını qırpa-qırpa göy otu xımırtladırdılar.

Aleksey Osipoviç pencəyini soyunduqdan sonra pəncərənin qabağına gəldi. Cib dəsmalını çıxardıb, saçı tökülmüş başının tərini sildi. O yaman yorulmuşdu. Rahat bir yer olsa, uzanıb dincələrdi. Elə bu məqsədlə evə göz gəzdirdi. Üstünə gəbə salınmış taxta yaxınlaşdı. Yanı üstə uzanıb mütəkkəyə dirsəkləndi. “Axır ki, səfəri başa vururam, – deyə düşündü, – sabah olmasa da, biri gün evdəyəm”. O gördüyü işdən həm razı idi, həm də narazı. Razı idi ona görə ki, zəhməti hədər getməmişdi. Az-çox rus dilini bilən uşaqlarla görüşmüş, onlarla söhbət edərək, altmışa qədər adamın razılığını almışdı. Digər tərəfdən də Aleksey Osipoviç uşaqların azlığına görə özündən narazılıq edirdi. “Gərək bir az gəzəydim. Ən ucqar kəndlərə də gedəydim. Bəlkə beş-on uşaq tapardım. Bircə kəndlərdə yerli dildə məktəblər açılmasına icazə veriləydi! Onda bizim də işimiz asanlaşardı”.

O, göz gəzdirib otağı nəzərdən keçirdi. Divardan asılmış yarımkürələr xəritəsi, küncdəki qlobus, pəncərənin qabağına və stolun üstünə yığılmış kitablar, dəftərlər diqqətini cəlb etdi. Bir az bundan əvvəl göz qapaqları ağırlaşıb, yatmaq istəyən Aleksey Osipoviçin yuxusu dağıldı. O durub stola yaxınlaşdı. Vərəqləri didilib tökülən əlifba kitabını səhifələdi. Sonra dəftərləri açdı.

Aleksey Osipoviç stul çəkib əyləşdi. Böyük maraq və diqqətlə yazıları nəzərdən keçirdi. O gah sətrin aşağısına doğru hərfləri əyilən,

gah da yuxarı dırmaşan sözləri böyük səy və çətinliklə yazan uşaqların balaca və titrək barmaqlarını gözü qabağına gətirdi. Xətlər cürbəcür idi. Hərflərin düzülüşündən burada əlinə yenicə qələm alan uşaqların da, az-çox xətlərini bişirənlərin də zəhmət çəkdiyini müəyyənləşdirmək olurdu. Kim isə yazıları yoxlamış, səhvləri də qırmızı mürəkkəblə düzəltmişdi.

Aleksey Osipoviç otağı bir də nəzərdən keçirdi. Bura məktəbə oxşamırdı. Elə ev sahibi də müəllimə bənzəmirdi. Bəs onda o haraya düşmüşdü? Axı o, kəndlərdə indiyəcən bu cür yaşayış evi görməmişdi.

Atları rahatlayandan sonra içəri, samovar aparmağa gələn Əhməd qonağın dəftərlərlə əlləşdiyini görüb ayaq saxladı.

– Nə üçün uzanıb dincəlmirsiniz?

Aleksey Osipoviç səsə qanrılıb baxdı.

– Siz müəllimsiniz?

– Xeyr.

– Bəs bunlar nədir?

– Dəftərdir. Uşaqlar yazıblar.

– Bilirəm uşaqlar yazıb, bəs sizin evdə nə gəzir?

– Mən yazdırmışam.

– Heç nə başa düşmürəm. Həm deyirsiniz müəllim deyiləm, həm də deyirsiniz mən yazdırmışam. Axı, Siz kimsiniz?

– Poçtalyon kimi bir şey.

– Necə, poçtalyon?

– Bəli. Bilirsinizmi, cənab, əslində mən burada işsizəm. Əvvəllər Bakıya, Yerevana, Gəncəyə gedən poçt faytonları, dilicanlar buradan gəlib keçərdi. Amma dəmiryol çəkiləndən sonra şose yolunda gəliş-gediş azaldı. Mən də, necə deyərlər, boş evə qarovul çəkirəm. Darıxmamaq üçün uşaqları başıma yığıb yazı-pozu öyrədirəm.

Aleksey Osipoviç ayağa durub Əhmədin çiynindən yapışdı. Onu işığa doğru gətirib, diqqətlə sifətinə baxdı. Elə bil Əhmədin gözlərindəki mənanı oxumaq, gülümsər çöhrəsini çulğamış hüzn və kədərin səbəbini öyrənmək istədi.

– Siz nə qədər böyük iş gördüyünüzü bilirsinizmi?

– Burada nə var ki? – deyə Əhməd sakitcə cavab verdi.

Aleksey Osipoviç ona baxdıqca öz gəncliyini xatırlayır, Əhməd isə bu qəribə və maraqlı qonağın xeyirxah insana oxşadığını hiss edirdi.

– Adınız nədir?

– Əhməddir. Əvvəllər kənd arasında mənə "poçt Əhməd" deyərdilər. Sonra nədənsə "rus Əhməd" oldum. İndi isə yavaş-yavaş "uçitel Əhmədə" çevrilirəm. Görək sonra nə olacaq.

– Poçt Əhməd... – Aleksey Osipoviç qəhqəhə çəkib güldü. – İndi uçitel olmusan. Lap mənim kimisən. Axı bizim taleyimiz bir-birinə yaman oxşayır. Mən də əvvəllər poçtda işləmişəm. Sonra müəllimliyə başladım. İndinin özündə də yoldaşlarım mənə zarafatla "eks poçtalyon" deyirlər. Elə bir çıxırıq. "Poçt Əhməd", ya da "eks poçtalyon". İkisi də bir sözdür. – O yenə qəhqəhə çəkdi.

Əhməd qonağının qoltuğunun altı qıdıqlanan uşaq kimi uğunub getdiyini, qıyıq gözlərinin daha da kiçilib yaşardığını gördükdə özünü gülməkdən saxlaya bilmədi. Onlar bir-birinə qoşuldular. Qapı ağzında dayanıb onlara tamaşa edən İvan Filippiç bir şey başa düşmədiyindən çiynini çəkdi və sakitcə samovarı götürüb həyətə çıxdı.

Aleksey Osipoviç gülməyinə ara verib, dəsmalla gözünü sildi. Sonra ağ dəsmalı yenə səliqə ilə qatlayıb şalvar cibinə qoydu. Əlini saqqalına çəkib dayandı.

– Bəs rus dilini harada öyrənmisən?

– Peterburqda.

– Başı bəlalı adama oxşayırsan, qardaş, – deyə Aleksey Osipoviç müsahibinin üzünə baxdı, sonra da stul çəkib əyləşdi. Onunla üzbəüz dayanan Əhməd eşmə papirosunu yandırandan sonra qonağın hələ də sual dolu baxışlarla onu süzdüyünü görüb dilləndi:

– Oxuyurdum.

– Harda?

– Hüquq fakültəsində.

– Qurtara bildinmi?

– Xeyr, yarımçıq qovdular.

– Niyə?

– Siyasi əqidəmi şübhəli hesab etdilər.

Aleksey Osipoviç müsahibinin titrək səslə söylədiyi sözləri eşidəndən sonra stulunu bir az geri çəkdi. Sakitcə dayanıb aramca papiros sümürən Əhmədin nəfəsi qırışıq havaya yayılan tüstü içində xəyal kimi görünən sifətinə baxdı. Onun saqqalı xeyli uzanmışdı. Uzun saçı qıvrılıb qaşının üstünə qədər enmişdi. Sifətində iztirablı günlərin izi qalsa da, hələ ilk təravətini itirməmişdi. Gözləri dalğın və düşüncəli idi. Aleksey Osipoviçin dodaqları azca qaçdı.

– Yoxsa inqilabçılara qoşulmuşdun?

– Bir balaca meyl etmişdim.
– Bəs indi necə?
– İndimi? – deyə Əhməd səsini bir az uzatdı. – İndi heç bir şey. Gördüyünüz kimi, ən ucqar kəndə gəlib çıxmışam. Cəmiyyətdən ayrı kimi yaşayıram. Atam-anam da məndən üz döndərib. Əlimdən heç nə gəlmir.
– Düz demirsən, Əhməd, sən özün də bilmədən yaxşı bir iş başlamısan. Zənnimcə, millətinə kömək etmək istəyən hər kəs elm və maarifə fikir verməlidir. Sənin bu kənddə uşaqlara dərs deməyin böyük xidmətdir. Bu işə çoxdanmı başlayıbsan?
– İkinci ildir.
– Uşaqlar bir şey öyrənə bilirlərmi?
– Öyrənirlər.
– Sabah onlarla söhbət edə bilərikmi?
– Yoxlamaq istəyirsiniz?
– Yox, yox... Bilirsinizmi, mən Qori seminariyasında işləyirəm. Biz orada təzə şöbə açmışıq.
– Harada işləyirsiniz?
– Qoridə. Necə məgər? – deyə Aleksey Osipoviç gözləri genişlənmiş Əhmədə baxdı.
– Bağışlayın, Siz Çernyayevski deyilsiniz ki, Aleksey Osipoviç?
İndi də qonaq heyrət və maraqla ev sahibini süzdü.
– Bəli, düz tapmısınız. Bəs Siz mənim adımı hardan bilirsiniz?
– Əşrəfin məktublarından. O həmişə Sizdən yazır. Axı, onu mən oxutmuşam. İndi Sizin tələbənizdir.
– Hansı Əşrəf? Göytəpəlimi? – deyə qonaq təəccüblə soruşdu.
– Bəli.
– Çox yaxşı tanıyıram. Ən yaxşı oxuyan tələbələrimizdəndir. Bilirsinizmi nə var, Əhməd, madam ki, Əşrəfi siz oxutmusunuz, demək, o biri uşaqlar da fərasətli olacaq. Necə deyərlər, xəstə sağalası olsa, təbib qənşər gələr. Demək, Siz mənə kömək edə biləcəksiniz. Uşaqlarınızdan neçəsini Qoriyə oxumağa apara bilərəm?
– Ailələri razı olsa, altı-yeddi nəfər.
– Yəni, deyirsiniz, bu işə etiraz edərlər?
– Bilirsinizmi? – deyə Əhməd kədərli səslə sözünə davam etdi.
– Bizim camaatın dərdi böyükdür. Ümumən, balaca millət olmaq bədbəxtlikdir. Hərə bir qapaz vurur, gözünü açmağa qoymur. Bir yandan da özümüzün satqınlarımız aman vermirlər. Siz bizim mollaları tanımırsınız. Onlar qoymurlar ki, camaat gözünü açsın.

– Ruhanilərin xalqa mənfəəti azdır.

– Düzdür, amma bizimkilərin dərdi heç açılası deyil. Kənddə bir adamın savadlı olmasını istəmirlər. Neçə dəfə mənə hücum çəkiblər. Keçən il də böyük dava oldu.

– Nəyin üstündə?

– Əşrəfin. Atası onu Qoriyə oxumağa göndərmək istəyəndə Molla Sadıq hay-haray saldı. Camaatın içində kişiyə "kafirsən" dedi. Hələ üstəlik məni də yamanladı. "Uşaqların mollaxanadan qaçmasının baisi sənsən", – deyə lənət yağdırdı.

– Demək, kəndinizdə mollaxana var.

– Bəli.

– Çox maraqlıdır. Sabah ora getmək pis olmaz.

– Məsləhət görmürəm.

– Heç nədən qorxmayın.

Onların başı söhbətə o qədər qarışmışdı ki, İvan Filippiçin həyətdə odun yarıb, ocaq qalamasından, qaynamış samovarı içəri gətirməsindən belə xəbərləri olmadı. Yalnız söhbətin çox uzun çəkdiyini hiss edən faytonçu "Aleksey Osipoviç, çay hazırdır" – deyə qışqırandan sonra dönüb baxdılar. Qonaq jiletinin yaxasından gümüş zənciri sallanan saatını çıxartdı. Düyməni basıb, qapağını açdı.

– İvan Filippiç, gərək bizi bağışlayasan, başımız söhbətə yaman qarışıb.

– Gecə keçir, rahatlanmaq lazımdır. Səhər tezdən yola çıxasıyıq.

Aleksey Osipoviç saatının qapağını şaqqıltı ilə qapayıb, döş cibinə qoydu. Əhmədin tələsik düzəltdiyi süfrəyə yaxınlaşdı. Buğlanan isti çayı qabağına çəkdi.

– Camaat hələ yaylağa köçməyib ki?

– Xeyr. Amma bu gün-sabah tərpənəsidirlər.

– Demək hamı kənddədir?

– Meşəyə, binəyə köçənlər də var.

– Demək belə. İvan Filippiç, deyəsən bir-iki gün bu kənddə qalası olacağıq.

– Bəs şəhərə tələsmirdiniz?

– Fikrimi dəyişdim.

– Özünüz bilən yaxşıdır.

– Gəlin əyləşin, çörək yeyək.

İvan Filippiç kətil çəkib oturdu. Lüləyi açıb, pıqhapıqla qaynayan samovardan bir stəkan çay süzdü. Tələsdiyindən çayın soyumasını göz-

ləyə bilmədi. Stəkanı yarıya qədər boşaldıb, nəlbəkini barmaqlarının ucunda yuxarı qaldırdı. Dirsəyini stola söykədi. Sol əli ilə dodağının üstünü örtən bığını geri sığalladı. Nəlbəkini ağzına yaxınlaşdırıb, buğlanan çayı hortahortla içməyə başladı. İkicə qurtumda nəlbəkini boşaldıb, əlini yenidən stəkana uzatdı. Elə bu vaxt haradasa dalbadal güllə açıldı. Kənd itləri səs-səsə verib zingildəşdilər. Belə şeylərə adət eləyən Əhməd yerindən tərpənmədən çayını içdi və qonaqlara "narahat olmayın, yəqin tülkü-mülkü qovurlar" – dedi. Ancaq atışma şiddətlənib, itlər səs-səsə verəndə Əhməd nəlbəkini yerə qoydu və bayırdakı səs-küyü xeyli sakitcə dinlədi. Ehmalca ayağa durub qoşalüləni götürdü.

– Yəqin yenə kiminsə evinə basqın eləyirlər.

– Nə, basqın? – deyə Aleksey Osipoviç təəccüblə soruşdu və özü də hiss etmədən Əhmədlə bərabər eyvana çıxdı. Onlar, ağız-ağıza verib hürüşən itlərə və gecənin sükutunu pozan qışqırtılara qulaq asdılar. Hay-haray əvvəlcə kəndin aşağısından gəlirdi. Sonra itlər basa-basa Kürün üstünə endilər. Çəmənlikdə bir xeyli nəyi isə qovdular. Dalbadal güllə atıldı. Əhməd göyün üzündəki qızartıları görəndə nəyinsə yandığını anladı və yanğının harda olduğunu bilmək üçün dərhal məhəccərin üstünə çıxdı. Buradan hər şey aydınca görünürdü. Sahildə çathaçatla yanan ot tayalarının alovları qaranlıqda şölələnirdi.

İtlər kimisə qovub suya saldılar. Atışmanın arası kəsəndə at kişnəməsi və boğuq tappıltılar eşidildi. Haradasa qıy çəkdilər.

– Nə olub? – deyə heç nə başa düşməyən Aleksey Osipoviç yenə soruşdu.

Əhməd məhəccərin üstündən boylana-boylana:

– Ot tayaları yanır, – dedi.

– Oğurluğa gələn otu niyə yandırır?

Əhməd məhəccərin üstündən aşağı endi.

– Bu oğru işinə oxşamır. Deyəsən düşmənçilik məsələsidir.

## 4

Yatmağa hazırlaşan Cahandar ağa nökərlərdən ot tayasına od vurulduğunu eşidən kimi çırağı söndürdü. Belə hallarda düşmən pusquda dayanıb, qapını gözlədiyini yaxşı bildiyindən, tüfəngi götürüb pəncərədən bayıra atıldı. Həyətə çıxmayıb, birbaş evin dal tərəfinə hərləndi. Çəpərin dibinə sinə-sinə kölgə kimi sürünüb, talvarın altına gəldi.

Dirəyə daldalanıb, itlərin qəzəblə hürdükləri tərəfə bir-iki güllə atdı. Qaranlıqdan onun atəşinə atəşlə cavab verdilər. Yaşıla çalan barıt alovu parıldayıb söndü. Cahandar ağa tətiyi bir də çəkib işıq gələn səmtə güllə atdı. Çaxmağı hərləyib yenidən nişan almaq istəyirdi ki, itlər qaraltını qovub sahilə endirdilər. Kişi "ayə, qoymayın!!!" – deyə qıy çəkdi. Nökərlər əllərinə nə keçdisə götürüb darvazadan çıxdılar. Tapdıq tövlədəki atlardan birini yallayıb belinə qalxdı və siyirməxəncər sahilə doğru çapdı.

İtlər qaraltını yaxaladılar. Onu əvvəlcə kəndin içinə doğru, sonra isə yanan tayalara tərəf qovdular. Cahandar ağa qaraltı alovun işığına çıxan kimi nişan almaq üçün barmağı tətikdə hazır dayandı. İtlər qaçanın qabağını kəsdilər. Cahandar ağa hiss etdi ki, at hürküb fınxırdı və birdən sıçrayıb üzüaşağı, Kürə doğru çapdı. İtlər ondan əl çəkmədilər. Kişi yenə bir-iki güllə atdı. Nökərlərin qaçan adamı qamarlamağa çalışdıqlarını bilib gözlədi. O hiss etdi ki, Tapdıq itlərin geri qaytardığı adamın qabağını kəsmək fikrindədir.

İtlər birdən uçurumun kənarında dayandılar. Ağır bir şey şappıltı ilə suya düşdü. Cahandar ağa itlərin sahildə dayanıb hürmələrindən anladı ki, atlı aradan çıxdı. O ya suya batıb qaldı, ya da ki, üzüb özünü adadakı cələyə saldı.

O, səs-səmir kəsəndən sonra tüfəngini çiyninə alıb ağır-ağır evə qayıtdı. Təlaş içində eyvanda dayanan Mələyə fikir vermədən içəri keçdi. Tüfəngi taxtın üstünə atdı və yalnız bundan sonra arvadını səslədi.

– Gəl çırağı yandır, özün də keç o biri otağa!

Mələk səs salmaqdan ehtiyat edirmiş kimi barmaqlarının ucunda gəlib, hələ istisi soyumamış şüşəni çıxartdı. Fitili yuxarı çəkib alışdırdı.Otağa solğun bir işıq çiləndən sonra ərinin üzünə baxmağa cəsarət etmədiyindən səssizcə kölgə kimi çəkilib qapının dalında əridi. Cahandar ağa papiros eşib müştüyə keçirdi, acgözlüklə papirosunu sümürə-sümürə otaqda gəzdikcə tüstü-duman evi bürüdü. Kişini fikir götürdü. Tez-tez "mənə sataşan kim olar?" – deyə özünə suallar verdi. "Bu, uşaq-muşaq işi deyil. Gələn oğru da deyildi. Oğru olsaydı tövləyə, ya da xalxala basqın edərdi, daha çöldəki otlara od vurmazdı. Yox, bu kimdirsə mənə sataşır. Bəlkə o gədədir, Şamxalın hayıfını məndən almaq istəyir? Yəni belə işə cürət edər? Yox, ağlım kəsmir. Gəmiçi Qocanın oğlunu qan ha örtməyib, belə qələt eləsin. İnanmıram. Yaxşı, bir hovurluğuna deyək ki, otu o yandırıb. Bəs Salatına

güllə atan kim idi? Onda ki Şamxal məsələsi yox idi. Deyəsən burda ayrı əl var. Bəlkə... Cahandar ağa duruxdu. Mələyin əvvəlki ərini indiyə qədər yadına salmadığına, bu barədə təzə arvadı ilə bir kəlmə danışmadığına özü də təəccüb etdi. – Necə olub ki, bu mənim ağlıma gəlməyib? Onun kimliyini öyrənməmişəm. Elə o olacaq. Yoxsa heç kəs cürət edib mənim evimin həndəvərinə hərlənməz. Hələ bu kənddə indiyəcən qabağımdan söz qaytaran olmayıb. İndi isə mənə sataşırlar. Elə bu onun işidir. Görünür, hələ məni yaxşı tanımır".

Kəndin bir az bundan əvvəl ağız-ağıza verən itləri səslərini kəsdilər. Nökərlər geri qayıtdılar. Darvazanın ağzında dayanıb qaranlığa hürən itlər zingildəyib susdular. Cahandar ağa gözünü qapıya zillədi. Nökərlərin nə xəbərlə gələcəklərini gözlədi. Hamıdan sonra həyətə girən Tapdıq atı dirəyə bağlayıb, ağanın yanına gəldi. Cahandar ağa gözünü geniş açıb qapının ağzında dayanan nökəri süzdü. Onun yoğun, zəhmli səsi eşidildi:

– Nə oldu?

– Tuta bilmədik, ağa, mən qabağını kəsənəcən özünü suya atdı.

– Belin qırılmamışdı ha, dalınca niyə getmədin?

– Sözün düzü, qısqandım.

– Nədən?

– Axı tüfəngli adamın üstünə əliyalın getmək çətindir.

– Bəs belindəki nədir?

– Xəncər tüfəng deyil ki, kürəyini odlayasan, ağa, əgər tüfəngim olsaydı, əlimdən qaça bilməzdi. Aramızda bircə güllə mənzili qalmışdı. Neyləyim, mən özümü yetirənəcən suyu keçib cələyə girdi.

– Yaxşı, tüfəng də verəcəm. Görüm onda sözün nə olacaq... Heç olmasa tanıya bildinmi?

– Yox, tanıya bilmədim.

– Çərkəz deyildi ki?

– Kim? Çərkəz? Yox, ağa, nə danışırsan! Çərkəz olsaydı, o saat tanıyardım. Kim idisə bura adamına oxşamırdı.

Cahandar ağa ağır sükut içində bir xeyli qarşısında dayanan nökərə baxdı. Sonra iri müştüyə keçirdiyi papirosunu tüstülədə-tüstülədə otaqda gəzindi. Tapdıq bu iri bədənli kişinin qurğuşun qaldırırmış kimi ağır-ağır tərpəndiyini, sir-sifətindən zəhrimar yağdığını, gözlərinin yenə qızarıb qan çanağına döndüyünü gördü və anladı ki, ağası bu saat qana həris bir yırtıcı kimi əlinə keçəni parçalamağa hazırdır.

Cahandar ağa onun qabağında dayandı. Qaşlarını çatıb zəhmlə nökərə baxdı.

– Deyirsən bura adamına oxşamırdı, hə?

– Bəli, ağa, nabələd adamdı.

Kişi papirosunu sümürüb yenə otaqda gəzindi. Tapdıq cansıxıcı sükutdan yaxasını qurtarmaq üçün astaca dilləndi:

– Ağa, deyəsən, gülləniz boşa çıxmayıb.

Cahandar ağa dabanı üstündə geri fırlanıb, eşitdiklərinə inanmırmış kimi gözünü Tapdığa zillədi. Onun qıllı qaşları bir-iki dəfə qalxıb-endi.

– Nə dedin?

– Dedim ki, gülləniz boşa çıxmayıb. O adam kimdirsə, yaralıya oxşayırdı. Deyəsən atına da güllə dəymişdi.

– Nədən bilirsən?

– Bundan, – deyə Tapdıq əlindəki yun başlığı göstərdi. – Qana bulaşıb.

– O nədir?

– Başlıq.

– Kimindir?

– Bilmirəm... Yarğanın qaşından tapdım. Görünür, itlər onu təntidib suya salanda başından düşüb.

– Göstər görüm.

Tapdıq başlığı taxtın ayaq tərəfində işığa sərdi. Cahandar ağa diqqətlə qotazlı yun başlığın ləkələrinə baxdı. Qanın təzə olduğunu görüb, özündən razı halda güclə sezilə biləcək tərzdə gülümsündü. Ancaq onun gözlərində ani qığılcım kimi parıldayan sevinc tezcə də yox oldu. Bəbəkləri qəzəblə alovlandı.

– Bəlkə o biqeyrət köpəkoğlu papağını da qoyub qaçıb? Əməlli-başlı yoxladın?

– Rast gəlmədi, ağa, qaranlıqda bir şey ağardığını görən kimi atdan düşüb baxdım. Başlıqdan başqa heç nə tapmadım.

– Gərək tapaydın.

– Ala-torandan yenə gedib baxaram. Papağı düşmüş olsa, tapıb gətirərəm.

– Sən elə bilirsən papağını itirmiş olsa, dalınca geri qayıtmaz?

– Ağlım kəsmir.

– Yekə-yekə danışma. Bu saat gedib anbardakı tüfəngdən birini götür. Uşaqlardan da kimi istəyirsən özünlə apar. Sabahacan suvadağı

kəsib pusquda durun. İşdi, o geri qayıtsa, ya ölüsünü, ya da dirisini mənə gətirin. Başa düşdünmü? Di yeri!

Tapdıq gedəndən sonra evdə tək qalan Cahandar ağanın qəlbinə indiyə qədər duymadığı bir yalqızlıq kədəri çökdü. Kişi yanında isti və doğma bir nəfəsin olmadığını ilk dəfə duyub qüssələndi. "Təklik yaman şeymiş" – deyə xəyalından keçirdi. Ona elə gəldi ki, obalar yaylaqdan köçüb gəlmiş, o isə yurdda tək qalmışdır. Nə bir səs var, nə də səmir. Sükutdan qulaq cingildəyirdi. "İki oğuldan biri yanında olmaya, axırda da nökərin ümidinə qalasan, heç bundan da böyük dərd olarmı? – deyə düşünən kişi qəhərləndi. – Birini göndərmişəm oxumağa, o biri də ki, belə. Yanımda olsaydılar, bəlkə də bu işlər başıma gəlməzdi. Gərək Əşrəfin getdiyinə razı olmayaydım... Amma yox, oxumaq yaxşıdır. Qoy lap böyüsün, divan-dərə ilə yaxın olsun. Deyəsən, indiki zamanda bir yanını hökumətə söykəməsən iş keçməyəcək. Bəlkə elə Əşrəfin özünü pristavdan-zaddan qoydular. Onda həndəvərimə heç kəs hərlənə bilməz. Lazım gəlsə onu padşahın oturduğu şəhərə də göndərərəm, təki fərasətli olsun. Bəlkə heç sözümə baxmadı? Şamxal kimi zaylıq elədi? Yox, elə şey olmaz. Əşrəf gərək mənim zənnimi itirməsin".

Kişi ağır düşüncələrin pəncəsindən yaxasını qurtarmaq və ürəyinə dammış şübhələri aydınlaşdırmaq üçün arvadını səslədi. Bayaqdan qonşu otaqda oturub, intizarla ərinin nə deyəcəyini gözləyən Mələk dərhal içəri girdi. Ürəyi döyünə-döyünə ərinin üzünə baxdı.

– Nə deyirsən?

– Yerdən-zaddan sal yataq. Mərdimazar köpəkoğlu olmasaydı, indi iki yuxu almışdıq.

Mələk dərhal yük yerindən yorğan-döşək gətirdi. Taxtın yuxarı başında ərinə yer saldı. Yastıqları qoşalayıb yanaşı qoydu. Ərinin işarəsini gözləmədən pəncərənin taxtasını basdı. Kişinin tüfəngini və xəncərini götürüb, həmişəki kimi divardan asmaq istədi, ancaq əri razı olmadı.

– Gətir yanıma qoy. Qoltuqaltını da bəri ver.

– Yatdığımız yerdə bunları neyləyirsən?

– Sənə borc deyil, nə deyirəm, ona bax!

Mələk ərinin sözünə əməl etdi. Kişinin paltarını və uzunboğaz çəkməsini götürüb bir tərəfə qoydu. Taxtın aşağısındakı yun başlığı görəndə üzünü ərinə çevirdi.

– Bunu niyə bura atıbsan? Özü də qana bələnib?

– Mənimki deyil.
– Bə kimindir?
– Nə bilim? Uşaqlar suyun qırağından tapıblar. Bax gör, bəlkə tanıdın?
Mələk ürəyinə qorxulu bir şey daman adamlar kimi əsə-əsə başlığı götürdü. Öz əli ilə düzəltdiyi qotazları görəndə gözünə qaranlıq çökdü. Elə bil otaq başına hərləndi. Bir xeyli beləcə dayandı və birdən bilmədən əlinə ilan götürən adam kimi dəhşətlə geri sıçradı. Başlığı yerə tulladı. Özü də hiss etmədən:
– Onundur! – deyə qışqırdı.
Cahandar ağa dik atıldı. Hələ də özünə gələ bilməyən arvadının başının üstünü kəsdirdi:
– Kimindir?
– Allahyarın.
– Allahyar kimdir?
– Əvvəlki...
– Ərin?!
– Hə.
Cahandar ağanın dişləri kilidləndi. Onun fısıltısını qulağının dibində eşidən Mələk nə edəcəyini bilmədiyindən, yumaq kimi büzüşdü.

## 5

Onlar yarğanın kənarında sudan gələn qızlarla qarşılaşdılar. Çəmənliyə səpələnib zarafatlaşan, çiyinlərində su dolu səhəng olmasına baxmayaraq, bir-birini qovub-oynaşan qızlar qaşdakı kişiləri görən kimi susdular. Onların yarğanlarda əks-səda verib qulaqlarda cingildəyən gülüşləri xırp kəsildi. Gəlinlər əmr almış kimi yaşmaqlarını burunlarının ucunadək qaldırıb, baş örtüklərini irəli, gözlərinin üstünə çəkdilər. Aleksey Osipoviç cığırla qatarlaşıb gələn qızları xeyli süzdü. Əhməd də yerindən tərpənmədi. Onların səfini pozmamaq üçün sahilə enən yeganə cığırdan kənara çıxdı və özünü elə apardı ki, guya gəlinləri görmür, harasa uzağa, Kürün o üzündəki meşəyə baxır.
Qızlar sakitcə onların yanından ötüb keçəndə Əhməd ayaq saxlayıb dala qalan Salatını tanıdı. Özü də hiss etmədən, titrək səslə onu çağırdı. Qardaşından bir xəbər, ya da məktub olacağını zənn edən, elə buna görə də ayağını sürüyüb arxada qalan qız dabanı üstə fırlanıb geri döndü. Qırmızı koftasının sinəsinə tökülmüş muncuğunun gümüş pul-

ları cingildəyib parıldadı. Yaşmağı sürüşüb düşdü. Onun təəccübdən geniş açılmış intizar dolu gözləri Əhmədin üzünə zilləndi. Qızı nə üçün çağırdığını unutmuş kimi sakitcə dayanan Əhməd gözünü qızın üzündən çəkmədən susdu. Əşrəfi Qoriyə yola salanda ilk dəfə gəminin yanında gördüyü Salatının indi xeyli dəyişdiyini dərhal sezdi. Qız qolunu çiynindəki səhəngin qulpuna keçirib dayanmışdı.

– Atan haradadır?

Yalnız bu zaman yaşmağının sürüşüb düşdüyünü və qızların bir kənarda dayanıb, onu gözlədiklərini hiss edən Salatın qızardı. O, cavab əvəzinə çiyinlərini çəkib başını yuxarı qaldırdı, sonra da gözlərini çevirib o taya baxdı. Əhməd Salatının "yəqin binəyə gedib" – demək istədiyini anladı. Qız Əşrəfdən kağız olub-olmadığını soruşmaq istədisə də cəsarəti çatmadı. Yenə dabanı üstə fırlanıb geri döndükdə Əhmədin səsini eşitdi:

– Atana deyərsən "Zayej"ə baş çəksin. Əşrəfin yanından gələn var.

– Kimin, qağamın?

– Hə.

– Necədir, nə söyləyirlər?

– Lap yaxşıdır. Sizə də çoxlu salamı var.

– Salam göndərənə də qurban olum, gətirənə də.

Qızın bu sadəlövh və səmimi cavabı Aleksey Osipoviçin yaman xoşuna gəldi. O, adəti üzrə gözlərini qıyıb bərkdən qəhqəhə çəkdi. Salatın hürküdülmüş quş kimi qanadlanıb qızların yanına qaçdı.

Onlar bir xeyli sakitcə dayanıb, uzaqlaşan qızların arxasınca baxdılar. Salatın tez-tez dönüb geri boylanır, qızlara nə isə deyir, onlar da xısın-xısın gülüşürdülər.

– Əşrəfin bacısıdır?

– Bəli.

– Yaman oxşayır.

– Elədir, – deyə Əhməd sakitcə cavab verdi və dönüb gözləri yol çəkən Aleksey Osipoviçə baxdı.

– Bu qızlardan mollaxanaya gedəni varmı?

– Yox, – deyə Əhməd sakitcə dilləndi. – Əvvəllər bir neçə ay dərs keçildi. Sonra camaat eşitdi ki, Molla Sadıq dərs əvəzinə cadudan danışır, qızları dirəyə arpa dırmaşdıra bilməsi ilə qorxudur. Bir sözlə, molladan gözləri su içmədi və qızlarını belə hələm-qələm adamın yanına göndərmədilər. Yaxşı da elədilər.

– Deyəsən molladan yaman yanıqlısan.

– Yanıqlı olmayım, nə edim? Zalım oğlu başdan ayağa kələkdir. Özü də kəmsavadın biridir. Ancaq özünü elə aparır, guya elm dəryasıdır. İndi də başına mürid yığır. Camaatımızın da dərdi çəkiləsi deyil.

– Elə bilirsən təkcə sizdə belədir? Başqa millətlərin ruhaniləri ağıllıdır?

– Hamısı birdir. Ancaq yenə bizimkinə baxanda onlara şükür. Heç olmasa azdan-çoxdan millətinə xeyir verməyə çalışırlar. Amma bizimkilərin işi-gücü xortdandan, cindən, şəyatindən danışıb, insanların canına xof salmaqdır. Camaata aman vermirlər ki, gözlərini açsınlar.

– Düzdür, – deyə Aleksey Osipoviç onun sözünü təsdiqlədi. Avamlıq ruhanilərin çörəyidir. Xalqımıza kömək etmək istəyiriksə, onun savadlanmasına çalışmalıyıq. Bizim hərəmiz bircə adam savadlandırsaq, böyük iş görmüş olarıq. Sənin mollaların heç vaxt maarif məşəlini yandırmayacaq. Əksinə, bacarsalar, bütün qığılcımları söndürəcəklər. Ona görə də möhkəm olmaq lazımdır. Yoxsa inanmırsan?

– İnanıram, Aleksey Osipoviç, amma tək əldən səs çıxmaz.

– Tək niyə oluruq? Gərək köməkləşək.

Aleksey Osipoviç sözünə ara verib, müsahibini süzdü, sonra kənd evlərinə baxdı.

– Hə, indi necə deyirsən, Molla Sadığın yanına gedək, ya yox?

– Nə mənası var?

– Heç olmasa tanış olarıq, görərik nə canlı-cinlidir.

Onlar kəndin ortasından keçən əyri yolla məscidə sarı irəlilədilər. Hava isti idi. Aleksey Osipoviç pencəyini soyunub çiyninə salmışdı. Əlindəki dəsmalla tez-tez alnının, üzünün tərini silirdi. Yolun az qala topuğa çıxan narın tozu onun çəkmələrini və şalvarını bomboz etmişdi. Əlindəki iri ağac ona qəribə bir görkəm verirdi. Yəqin elə buna görə də qara damların həyətinə toplaşan uşaqlar bic-bic gülür, bu topasaqqal kişinin haradan gəldiyini və kim olduğunu bilmək istəyirdilər. Bunu Aleksey Osipoviç özü də duymuşdu. Ancaq heç nəyə fikir vermir, hətta zarafata salıb Əhmədə göz vurur, "sənin keçisaqqal bir rusla yol getməyinə gülürlər", – deyə uşaqları göstərirdi.

Doğrudan da, elə bil kəndə hay düşmüşdü. Ayaqyalın uşaqlar cığırla qaçır, bir-birinə xəbər verib doqqazlara, çəpərlərin dibinə toplaşırdılar. Rus Əhmədlə gəzən adam onlara əcaib təsir bağışlayırdı. Hətta dəcəllik edib onlara it qısqırdanlar da olurdu. Əhməd əsəbiləşsə də, Aleksey Osipoviç halını pozmur, gözlərini qıyıb gülürdü.

Məscidin həyətində Aleksey Osipoviç üstünün tozunu çırpıb, pencəyini geyindi. Dəsmalla üzünün, boynunun tərini silib, əlindəki şapkasının içini quruladı. Qalstukunu düzəltdi. Papağını başına qoyandan sonra məscidin qapısını açdı. İçəri nəm qoxuyurdu. Səliqə ilə süpürülüb, su çilənmiş torpaq döşəməyə həsir salınmışdı. Dar pəncərələrin balaca gözündən düşən işıq zolaqları otağın divarlarında oynaşırdı. Yarıqaranlıq məscidin içindəki çal-çarpaz zolaqlar, orada qaynaşan saysız-hesabsız toz dənələri adamın diqqətini cəlb etdiyindən, küncdə oturanlar nəzərə çarpmırdı. Aleksey Osipoviç bir az dayanmalı oldu. Bir neçə dəqiqədən sonra gözü qaranlığa alışdı və yalnız bu zaman minbərin yanında dizi üstə əyləşən uşaqları, onlardan bir az aralı döşəkçədə oturan mollanı gördü. İçəridəki sükutu havada oynayan çubuğun şaqqıltısı pozurdu. Kimi isə falaqqaya salmışdılar. Boyun-boyuna verən uşaqlar qorxularından nəfəslərini çəkmirdilər. Onların saralmış sifətləri solğun işıqda daha sarı görünürdü. Döyülən uşaq ağrıdan qıvrılsa da, səsini çıxartmırdı.

Əhmədlə Aleksey Osipoviç həsirin üstü ilə küncə tərəf getdilər. Molla Sadığın başı o qədər qarışmışdı ki, içəri girənlərin ona yaxınlaşdığını hiss etmədi. Əhməd döyülən uşağı tanıyıb irəli atılmaq istəyəndə Aleksey Osipoviç onu dayandırdı. Asta addımlarla mollaya yaxınlaşdı.

– Bu uşağın günahı nədir?

Molla Sadıq halını pozmadan dönüb yanında dayananlara baxdı. Onun qəzəbli gözləri Əhmədə sataşanda ilan çalmış kimi dik atıldı. Əllərini yuxarı qaldırıb, əbasını yellətdi:

– Çıx buradan, məlun! Allahın evini murdarlama, dinsiz!

– Molla...

– Kəs, məlum! Özün gəldiyin yetmir, məscidə kafir də gətirirsən?!

– Molla Sadıq, sakit ol, mən özüm gəlmişəm, – deyə Aleksey Osipoviç astaca dilləndi.

Molla "kafirin" xalis müsəlmanca danışdığını görüb susdu. Nə edəcəyini bilmədiyindən, əlləri havada asılı qaldı. Bir xeyli beləcə dayandılar. Aleksey Osipoviç ayağı falaqqaya qoyulmuş uşağı göstərdi.

– Bunun günahı nədir?

Yalnız bu zaman Molla Sadıq əllərini aşağı saldı. Hirsini udub müsahibini süzdü. Onun qiyafəsindən hiss etdi ki, qonaq bura adamı deyil, şəhərdən gəlib. Onun sifətindəki ciddilik və təmkin mollanı qorxuya saldı. Gələnin hökumət adamı olduğunu zənn edib özünü yığışdırdı. Onunla necə danışacağını bilmədiyindən, yenidən uşaqların üstünə qışqırdı:

– Açın onun ayağını, özünüz də rədd olun!!!

– Molla, dayan, mənim bu uşaqlarla işim var.

– Sizin bu şeytan balaları ilə nə işiniz ola bilər? Qoy cəhənnəm olsunlar!

Molla qonağın narazılığını görüb susdu. Onun sualına hələ də cavab vermədiyini yadına saldı. Yavaşca əlini ütülmüş saqqalına uzatdı.

– Görmürsünüz başıma nə oyun açıblar? Tütünün içinə barıt doldurub, mənə papiros eşirlər. Hamısı da bu məlun Osmanın işidir.

Falaqqadan açılmış uşaq ayağa durdu. Əvvəlcə dizi yamaqlı şalvarını yuxarı çəkdi. Sonra qalın ağdan tikilmiş və çirkdən rəngi qaralmış köynəyinin qolu ilə gözünün yaşını silib, bir-iki dəfə burnunu dartdı. Ayağını yerə basanda təngildəyib ufuldadı. Köynəyinin açıq yaxasından uşağın körpücük sümükləri və boynundan asılmış üçkünc dua göründü. Onun bu halınamı, yoxsa bir az bundan əvvəl olub-keçən hadisəyəmi, nəyə isə pıqqıldayıb gülüşən uşaqların qorxudan saralmış rənglərinin qanı özünə gəldi. Osman da özünü saxlaya bilmədi. İslanmış kirpiklərini tez-tez döyüb mollanın üzünə baxdı. Onu da gülmək tutdu. Seyrək dişləri göründü. Gözlərinin ətrafı qırışdı. Ayazın və günün çat-çat etdiyi yanağının almaları yumrulandı. Göz yaşının izi daha aydın göründü. Həlqələri yaşla dolu olan bic gözlərdəki istehza ətrafdakıların nəzərindən qaçmadı. Uşaqlar mollanın sifətindəki qəzəbdən qorxuya düşüb, gurultu ilə qapıya doğru qaçanda Əhməd onları səslədi.

– Bayırda gözləyin, sizinlə işimiz var.

Uşaqları qəzəbli baxışları ilə qapıya qədər ötürən Molla Sadıq əlini bir-iki dəfə ütülmüş saqqalına çəkib, döşəkçənin üstündə əyləşdi. Qonaqlara da yer göstərdi. Sonra da sarı kəhrəba təsbehinin qoz boyda dənələrini şaqqıldatdı:

– Bağışlayın, ismi-şərəfinizi bilmək olarmı?

– Niyə olmur, adım Aleksey. Aleksey Osipoviç.

– Nə? – Molla dizi üstə qalxdı. Təsbehin axırıncı muncuğu şaqqıldayıb dayandı. Onun qorxu və təəccüb dolu gözləri geniş açılıb matmat Aleksey Osipoviçə baxdı. Bir xeyli beləcə dayanandan sonra qaşlar çatıldı və qəzəbli baxışlar Əhmədin üzünə sancıldı. Onun titrək əlləri havaya qalxdı, dodaqları tərpəndi. "İlahi, keç günahımdan. Sənin hüzurunda qəbahət işləmişəm". Molla tələsik ayağa durdu. Başmaqlarını birtəhər cütləyib geyindi. Əbasının ətəyi dolaşa-dolaşa qapıya doğru addımladı:

– Tez olun, məni günaha batırmayın.

– Molla Sadıq, axı Sizinlə ciddi söhbətimiz var.

– Mən Allahın evində siznən kəlmə kəsə bilmərəm. Göydən od yağar.

– Yağmaz, molla, qorxma.

– Küfr danışma, Əhməd, taqsırın hamısı səndədir. Mən onun müsəlman olmadığını bilsəydim, heç içəri buraxmazdım. Tez olun, məni günaha batırmayın.

Mollanın hay-harayından çaşan Aleksey Osipoviç dönüb Əhmədin üzünə baxdı:

– Yaxşı, indi nə edək?

– Mən dedim ki, bir şey çıxmaz, gedək.

– Yox, hələ tələsmə, Molla Sadıq, məscid olmasın, bayır olsun, biz söhbətimizi edəcəyik.

Onlar nəm qoxuyan otaqdan çıxdılar. Məscidin həyətindən bir az aralı otluqda dayanan uşaqlar Molla Sadığı görən kimi aşağı sinib gizləndilər. Molla ikrah edirmiş kimi bir-iki addım geri çəkilib dayandı və əli ilə Kürdən əsən mehin oynatdığı ütülmüş saqqalını tumarlaya-tumarlaya gələnləri qıyıq gözləri ilə süzdü.

– Sizin mənimlə nə söhbətiniz ola bilər?

– Üləmalar danışmağa söz taparlar.

Molla Sadıq Aleksey Osipoviçin istehzasını başa düşmədiyindən və şəhər qiyafəli bir adamın onu alim hesab etməsindən məmnun qaldığından gülümsədi.

– Onda buyurun.

– Bilirsinizmi, Molla Sadıq, mənim elmə can yandıran adamlardan xoşum gəlir, – Aleksey Osipoviç sakitcə söhbətə başladı. – Sizin də elm şəhidi olduğunuzu görəndə sevinməyə bilmirəm. Yoxsul kəndli balalarına dərs demək çox savabdır. Siz də hücrənizdə onlara dərs deməkdə çox savab iş görürsünüz, molla, Allah-taala zəhmətinizin əvəzini yetirəcək. Elə əlahəzrət padşah da belə işlərə qiymət verir. Buna görə də padşahımız müsəlman balaları üçün yeni məktəblər açmağa icazə veribdir. Gərək siz də bu işdə bizə kömək edəsiniz. Bizim yeganə ümidimiz müsəlman ruhaniləridir.

Aleksey Osipoviç sözünə ara verib gözaltı Molla Sadığı süzdü. Onun əvvəlcə məmnun qaldığını, sonra yavaş-yavaş təhlükə hiss edən hiyləgər adamlar kimi gözlərinin qıyılıb süzüldüyünü gördü. Əlbəttə, Aleksey Osipoviç Molla Sadığın köməyinə o qədər də ümid etmirdi.

Ancaq ruhanilərin yoxsul kəndlilər arasında çox böyük hörmətə malik olduğunu da bilirdi. O bilirdi ki, mollalar savadsız camaatı Allah xofu ilə qorxudur, cəhənnəm əzabları ilə dəhşətə gətirir və behişt xülyaları ilə məst edirlər. Həm də özlərini elə aparırlar ki, guya külli-ixtiyardırlar, istəsələr, adamları cəhənnəm oduna yandırar, istəsələr də behiştə göndərərlər. O belə bir qüvvədən yeri gəldikcə istifadə etməyi qərara almışdı. Aydın idi ki, mollalar ata-anaları dilə tutmaq və uşaqlarını yeni məktəbə göndərməyə razı salmaqda istəsələr çox iş görə bilərlər. Elə buna görə də Aleksey Osipoviç əvvəlcə Molla Sadığa müraciət etməyi, onu öz dili ilə danışdırıb, süst damarından tutmağı qərara almışdı.

– Görürəm, sizin kənddə savadlı uşaqlar var. Onlardan beş-on nəfərini oxumağa aparmaq lazımdır. Bu işdə gərək mənə kömək edəsiniz.

Müsahibini diqqətlə dinləyən Molla Sadıq söhbət bu yerə çatanda üzə vurmasa da ürəyində ehtiyat etməyə başladı. Müsəlmanca onun özündən yaxşı danışan bu rusun kələyinə uymamaq üçün ehmallı olmağı qərara aldı. Bir də, Əhmədin bu işə qarışmağı onu yaman çaşdırmışdı. Onun "Zayej"də uşaqları başına yığıb gizli dərs keçməsi xəbərini eşidəndən sonra mollanın, necə deyərlər, kürəyi sancırdı. İndi də təzə məktəb söhbəti ortaya çıxmışdı. "Bütün bunlar Əhmədin kələyi deyilmi? Elə keçən il Cahandar ağanı baş-beyindən çıxarıb Əşrəfi oxutmağa göndərtdirən də bu deyildimi? Yox, Molla Sadıq, ehtiyatlı ol, saqqızını oğurlatma".

Molla Sadıq zahirən özünü çox təmkinli apardı:

– Mən Sizə nə kömək edə bilərəm?

– İstəsəniz çox iş görərsiniz. Camaat Sizin bir sözünüzü iki eləməz. Onları başa salın ki, qoy uşaqlarını bizim məktəbə göndərsinlər.

– Çox pakizə. İndi mətləbiniz mənə bəlli oldu. – O ani bir sükuta gedib gözlərini qıydı. Bir xeyli Aleksey Osipoviçin çiyninin üstündən o yana, kənarda dayanmış Əhmədə baxdı. – Ancaq bacarmayacağam.

– Nə üçün, molla?

– Mən müsəlman uşaqlarını öz əlimlə dinsizlərə qoşa bilmərəm. Siz istəyirsiniz onlar gedib boyunlarına xaç salsın, başlarına şapka qoysun, Allahın yolundan, peyğəmbərin dinindən dönüb kafir olsunlar, mən də bu işə kömək edim? Yox, cənab, mən bu işi bacarmayacağam. Sizin məqsədiniz heç də bizim uşaqların qeydinə qalmaq deyil. Siz islamın düşmənisiniz. İndi də bu yolla uşaqlarımızı öz dinlərindən döndərmək istəyirsiniz.

– Oxumaq dinsizlik olsaydı, Tiflis şeyxi hamıdan qabaq bu işə etiraz edərdi. Şuşa, Şəki mollaları mənə kömək əlini uzatmazdı. Elə Məhəmmədin Quranında da elm öyrənmək tövsiyə edilir.

– Amma sizin elminiz yox.

– Elm elmdir, molla.

– Yox. Bizim öz elmimiz var, onu da uşaqlarımıza öyrədərik.

– Gördük necə öyrədirsiniz.

Molla Sadığın yağırı basılmış kimi üz-gözü əyildi. Sifətindəki süni sakitlik yox oldu. Gözləri qəzəblə parıldadı:

– Siz bu işə qarışmasanız yaxşıdır.

– İstəsəniz də, istəməsəniz də qarışacağıq, molla, başqa əlac yoxdur.

**6**

Kəndin ortasındakı təpədə, iri tut ağacının kölgəsində, böyük bir mərəkə vardı. Göytəpəlilər dağ köçü, ya da biçin vaxtı olduğu kimi, buraya məsləhətə yığışmışdılar. Adətən onlar çətinliyə düşəndə, elliklə bir iş lazım gələndə buraya toplaşıb ağsaqqallara qulaq asar, görüləcək işlər barədə tədbir tökərdilər. Bu təpə çox hadisələrin şahidi olmuşdu. Sözləri çəpləşən kənd cavanları burada çox yumruq davasına çıxıb bir-birinin üstünə xəncər çəkmiş, bəzən də aralığa qan salmışdılar. Burada çox adamlar əlini Qurana basıb günahsız olduğuna and içmiş, çox qanlılar barışdırılmışdı. Bu təpədə evlər yıxılıb, evlər tikilmişdi.

İndi də camaat böyük maraq və intizarla buraya toplaşmışdı. Üç gündən bəri şenliyə yayılan söz-söhbətin əslini öyrənmək və kəndi dolaşan o “keçisaqqal rus”un haradan gəldiyini və nə istədiyini bilmək həvəsi ürəkləri bürümüşdü. Kənd arasında dolaşan söhbət çoxlarını çaşbaş salmışdı. Molla Sadığın məsciddə dediyi sözlər adamları ehtiyatlandırmışdı. Təpə arı yuvası kimi qaynayırdı.

Cahandar ağa da burada idi. O, atını cidarlayıb otlağa ötürmüşdü. Özü isə kürəyini tut ağacına söykəyərək domuşub oturmuş, tüfəngini də dizinin üstünə qoyub dirsəklənmişdi. Oğlu Şamxalın hadisəsindən sonra camaat arasına birinci dəfə çıxdığından sıxılırdı. Gəmiçi Qocanın da burada olması onu lap darıxdırırdı. Nə qədər çalışsa da bacarmır, kənardaca torpağın üstə bardaş qurub oturan kişini gözaltı süzürdü. Gəmiçi Qocanın beli lap əyilmişdi. Əynindəki paltar didik-didik

olmuşdu. Ağ saqqalının tükləri daraqdan çıxmış yun kimi pilələnmişdi. Çuxura düşmüş gözləri güclə görünürdü. Cahandar ağa ixtiyarsız Şamxalı yadına saldı və ürəyində onu yamanladı. “Belin sınsın, fərsiz oğul, gör kimnən qohum oldu! Arxasını kimə dayadı! İndi mən nə edim? Qapısına gediləsi deyil ki, beş-on adam yığıb aparasan, el adətincə barışıqlıq eləyəsən. Nə də bir adamlığı var ki, kişi kimi düşmənçilik çəkəsən. Ona əl qaldırmaq heç qeyrətdən deyil. Onsuz da ayaq üstündə ölüb”.

O yenidən qudasını saymazyana süzdü. Kişinin məyus və müşkül görkəmi, bulud kimi tutulub susması, həmişə şuxluq edib aləmi güldürən Qocanın indi yumaq kimi büzüşməsi Cahandar ağanın da ürəyini ağrıtdı. “Allah kasıba qız verincə başına daş salsa yaxşıdır. İndi bu yazıq neyləsin? Özü də bilir ki, qapısını açıb barışığa gələn olmayacaq”, – deyə xəyalından keçirdi.

O darıxdı. Fikrini dağıtmaq üçün çuxasının yan cibindən gümüş qutusunu çıxartdı. Qapağı açıb sol əlini barmaqları arasında tutdu. Əvvəlcə cığara kağızdan birini götürdü. Qapağın basıb yapıxdırdığı saçaqlı sarı tütündən bir çimdik götürmək istədi. Zərif doğranan liflər rezin kimi uzanıb yuxarı qalxdı. Cahandar ağa tütünü barmağı ilə qırdı. Kağızın arasına qoyub yoğun bir papiros eşdi. Qutunu şaqqıltı ilə örtüb cibinə qoydu. Uzun kəhrəba müştüyünü çıxardıb papirosunu keçirdi. Çaxmaqla qovu alışdırdı. Papirosunu yandırıb, dərindən nəfəs aldı. Ağımsov tüstü onun enli dodaqlarının üstünə enmiş qalın bığlarının arasına doldu.

Elə bu zaman Aleksey Osipoviçlə Əhməd mərəkəyə yaxınlaşdı. Onlar, adəti üzrə, toplaşanlara salam verdilər. Oturanların bəzisi ayağa durdu, bəzisi yerindəcə qurcalandı, bəziləri də başlarını tərpətməklə salamı aldılar. Aleksey Osipoviç Molla Sadığın yanında oturan saqqallı kişilərin dinmədiyini, əksinə, qaşqabaq tökdüklərini gördükdə söhbətin o qədər də asanlıqla keçməyəcəyini dərhal duydu. Ancaq özünü sındırmadı. Mərəkədəkilərlə bir-bir əl tutdu. Cahandar ağaya yaxınlaşanda xeyli dayandı. Diqqətlə kişinin üzünə baxdı.

– Siz Əşrəfin atası deyilsiniz ki?

– Bəli, – Cahandar ağa yavaşca dilləndi və ayağa qalxdı. – Uşaq necədir, canı-başı sazdırmı?

– Oho, heç onun dərdini çəkməyin, lap qırğı kimidir. Özü də məktəbimizin gülüdür. Halal olsun, çox kamallı uşaqdır.

– Bəs nə vaxt gələcək, evə tezmi buraxacaqsınız?

– Gələr. Beş-on günəcən evdə olar.

– Köçə çatarmı?

– Çatar, heç darıxma.

– Uşaqdan ötəri yaman qəribsəmişik.

– Əslinə baxsan, o da yaman qəribsəyir.

– Niyə, olmuya korluq çəkir?

– Yox, o barədə arxayın olun, – deyə Aleksey Osipoviç sakitcə cavab verib ətrafdakıları süzdü. – Təkdir, dostlarından ötəri yaman darıxır. Axı bizim məktəbdə Əşrəfdən başqa Göytəpədən heç kəs oxumur. Onun yoldaşlarından beş-altı nəfəri də oxumağa getsə, lap qiyamət olar. Bir-birilərinə həyan olub, qəribliyi unudarlar. Düz demirəmmi? Gərək onu tək qoymayaq. Elə sizin kəndə ondan ötəri gəlmişəm. Gərək kömək edəsiniz, uşaqlardan seçib oxumağa aparaq.

Söhbət bu yerə çatanda aralığa sükut çökdü. Cahandar ağa nə cavab verəcəyini bilmədi.

Molla Sadıq da susub mənalı-mənalı camaatı süzdü. Onun təsbehi daha da bərkdən şaqqıldadı. Aleksey Osipoviç söhbəti başlamaq üçün ələ düşən fürsətin gedəcəyini görüb sükutu pozdu.

– Niyə susursunuz?

– Bizim kənddə oxumağa gedəsi uşaq yoxdur!

– Niyə yoxdur, var, – deyə Aleksey Osipoviçdən qabaq Əhməd dilləndi. – Onları oxutsaq, əməlli-başlı adam olarlar.

– Kimdir onlar?! – Molla Sadıq da bu dəfə qəzəblə dilləndi.

– Biri Osman.

– Kim? Osman! O ki, korafəhimin biridir. Üç ildə bir Quran ayəsini əzbərləyə bilmir, ondan oxuyan çıxar?

– Çıxar, niyə çıxmır?!

– Dərs deyən mənəm. Mən yaxşı bilirəm, yoxsa sən?

– Bilməsəm demərəm. Bir də o cür ki siz dərs deyirsiniz, əlbəttə, uşaq heç nə başa düşməz.

– Ey, rus Əhməd, artıq-əskik danışma. Həddini bil, sonra peşman olarsan!

– Bəs Əli necə, o da fərasətsizdir?

– İkisi də bir bezin qırağıdır.

– Səlim də?

– İndi burda mənnən nə hinkir-minkir başlayıbsan?

– Acığın tutmasın, ay Molla Sadıq, – səhərdən söhbətə qulaq asan Gəmiçi Qoca astaca dilləndi. – Nəfəsin ağırdır. Uşaqlar səndən heç nə öyrənə bilmirlər. Elə bizim Çərkəz də üç-dörd il ayaq döydü, amma bir şey çıxmadı.

– Demək, Allah-taala özü sizi sirrinə vaqif eləmək istəmir.

– Allah-taalanın burada nə işi var, ay molla?

– Küfr danışma, kişi, hər şey Allahın əmri ilədir.

– Nə üçün dava-dalaş salırsınız? – deyə Aleksey Osipoviç mübahisə edənləri sakitləşdirməyə çalışdı. – Əlahəzrət padşahımız özü müsəlman balalarının oxumasına icazə veribdir. Kəndlərin bir çoxunda yeni məktəblər açılıbdır. Sizin uyezddə də bu işə başlamaq lazımdır. Biz də sizdən ötəri çalışırıq. Qoyun uşaqlarınız oxusun.

– Nə olar. Biz padşahımızın fərmanına boyun əyməyə həmişə hazırıq. Ancaq bizi başa salın görək, o təzə məktəblər necə olacaq? Orada Quran oxunmayacaq?

– Oxunacaq, Molla Sadıq, niyə oxunmayacaq. Orada şəriət dərsləri də keçiləcək. Elə bizim Qoridəki seminariyada da şəriət dərsləri keçilir.

– Sünnilərlə şiələr bir yerdə.

– Yox, onu da nəzərə almışıq. Hərənin öz mollası var. Gündə üç öynə namazlarını da qılırlar. Biz heç kəsi dinindən döndərmək istəmirik.

Molla Sadıq gözlərini qıyıb, hiyləgərcəsinə Aleksey Osipoviçə baxdı. Sonra da ətrafdakıları süzdü.

– Yox, cənab, bu yollarla bizi aldada bilməzsiniz. Xaçpərəstlərin islam milləti arasında təfriqə salmaq köhnə peşəsidir. Biz sizi yaxşı tanıyırıq. İndi də uşaqları oxutmaq adı ilə başımızı tovlamaq istəyirsiniz. Aralığa çaxnaşma salmaq fikrindəsiniz. Ancaq onu bilin ki, belə işlər daha baş tutmaz. Biz uşaqlarımızı verən deyilik. Ay camaat, eşidirsinizmi?

Molla Sadıq əlini havada oynatdı. Aleksey Osipoviç beli xəncərli kişilərin qaşlarının üstünə qədər enmiş saçaqlı papaqları altından parıldayan qəzəbli gözlərinə baxdı. O, ağzını açmağa macal tapmamış Molla Sadığın yanındakı kişilərdən biri qabağa yeridi. Onun sallamalı kəmərindən asdığı iri xəncəri az qalırdı ki, belini üzüb salsın.

– Bura bax, bizə nə veribsən ala bilmirsən? Qapı-qapı düşüb uşaqlarımızın başını niyə tovlayırsan?

– Mən ki onlara pislik eləmək istəmirəm.

– Sənin yaxşılığın da, pisliyin də bizə lazım deyil, rədd ol burdan!!!

Elə bil camaat buna bənd imiş. Kişi sözünü deyib qurtaran kimi hərə bir tərəfdən hoqquldamağa başladı.

– Biz uşaqlarımızın başından keçməmişik!

– Qoymarıq onların boynuna xaç salasınız!

– Ay camaat, qovun onu!

– Rus Əhmədi də ona qatın!

– Dinsizlər, çıxın kəndimizdən!

– Bizi də özləri kimi kafir eləmək istəyirlər!

– Ay camaat, səbriniz olsun, bir az dayanın!

– Kəs səsini, rusdan dönmüş!

– Mən də sizin kimi müsəlmanam.

– Yalan deyirsən. Adını Əhməd qoysan da kafirsən!

– Bu saat ikinizi də bir-birinə çataqlayıb, yarğandan başı aşağı Kürə atacağıq.

Adamlar getdikcə qızışdılar. Onların çoxu əlini xəncərə atıb, irəli cummağa bir balaca işarə gözlədi. Aleksey Osipoviç bunu aydın görsə də, geri çəkilməyin mümkün olmadığını dərk etdiyindən, özünü şax tutdu. O hələ bu cür qızışmış adamlarla üz-üzə gəlməmişdi. Başqa kəndlərdə ona qulaq asmış, üstəlik də kömək etmişdilər. Ancaq bu saat onun həyatı belə təhlükə altında idi. Kürün sahilindəki bu ucqar kəndin adamlarını başa salmaq, görünür, o qədər də asan deyildi. Əhməd də çıxılmaz vəziyyətdə qalmışdı. O, Göytəpəyə gələli az-çox xasiyyətinə bələd olduğu kəndlilərin belə səbrsiz olacağını, hətta qana susayacaqlarını təsəvvür etmirdi. Şübhəsiz, burada bir əl var idi. Görünür, Molla Sadıq bütün gecəni yatmamışdı. Yoxsa camaat birdən-birə yuvası dağıdılmış arı kimi qəzəblənməzdi. Əhməd qorxdu. Bir hadisə olan kimi Kürü keçib, özlərini meşəyə verən, divan-dərə tanımaq istəməyən bu adamlar fitvaya uyub nə desən edə bilərdilər. O, gözaltı qonağını süzdü. Aleksey Osipoviçin rəngi köynəyinin ağ yaxalığından seçilmirdi. Hücuma keçən kəndlilər onları tut ağacına doğru sıxışdırdılar. Əhməd hər ehtimala qarşı qabağa keçdi. İlk zərbələrin qarşısını almaq, ya da camaatı sakitləşdirmək üçün bir-iki söz deməyi lazım bildi.

– Ay camaat, hay-haray nəyə lazımdır, uşağınızı vermirsiniz, verməyin, daha aləmi başınıza niyə tökürsünüz? Biz dedik məsləhətləşək, demədik dava eləyək. Ağlınızı başınıza yığın.

– Bizə ağıl öyrətmə! Taqsırın hamısı sən dinsizdədir. Bu rusu tovlayıb gətirən də sənsən. Əvvəlcə elə səni doğramaq lazımdır!

Aleksey Osipoviç Əhmədin qolundan çəkib geri dartdı. Özü qabağa yeridi. Şapkasını çıxardıb, içini dəsmalla quruladı. Bir müddət sakitcə dayanıb camaatın susmasını gözlədi.

– Biz heç kəsi öz dinindən döndərmək istəmirik. Bizim məqsədimiz sizin uşaqlarınızı oxutmaq, onlara elm öyrətməkdir. Onları savadlandırmaqdır. İndi zaman dəyişir. Elmsiz adam kor kimidir. Gərək siz uşaqlarınızı bədbəxt olmağa qoymayasınız.

– Biz oxumamışıq, dünya uçub? Uşaqlarımız da oxumasa, yeməyə çörək tapmayacaqlar? Lazım deyil sizin oxutmağınız!

– Biz sizin xeyriniz üçün çalışırıq. Bizə kömək etmək əvəzinə Molla Sadığın fitvasına nahaq uyursunuz.

– İndi də mollamıza sataşırsan? – deyə bayaqkı xəncərli kişi onun sözünü kəsdi. – Əlim-ayağım dəyməmiş rədd ol burdan!!!

– Aleksey Osipoviç, nahaq yerə fitva verirsiniz, getsəniz məsləhətdir.

– Fitvanı o yox, Siz verirsiniz!

Molla Sadıq dodaqucu gülüb, Əhmədi başı ilə camaata göstərdi.

– İndi gördünüz bu işlərin mayeyi-fəsadı kimdir?

Molla Sadığın təmkinlə söylədiyi bu sözlər adamları yerindən oynatdı. Onlar Əhmədlə Aleksey Osipoviçi tut ağacına qısnadılar. Əhməd artıq gözləməyin mümkün olmadığını yəqin etdi. Hər ehtimala qarşı cibində gəzdirdiyi naqanın dəstəyinə əl uzatdı.

Bayaqdan papirosunu papirosun oduna yandıran Cahandar ağa dözə bilmədi. Tüfəngi dizinin üstündən götürüb, ayağa durdu. Qızışmış camaatın önüncə gələn Molla Sadığın qabağını kəsdi. Onun zəhmli baxışlarından ehtiyat edib, ayaq saxlayanlar tərəddüd içində dayandılar. Cahandar ağanın yoğun səsi eşidildi:

– Geri durun!

Camaat burulğan kimi burulub yerindəcə fırlandı.

– Geri durun, deyirəm sizə!!!

Onlar tərpənmədilər. Cahandar ağa çaxmağı hərləyərək gülləni lüləyə verdi.

– Fikriniz nədir, yoxsa könlünüzə Sibir düşüb? Bəs bunun sonrasından qorxmursunuz? Sabah atlı kazaklar tökülüb gələndə cavab verə biləcəksiniz? Hə, niyə dinmirsiniz? Sizi bir-birinizə çataqlayıb atın döşünə salanda bu Molla Sadıq qabağa dura biləcəkmi? Sizdən soruşuram, onda harayınıza çatan olacaqmı?!

Adamlar qımışdılar. Addım-addım geri çəkilib gözlərini Cahandar ağaya zillədilər. Nə edəcəklərini bilmədən tərəddüd içində dayandı-

lar. Bunu hiss edən Cahandar ağa da səsinin ahəngini dəyişib, məzəmmətə keçdi:

– Adam bir iş görəndə fikirləşər. Hər yetənin sözünə baxıb toy toğlusu kimi ortalığa düşməz. Bir də, qonağa əl qaldırmazlar.

Molla Sadıq gördü ki, bir az bundan əvvəl irəli atılanlar geri çəkildilər. Cahandar ağanın sözlərini eşidib susdular. O özünün məğlub olduğunu hiss etsə də, sözündən dönmək istəmədi. Sinəsini gərib, Cahandar ağanın üstünə qabardı.

– O qonaq deyil.

– Qonaqdır.

– Kimin qonağıdır?

– Mənim.

– Sənin?

– Bəli. İndi kimin hünəri var, qabağa çıxsın!

– Elə sənin kimiləri deyilmi camaatın evini yıxan.

– Ə, cadugər haramzada, dilini qarnına qoy!

– Artıq-əskik danışma. Öz oğlunu dinsiz eləməyin yetmir, indi də başqasının...

– Ə, xalq səni özünə vəkil eləyib? Nə düşmüsən ortalığa?

– Bəs sən niyə düşmüsən? Niyə qoymursan bu dinsizləri qovaq getsin? Yoxsa təzə qudan Gəmiçi Qocanın qardaşı oğlu Osmanı da oxumağa göndərəcəksən, hə?!

– O mənim öz işimdir!

– Səni özbaşına qoymazlar!

– Kim qoymaz?

– Tapılar.

– O hansı köpəkoğludur, gəlsin görüm?

Molla Sadıq çiynindən sürüşüb düşən əbasını düzəltdi. Əlindəki təsbehi saqqalı bərabərinə qaldırıb, səsini dəyişdi.

– Yekə kişisən, ağzını təmiz saxla.

– Kəs səsini, dınqıra süzən qurumsaq!

Molla Sadıq Cahandar ağanın qıllı qaşları altından üzünə zillənən qan sağılmış gözlərinə baxa bilmədi. Onun iri qalın dodaqlarının səyridiyini, barmağının tüfəngin tətiyində titrədiyini görəndə sözünün dalını qısdı. Hələ uşaqlıqdan xasiyyətinə bələd olduğu, balaca vaxtı bir yerdə oynayanda dəfələrlə yumruğunun dadını gördüyü Cahandar ağanın zəhmi onu basdı. Demək istədiyi söz ilişib boğazında qaldı. Müsahi-

binin dodağının bir balaca tərpənməsinə bənd olan Cahandar ağa da susdu. Mollanın dillənməyə taqəti olmadığını yəqin etdikdən sonra barmağını tətikdən çəkdi.

– Ağır otur, batman gəl. Burada səndən başqa da kişi var.

Molla Sadıq hirslə camaatı süzüb, mərəkədən uzaqlaşdı. Beş-on saqqallı kişi də onun arxasınca getdi. Aralığa dava düşsə vuruşmağa hazır olanlar yarıya qədər siyirdikləri xəncəri şaqqıltı ilə qınına saldılar. Cahandar ağa qohumlarını gözaltı süzüb arxayınlaşdı. Aleksey Osipoviçlə Əhməd də dərindən nəfəs aldılar. Əhməd dilinin ucu ilə qaysaqlanmış dodağını isladıb, ovcunda sıxdığı naqanın dəstəyini buraxdı. Camaatın sakitləşdiyini və bir daha qalmaqal salmayacaqlarını yəqin etdikdən sonra Cahandar ağa yenə əvvəlki yerinə qayıtdı. Çiynini tut ağacına söykədi. Əsəblərini sakitləşdirmək və həyəcanını ətrafdakılara bildirməmək üçün yenidən papiros eşdi. Bir-iki dəfə dərindən nəfəs aldıqdan sonra üzünü Əhmədə tutdu:

– A bala, adam bir iş görəndə əvvəlcə məsləhətləşər. Yoxsa durduğun yerdə özünü də xataya salmışdın, bizi də. Bu kişini də ortalıqda biabır elədin. Qərib adamsan, hər şeyə baş qatma. Qanmaz adam çoxdur, əllərindən nə desən gələr.

– Mən ki onlara pislik eləmirəm.

– Sözümə qulaq as, – deyə Cahandar ağa səsini ucaltdı. – Mənim söz güləşdirən adamdan xoşum gəlməz. Bir işin olanda əvvəlcə mənə de. Hər yetənlə ağız-ağıza vermə. Əşrəfin dostu məndən ötəri də əzizdir, bildinmi?

– Çox sağ olun.

Aleksey Osipoviç köynəyinin yaxasını açdı. Qalstukunu boşaldıb əlindəki dəsmalla tərini sildi. Sonra da adəti üzrə şapkasının içini quruladı. Dağılıb gedənlərin arxasınca xeyli baxdı. Böyük kədər və hüznlə başını buladı.

– Mən belə gözləmirdim. Deyəsən adamlarınız yaman xatalıymış.

– Onlarda günah yoxdur. Taxsırın hamısı o mürid köpəkoğlundadır.

– Təəssüf ediləsi haldır. Ancaq nə etməli, görünür, əliboş qayıtmalı olacam.

Cahandar ağa sakitcə cavab verdi:

– O barədə sonra fikirləşərik.

Mərəkədəkilər dağılışdılar. Beli xəncərli kişilərin çoxu kəndin dolama cığırlarında görünməz oldu. Tut ağacının ətrafında yalnız Cahan-

dar ağanın qohumları qaldı. Aleksey Osipoviç fikirli-fikirli papiros çəkən Cahandar ağaya yaxınlaşdı.

– Çox sağ olun. Əgər Siz olmasaydınız, deyəsən salamat qurtara bilməyəcəkdik. Sizə minnətdaram. Əşrəfə sözünüz yoxdur ki?

Kişi oğlunun adını eşidəndə qaşlarını çatıb ağır-ağır qonağa baxdı. Bir az bundan əvvəl baş verən hadisədən xəcalət çəkdiyindən nə edəcəyini belə müəyyənləşdirə bilmədi.

– Getmək istəyirsiniz?

– Bəli.

– Nə vaxt?

– Elə bu saat. Yolçu yolda gərək, onsuz da yaman gecikmişəm.

– Tələsməyin.

– Fayton gözləyir, ertəykən yola düşsək yaxşıdır.

– Darıxmayın, – deyə Cahandar ağa ona cavab verdi, sonra da üzünü cavanlardan birinə tutdu. – A bala, get o atın cidarını al, bura gətir. Sonra da qaç evə, xəbər ver ki, qonağımız var. Başa düşdünmü? Uşaqlara da tapşır ki, hazırlaşsınlar, yola çıxacağıq. Hə, indi durun evə gedək.

– Zəhmət çəkməyin.

– Durun gedək. Bu kəndə gələn qonaq mənim evimdə çörək kəsməmiş gedə bilməz.

– Sözün düzü...

– Gedək evə. Orada danışıb məsləhətləşərik.

Aleksey Osipoviç dönüb Əhmədin üzünə baxdı. Razılaşmaqdan başqa əlac olmadığını bilib susdu. Onlar tozlu yolun kənarındakı cığırla Kürün sahilinə doğru addımladılar. Cahandar ağa atını yedəkləmişdi. İvan Filippiçsə faytonu asta-asta sürürdü.

## 7

Mələk Cahandar ağanı bir həftəlik ayrılıqdan sonra öz istəkli ərinin həsrətini çəkən təzə gəlinlər kimi mehribanlıqla qarşıladı. Qəmər at evə çatdığını hiss edib bərk kişnəyəndə, şalını başına salıb həyətə yüyürdü, nökərlərdən əvvəl cilovu tutub, kişinin üzəngisini basdı. Belə şeylərdən xoşu gəlməyən və tez-tez "Mən ölənə kimi üzəngimi basmağa qoymaram" – deyən Cahandar ağa bu dəfə də dinmədi. Görünür, son vaxtlar Mələyin bu cür hərəkətlərinə alışmış olduğundan, sakitcə atın tərkindəki iri xurcunu yerə düşürdü. Bu bir neçə gündə

sir-sifəti durulan təzə arvadını gözaltı süzdü. Kişinin odlu baxışlarını üzündə hiss edən Mələk azca qızarıb həyalandı. Bunu ərinə sezdirməmək üçün sürüşüb boynunun dalına düşən şalını yavaşca gözünün üstünə çəkdi. Kişi Mələyin həm utandığını, həm də gözəlliyini duyan qadınlar kimi qəmzələndiyini hiss etdi. Hətta onun ürək çırpıntılarının koftasını titrədiyini də gördü. Büruzə verməsə də, belə bir cavan gəlinin qəlbini ovlaya bildiyi ilə qürurlandı. Mələk ərini altdan-yuxarı ürkək baxışlarla süzdü.

– Əyə, nə yaman ləngidin?

– Mənsiz darıxıbsan?

Kişinin zahirən laqeyd, bir qədər də kobud şəkildə yoğun səslə dediyi bu sözün arxasınca incə bir eyhamın olduğunu, arvadı üçün darıxan bir adamın öz həsrətini sezilməz dərəcədə ustalıqla etiraf etdiyini zərif bir qadın həssaslığı ilə duyan Mələk, hər şeyi açıb söyləmək, "sənsiz lap qəribsəyirdim, yadıma düşəndə burnumun ucu göynəyirdi", – demək istədi. Çoxdan bəri qəlbində yatan bir hissin alovlandığını duyan cavan qadınlara xas olan işvə ilə ərini oxşamaq istədiyini dərk etdi. Amma tezcə də öz hisslərini cilovladı: "Bəlkə onun bu cür şeylərdən xoşu gəlmir? Mənim mehribanlığımı yüngüllük kimi başa düşsə hirslənməzmi? Axı, onun xasiyyətinə hələ o qədər də yaxşı bələd deyiləm". Mələk dilinin ucuna gələn sözü uddu. Ərinin sualına cavab vermədi. Əyilib xurcunu yerdən qaldırmaq istədi. Cahandar ağa həyadanmı, yoxsa xurcunun ağırlığındanmı, nədənsə qulağının dibinəcən qızaran Mələyin qolundan tutdu:

– Qoy dursun, uşaqlar aparar.

Mələk bu sözlərdə özünə qarşı bir qayğının olduğunu duydu. İndiyə qədər heç kəsdən nəvaziş görməyən bu qadın dikəlib ərinin üzünə baxdı. Zahirən kobud görünən bu enlikürək, qarayanız kişinin ürəyindən nələr keçdiyini bilmək istədi. Cahandar ağa üzünə dikilən gözlərdə sevinc qarışıq narahatlığı gördü. O dərk etdi ki, arvadı lal baxışlarla qəlbini açır, ərinə öz razılığını, təşəkkür və minnətdarlığını bildirir. Kişinin ürəyi birdən-birə kövrəldi. O, yaşına və təbiətinə uyğun olmayan bir həvəslə arvadının başını sinəsinə sıxmaq arzusunun bir ildırım sürəti ilə beynindən keçdiyini duydu.

– Hamı yoldan sağlıqnan, ağa.

Tapdığın səsi kişini özünə gətirdi. Ovsunlanmış kimi yerindən tərpənə bilməyən Mələk də şirin duyğuların pəncəsindən qurtardı və cəld ərinin tüfəngini götürüb aralandı.

Dağa köçməzdən əvvəl şəhərə gedib, işlərini sahmana salan və bir az da, özü demişkən, "ayın-oyun" alan Cahandar ağa otağa keçib taxtın üstündə əyləşəndə evi üçün qəribsədiyini bir daha dərk etdi. Diqqətlə şüşəsi tərtəmiz silinmiş otuzluq lampaya, qürub şəfəqlərini özündə əks etdirib alovlanan pəncərələrə tutulmuş təzə pərdələrə, səliqə ilə yığılmış yorğan-döşəyə, tərəcədəki qab-qacağa, gümüş kimi parıldayan qalaylı iri mis sinilərə, divar boyu başdan-başa vurulmuş xalıya nəzər saldı. Hər şey adamın üzünə gülürdü. Elə bil taxtın üstünə salınmış gəbələrin də rəngi açılmışdı. Naxışların hərəsi bir rəng çalır, çəmən çiçəkləri kimi adamın gözünü oxşayırdı. Cahandar ağaya elə gəldi ki, divarlar da, tavanın taxtaları da tərtəmiz yuyulmuşdur. Otağın havasında nə isə adamın ruhunu oxşayan, onu xumarlandırıb yatırtmaq dərəcəsinə gətirən isti bir nəfəs var. Kimsə otağı qızdırır, ev sahibinin əzalarındakı yorğunluğu çıxartmaq üçün bədənini ovur, taxtın üstündə yumşaq döşəkçəyə uzanıb mütəkkəyə dirsəklənməyə, başının altına tük balış qoyub dincəlməyə çağırırdı. Mələk ayaqqabısını soyunub taxtın üstünə çıxanda, divara vurulmuş pərli-budaqlı maral buynuzundan ərinin gümüş dəstəkli xəncərini, tüfəngini, vəznəli çuxasını, onun üstündən ağ qotazlı başlıqla göy buxara papağını asanda, kişi ev rahatlığının, qadın qayğısının nə demək olduğunu bir daha duydu. Bütün bunlar nə demək idi? Nə üçün indiyə qədər o, evindən ötəri bu qədər darıxmamışdı. Bu ılıq və adamı oxşayıb ovunduran nəfəsi bu evə kim gətirmişdi? Yoxsa, o qocalırdı? Ona görə də özünü istiyə verən bir pişik tənbəlliyi ilə evdə oturmaq istəyirdi?!

Mələk hələ də taxtın üstündə oturan və fikirli-fikirli ətrafa boylanan ərinə yaxınlaşdı.

– Gətir çəkmələrini soyundurum.

Kişi xəyaldan ayrıldı. Qarşısında dayanıb, gülümsünən arvadına əziyyət vermək istəmədi.

– Özüm soyunaram.

– Yaxşı, onda su gətirim, ayaqlarını yu.

Cahandar ağa dabanı üstündə fırlanıb geri dönən arvadının qırçınlı donunun yelləndiyini gördü. Otağın havası dalğalanıb, onun üzünə vurdu. Kişi uzunboğaz çəkmələrini soyunub, taxtın ayağında cütlədi. Heç ikicə dəqiqə keçməmiş Mələk aftafa-ləyənlə içəri girdi. Çöməlib ərinin qabağında oturdu. Uzun və gen donunun ətəyi dövrələnib, yerə sərildi.

– Əyə, bəri, yaxın gəl.

Kişi heç nə demədi. Mələyin onun adını çağırmayıb, sadəcə "əyə" deməsindən xüsusi bir ləzzət aldı. Ayaqlarını ləyənin içinə saldı.

Cahandar ağa şalvarının balağını çirmələyən arvadının yumşaq əlinin təmasını duydu. Mələk səylə ılıq suda onun ayağını ovxalayıb barmaqlarını şaqqıldatdı, dabanını qaşıdı. Cahandar ağa isti su və qadın nəvazişindən məst olub yerindən tərpənmir, sakitcə arvadına baxırdı. Mələk aşağı əyildikcə kürəyinin ortasındakı hörükləri sağa-sola qıvrılır, gah ilan kimi belinə dolanır, gah da çiynindən sürüşüb döşü aşağı sallanırdı. Mələk saçını cəld çiyninin üstündən geri atır, yenə də işinə davam edirdi. Bunlara öz qoyan Cahandar ağa, Mələyin hörüyü bir də sürüşüb ləyənə doğru sallananda, əlini uzadıb, saçı geri elədi. Arvad onun barmaqlarının qəsdənmi, yoxsa təsadüfənmi boynunun dalında gəzdiyini duydu və gözlərini süzdürüb, altdan-yuxarı kişinin üzünə baxdı. Cahandar ağa nəzərini arvadının sürüşüb çiyninə düşmüş şalı altından görünən ağ boynundan və qızıl sırğalarının yanında qıvrılan telindən çəkmədən, hərəkətinə bəraət verirmiş kimi qaşqabaqlı dilləndi:

– Bu nədi, başını niyə örtmürsən?!

Ərinin halını gözəl başa düşən Mələk dodağını dişləyib gülümsündü:

– Burda başqa adam yoxdur, özümüzük.

Kişi hirslənmişdi. Arvadının qarşısında zəiflik edəcəyindən və bunu Mələyin duyacağından qorxduğu üçün sifətinə sərt bir ifadə verməyə çalışdı.

Mələk sakitcə şalını irəli çəkdi. Tellərini yığıb qulağının ardına itələdi, boyun-boğazını örtdü və bundan sonra ərinə çəpəki nəzər saldı. Sanki "ürəyin dincəldimi?" – demək istədi. Ləyəni kənara itələdi. Ərinin ayağını qurulamaq üçün yuxarı qaldırdı, dizinin üstünə qoydu. Cahandar ağa arvadının yumşaq budlarının təmasından titrədi. Bir dəqiqə bundan əvvəl ürəyindən keçənləri, arvadının qarşısında alçala bilmək təhlükəsini unutdu. Sifətindəki ciddilik yox oldu. Mələyin belindən tutub özünə doğru çəkdi. Qəribə nəvaziş və naməlbut hərəkətlərlə sinəsinə sıxıb, öpməyə başladı. Belə bir hadisəni gözləməyən Mələk əvvəlcə heç nə demədi. Ani olaraq "bu kişiyə nə oldu?" – deyə düşündü. Onun iradəsinin əleyhinə getməmək üçün ərinin sinəsinə qısılıb dayandı. Cahandar ağanın onu ağuşundan buraxıncaya qədər gözləməyi qərara aldı. Əslinə baxsan, onun bu oxşamadan xoşu gəlir, dağ kimi zəhmli bir kişini yerindən oynatmaq qüdrətinə malik olma-

sına ürəyində sevinirdi. Ancaq bu hal uzun sürmədi. Bir az bundan əvvəl ərinin nahaq yerə hirsləndiyini başa salmaq və özünün təqsirsiz olduğunu bildirmək üçün iradəsini ələ aldı. Həm də bütün qadınlarda olduğu kimi, kişiyə zahiri müqavimət göstərmək meyli gücləndi. O çırpınıb ərinin qolları arasından çıxdı.

– Ayıbdı, görən olar.

– Yaman darıxmışam.

Mələk qələbəsinə əmin olduğundan, cəld ləyəni götürdü və ərinin üzünə ötəri nəzər salıb gülümsündü.

– Bir az səbir elə, amanın qırılmayıb ha.

O, qapını vurub bayıra çıxandan sonra Cahandar ağa özünə gəldi. Taxtın üstündə uzanıb mütəkkəyə dirsəkləndi. Mələyin son sözü onu yaman tutmuşdu. Cibindən gümüş qutusunu çıxardıb, papiros eşmək istədi. Barmaqlarının titrədiyini hiss etdi. Kişi yaman pərt olmuşdu. Uşaq kimi səbirsizlik etdiyini və öz hərəkəti ilə arvadının qarşısında alçaldığını düşündükcə, öz-özünü bağışlamaq istəmirdi. Onun zənnincə, kişi ömrü boyu istədiyini arvadına bildirməməlidir. Arvad həmişə intizar içində yaşamalı, ərinin onu sevib-sevmədiyini bilməməlidir. Hərdənbir ötəri deyilən xoş sözün, adi bir təbəssümün, ya da nadir hallarda büruzə verilən nəvazişin aylarla həsrətini çəkməlidir. Belə olanda arvad kişinin qədrini bilər, ömrü boyu ondan xoş söz eşitmək eşqi ilə alışıb-yanardı. Kişinin əzəməti də, qüdrəti də, arvad yanındakı amiranəliyi də onun sirli, sehrli olmasındadır. Cahandar ağa indiyəcən belə yaşamış, dədə-baba adətini pozmamışdı. Amma, nədənsə Mələyi görəndə hər şeyi unudur, müvazinətini itirir, oyuncağa dönürdü. O, papirosunu tüstülədir, "Mənə nə olub, cavanlığımda bir qızın, bir gəlinin qabağında əyilmədim. Zərnigarın üzünə bir dəfə gülmədim, indi mən niyə belə olmuşam? Niyə Mələyi görəndə hər şeyi yadımdan çıxardıram?" – deyə öz-özünü mühakimə edirdi.

Bir az bundan əvvəlki şadlıq yox oldu. Cahandar ağanın iri qıllı qaşları aşağı enib, gözünün üstünə kölgə saldı. Sanki bəbəklərindəki mənanı gizlətmək, ürəyindən keçənlərin gözlərindən oxunmasına imkan verməmək üçün kirpiklərinin qabağına çəpər çəkdi. Cahandar ağa bir anda üz-gözündən qan daman zəhmli və yontalmamış nəhəngə dönüb döşəkçənin üstünə sərələndi.

Bir az bundan əvvəl özünün də hiss etmədən verdiyi köntöy cavabdan ərinin tutulduğunu duyan Mələk onun könlünü almağa çalışdı.

– Bir azca səbir elə, sənə ləzzətli bir xəngəl bişirəcəm. Dünəndən qurud əzib, təpitmə kəsmişəm. Vallah, düz sözümdür, inanmırsan?

Cahandar ağa özünü bir az da ağır göstərməyə çalışıb dinmədi. Ancaq bu hal uzun çəkmədi. Bir azdan Mələk siniyə çəkdiyi qurudlu xəngəli taxtın üstünə qoydu. Cahandar ağa bardaş qurub oturdu. Bütün xörəklərdən çox sevdiyi xəngəli görəndə dərhal sinini qabağına çəkdi.

– Gəl otur, sən də ye.

– Mənim payım durur.

– Yoldaşlı yeyəndə iştahlı olur.

Mələk bu dəfə etiraz etmədi. Ərinin böyrünə qısılıb, əlini siniyə uzatdı.

– Xoşuna gəlirmi, deyəsən, soğanı çox olub?

– Yox, – deyə Cahandar ağa diqqətlə onun üzünə baxdı. Mələyin gözlərindən oxudu ki, təriflənmək, bişirdiyi xörəyin ləzzətli olmasını təsdiq edən söz eşitmək istəyir. Qadınların belə bir zəif cəhətlərinin olduğunu, həmişə hər balaca işdən ötəri ərlərinin tərifini eşitmək istədiklərini, bununla daha da xoşa gəlməyə çalışdıqlarını bilən Cahandar ağanın dodağı qaçdı. – Xəngəlinə söz ola bilməz. Əlin çox duzludur. Xörəklərin ləzzətli olur.

Mələk dinmədi. Əli sinidə, gözü isə arvadının üzündə qalan ərinin böyrünə balaca toxundu.

– Yaxşı, çörəyini ye.

Xörəkdən sonra, qabağında çay, döşəkçənin üstünə uzanan Cahandar ağa Mələyi yanına çağırdı.

– O xurcunu bura gətir.

Gəlin ərinin sözünə əməl etdi.

– Aç, parçaları çıxart.

Mələk xurcunun içindəkiləri ortalığa tökdü. Atlas və güllü ipək parçalar, xara döşəküzüləri, Səmərqənd ipəyi, kişmiri şal taxtın üstündə qalaqlandı.

– Ürəyin hansı parçanı istəyir, seç götür.

– Özün ver.

– Mən bəyəndiyim xoşuna gəlməz.

– Sənin xoşuna gələn mənim də ürəyimdən olacaq.

Cahandar ağa qurtum-qurtum içdiyi çayı qurtardı, boş stəkanı nəlbəkiyə qoyub, əlini güllü atlasa uzatdı.

– Necədi?

– Nə bilim?

Kişi bu qeyri-müəyyən cavabdan arvadının ürəyindən xəbər verdiyini duyub, parçanı onun qubağına atdı.

– Al, bu sənin. Bu da onun, – deyə kişmiri şalı göstərdi: – Bu güllü parçanı da Salatına almışam. – Cahandar ağa dayanıb, yol çəkən gözləri ilə Mələyə baxdı. – Mən gedəndən sonra heç buralara hərlənibmi?

– Yox. Bircə dəfə su yolunda görmüşəm.

– Bəti-bənizi qaçmayıb ki?

– Yox. Lap yaxşıdır, – Mələk övladının intizarını çəkən kişinin ürəyindən keçənləri duydu və onu sakitləşdirmək istədi. – Maşallah lap su sonasına dönüb.

– Hardan? – Cahandar ağa astaca dilləndi. – Yəqin korluq çəkirlər.

Kişinin halı birdən-birə dəyişdi. Bir az bundan əvvəl həbəşi dodaqlarında oynayan təbəssüm yox oldu. Parçaları kənara itələyib mütəkkəyə dirsəkləndi.

– Yaxşı. Qalanlarını da özün bölüşdür. Hərənin payını özünə göndər. Şahnigarı da yaddan çıxartma. İstəyirsən onun qənd-çayını elə bu saat Tapdıqnan yolla.

– Yaxşı.

Mələk hər şeyi başa düşdü. Cahandar ağanın nə qədər hirsli olsa da, evdən küsüb gedən arvadı Zərnigara da, qızına da, oğluna da, elə gəlininə də pay aldığını anladı. Gözəyarı hər şeyi yerbəyer etdi. Kimə nə göndərəcəyini müəyyənləşdirdi. Həm də qərara aldı ki, bu işləri ərindən xəbərsiz kimi xəlvəti görsün. Amma Şahnigarın payını elə buradaca, kişinin gözü qabağında ayırdı. Güllü bir çitə bağlayıb kənara qoydu. Cahandar ağanın bacısı Şahnigarı çox istədiyini yaxşı bildiyindən, payı ləngitmədi. “Qoy arvadın payını elə kişinin gözü qabağınaca yollayım” – deyə düşündü və dərhal Tapdığı çağırdı.

Tapdıq getdi. Amma, əlində bağlama, dabanı üstündə də geri qayıtdı.

– Ağa, Şahnigar xanım evdə yoxdur.

– Hara gedib?

– Meyxanaya.

– Nə, meyxana?!

– Bəli, ağa. Müridlər bu axşam Molla Sadığın evinə yığışıblar. Türbədən də gələnlər var. Deyirlər yaman meyxana olacaq.

– Get atı yəhərlə!

Tapdıq səssizcə otaqdan çıxdı. Cahandar ağa stəkandakı çayı ikicə hortumda başına çəkib, ayağa durdu.

– Çəkmələrimi gətir!

Mələk danışmağı və ərindən söz soruşmağı yersiz bildi. Sakitcə onun paltarını geyib, yaraqlanmasına kömək etdi. O başa düşdü ki, kişinin dişi bağırsaqlarını kəsir. Əlindəki qamçının dəstəyini az qalır ovxalayıb töksün. Mələk "Yolum qara gəlsin, kaş payı bu gün göndərməyəydim", – deyə özünü danladı.

Cahandar ağa arvadının sual dolu baxışlarına cavab vermədi. Quş kimi sıçrayıb, atın belinə qalxdı. Dördnala çapan at gecənin qaranlığına qarışıb, xəyal kimi əridi.

## 8

Molla Sadığın on iki kərənli uzun evi başdan-başa gəbə ilə döşənmişdi. Divar boyu döşəkcələr salınmışdı.

Hər tərəf tərtəmiz süpürülmüş, tavandan asılan çırağın məftili elə bil qəsdən lap aşağıya endirilmişdi. Divara vurulan ala-bəzək kilimlərin tozu alınmış, künc-bucağın qurumu da təmizlənmişdi. Ev adamın üzünə gülürdü.

Molla Sadıq dodaqaltı otaqda zümzümə edə-edə otaqda hərlənir, tez-tez də təsbehinin iri muncuqlarını şaqqıldadırdı. O bu gün dərs keçməmişdi. Uşaqları məsciddən birbaş evinə gətirmiş və hərəsinin əlinə bir süpürgə vermişdi. "Axşam qonağımız olacaq, evi sahmana salın", – demişdi. Bunlar azmış kimi axşama qədər uşaqları saxlayıb, qapı-bacanı çalğılatmışdı. İndi hər şey hazır idi. Qonşu otaqda arvad-uşaq düyü təmizləyir, nökərlər odun yarırdılar. Ağ samovarlar eyvanda yan-yana düzülüb poqquldayırdı.

Evin ortasında hərlənən Molla Sadıq hər şeyə göz qoyur, çöpün çöp üstündən süyüşməsini istəmirdi. Onun özü də bu gün çox səliqəli və şıx geyinmişdi. Arxalığını təzələmiş, toyda-nişanda olduğu kimi ipək qurşaq bağlamış, əmmaməsini də xüsusi bir zövqlə başına qoymuşdu. Tez-tez əlini saqqalına çəkib boğazını arıtlayırdı. Kişi buxaq bağlamışdı. Səliqə ilə altı vurulmuş saqqalını tərpədib, çənəsini bir az boynuna doğru əyəndə ağ ət qat-qat olurdu. Sinəsi qabarıq idi. Yanaqlarından qan damır, qaş-gözü oynayırdı.

O, eyvana çıxdı. Pəncərədən qonşu otaqda düyü arıtlayan gəlininə və qonum-qonşudan yığılan cavan arvadlara baxdı. Birdən havalanmış

buğa kimi “hey, hey!”, “hey, hey!” – deyib nərildədi. Onun zil səsi kəndin ortasına qədər getdi. Otaqdakı arvadlar diksinib:

– Bismillah, bu kişiyə nə oldu? – deyə xosunlaşdılar. Molla Sadığın gəlini sehrli bir pıçıltı ilə onlara:

– Kişinin qulağına səs gəlib, gözünə mələklər görünür, onlarla danışır, işinizdə olun, – deyə cavab verdi. Arvadların bəzisi vahimə içində küncə çəkildi.

Qaş qaralır, Molla Sadıq intizar içində müridləri gözləyirdi. Bu axşam onun evində meyxana qurulacaqdı. Qonşu türbədən də hörmətli bir qonaq gələcəkdi.

Əvvəllər göytəpəlilər müridliyin nə olduğunu bilməzdilər. Elə uzaqdan-uzağa qonşu dağ kəndlərindən birində müqəddəs qəbir olduğunu, adamların oraya toplaşıb, ibadət etdiklərini eşidərdilər. Deyilənə görə, o türbəyə müqəddəs bir adam basdırılmışdı. Onun müridləri də vaxtaşırı qəbri ziyarət edir və sonra da meyxana başlayırdılar. Meyxana haqqında çox qəribə şeylər söyləyirdilər: guya müridlər ibadət zamanı qızışır, əllərini közərmiş dəmirə, ya da od kimi qızmış peçə basırlar. Onların nəinki əlləri yanmır, heç istiliyi də hiss etmirlər. Ya da poqquldaya-poqquldaya qaynayan samovarı qucaqlarına alır, şaq-şaq şaqqıldayan çaydan süzüb, birnəfəsə içirlər, yenə heç nə olmur. Çox qəribə, möcüzəli sözlər danışırdılar. Müridlərin cəzb olduğu, ağızları köpüklənərək qəşş etdikləri, saatlarla bu dünyadan köçüb, o dünyada ruhlarla qovuşduqları haqqında rəvayətlər söyləyirdilər. Hər yerə belə bir xəbər yayılmışdı ki, kim türbəyə ziyarətə getsə, ya da oranın bir tikə çörəyini yesə, istədiyi arzuya çatıb, bütün qada-bəladan uzaq olar. Çox adam müridləri əfsanəvi varlıqlar, sirlərlə dolu olan ecazkar və müqəddəs insanlar kimi təsəvvür edirdi.

Bir neçə il bundan qabaq bu uzunsaqqal müridlərdən biri Göytəpəyə gəlib çıxdı. Üç gün, üç gecə Molla Sadığın evində yeyib-yatdı. Getməzdən əvvəl ona bir kitab verdi. “Bizim mürşidimiz, cəddinə qurban olduğum Seyid Nigarinindir. Oxu öyrən, başqalarını da başa sal, onun müridi ol”, – dedi.

Molla Sadıq çox fikirləşmədi. Buradan qazanc iyinin gəldiyini duyub dərhal işə başladı. Ona türbəyə toplanan nəzirlərdən pay göndəriləcəyini vəd etmişdilər.

Bu hadisədən bir neçə ay sonra Göytəpədə uzunsaqqal kişilər görünməyə başladı. Uşaqların “keçisaqqal” – deyə ələ saldıqları bu adam-

ların sayı tədricən artdı. Hətta cavanlardan da bu işə qoşulan, şəvə kimi qara saqqal uzadanlar oldu. Molla Sadıq onları müdafiə etdi. Kənd əhlini məscidə toplayıb, minbərə qalxdı. "Camaat, hamınız sünnüsünüz, məzhəbinizdən dönməyin, şəkk eləməyin, sonra axirət dünyasında cəhənnəm oduna yanarsınız", – dedi. Adamlar xofa düşüb susdular.

Bundan sonra Göytəpədə müridlər çoxaldı. Qəribə idi, kim bircə dəfə onların məclisinə düşsə, əl çəkmir, elə həmin günün səhərisi saqqalını uzatmağa başlayırdı.

Son illər müridlərin dəstəsinə qadınlar da qoşulurdu.

... Nəhayət, kəndin yan tərəfindən təpələrin kölgəsi uzanıb evlərin üstünə səriləndə Molla Sadığın intizarla gözlədiyi qonağın atı doqqazda kişnədi. Nökərlərdən əvvəl o özü gələnin qabağına yüyürdü. Üzəngini basıb, atın başını tutdu.

– Xoş gəlmisən, ay Hacı Əmrah əfəndi, yol səni yormadı ki?

– Çox sağ ol, xoş günün olsun, – deyə atın üstünə yayxanmış göbəkli kişi dilləndi. Sonra da iri bədənini birtəhər sürüyüb, yerə düşdü. Onlar ikiqat əyilib görüşdülər.

Molla Sadıq qonağına yol göstərə-göstərə eyvana gəldi. Hacı Əmrah əfəndi içəri girməzdən əvvəl dönüb geri, kəndin üstünə çökən buludların tonqal kimi alovlanıb qızarmasına, saralan üfüqlərin tutqunlaşmasına baxdı və birdən bədəninə üşütmə gələn adamlar kimi "Allah, Allah" – deyə heybətli səslə qışqırdı. Molla Sadıq əlini saqqalına çəkib, dodaqlarını tərpətdi. Bütün müridlər kimi guya ani zikrə gedən Hacı Əmrah əfəndi dua oxuduqdan sonra üstü bıçaqla kəsilmiş postallarını qapının ağzında soyundu. Molla Sadıq onları cütləyib qoydu və qapını açdı.

– Buyuracaqsınız.

Hacı Əmrah əfəndi gəbələrin üstü ilə səssizcə addımlayıb, yuxarı başa keçdi. Hər tərəfinə iri bir yastıq qoyulmuş döşəkcənin onun üçün hazırlandığını yaxşı bildiyindən, ev sahibinin təklifini gözləmədən keçib əyləşdi. Balışları qoltuğunun altına qoyub ayaqlarını uzatdı. Molla Sadığın gözləri ixtiyarsız olaraq qonağın naxışlı yun corabına dikildi. Hansı bir qadınınsa səylə toxuduğu corab təptəzə idi.

Kişi heç nəfəsini dərməmiş Molla Sadığın gəlini aftafa-ləyən gətirdi. Yaşmağını yuxarı qaldırıb Hacı Əmrah əfəndinin əlinə su tökdü. Aftafanın hacıleylək boğazı kimi uzun, nazik lüləyindən şoralanan sərin su ilə əllərini yuyub saqqalına çəkən kişi "atan behiştlik" – deyə

qurulandığı xoruzlu, güllü dəsmalı geri qaytardı. Heç ikicə dəqiqə keçməmiş boğmalı armudu stəkanda buğlanan pürrəngi çay onun qabağında hazır oldu. Qonaq iki stəkan dalbadal boşaltdıqdan sonra iri dəsmalla, puçur-puçur olub alnından axan təri sildi.

– İşlərin necə gedir, ay Molla Sadıq?

– Şükür xaliqə, pis deyil.

– Cəddinə qurban olduğumun müridləri çoxalır, ya yox?

– Çoxalır, Hacı, indi özünüz görəcəksiniz. Zənənlər də var.

– Zənən də? – təəccüblə soruşan Hacının çuxura düşmüş gözləri quyu dibindəki su kimi parıldadı. Sarıya çalan qıllı qaşları bir-iki dəfə qalxıb-endi. – Çox pakizə, çox gözəl. Cəddinə qurban olduğum özü sənin zəhmətini qiymətləndirər.

Molla Sadığın da xırdaca gözləri muncuq kimi işıldadı. Əlini qaşının pırpızlanmış tükünə çəkib ikiqat əyildi:

– Borcumuzdur, Hacı, din-məzhəb yolunda adam canından keçər.

– Əlbəttə, əlbəttə. Biz bəndələrin işi Allaha qulluq etməkdir.

Bayaqkı gəlin yenə içəri girdi. Tavandan asılmış çıraqları yandırıb, fitili qaldırdı. Axşamın boz-bulanıq qaranlığına bürünən otaq işıqlandı.

Qapı açıldı. Göytəpənin adlı-sanlı müridlərindən biri içəri girdi. Hacıya ehtiramla baş əyib görüşdü. Sonra da döşəkcələrdən birinin üstünə əyləşdi. Bundan sonra qapı tez-tez açılıb-örtüldü, astanada cütlənib qatarlaşan ayaqqabıların sayı çoxaldı. Yavaş-yavaş içəri saqqallı adamlarla dolur, divar boyu cərgələnmiş döşəkcələr üstündə əyləşənlərin naxışlı corabları nizamla sıraya duran əsgərlər kimi qatarlaşırdı.

Bir az bundan əvvəl eyvanda qaynayan samovarları içəri gətirdilər. Qonum-qonşudan çağırılan qız-gəlin ortası güllü, qara sinilərdə çay daşıyır, balaca, armudu stəkanlar ayaqların bərabərində sıralanırdı. İçəri dolur, məclisə gələn müridlərin ardı-arası kəsilmirdi. Kişilərdən sonra əli təsbehli qadınlar da gəldi. Onlar da öz yerlərini tutdular. Bardaş qurub kişilərlə bərabər çay içdilər.

Yerini rahatlayıb, kürəyini iri balınca söykəyən Hacı Əmrah əfəndi gözaltı divar boyu düzülmüş corablı ayaqlara, sinəyə tökülən uzun saqqallara tamaşa edirdi. Cəmi bir neçə ildə bu qədər mürid toplaya bildiyinə görə Molla Sadıqdan razı qalmışdı. Onun payını artırmağın, daha da həvəsləndirməyin vaxtı gəlib çatdığını dərk edən Hacı, son zamanlar ziyarətə gələnlərin çoxalmasında, nəzirlərin artmasında Molla Sadığın xüsusi rol oynadığını bilirdi. Ona görə də onu daha da şirnikləndirmək haqqında düşünürdü.

Samovarlar dolub-boşalandan sonra ortalığa iri sinilərdə plov gəldi. Biləklər çirməndi, buğumlu barmaqlar yağlı düyünü xışmalayıb, ağızlara təpişdirdi. Üç-dörd şapalaqla sinini boşaldıb, geri çəkilənlər də oldu. Saqqallarına bulaşan düyüləri təmizləyənlər yenidən çaya hücum etdilər.

Çıraqların fitilini bir az da qaldırdılar. Molla Sadıq pəncərələrin taxtasını bağlatmaq istədi. Ancaq Hacı Əmrah əfəndi qoymadı. Oradan boylanan uşaqları, ağzı yaşmaqlı gəlinləri, içəri girməyə cəsarət etməyən cavanları göstərdi. "Qoy tamaşa eləsinlər, xeyri var. Lazım olanda mən özüm deyərəm".

Molla Sadıq qonağın gözlərindən qəlbini oxuyub, yerində qurcalandı. Elə bu vaxt küncdə əyləşən müridlərdən biri dizi üstə oturub, saqqalını tərpətdi:

– Ay Hacı, sizə bir sualım var.

– Buyur, oğlum.

– Qapının ağzında üstü bıçaqla kəsilmiş bir cüt təzə postal var, o sizindirmi?

– Bəli, övladım.

– Onu özünüzmü kəsibsiniz?

– Bəli, bala.

– Səbəbini bilmək olarmı?

Hacı Əmrah əfəndi əlindəki stəkanı yerə qoyub gülümsündü və ayağındakı naxışlı coraba baxdı.

– Ayağımı sıxırdı, mən də kəsdim. Kəsməyə də bilərdim. Amma cəddinə qurban olduğum deyir ki, insan gərək bu dünyada özünə əziyyət verməsin. Nəfsini qaytarıb, gözünü ac qoymasın. Kim bu dünyada sıxıntı çəksə, elə axirətdə də əzab içində qıvrılacaq. İnsan gərək havalı və eşqli olsun. Eşqdir bu dünyanın əzəli. Qəlbində Allaha məhəbbəti olmayan bu dünyada yaşaya bilməz. Elə cəddinə qurban olduğum Seyid Nigari bir eşqlə yanıb kül olmadımı? Onun Nigara olan eşqi ilahi bir eşqə çevrildi. Xaliq özü belə buyurmuşdur. Aşiq və məşuq öz eşqləri ilə Yaradana qovuşurlar. Dünyanın sirri budur, əzizlərim. Qəlbində eşqi çox olan adam Allaha daha tez qovuşar.

Müridlər qulaq kəsilmişdilər. Müridlər də gözlərini bu ağ sinəli, yaşı əllini keçmiş olsa da, gümrahlığını itirməyən kişinin ağzına zilləmişdilər. Meyxanaya gələn arvadların bəzisi bu sözləri əvvəllər də eşitmişdi. Ancaq yenə də qulaq asırdılar. Hətta arabir sual verənləri də

olurdu. Ancaq belə məclisə yenicə gələnlər hələ utanır, küncə qısılıb, üzlərini gizlədir, acgözlüklə Hacıya qulaq asıb dediklərinin mahiyyətini dərk etməyə çalışırdılar. Onlar xof və həyəcan içində oturur, ruhların mələklərə necə qovuşacağı haqqında fikirləşirdilər. Kəlağayılarının altında gizlətdikləri kitabı sinələrinə qısıb titrəşirdilər. Onlar çox qəribə hal keçirirdilər. Deyilənə görə, əsl müridlərin çoxu yol getdikləri yerdə belə, Allahı görür, mələklərə rast gəlirdilər. Hətta onlarla söhbət də edirdilər. Belə bir səadətə nə vaxt və necə çatacaqlarını düşünən müridlər maraq və intizar içində qıvrılırdılar. Onların bu məclisə gəlməsinin əsas səbəbi də bu idi. Ona görə də Hacı Əmrah əfəndinin dediklərini o qədər də yaxşı anlaya bilmirdilər.

Cahandar ağanın bacısı Şahnigar xanım da bunların içində idi. Onun çox qəribə taleyi vardı. Keçən il ərini ilan vurandan sonra damın altında tək qalmışdı. Kişinin ölümündən sonra arıqlamaq əvəzinə kökəlmiş, buxaq sallayıb, buğum-buğum ət tökmüşdü. Qardaşı ona "çıx, gəl evimizə" – demişdisə də, Şahnigar xanım razı olmamışdı. "Ərimin var-dövləti təkcə mənə qalıb, oturub sağa-sola xərcləyəcəm. Nə işimə qalıb ki, özümü cəncələ salıram? Yengə əlinə baxıb, minnətlə qardaş çörəyi yeməkdənsə, damın altında tək qalmaq yaxşıdır", – deyə fikirləşmişdi.

Şahnigar xanım dediyindən dönmədi. Evindəcə oturdu. Geyinib-kecindi, hətta Kürə suya gedəndə də özünü daş-qaşla bəzədi. Bir toy, bir nişan onsuz keçmədi. O çox qəribə olmuşdu. Oynamaqdan doymur, şaqqıldayıb gülməkdən usanmırdı. Onun əyyarlığını bəyənməyən arvadlar tərs-tərs baxır, "bəxtəvərə bax, gör əri öləndən sonra nə əl-qol açıb! Necə də harınlayıb!" – deyə Şahnigarı öz aralarında asıb-kəsirdilər. O isə heç nəyə fikir verməyib şaqqıldayırdı. Qarıların dediyi kimi, "ərəmik camış tək anqırıb gəzirdi". Onu danlayıb bir söz deyəndə də hirslənirdi. "Məndən nə istəyirsiniz, eşitməyibsinizmi ərsiz arvad yüyənsiz at kimi şeydir, haraya istəsə, oraya da gedəcək? İndi mən də haraya istəsəm çapacam. Əl-ayağıma dolaşmayın".

Yavaş-yavaş pıçıltılar, dedi-qodular çoxaldı. Hətta bir dəfə Cahandar ağa onu təpiyinin altına salıb, bədənini qamçı ilə tuluq-tuluq etdi. Amma Şahnigar xanım dediyindən dönmədi...

Bir hörümçək həssaslığı ilə hər şeyə göz qoyan Molla Sadıq onu izləyirdi. Mollanın bu ətli-əndamlı qısraq qadından xoşu gəlirdi. Amma bu sirri heç kəsə aça bilmir, hətta ürəyindən keçənləri etiraf etməkdən də qorxurdu. Molla Sadıq Şahnigar xanıma yaxın getməyi, ona söz

deməyi xəyalına belə gətirə bilmirdi. O nə qədər əyyar arvad olsa da, kənddə bir az açıq dolansa da, hələ həndəvərinə dolanan olmamışdı. Heç kəs canından keçməmişdi. Molla Sadıq da başının qədrini bilirdi. Necə deyərlər, kürəyini Cahandar ağanın gülləsinə verməyə təhəri yox idi. Burada nə isə başqa bir əməl işlətmək lazım idi.

Molla Sadığın ayrı bir məqsədi vardı. O, Cahandar ağanı sındırmaq və özünün haqlı olduğunu camaat qarşısında nümayiş etdirmək istəyirdi. Axı Cahandar ağa kənddə yenicə müridlər yarananda Molla Sadığı çox pis vəziyyətə salmışdı?! Molla Sadıq ilk dəfə öz evində meyxana düzəltmişdi. Cahandar ağanı da dəvət etmişdi. Onun məqsədi kəndin bu hörmətli adamını ya müridə çevirmək, ya da heç olmazsa bu işə rəğbət bəsləyən bir adam halına salmaq idi. Ancaq zənnində yanılmışdı. Cahandar ağa bir az oturub, türbədən gələn müridin hədisinə qulaq asandan sonra narazılığını bildirmiş, müridlər çalıb-oynayanda isə məclisi yarımçıq qoyub ayağa durmuşdu: "Mənim ağlım bir şey kəsmir, bunlar hamısı lotuluqdur" – deyə qapını vurub çıxmışdı. Hamı mat qalmışdı. Molla Sadıq özünü sındırmamaq üçün onun arxasınca çıxmış və ayağını üzəngiyə qoyub atın belinə qalxmağa hazırlaşan Cahandar ağaya yaxınlaşmışdı:

– Sən niyə dinsizlik edirsən, Allahın qəzəbindən qorxmursan?

– Bilirsən nə var, Molla Sadıq, mənim elə uşaqlıqdan səndən xoşum gəlmir, oğraş adama oxşayırsan.

– Sən dini, Allahı danırsan.

– Allahda işin olmasın!

– Sən kafirsən!

– Molla, mənə lotuluq gəlmə, get dınqırına süz. Mən Allahımı da tanıyıram, peyğəmbərimi də.

O, atını minib uzaqlaşmışdı.

Elə o vaxtdan Molla Sadıq Cahandar ağa ilə yanıqlı gəzir, intiqam almaq üçün fürsət axtarırdı. Nəhayət, belə bir məqam ələ düşdü. O, Şahnigar xanımı öz dəstəsinə çəkməyə çalışdı.

Lap uşaqlıqdan cinə, ərdoya inanan, qorxulu, uydurma nağılları bir həqiqət kimi qəbul edən Şahnigar xanım tez tələyə düşdü. İkicə ayın içində onu inandırdılar ki, müridlik savab işdir. Onlara qoşulan cənnətlik olacaq.

Şahnigar xanım Seyid Nigarinin kitabını Quranla yanaşı qoydu. Gecələr çətinliklə də olsa mollaxanada oxuduğu hərfləri yadına salıb

höccələyə-höccələyə şerləri əzbərlədi. “Ərim yox, uşağım yox, elə Allahın bədbəxtiyəm, – deyə düşündü. – Bəlkə qəzəbə gəlmişəm. Günahım çoxdur. Onun üçün də rəhminə qurban olduğum mənə kəc baxır. Bəlkə gec deyil, elə bu müridlərə qoşulsam kəramət sahibi məndən mərhəmətini əsirgəməz?”. Arvad çox düşündü. Belə bir yoldan geri dönsə, axirət dünyasında oda qalanacağını gözünün qabağına gətirdi və razılıq verdi.

Haradansa qardaşı Cahandar ağa bu işləri eşitdi və ona sifariş elədi ki, “qulağıma söz-zad dəyir, bax ha, ağlını oğurladarsan, ondan sonra məndən küsmə, böyük tikəni qulağın boyda edərəm”.

Şahnigar xanım odla su arasında qaldı. Qəribə idi, arvad Allah yolundan dönməkdən daha çox xoflanırdı. Nəhayət, ibadət hissi qorxuya üstün gəldi. Şahnigar xanım qardaşının kənddə olmamasından istifadə edib, böyük tərəddüdlə də olsa, ilk dəfə Molla Sadığın evinə, müridlərin meyxanasına gəldi.

İndi o, küncdəcə oturur, qorxu və maraq içində nələr olacağını gözləyirdi...

Molla Sadığın gözü onu çoxdan almışdı. Nəhayət, məqsədinə çatdığına və Cahandar ağanı el içində biabır eləyəcəyinə görə ürəyində sevinir, saqqalını tumarlaya-tumarlaya Hacı Əmrah əfəndiyə baxırdı.

Artıq gecə keçirdi. Meyxananı başlamaq olardı.

Qonağa nazik bir sini verdilər. O dərhal dikəlib bardaş qurdu. Qalan müridlər də arvadlı-kişili dizi üstə oturdular. Molla Sadıq da diz çökdü. Şahnigar xanım böyük təəccüblə qonağın asta-asta sini çalmasına baxdı. Birdən kişi yaşına uyğun olmayan zil və məlahətli səslə oxudu. Oturanlar onun sözünü bir ağızdan təkrar edib, yerlərində yırğalandılar.

“Ay baba, gödək baba,
Meyxanaya gedək baba”.

Şahnigar xanım yanındakı arvadların da dingildədiyini gördü. Hamı titrəməli kimi silkələnir, asta-asta sağa-sola ləngər vururdu. O nə edəcəyini bilmədiyindən, donub yerindəcə qalmışdı. Kimsə onun böyrünə toxundu. “Meyxana başlanıb, sən niyə oxumursan?” – deyə pıçıldadı. Şahnigar xanım heç nə anlamırdı. Ona elə gəlirdi ki, sehrli bir aləmə düşmüşdür. Səslər getdikcə güclənir, otağa boğuq bir gumbultu düşüb, divarı cingildədirdi. Hacı Əmrah əfəndi qızışıb sinini daha bərkdən dan-

qıldadır, cuşa gəlib zil səslə oxuyurdu. Divar boyu çömbəltmə oturan müridlərin saqqalları tərpənirdi. Onlar gərili yay kimi titrəyir, sıçrayıb ortalığa atılmağa him axtarır kimi yerlərində güclə qərar tuturdular. Nəğmənin ahəngi, sözləri də dəyişirdi:

"Ay Sənəm, Sənəm,
Dərdini çəkən
Bil, mənəm, mənəm".

Ağız deyəni qulaq eşitmirdi. Artıq bir-birinə fikir verən yox idi. Elə bil otağın içindən bir burulğan qalxıb, hər şeyi yerindən oynadırdı. Nəhayət, bu burulğanın küləyi Şahnigar xanımı da silkələdi. Onun da dodaqları aralandı, pıçıltı ilə dediyi sözlər səslərə qarışdı. Özü də hiss etmədən yerindəcə yırğalandı. Əslində onda təqsir yox idi. Oxunan hava çox yüngül idi. Adamın sümüyünə yaman düşürdü.

Birdən kimsə ilan çalmış kimi atılıb ortaya düşdü. Çiyinlərini yuxarı çəkib, boynunu qısdı. Əvvəlcə sağa, sonra da sola əyilib, dabanı üstündə dingildədi. Şahnigar xanım bu ətli kişinin dabanlarını yerə vurduqca yırım-yırım yırğalandığını gördü. O çox qəribə bir hala düşmüşdü: dəli kimi əl-qol atır, həm oynayır, həm də oxuyurdu. Həm də hər misradan sonra "puffa, puffa!" – deyə ağzını tavana tutub fısıldayırdı. Yavaş-yavaş bu hal başqalarına da sirayət etdi. Şahnigar xanım gördü ki, hamı ayağa qalxdı, arvad, kişi bir-birinə qarışdı. Yallı oynayan kimi qatarlaşıb, yerlərində ləngər vurdular. Puffultu, tısıltı çoxaldı. Ağızlar köpükləndi, sinələr qalxıb-düşdü. Hər şeyi unudub, əcaib bir şeyə tamaşa edirmiş kimi yerindəcə çaşbaş qalan Şahnigar xanım ürəyində "dınqıra süzmək bu imiş", – deyə pıçıldadı. Onu gülmək tutdu. "Ay camaat, sizə nə olub, başınıza havamı gəlib?" – deyə qışqırmaq istədi. Elə bu zaman kimsə onu tərpətdi. O da ayağa durdu. Şahnigar xanım heç nə başa düşmürdü. O, pəncərə taxtalarının necə, nə zaman bağlandığını görmədi. Çıraqların işığının nə üçün öləziyib, titrəməsinin səbəbini anlamadı. O yalnız bircə şeyi, qızışıb cəzb olan müridlərin çırağın altında fısıldayıb dingildədiklərini, iki-üç nəfərin bihuş halda yerə sərələndiyini görə bildi. Şahnigar xanım qarışıq və eybəcərləşmiş sifətlər arasında Molla Sadığın gözlərini gördü. Kişi ağzından köpük daşlana-daşlana onun ətrafında fırlanırdı.

Şahnigar xanımı dəhşət bürüdü. Yuxudan ayılan kimi oldu. O haraya düşmüşdü? Arvad xoflandı. Bəli, bu hürkü Allah xofundan da

dəhşətli idi. Birdən-birə bədəninə soyuq tər gələn Şahnigar xanım qapıya yaxınlaşdı. Elə bu zaman işıqlar söndü. Şahnigar xanım otaqdakıların başı kəsilmiş toyuq kimi partapartla yerə sərilib çırpındıqlarını hiss etdi. O, əlini qapının cəftəsinə uzatmaq istədikdə, kimsə qolundan yapışdı. Küncə doğru dartışdırdı. Elə bil arvadın qoynuna ilan saldılar. Buz kimi soyuq bir şey belinə dolanıb, dırnaqlarının ucuna qədər yeridi. Saçlarının dibi üşüdü. Şahnigar xanım qolundan yapışan əlin təmasından kişiliyini duydu. Qolunu hərlədi. Otağa qulaqbatırıcı bir şaqqıltı düşdü.

– Haramzada köpək oğlu, burax məni!

Şahnigar xanım çırpınıb inildədi. Elə bu vaxt güclü bir zərbədən zirəzələri qopan qapı taybatay açıldı. Divarın suvağı qopub töküldü. Heybətli bir səs qulaqlarda cingildədi.

– İşığı yandırın!!!

Lakin dillənən olmadı. Qaranlıqda çaxmaq şaqqıldadı. Dalbadal iki güllə açıldı. Barıtın yaşıla çalan ağımsov işığında ani olaraq bərələn gözlər parıldadı. İçəridəkilər süründülər. Görünür, onların çoxu qaranlığa salıb, birtəhər aradan çıxmaq istəyirdi. Ancaq qapının ağzını kəsən Cahandar ağa qızmış nərə dönmüşdü.

– Tez olun, yoxsa hamınızı güllədən keçirəcəm!!! Binamus köpək uşağı!

Kimsə eşələndi. Az sonra işıq yandı. Otağa dolmuş qaranlıq xəcalət çəkirmiş kimi sürünüb künclərə qısıldı. Solğun bənizlər, pırpızlaşmış saçlar, didilib açılmış yaxalar, qıllı saqqallar göründü, parıldayan gözlər qapıya zilləndi. Cahandar ağa baş tərəfdəki döşəkçələrin boş olduğunu gördü. Hirsindən dodağını elə dişlədi ki, fışqırıb üstünə şoralanan qandan xəbəri olmadı.

– Hanı o oğraş!!! – deyə yenidən nərildədi.

Heç kəs cavab vermədi. Evin dal tərəfindəki pəncərə açıq idi. Kilimin biri də aralanmışdı. Ev sahibindən başqa heç kəsin bilmədiyi qapının bir qanadı görünürdü.

Cahandar ağa gözü ilə hər yeri axtardıqdan sonra küncdə tir-tir əsən bacısını gördü. Onun pırpızlaşmış saçı gözünə sataşanda otaq başına hərləndi. Qamçını havaya nə zaman qaldırdığını bilmədi. Qamçı ilə bərabər Şahnigar xanım da ilan kimi qıvrılıb, yerindəcə qovruldu.

– Düş qabağıma, qancıq!!!

## 9

Qəmər at sahibinin hirsləndiyini duymuş kimi yüyəni çeynəyib fınxırdıqca ağzından köpük daşlanırdı. O, qaranlıqda güclə seçilən qadını döşünün altına alıb əzmək istəyirdi. Atın isti nəfəsini kürəyinin ortasında duyan Şahnigar isə səsini çıxartmadan yumaq kimi bükülüb irəliləyirdi. Uzun donunun ətəyi kol-kosa ilişib təngildəsə də dayanmır, ayağı büdrəyib yıxılan kimi sıçrayıb qalxır, şallağın çiyni aşağı enəcəyindən qorxduğuna görə canını dişinə tutub yorturdu. Kəndə çaxnaşma düşmüşdü. İtlər ağız-ağıza verib ulaşır, orda-burda tüfəng atılırdı.

Cahandar ağa susurdu. Gözünü atın qulaqları arasından irəli zilləyib, güclə görünən bacısına baxırdı. O gah sirkənlikdə təmiz itən, gah da az qala atın ayağı altına düşən Şahnigarın ağaran paltarından başqa heç nə görmürdü. Dodaqları səyriyir, barmağı isə tüfəngin tətiyində oynayırdı.

Onlar kəndi keçmişdilər. Şahnigar bunu bilsə də dinmir, qanqalların arası ilə irəliləyirdi. Sarı tikanlar dizinin gözünə, bəzən də nazik paltarından keçib, bədəninə dolduqca ufuldanırdı. Atın döşünə çıxan topa qanqallar bu dilsiz-ağızsız insanı döyəcləyirdi.

Artıq ay batmışdı. Kəndin və çöllərin üzərinə qatı qaranlıq çökmüşdü. Elə bil hər şey daşa dönüb donmuşdu. Nə ötən böcəklərin səsi eşidilir, nə də bir az bundan əvvəl kəndə çaxnaşma salan itlər hürüşürdü. Həmişə Kür tərəfdən əsən meh də dayanmışdı. Sanki təbiət nəfəsini içəri çəkib susur, çəmən otlarını, kolların yarpaqlarını xışıldadıb, mürgüləyən kəndi oyadacağından ehtiyat edirdi. Cahandar ağanın qəlbinə çökən dəhşətli qara fikirlərdən də qatı bir qaranlıq ətrafı çulğalamışdı.

İri bir qanqal topası Şahnigarın düz gözünün altına dəydi. Arvad özünü saxlaya bilməyib qışqırdı. Əlləri ilə gözünü tutub atın dırnağının dibinə çökdü. Qəmər fınxırıb yüyəni daha bərkdən çeynədi. Yalnız bu zaman Cahandar ağa fikirdən ayılıb, atın başını çəkdi. Şallaq yenə havada şaqqıldadı.

Getdikcə qanqal və sirkən xışıltısı azaldı. Nəhayət, araba yolunun narın və yumşaq tozu atın ayağının altında tappıldadı. Şahnigar yüngül nəfəs alıb irəlilədi. O, qardaşının tərsliyini bildiyindən dinmirdi. Nə göz yaşının, nə yalvarışın, nə də ah-nalənin onu inadından döndərə bilməyəcəyini, əksinə daha da höcətə salacağını anlayan Şahnigar susur, bu işlərin nə ilə qurtaracağını, yeganə qardaşının onu haraya apardığını dəhşət və səbirsizliklə gözləyirdi. Bir də o, qardaşına nə deyə bilərdi? Axı, Cahandar ağa vaxtında ona xəbər vermişdi. “Bu müridlərə uyma”

demişdi. Bəs Şahnigar ona niyə qulaq asmamışdı? Məgər qardaş bacının pis gününü istəyərmi? Onun adının ləkələnməsinə dözərmi? "Hələ mənə bu da azdır. Lap gözündən boğazlanasıyam. Nahaq yerə ağlımı oğurladıb sözə baxdım. İndi nə olsun? Kimin ağzını bağlayacaqsan? Kimi başa salacaqsan ki, heç nə olmayıb. Sabah bütün kənddə zurna çalmayacaqlarmı? Yazıq qardaş, səni də dərdə saldım. İndi bilirəm nələr çəkirsən? Mənim kimi bacını Allah yerə soxsun, vaxtında sözünə baxmadım. Məni öldürsən də azdır. Onun üçün deyiblər, böyüyün sözünə baxmayan böyürə-böyürə qalar".

Hava avazıyırdı. Artıq yolun kənarındakı otlar, iri ağaclar seçilirdi. Otların dibinə qısılıb yatan quşlar oyanıb pırıltı ilə havaya qalxır, torağaylar isə yolun ortası ilə dazıyıb dil açırdılar. Orda-burda quşlar cikkildəşirdilər. Olduqca sərin, adamın bədənini üşürgələndirməyə başlayan meh əsməyə başladı. Şahnigar sinəsi dolu nəfəs alıb irəli baxdı. Elə bil qaranlıq zərif bir tül kimi yerin üzərindən götürüldü. Silsilə təpələrin zirvəsi ağarışdı, üfüqdə əyri-üyrü xətt cızıldı. Dan yerinə güclə seçilən çəhrayı rəng çiləndi. Ətraf aydınlaşdı. Bir az bundan əvvəl ayağının altını belə görə bilməyən Şahnigarın gözü qarşısında qıjıldayıb axan Kür parıldadı. Sahildəki yulğun kolları xışıldadı. Qaranlıqla bərabər onun ürəyinə çökmüş qorxu da azaldı. Birdən onda dayanıb oyanan səhərin nəğməsini dinləmək, üfüqlərin qızarmasına doyunca tamaşa edib, axar suların şaxələnmiş qollarına baxmaq arzusu doğdu. Artıq yolların sinəsi ilə sürünüb, Kürün üstünə doğru enən duman da göründü. Hər şey aydınlaşırdı. Bəs o haraya gedirdi?

Bir anlığa bədəninə dolan tikanların ağrısını unudan Şahnigar kürəyinin ortasını qızdıran at nəfəsini hiss etdikdə səhərin gözəlliyini unutdu. Onun gözlərində hər şey bir-birinə qarışıb dumana büründü. Yenə qəlbinə qara qorxu çökdü. Arvad nə qədər çalışdısa da, harada olduqlarını müəyyənləşdirə bilmədi. Deyəsən, kənddən çox uzaqlaşmışdılar. Bəs Cahandar ağa niyə dinmirdi? Nə üçün qamçını hərləyib onun bədənini tuluq-tuluq etmirdi? Nə üçün bir-iki ağır söz deyib, bacısını söymür, onu doyunca danlamırdı? Nə üçün ürəyini boşaltmırdı? Axı, Şahnigar da cana doymuşdu. Xısın-xısın ağlayıb ufuldamaqdan təngə gəlmişdi. O, başının üstünü alan qara buludların birdəfəlik baş-başa gəlib şaqqıldamasını, ildırım kimi çaxıb guruldamasını istəyirdi. Qoy selləmə yağış yağsın, nə olacaqsa, birdəfəlik olub qurtarsın, göyün üzü açılsın. Yoxsa bu məchulluqdan nə çıxar? Yoxsa...

Arvadı titrətmə götürdü. Birdən-birə beyninə gələn fikirlər onu hürkütdü. Qardaşının daş kimi lal-kar olması onu lap vahimələndirdi. "Deyəsən, mənimki də bura qədər imiş. Öldürməyə aparır. Yoxsa düz-dünyanı niyə dolanır? Nə?! Öldürmək?! Axı, niyə?! Nə pis iş tutmuşam ki?! Sənin əlin məni, bircə bacını öldürməyə qalxarmı, ay qardaş? Doğrudur, suçum var, boynuma alıram, ancaq günahım o qədər də böyük deyil. Vallah, düz sözümdür, o inandığımız haqqı yalan danışmıram. Özün bilirsən ki, mən səni heç vaxt aldatmamışam. Mən balacalıqdan hamıdan söz gizlətsəm də, sənə ürəyimi açmışam. Axı biz bacı-qardaşdan çox, sirdaş olmuşuq. Anam öləndə məni sən saxladın. Onun iyini səndən almadımmı, ay qardaş? Gecələr böyrünə qısılıb yatdığım, burnumu kürəyinə söykəyib səni qıdıqladığım yadından çıxıbmı, ay qardaş? Bu saat da sənin bədəninin qoxusu burnumdan getməyib, ay qardaş. Yüz adamın paltarının içində sənin köynəyinin iyindən taparam. Sənə toy olanda hamıdan çox sevinən mən olmadımmı? Gəlinimizi gətirəndə hamıdan qabaq məndən soruşmadınmı ki, yengən necədir, xoşuna gəlirmi? Mənə toy olanda hamıdan çox qəmlənən sən olmadınmı? Gəlin getməzdən əvvəl otağa girib üzümdən duvağı açdığın, "Ay şeytan, sənsiz lap darıxacağam" – dediyin yadında deyilmi? Axı mən o günü sənin doluxsunub yaşaran gözlərini indi də unutmamışam. Heç nə, heç nə mənim yadımdan çıxmayıb. Cehizimlə bərabər məni bəzəkli arabaya mindirib yola salanda da gözüm səndə idi. Nə cıdıra çıxan atlıları, nə ətrafımda hərlənən qızları, nə qol açıb zurnaçıların qabağında süzən gəlinləri görürdüm. Mənim gözüm səndə idi. Eyvandaca boynunu büküb durmuşdun, ay qardaş. Sən məndən ayrılmaq istəmirdin. Əslinə baxsan, elə mən də sənin kimi idim. Eldən arlanmasam, arabadan düşüb yanına gələr, "gözlərinə qurban, ay qardaş, niyə bikefsən, istəyirsən heç getməyim" – deyərdim. Axı sən məni çox istəyirdin?! Yadındadırmı, bir dəfə ərim məni döymüşdü. Kərənti də düşüb ayağımı kəsmişdi. Onda atlanıb gəldin, yazığın boğazını üzürdün. "Mənim bacıma əl qaldıranın əlini kəsərəm", – dedin. Mən olmasam araya qan düşəcəkdi. Heç kəsi eşitmədin. Yenə mənə, bacına qulaq asdın. Onda bildim ki, məni lap çox istəyirsən. Bəs indi nə olub ki, məni öldürmək fikrinə düşmüsən? İnanmıram. Mənə əl qaldırmazsan, ay qardaş!"

Şahnigar bir az ürəkləndi. Hətta qanrılıb geri, ala-toranda qardaşının üzünə baxmaq, onun hirsinin soyuyub-soyumadığını bilmək, hər şeyi necə olubsa söyləmək istədi. Ancaq at döşü ilə vurub onu irəli itələdi. Arvad dinmədi. Yenə ətəyi dolaşa-dolaşa irəlilədi.

Cahandar ağa isə fikrini cəmləşdirə bilmirdi. Əslinə baxsan, o heç fikirləşmirdi. Elə bil beyni, ürəyi keyimişdi. Bir yanını şaqqalayıb kəssən də xəbəri olmazdı. Atın üstündə necə oturduğunu, haraya getdiyini də bilmirdi. Gözünün qabağında yalnız duman içində ağaran bacısı, bir də Molla Sadığın qaba, iyrənc sifəti dururdu. Dodaqları səyriyir, gözünün həlqələri tez-tez dolub boşalırdı. O nə edəcəyini bilmirdi. Şübhə ac qurd kimi sinəsini gəmirib parçalayırdı. Nəfəsi darıxır, hava çatışmırmış kimi tez-tez köksünü ötürürdü. Ona elə gəlirdi ki, lap bu saat ürəyi partlayıb sinəsindən bayıra çıxacaqdır. Yumruq boyda olan bu ət parçası sıxıldıqca nəfəsi boğazına yığılıb, oradaca düyünlənirdi.

Onun üçün bu dünyada hər şeydən əziz təmiz adla yaşamaq idi. "Kişi ki adamların gözünün içinə şax baxa bilmədi, ölsə yaxşıdır. Gözükölgəli ömür sürməkdənsə, arvad kimi ləçək bağlamaq, mərəkə içinə çıxmamaq məsləhətdir. Beş gün yaşa, amma gözükölgəli olma. Bu dünyada təmiz ad saxlamaq çox çətindi. Adına söz deyildimi, qurtardı. Ondan sonra nə qədər çalışsan da, ləkəni təmizləyə bilməyəcəksən. Dilləri kəsmək, deyilən sözləri geri qaytarmaq ki, mümkün deyil". Cahandar ağa həmişə belə düşünürdü. O hər şeydən çox şübhədən qorxurdu. Elə ona görə də qohumlarına dönə-dönə tapşırırdı ki, "Çalışın adınıza söz çıxmasın. Mənim ürəyimə bir balaca xal düşsə, özünüzdən küsün". İndi onun qorxduğu iş başına gəlmişdi. Bacısı onun adını batırmışdı. Necə deyərlər, papağını yerə soxmuşdu. Müridlərin meyxanasına getmişdi. Molla Sadığın, ya da başqa bir müridin əli ona dəymişdi. "Bəlkə də ona heç nə olmayıb, tərtəmizdir. Amma kimi inandıracaqsan? Bundan sonra mən camaat arasına necə çıxacam? Başıma papaq qoyub necə gəzəcəm? Mərəkədə oturub necə söhbət edəcəm? Üzümə deməsələr də, arxamca rişxənd edib, atamın goruna söyməyəcəklərmi? Kişilikdən dəm vurur, namusdan danışır, amma bacısından xəbəri yoxdur, müridlərin dınqırına süzür, – deməyəcəklərmi? Bundan sonra hər baxış, hər mənalı gülüş məni şübhəyə salmayacaqmı? Kaş sən heç yaranmayaydın? İndi mən nə edim? Dərdimi kimə açım?"

O, atın başını döndərib sahilə endi. Kür köpüklənmişdi. Boz-bulanıq sular yerindəcə çalxalanıb qumları yalayırdı. Cələdəki kolların, yarğanların dibi ilə qatarlaşan qalın yulğunların, otların üstünə şeh düşmüşdü. Quşlar artıq oyanmışdı. Hardasa, ağacların budaqları arasında gizlənmiş bir bülbül səhərin açılmasına sevindiyindənmi, yoxsa ürəyindəki kədərin təsirindənmi, nədənsə cəh-cəh vururdu. Onun səsi budaqdan-budağa düşüb yarğanda cingildəyirdi. Kürün üzərinə çök-

müş duman da yavaş-yavaş geri çəkilirdi. Cığırlara şeh qonmuşdu. O yenə dinmirdi. Bacısını qabağına salıb, cığırla cələnin içərilərinə gedirdi.

Şahnigar taqətdən düşmüşdü. Ayaqqabısının dabanı qopmuş, əynindəki paltar didik-didik olmuşdu. Bədənində salamat yer qalmamışdı. O yerimir, güclə sürünürdü. Qardaşının heç olmasa insafa gəlib dayanmasını gözləyirdi. Cığır isə qol-budağı bir-birinə çarpazlaşmış iri ağacların arası ilə qıvrılıb daha da qalınlığa gedirdi. Meşənin qatı kölgəsi elə bil səhərin açılmasını bir az da ləngitmək, ağacların mürgüləməsinə mane olan səhər mehinin qarşısını almaq, yarpaqların xışıldayıb quşları oyatmasına imkan vermək istəmirdi. Amma gözlənilməyən qonaqların ayaq tappıltısı, at fınxırtısı bu sükutu pozurdu. Quşlar pırıltı ilə ora-bura uçurdular.

Cığır iri bir palıdın ətrafına dolanıb açıqlığa çıxanda Şahnigar dayandı. Kürün ayrılan bir qolu yolu kəsmişdi. İrəli getmək mümkün deyildi. O bir qarşıdakı suya, bir də dönüb atın üstündə dayanan qardaşına baxdı. Cahandar ağanın gözü qan çanağına dönmüşdü. O buna pis məna vermədi. "Bacın ölsün, ay qardaş, səni də yuxusuz qoydum", – deyə xəyalından keçirdi. Cahandar ağa da atın başını çəkib dayandı. Yüngülcə sıçrayıb yerə düşdü. Qəməri çidarlayıb otluğa buraxdı. Özü isə suya yaxınlaşdı. Bir xeyli xırdaca ləpələrə, sonra da üfüqdən baş qaldıran günəşə baxdı. Göyün üzü tərtəmiz idi. Meşənin üstünə elə bil su çilənmişdi. Ağacların yarpaqlarından süzülən və lap ucda yumrulanıb dayanan şeh damcıları parıldayırdı. Havaya nəm xəzəl qoxusu hopmuşdu.

O əyilib üzünə bir-iki ovuc su çırpdı. Yalnız bundan sonra dönüb bacısına baxdı. Yenicə çırtlayan günəşin maili şüaları yarpaqların arasından süzülüb, Şahnigarın üstünə düşmüşdü. Onun donu cırıq-cırıq olmuşdu. Koftasının qolu çiynindən üzülüb sallanmışdı. Ağ bədənində qara zolaqlar görünürdü. Pırpızlanmış saçına və hörüklərinin ucuna pıtırğan yapışmışdı. Gözünün altı göyərmişdi. Sinəsi açıq idi. Donunun ətəyi şehə batmışdı. Qolları və cırıq paltarından görünən dizləri al qana boyanmışdı. Ayaq üstə güclə dayanırdı. Şahnigar ağlamamaq üçün dodağını çeynəsə də olmur, yaş sel kimi axıb yanaqlarından süzülürdü.

Cahandar ağa bacısının məzəmmət və yalvarışla dolu gözlərindəki məzlumluğu, imdad istəyən bir adamın iztirabını duyanda kövrəldi. Bir-iki dəfə udqunub, gözünün həlqələrini dolduran yaşı geri qaytardı. Hönkürtü ilə ağlayacağından qorxub, üzünü yana çevirdi. Şahnigarın dodağını çeynəyib səssizcə ağlaması, hıçqırığını boğub titrəməsi onun xəyalını uzaqlara apardı. Bacısının balacalığını gözünün qabağına gə-

tirdi. Şahnigar uşaq vaxtı da təqsiri olanda beləcə səssizcə ağlayırdı. Arvadın görkəmi onu sarsıtdı. Bir anlığa hər şeyi unutdu. Uşaqlıqda olduğu kimi qanadlanıb boynunu qucaqlamağa hazırlaşan və balaca bir işarə gözləyən bacısını bağrına basmaq istədi. Hər şey tükdən asılı idi. Bunu hiss edən Şahnigar bir-iki addım irəli gəldi. Amma Cahandar ağa cəld geri döndü. Onun qan sağılmış gözləri bacısının üzünə zilləndi. İri qıllı qaşları birləşib aşağı endi:

– Əl-üzünü yu!

Şahnigarın qolları yanına düşdü. Qıllı qaşlar altında mağaraya çəkilmiş yaralı və qəzəbli pələng kimi ona baxan gözlərin zəhmindən sarsıldı. Bir an bundan əvvəl ona təsəlli verən, həlqəsi yaşla dolub-boşalan nəmli gözlər əvəzinə, qardaşının qan çanağına dönmüş bəbəklərini görəndə bütün ümidləri alt-üst oldu. Ürkək addımlarla suya yaxınlaşdı. Səksəkəli də olsa sahildə dayanıb, kolların arasından boylanan günəşə, alışıb-yanan Kürə baxdı. Meşə çıraqban kimi parıldayırdı. Ala-bəzək qızlarquşu dəstə ilə havaya qalxıb adaların üstü ilə uçur, bəzən də çiləkənlərin ətrafında fırlanırdı. Onların səsi şırıldayıb, axan suların zümzüməsinə qarışmışdı. Şahnigar cələni ortadan yarıb otları yalaya-yalaya axan suyun kənarında çömbəltmə oturdu. Əlini şıltaq ləpələrə uzatdı. Bir xeyli beləcə dayanıb nə edəcəyini bilmədi. Doğrudanmı üzünü yusun? Bu uzun yolu bircə kəlmə də danışmayan qardaşı nə üçün ona belə bir əmr vermişdi? Bu nə demək idi? Şahnigarın gözü dalda idi. Sümüyü çaxnaşan arvadın kürəyi gizildəyirdi. O ehtiyatla, qardaşına sezdirmədən geri baxdı. Cahandar ağanın qutu çıxardıb papiros eşdiyini görəndə ürəyi rahatlandı. Əlini suya saldı. Barmaqlarının arasına və qoluna dolan sarı tikanların yeri göynədisə də, bədəninə sərinlik yayıldı. Elə bil dizlərinin ağrısı da azaldı. Şahnigar yüngülləşən kimi oldu. “Bacın ölsün, ay qardaş, sənciyəzi əldən saldım”, – deyə ürəyindən keçirdi.

Meşə oyanmışdı. Bayaqkı bülbül yenə şaqqıldayırdı. Ayağı çidarlı Qəmər isə fınxıra-fınxıra göy otu xımırtladırdı. Tüstünü ciyərlərinə çəkib acgözlüklə papiros sümürən Cahandar ağanın gözləri əl-üzünü yuyan bacısından başqa heç nə görmürdü. Hər şey dumana bürünmüş kimi bir-birinə qarışmışdı. “Bəlkə elə indi... heç özünün də xəbəri olmadan...” – deyə düşünən Cahandar ağa tüfəngi hərlədi.

Lap yaxından bir quş qalxdı. Günəşin zərrələri altında sinəsi və kiçik qanadları parıldayan quşcuğaz havalanmış kimi süzüb bir-iki dəfə mayallaq vurdu. Şahnigar ixtiyarsız olaraq əlini gözünün üstünə qoyub

ayağa qalxdı: mavi ənginliklərə doğru baş alıb gedən quşu gözdən itirməməyə çalışdı. Birdən hardansa peyda olan ley onun üstünə cumdu. Yazıq quş tərpənə bilmədi. Havada lələklər oynadı. Şahnigar ağzını açıb qışqırmaq istədi. Ancaq nəfəsini çəkə bilmədi. Meşə uğuldayıb şaqqıldadı. Kürəyinin arası od tutub yandı. Nə üçün gözündən tüstü çıxdığını, başı gicəllənib səldirlədiyini bilmədi. Yıxılmamaq üçün suyun kənarındakı balaca yulğun kolundan yapışdı. Qanrılıb geri, qardaşına baxdı. Bir an, yalnız bircə an onların gözləri bir-birinə sancıldı. Şahnigarın sifətində gülüşdən çox məzəmməti andıran bir təbəssüm oynadı. Gözlər süzüldü. "Qurban olum, ay qağa, məni niyə..." Cahandar ağa bu sözləri güclə eşitdi. Şahnigarın təngildəyib fırlandığını və kökündən kəsilmiş ağac kimi göy otların üzərinə sərildiyini görmədi. Onun gözləri torlanmışdı. Yaş bəbəklərini qapamışdı. Bacısının son anda üzünə zillənmiş lal baxışı – durğun göl kimi sakit dayanan iri qumral gözləri, sifətindəki məzəmmət dolu təbəssüm beynində əbədi həkk olunmuşdu. Onun dodaqları titrəyə-titrəyə dediyi son sözlərdən başqa qulağı heç nə eşitmirdi. Cahandar ağa bir-iki addım qabağa gəlib, yerə sərilmiş Şahnigarın yanında dayandı. Bəbəklərini torlandıran yaş yanaqları aşağı süzüldü. Elə bil onun gözünün qabağından tor götürüldü: hər şey aydınlaşdı. Bacısı şehli otların arasında arxası üstə uzanmışdı. Yaxası açıq idi. Sinəsinin ortasından axan qan buğlanırdı. Dodağı azca aralanmışdı. Nazik qaşlarının ucu aşağı əyilmişdi. Elə bil burun pərələri titrəyirdi. Cahandar ağa ilk dəfə görürmüş kimi bacısını diqqətlə süzdü. Onun xəyalı allandı. Ona elə gəldi ki, qarşısındakı Şahnigar yox, anasıdır. Qız nə qədər də ona oxşayırmış! Kişi diz çökdü. Bacısının geniş açılmış bəbəklərində əyilib ovunu parçalamaq istəyən heybətli bir sifət gördü. Qıllı papaqlı, qıllı qaşlı, iri həbəşi dodaqlı bir adam onun özünə də yad gəldi. Birdən-birə hələ istisi soyumamış cəsədin üstünə sərilib hönkürdü.

Quşlar yenə oxuyurdular. Bayaqkı bülbül daha bərkdən cikkildəyirdi. Ağacların yarpaqları arasından süzülüb düşən səhər günəşinin maili şüalarında çimən sular heç nə olmamış kimi şırıltı ilə axıb gedirdi. Üfüq qan rənginə boyanmışdı. Kürün suları da qızarmışdı. Hər şey öz ahəngində idi. Yalnız sahibinin ağzı üstə döşənib inildədiyini duyan kəhər ayağı ilə yeri eşir, haray salıb köməyə adam çağırırmış kimi bərkdən kişnəyirdi.

## ÜÇÜNCÜ HİSSƏ

### 1

Boz dağların ətəyi ilə qıvrıla-qıvrıla gələn qatar kiçik bir dayanacaqda azca yavaşıdı. Əşrəf vaqonun ayaqlığından yerə atıldı. Qatar bunu gözləyirmiş kimi dartınıb silkələndi. Çarxlar relslərin üstündə sürüşüb fırlandı. Parovoz içini təmizləyib bir neçə dəfə güyüldədi və fışıltı ilə yoluna davam etdi. Qumu, torpağı və relslərin altındakı taxtaları belə mazuta bulanmış yolun ətrafındakı otların üstünə elə bil şeh çiləndi.

Əşrəf paltarının tozunu çırpıb yolun kənarında dayandı. Kəsik-kəsik fit verib uzaqlaşan qatarın arxasınca xeyli baxdıqdan sonra kiçik yol çamadanını götürüb, bircə budkadan ibarət olan stansiyaya yaxınlaşdı. Qatarı yola salan xidmətçi axşamüstü bu kimsəsiz yerdə tək qalan sərnişinə baxdı. Onun geyimindən seminarist olduğunu bildikdə daha da təəccübləndi. Bu yaxınlarda kənd yox idi. Gün yaxmışdı. Gecə vaxtı o hara gedəcəkdi?

Gözətçi sərnişinin yaxınlaşmasını gözlədi. Əslinə baxsan, o özünün kiçik daxmasında bu qərib oğlana yer verməyə hazır idi. Səssizlikdən qulaq batan, kənddən-kəsəkdən uzaq balaca stansiyada o, təklikdən darıxırdı. Cəmi üç-dörd işçisi olan bu cür yerdə yeni bir adam görəndə sevinir, ürəyində yığılıb qalanları danışmaq üçün həmsöhbət tapanda bir əl-ayaq da satın alırdı.

Əşrəf gözətçiyə yaxınlaşıb salamlaşdı. Çamadanını yerə qoyub ətrafa boylandı. Gözünü meşəyə doğru uzanan cığıra zillədi. Cığırların və araba yolunun doğradığı çəmənlikdə heç kəs görünmürdü. Sükutdan qulaq güyüldəyirdi. Sol tərəfdəki boz təpəliklərə qədər uzanıb gedən səhrada cırcıramalar ötüşürdü.

Gözətçi oğlanın narahatlığını hiss etdi:

– Burda məndən başqa heç kəs yoxdur, cavan oğlan, kimi axtarırsınız?

Əşrəf gözünü yoldan çəkmədən gözətçiyə cavab verdi:

– Məni qarşılamağa gələsi idilər.

– Görünür ya gecikiblər, ya da sifarişiniz çatmayıb. Uzağamı gedəcəksiniz?

– O taya, – deyə Əşrəf əli ilə meşənin qurtaracağında, hündür yarğanların o tərəfində, üfüqlə birləşən boz təpəliklərin ətəyində güclə seçilən kəndi göstərdi.

Gözətçi artıq üzərinə axşam qaranlığı düşən meşəyə və üfüqdə son şəfəqlərini yayıb batmaqda olan günəşə baxdı:

– Gecdir bala, heç yana gedə bilməzsən, yollar qorxuludur.

Əşrəf dodaqaltı gülümsündü.

– Doğru sözümdür, qalın, qonağım olun.

Əşrəf yaşı əllini keçmiş gözətçiyə baxdı. Onun beli azacıq donqarlanmışdı. Papiros çəkməkdən bığının ortası saralmışdı. Baş barmağının sədəfi kəhrəba rənginə çalırdı.

– Çox sağ ol, əmi, birtəhər gedib çıxaram.

– Qalsan məsləhətdir.

– Getsəm yaxşıdır. Ürəyim sözümə baxmır.

– Özün bil. Ancaq...

– Heç nə olmaz. Mən buranın hər cığırına bələdəm.

Əşrəf qocadan ayrıldı. Ot basmış cığırla meşəyə doğru addımladı. Gözətçi həmsöhbətini əldən buraxdığına təəssüfləndi və papiros eşib balaca müştüyünə keçirdi.

Stansiya ilə meşənin arası beş-altı verst olardı. Ətraf yamyaşıl idi. Çəmənliyin otu qurşağa çıxırdı, ılıq meh dalğalandırdıqca qırçın-qırçın olub dəniz kimi ləpələnirdi. Otların dibinə sinən quşlar Əşrəfin ayaq tappıltısını eşidib pırıltı ilə havaya qalxır, göydə bir neçə dəfə qanad çalır və yenidən çəmənliyə qonurdular. İri yaşıl çəyirtkələr atılıb yolun ortasına düşürdü.

Əşrəf çamadanını kəmərə bağlayıb çiyninə almışdı. Əlindəki nazik çubuqla cığırın kənarındakı otları, çiçəkləri vura-vura irəliləyirdi. O, həsrətini çəkdiyi bu yerlərin havasını ciyərlərinə doldurub ləzzətlə nəfəs almaqdan doymurdu. Ürəyi quş kimi çırpınır, az qalırdı, qanadlanıb uçsun.

Əşrəf başını qaldırıb havaya baxdı. Qaranlıq çökürdü. Yolda heç kəs görünmürdü. Həmişə Qoridən qayıdanda atası onun qabağına adam göndərərdi. Əşrəf ona gətirilən atın belinə qalxıb dördnala çapar və bir anda meşənin qalınlığında gözdən itərdi. Bəs indi? Bəlkə elə doğrudan da xəbər çatmayıb? Bəlkə Kürün suyu daşıb, bəri üzə keçmək mümkün deyil? Bəlkə Qoca dayının gəmisi işləmir?

Əşrəf meşəyə çatdı. Ağacların qatı kölgəsi axşamın yaxınlaşmasını bir az da tezləşdirdi. Yol isə hələ çox idi. Əşrəf yalnız indi, axşamüstü nahaq yola çıxdığını düşündü. "Gərək stansiyada gecələyəydim. Birtəhər sahilə çatsam da, Kürü keçə bilməyəcəyəm. Gecə vaxtı kim mənim qabağıma gəmi gətirəcək?".

Cığır talaya çıxdı. Sıx yarpaqlı iri palıd ağaclarının tompal kölgələri uzanıb, qaladakı güllü-çiçəkli otların üstünə sərilmişdi. Bir cüt qırqovul cığırın ətrafında hərlənib yem axtarırdı. Onlardan bir az o yana isə meşəxoruzu oxuyurdu. Əşrəf onları hürkütməmək və bir az dincini almaq üçün dayandı. Çamadanını yerə qoyub üstündə oturdu. Köynəyinin yaxasını açıb şapkası ilə özünü yellədi.

Meşə zümzümə edirdi. İlbizlər oxuyur, harada isə bülbül cəh-cəh vururdu. Onun səsi budaqlarda əks-səda verib bütün meşəyə yayılırdı. Arabir ağacların arasında qanad şaqqıldayırdı. Qarasu tərəfdə qaz qaqqıldayırdı.

Birdən hər şey susdu. Talanın ortasında bir sürü maral göründü. Quşlar harda isə gizləndilər. Xoruzların səsi kəsildi. Ancaq bu çox çəkmədi. Hər şey yenidən öz qaydasına düşdü.

Əşrəf beləcə bəlkə də bir neçə saat oturardı. Ancaq gecə öz qanadını meşənin üstünə gərmişdi. Taladan o yana meşə daha da qalınlaşırdı. Üstəlik qarasu yolu kəsirdi. Qaranlıqda keçidi tapmaq çətin olacaqdı.

O, ayağa durdu. Yoluna davam etmək istədi. Elə bu vaxt talada hər şey bir-birinə qarışdı. Maral sürüsü hürküb kolluğa qaçdı. Quşlar heybətlə qışqırıb budaqların arasında gizləndilər. Meşənin dərinliyindən at fınxırtısı və ayaq tappıltısı gəldi. Əşrəf ehtiyatlandı. Cığırdan kənara çıxıb gizləndi. Meşədən aralanan qaraltılar talanın ortası ilə düz onun üstünə gəldi. Əşrəf ala-toranda gələnləri güclə seçdi. Onların yedəyində yəhərli bir atın da olduğunu yəqin etdikdə ürəyi sakitləşdi və gizləndiyi yerdən çıxdı. Atlar hürküb tırıldadı. Gələnlər cilovu çəkib səksəkəli halda soruşdular:

– Kimsən?

– Mənəm.

– Əşrəf, dərdin alım, sənsənmi?

Onlar atdan düşdülər. Qucaqlaşıb görüşdülər. Tapdıq Əşrəfin çamadanını götürdü. Atı qabağa çəkdi.

– Tez ol, min gedək, ağa bizi gözləyir.

Əşrəf sıçrayıb atın belinə qalxdı. Qabağa düşdü. Ancaq gələnlər ona çatıb atları yanaşı sürdülər.

– Bəs Şamxal hanı, mənim qabağıma həmişə o gələrdi?

– İşi vardı, – deyə Tapdıq könülsüz cavab verdi.

Tapdıq Əşrəfin şapkasına, balağı düz şalvarına baxdı və cilovu çəkib atı saxladı. Tərkindəki xurcunu götürüb Əşrəfə uzatdı.

– Al, paltarını dəyiş.

Əşrəf yəhərin üstündən qanrılıb Tapdığa baxdı. O isə sözünə davam etdi:

– Ağa tapşırdı ki, kəndə rus libasında gəlməsin, ayıbdı.

– Kimdən?

– Camaatdan.

Əşrəf cingiltili səslə qəhqəhə çəkib atın yalına yatdı. Kəhər cilovun boşaldığını hiss edib qulağını yapırtdı və dartınıb irəli atıldı. Əşrəf daha da aşağı əyildi. At ağacların yanından sivişib keçdikcə yəhərin qaşına sindi. Budaqlardan özünü qorudu. Tapdıqgil də onun arxasınca dördnala çapdılar. Əşrəf xırdaca şaxların belinə, baldırına toxunmasına, yarpaqların yanağına çırpılmasına fikir vermədi. Meşənin dərinliyinə getdi. Yarpaq qoxulu nəm havanı ciyərinə çəkdi. Bir az da getsə meşə seyrələcək, taladakı binələr görünəcəkdi. Əşrəfdən olsa heç yerdə dayanmaz, atın başını çəkmədən birbaş sahilə gedər, Kürün lilli və burulğanlı qollarını keçib, atı üzdürə-üzdürə o taya adlayardı.

Qarşıdan səs gəldi. Çaxmaq şaqqıldadı. Əşrəf özünə gələnə qədər yolu kəsdilər.

– Dayan!

O, atın cilovunu dartdı. Kəhər özünü saxlaya bilməyib büdrədi. Sonra dal ayaqları üstə qalxıb fınxırdı. Əşrəf yəhərin qaşına sindi. Tapdıqgil ağacların dalına girdilər. Bir xeyli beləcə nəfəslərini dərmədən dayandılar. Qaraltılar irəli çıxdı. Əşrəf onların atlı kazak olduğunu gördükdə təəccübləndi və dönüb yoldaşlarına baxdı.

Kazaklar onlarla üzbəüz dayandılar:

– Kimsiniz?

– Yol adamıyıq.

– Hara gedirsiniz?

– Evimizə.

Kazakın biri tüfəngini çiyninə keçirdi və atını mahmızlayıb lap Əşrəfə yaxınlaşdı. Qaranlıqda gözünü onun üzünə zillədi:

– Sən kimsən?

– Görmürsən, adamam.

– Bilirəm adamsan. Studentsən?

– Bəli.

– Bəs buralarda nə gəzirsən?

– Dedim ki, evimizə gedirəm.

Kazak atın başını qanırıb aralandı və tüfəngi əlinə aldı:

– Düşün qabağa.
– Nə üçün?
– Siz dustaqsınız!
– Nədən ötəri?
– Niyə qoruğa giribsiniz?
– Qoruq nədir?
Bu dəfə kazak daha qəzəblə qışqırdı. Onun yoğun və xırıltılı səsi meşəyə yayıldı:
– Özünüzü bilməməzliyə vurmayın. Düşün qabağa!
Bayaqdan söhbətə qulaq asan və heç nə anlamayan Tapdıq atını mahmızlayıb Əşrəflə bərabərləşdi:
– Əşrəf, bu urus bizdən nə istəyir?
– Deyir dustaqsınız, qoruğa giribsiniz.
Tapdıq da, Əşrəfin əmisi oğlu da təəccüblə çiyinlərini çəkdilər. Onlar indiyə qədər bu meşədə belə şey görməmişdilər. Qoruq sözünü də birinci dəfə eşidirdilər. Əşrəf özü də mat qalmışdı:
– Məni başa salın, görüm, bu qoruq kimindir?
– Padşahın.
– Haçandan?
– Onun sənə dəxli yoxdur.
– Necə dəxli yoxdur, bura dədə-babadan bizim kənd camaatınındır.
Kazak artıq dözmədi. Yəhərin üstündə dikəlib Əşrəfin üstünə bağırdı:
– Ey, tatar balası, çox danışma!
– Bu özbaşınalıqdar. Böyüyünüz kimdir?
– Böyüyümüz özü əmr edib ki, kim qoruğa girsə, güllə ilə vurun. Hələ sizin bəxtiniz gətirib ki, diri qalıbsınız. Düşün qabağa!
Əşrəf heç nə demədi. Atını mahmızlayıb qabağa keçdi. Onu qarşılamağa gələnlər də dinməzcə cilovu buraxdılar və Əşrəfin dalınca irəlilədilər. Kazaklar onları arakəsməyə aldılar.
Cığır talanın qurtaracağında haçalandı. Əşrəf cilovu çəkib dayandı. Qanrılıb geri, onlardan bir az aralı gələn kazaklara baxdı:
– Bizim yolumuz bu yanadır.
Kazak atını səyirdib qabağa gəldi və daha da qəzəbləndi:
– Xeyr, bu yanadır.
O, əlini uzadıb cilovdan yapışdı. Qaranlıqda gözünü Əşrəfə bərəltdi:
– Atdan düş!
Tapdıq artıq dözə bilmədi. Atı ehmalca mahmızlayıb cığırdan çıxdı. Əlini yəhərin tərkindəki irəşməyə uzatdı. Arxa tərəfdən kazaka

yaxınlaşdı və gözlənilmədən irəşməni hərləyib atdı. İrəşmə göydə ilan kimi qıvrılıb kazakın boynuna dolandı. O, əl-ayaq atana qədər Tapdıq sürüyüb kazakı atdan saldı. O biri kazak çaxmağı hərlədi. Ancaq Əşrəfin əmisi oğlu ona aman vermədi. Xəncərin siyirib şığıdı. Kazakın əlindəki tüfəngin qundağı ortadan iki bölünüb yerə düşdü. Əşrəf quş kimi atılıb atın tərkinə mindi və daldan kazakı qucaqlayıb qollarını tutdu. Tapdığın atdan yıxdığı kazak bir xeyli kəməndlə bərabər süründükdən sonra ayağa qalxdı. Qılıncını siyirib, arxadan Əşrəfə hücum etdi. At kişnədi və ilan sancmış kimi kənara sıçradı. Yenidən əlbəyaxa döyüş başladı. Torpaq eşim-eşim oldu. Otlar, çiçəklər əzildi. Atlar kişnəyib talaya qaçdı. Əşrəfgil yarımsaatlıq vuruşmadan sonra kazakları üstələdilər. Onların tüfənglərini, qılınclarını alıb qollarını çatdılar, palıd ağacına sarıdılar.

Tapdıq çəmənlikdəki atları cilovlayıb yaxına gətirdi. Əşrəf atının yəhərini düzəltdi. Dal tərəfə keçib kəhərin buduna baxdı. Qılıncın yaraladığı yerdən qan axırdı. Onun ata yazığı gəldi və qəzəblə kazaklara yaxınlaşdı. Hirsindən dişini-dişinə sıxdı:

– Axı, nə istəyirsiniz, niyə qoymursunuz camaat rahat dolansın?

Kazak dartındı. Qolunun kəndirini açmağa çalışdı və xırıltılı səslə Əşrəfi söydü:

– Bu sizə baha tamam olacaq, quldurlar.

– Ağzını təmiz saxla, axmaq.

Əşrəfin əmisi oğlu rusca deyilənləri başa düşməsə də anladı ki, artıq-əskik danışırlar. Tüfəngin lüləsinə güllə verdi və Əşrəfi geri itələdi:

– Ə, belə dur, qoy səsini kəsim.

– İşin olmasın, – deyə Əşrəf dabanı üstə fırlandı və tüfəngin lüləsini əli ilə kənara itələdi. – Bunlarda nə təqsir var?

– Bə kimdədir?

– Onları buraya göndərəndə.

Tapdıq kazakların da atını tutub gətirdi. Tüfəngləri götürüb çalın-çarpaz çiyninə keçirdi. Qılıncları belinə bağladı. Əşrəfin çamadanını atın tərkinə sarıdı və sıçrayıb yəhərə qalxdı:

– Tez olun, səs-səmirə tökülüb gəlməmiş gedək.

Əşrəf ayağını üzəngiyə qoyub atına mindi. Cığıra düşməzdən əvvəl dönüb geri baxdı. Tapdığın yedəyindəki atları görüb təəccübləndi:

– Bu nədir?

– Əlimizə müftə at düşüb, meşədə ha qoymayacağam, aparıb ilxıya qatarıq.

– Burax.
– Niyə?
– Belə işi ancaq qaçaq-quldur görər.
– Ağa, sən belə işlərə qarışma, atını sür, gedək.
– Dedim, burax.

Tapdıq çiynini çəkib yoldaşına baxdı. Onlar başa düşdülər ki, Əşrəfi sözündən döndərmək mümkün deyil.

– Nə deyir, sözünə bax, burax getsin.

Tapdıq əlacsız qalıb atları buraxdı və onlar talada gözdən itincəyə qədər dallarınca baxdı.

– Heyf, yəhərləri lap təzə idi. – O, tüfəngləri çıxardıb qucağına aldı və üzünü Əşrəfə tutdu: – Bə bunları neyləyim?

Əşrəf tüfəngləri də, qılıncları da Tapdıqdan aldı. Atını geri sürüb palıd ağacının bərabərində otluğa atdı. Əmisi oğlu bu dəfə dözə bilmədi. Atdan düşüb silahları götürmək istədi:

– Ə, nə qayırırsan, adam da tüfəngi əldən verərmi?

– İşin olmasın. Yazıqdırlar. Tüfənglərini aparsaq, onları dinməz-söyləməz güllələyərlər.

– Cəhənnəmə güllələsinlər.

– Adam insaflı olar.

Əşrəfin əmisi oğlu narazılıqla başını buladı:

– Deyəsən, oxuduqca ağlın azalır.

Talanın o tərəfindən, meşənin qalınlığından səs gəldi. Bir dəstə qaraltı qoruğa çıxdı. Bayaqdan sakitcə dayanan və Əşrəfgilin getməsini gözləyən kazaklar da bu səsi eşitdilər. Onlar ikisi də birdən qışqırdı:

– Köməyə gəlin, quldurlar bizi qırır.

Tapdıq dərhal atını mahmızladı.

– Ağa, tez ol, aradan çıxaq.

Əşrəf cilovu buraxdı. Atlar dördnala çapıb meşədə görünməz oldu.

## 2

Meşənin dərinliyində, binələrdən xeyli uzaqda dalbadal güllə atıldı. Meşəyə boğuq bir gurultu yayıldı. Dəyələrdən bir az aralı, talanın ortasındakı çəmənlikdə hörüklənmiş Qəmər qulaqlarını şəklədi. Yalını pırpızlandırıb bərkdən kişnədi və dal ayağı üstə qalxıb çəçiyini havada oynatdı. Zərblə dartınıb irəşməni qırdı. Dördnala çaparaq dəyələrə

tərəf qaçdı. Binədəki arvad-uşaq çığırışıb kənara dağıldı. Cahandar ağa alaçıqdan hövlnak çıxıb atın dalınca yüyürdü. Yoğun və zəhmli səslə bir-iki dəfə "hey-hey, Qəmər!" – deyə atı səslədi. Qəmər nə qədər çılğınlaşmış olsa da, sahibinin səsini eşidən kimi yerişini yavaşıtdı. Dəyələrin ətrafında bir-iki dəfə dövrə vurub dayandı. Sakitləşmək üçün qabaq ayağı ilə yeri eşdi. Cahandar ağa ona yaxınlaşanda isə təlaşla ətrafa boylanıb astadan oxrandı. Kişi irəşməni yığdı, atın yalını sığalladı və yedəkləyib alaçığın yanına gətirdi.

Gün yaxmışdı. Meşənin arxasında gizlənən günəşin maili şüaları yarpaqların arasına soxulub ətrafı işıqlandırmağa çalışırdı. Ancaq baş-başa vermiş palıdlar, iri fıstıq və vələs ağaclarının qalın yarpaqları işığın qabağını kəsib yerə qatı kölgə salırdı. Meşəyə birdən-birə qaranlıq çökürdü.

Cahandar ağa atı alaçığın yanında təzədən örüklədi. Dəyələrin bərabərindəki iri palıd ağacının altına gəldi. Kürəyini ağaca söykədi. Gözünü meşənin dərinliyinə gedən cığıra zillədi. "Görəsən uşaqlara bir şey olmadı ki?" – deyə düşündü. Qutusunu çıxardıb barmaqları titrəyə-titrəyə papiros eşdi.

Mallar örüşdən qayıtmışdı. Arvadlar sərnic götürüb inəkləri sağırdılar. Mələk də onların içində idi. O, başını qızıl bir inəyin böyrünə qısıb buzovu əmizdirir, dodaqaltı eydirmə deyirdi:

Lay-lay çallam həmişə,
Karvan gedib yemişə.
Axurunda gül bitsin,
Otlağında bənövşə.

İnəklər balasını yalayıb astadan fısqırır, buzovlar dartınıb anasını əmməyə çalışırdı. Sərniclər köpüklənib dolduqca ətrafa ahəngdar bir qıjıltı yayılırdı. Ancaq Cahandar ağa bunların heç birini görmürdü. O, təlaşla papirosunu sümürür və gözünü yoldan çəkmirdi.

Naxırın içində fırlanan maral boynundakı qumrovu zınqıldada-zınqıldada Cahandar ağaya yaxınlaşdı. Kişinin əlini, paltarını iylədi, sonra da iri buynuzunu oynadaraq, nəm burnunu onun üzünə yapışdırdı. Cahandar ağa maralın boynunu qucaqladı. Maral qəşəng gözlərini sahibinin üzünə zillədi. Kişi bu iri, qumral, göyçək gözlərin dərinliyində sanki bir məzəmmət gördü. Elə bil bu dilsiz, lakin mehriban

heyvan ondan gileylənir, sahibinin laqeydliyindən, ona qarşı əvvəlki nəvazişini əsirgədiyindən şikayətlənirdi. Maralın təzə ot qoxusu verən nəfəsi onun nəfəsinə qarışdı. Cahandar ağanın bədənindən xəfif bir gizilti keçdi. Kişi daha da xoşhallanaraq maralın gözündən öpdü. Maral da bunu gözləyirmiş kimi sahibinin sinəsinə qısılıb dayandı. Cahandar ağa onun buynuzunun dibini qaşıdı...

İtlər qarasuyun o tayındakı qamışlığa doğru cumdular. Maral diksinib qulaqlarını şəklədi. Cahandar ağa tüfəngini çiynindən alıb çaxmağı hərlədi. Bir xeyli, səksəkəli halda ətrafı dinlədi.

Qaraltılar talanın aşağı tərəfindəki körpüdən keçib dəyələrə doğru irəlilədilər. Cahandar ağa əvvəlcə Tapdığın, sonra da Əşrəfin səsini eşitdi. Köynəyinin yaxasını açıb dərindən nəfəs aldı. Tüfəngin dabanını endirdi. Papirosunu axırıncı dəfə sümürüb yerə atdı. Oğlunun qabağına getmək əvəzinə, durub alaçığa doğru addımladı. Qapı yerindən asılmış pərdəni aralayıb içəri keçdi. Tüfəngi çadırın divarına söykədi. Döşəkçənin üstünə uzanıb mütəkkəyə dirsəkləndi.

O buradan hər şeyi aydın görə bilməsə də, səs-küydən və ocaqların ətrafında dolaşan kölgələrin hərəkətindən həyətdə nələr baş verdiyini təsəvvüründə canlandırırdı. O hiss etdi ki, Əşrəfi qarşılamağa çıxanlar atın başını tutdular. Oğlan yəhərdən enib ətrafdakılarla bir-bir görüşdü. Arada deyəsən zarafatlaşanlar da oldu. Hamı güldü. Sonra Əşrəfi saxladılar. Tapdıq iri bir qoçun buynuzundan yapışıb darta-darta gətirdi və düz Əşrəfin bərabərində dayandı. "Bir az səbr elə", – deyə onu tərpənməyə qoymadı. Əşrəf mane olmaq istədisə də, Tapdıq qulaq asmayıb qoçu düz onun ayağının altına uzatdı. "Mənə tapşırıblar, gərək kəsəm. Yoxsa dərimə saman təpərlər". Əşrəf el adətinə tabe oldu. Ayağının altında kəsilən qurbana xeyli baxandan sonra kənara çəkildi. Yenə onun başına toplandılar. Cahandar ağaya elə gəldi ki, aradan keçən dəqiqələrin hər biri il qədər uzun çəkdi. Kişi darıxdı. Hətta ayağa durmaq, Əşrəfi söhbətə tutub ləngidənlərə acıqlanmaq və oğlunu yanına çağırmaq istədi. Ancaq yerindən tərpənmədi.

Mələk içəri girdi. Əlindəki samovarı alaçığın qabaq tərəfindəki küncə qoydu. Çırağın fitilini qaldırdı. Samovar dığıldayıb zümzüməyə başladı. Mələk çayniki dəmkeşin üstünə qoyduqdan sonra qara, güllü podnosdakı stəkanları irəli çəkdi. Gözünü ərinin üzünə zillədi:

– İndi nə deyirsən, mən onun gözünə görünümmü?

Cahandar ağanın fikri həyətdə olduğundan, bir az gec dilləndi:

– Hə, özün qulluq elə.

Mələk gəldiyi kimi də astaca çıxıb qonşu dəyəyə getdi.

Həyətin ortasındakı səs-küy azaldı. ayaq tappıltıları çadıra yaxınlaşdı. Tapdığın səsi eşidildi:

– Ağa, buradasanmı?

– Gəlin.

Əşrəf atasının səsini eşidən kimi qabağa keçdi. Alaçığın pərdəsini aralayıb içəri girdi. Bir xeyli sakitcə dayanıb, döşəkcənin üstündə bardaş qurub oturan Cahandar ağaya baxdı. Bütün yol boyu evə çatan kimi atasının boynunu qucaqlayıb, üz-gözündən öpəcəyini qət etmiş olsa da, indi kişiyə yaxınlaşa bilmədi. O da yerindən tərpənmədi. Oğlunu lal sükutla başdan-ayağa süzdü.

Əşrəf məktəbli libasında idi. Ayağında qara çəkmə var idi. Balağı açıq uzun şalvar geymişdi. Belinə üstündə yazı olan iri toqqalı kəmər bağlamışdı. Başında isə günlüyü parıldayan mahud şapka var idi. Uşaq lap dəyişmişdi. Cahandar ağa oğlunu həmişə vəznəli çuxada görmüşdü. Əşrəf göy buxara papaq geyərdi. Belindəki sallamalı kəmərindən xəncər asardı. İndi isə o, uzaq yerdən gəlmiş yad bir adama oxşayırdı. Çırağın solğun işığında aydın görünməsə də, Əşrəf atasının birdənbirə tutulduğunu hiss etdi. O gözləyirdi ki, atası ayağa duracaq, ya da onu yanına çağırıb üz-gözündən öpəcək, gülə-gülə salamlaşıb hal-əhval tutacaqdı. Ancaq bunların heç biri olmadı. Cahandar ağanın hirsli səsi eşidildi:

– Get, paltarını dəyiş.

Əşrəf seminariyada oxuduğu müddətdə xeyli sərbəstliyə alışmışdı. O özünü artıq böyük adam hesab edirdi. Amma indi atasının səsini eşidən kimi uşağa döndüyünü hiss etdi. Ona etiraz etmək, məktəb libasını soyunmaq istəmədiyini söyləmək ağlına belə gəlmədi. Salamı dilində qaldı. Sakitcə alaçıqdan çıxdı. Onu kölgə kimi izləyən Tapdıqla birlikdə qonşu dəyəyə keçdi. Mələk paltarların içəridə, sandığın üstündə olduğunu işarə ilə başa salıb uzaqlaşdı.

Əşrəf könülsüzcəsinə libasını dəyişdi, yenidən alaçığa, atasının yanına getmək istədi. Ancaq Cahandar ağanın səsi onu saxladı:

– Ay uşaq, onun əlinə su tökün, yoldan gəlib.

Tapdıq əlində aftafa, qolunun üstündə dəsmal, hazır oldu.

Əşrəf tərtəmiz yuyunub, üst-başını səliqəyə saldıqdan sonra alaçığa qayıtdı. Kişi bu dəfə onu çağırıb yanında, döşəkcənin üstündə oturt-

du. Mələk səssizcə içəri girdi. İki stəkan çay süzüb birini ərinin, o birin Əşrəfin qabağına qoydu. Yaşmağını yuxarı qaldırıb küncdə əyləşdi. Əşrəf onu gözaltı süzdü və başa düşdü ki, təzə adamdır. "Yəqin qulluqçudur" – deyə xəyalından keçirdi və heç nə soruşmadı. Cahandar ağa stəkanı qabağına çəkdi və oğlunun üzünə baxmadan dilləndi:

– Yolda nə çox ləngidiniz?

– Qabağımızı kəsmişdilər.

– Kim?

– Kazaklar.

Kişi yerindəcə qurcalandı və qaşlarını çatıb təəccüblə oğlunun üzünə baxdı:

– Kazakların bizim meşədə nə işi var?

– Nə bilim? – deyə Əşrəf çiynini çəkdi. – Deyirlər buralar daha qoruq olacaq. Padşahın adamları ova çıxacaqlar.

Araya sükut çökdü. Cahandar ağa qənddandan iri bir qənd götürüb ağzına atdı. Hortahortla çayını içdi.

Bayırda ocaq çatdılar. Qovrulan ət iyi meşəyə yayıldı. Cahandar ağa üzünü Mələyə tutdu:

– Get de, tez olsunlar, uşaq acdır.

Mələk alaçıqdan çıxmazdan əvvəl ərinə bir stəkan da çay süzdü. Ata ilə oğul tək qaldı. Yalnız bu zaman Əşrəf ürəklənib atasının üzünə baxdı:

– Bəs anam hanı?

– O tayda, kənddədir.

– Şamxal da?

– Hamısı. Biz də səhər köçürük. Elə səni gözləyirdik.

– Bibim nə təhərdir?

Cahandar ağanın çayı boğazında qaldı. Kişi çeçəyib stəkanı yerə qoydu. Cibindən dəsmal çıxardıb ağız-burnunu sildi. Sonra yenə səliqə ilə qatlayıb arxalığının qoynunda gizlətdi. Bundan sonra soyuqqanlıqla dilləndi:

– Pis deyil.

Əşrəf hiss etdi ki, atası nədənsə çox danışmaq istəmir. Həm də onun öskürməsi, stəkanı hirslə geri itələməsi göstərirdi ki, bu barədə danışmaq lazım deyil.

Əşrəf stəkanı qabağına çəkib qurtum-qurtum çay içməyə başladı. Cahandar ağa susdu. O, oğluna nə yalan danışa bilir, nə də bu saat hər

şeyi ona söyləməyi münasib hesab edirdi. Kişi qorxurdu. O çox gözəl bilirdi ki, Əşrəf həqiqəti öyrənəndən sonra ağız ləzzəti ilə bir tikə çörək yemək, heç olmazsa beş-altı aydan bəri üzünü görmədiyi oğlu ilə şirin-şirin danışmaq belə çətin olacaqdı. Ona görə susmağı və gecəni sakit keçirməyi qərara almışdı. Cahandar ağa Əşrəfin bu işlərə necə münasibət bəsləyəcəyini bilməsə də, hər halda xoşagəlməz, könül bulandıran söhbət eşitmək istəmirdi. O hamıya tapşırmışdı ki, Əşrəfə heç nəyi xəbər verməsinlər. O istəyirdi ki, Əşrəf kəndə gedəndə özü hər şeyi öyrənsin. Kişi bu oğlunu da küsdürəcəyindən ehtiyat etdiyi üçün susmağı, heç olmasa bircə gecə mehriban yatmağı arzu edirdi...

Çay-çörəkdən sonra Mələk ata ilə oğula alaçıqda yanaşı yer saldı. Əşrəf atasına sərbəstlik vermək və onun hüzurunda soyunmamaq üçün eşiyə çıxdı. Ocaqlar sönmüşdü. Dəyələrin çoxu sökülmüş, farmaşlar, çətənlər, qalın keçələr, qab-qacaqlar arabalara doldurulmuşdu. İşini qurtaranlar şirin yuxuya getsələr də, hələ ora-bura qaçanlar, yaddan bir şey çıxartmamaq üçün yurd yerini dönə-dönə yoxlayanlar da var idi. Xalxalda kövşəyən malların gəyirtisi eşidilir, arabir öküzlər öskürüşürdü. Bir az bundan əvvəl meşəni bürüyən zil qaranlıq uzaqdakı qollu-budaqlı nəhəng ağacların yarpaqları arasından boylanan və hər dəqiqə yüksəyə qalxan narıncı dəyirmi ayın parıldadığını görüb geri çəkilmişdi. Meşəyə solğun bir ziya səpələnmişdi. Taladakı təkəm-seyrək ağacların çəmənliyə sərilən kölgələri aydın görünürdü. Yalnız qalın kolların sıx yarpaqları əvvəlki kimi bir-birinə qısılaraq ay işığının qabağını kəsir, qatı kölgələri daha da tündləşdirməyə çalışırdı.

Lap yaxında anadil ötdü. Əşrəf bu gözəgörünməz quşların səsini eşidən tək alaçığın qabağındakı palıdın altına getdi. Ağacın gövdəsinə söykənib susdu. Meşə sehrli bir qaranlıq içində mürgüləsə də, min bir pıçıltı ilə danışırdı. Çəyirtkələr pırıltı ilə otdan-ota atlanır, arabir meşəxoruzları banlayır, harda isə qanad şaqqıldayır, qarasuyun yaxası boyu uzanan qamışlıqlarda qurbağalar quruldayır, çaqqallar vaqqıldayırdı. Bu səslər kəsik-kəsik, fasilələrlə eşidilirdi. Bax həmin bu sükut anlarında sanki hər şeyin susmasını gözləyən anadillərin zil və kədərli səsi eşidilirdi. Əşrəf lap uşaqlıqdan bu quşların qəmli oxumağını dinləyəndə mütəəssir olurdu. O indi hər şeyi unudaraq meşəyə qulaq asdı. O bilirdi ki, ağacların budaqları arasından başıaşağı sallanan bu quşlar yalnız gecələr oxuyurdular. Deyilənə görə onlar vaxtı ilə insan olmuşlar. İndi bir-birini səsləyən anadillər peyğəmbərin danasını otarırlar-

mış. Bir gün dana itir, onlar nə qədər axtarırlarsa, heyvanı tapa bilmirlər. Meşənin qaranlığında, çənli-çiskinli havada hərəsi bir yana üz tutur, biri "tapdınmı?" – deyə soruşur, o biri isə "yox" – deyə cavab verir. Elə bu cür, bir-birilərini səsləyə-səsləyə, qorxularından dönüb quş olurlar.

Əşrəf deyilənlərin doğru olub-olmadığını yoxlayırmış kimi sakitcə qulaq asdı. "Tapdınmı?", "Yox"... "Tapdınmı?", "Yox", Necə aydın idi!

Ayın işığı yarpaqların kölgəsini çalın-çarpaz doğrayıb Əşrəfin çiyninə düşdü. Hardasa qanad şaqqıldadı. Lap yaxında bayquş uladı. Ağacların dövrəsində yarasalar uçuşdu. Əşrəf diksindi. Asta addımlarla alaçığa yaxınlaşdı. Cahandar ağa yorğanı sinəsinə çəkib yerinə uzanmışdı. Tüfəngi döşəyin yanına qoymuşdu. Onun iri əzələli tük basmış geniş sinəsi açıq idi.

– Tüfəng atan siz idinizmi?

– Yox, kazaklar idi. Dalımızca düşmüşdülər.

– Haraya gəldiyinizi gördülərmi?

– Yox. İzi itirdik.

Kişi xeyli dinmədi. Gözünü alaçığın tavanına zilləyib dayandı. Elə bil xəyalında nəyi isə ölçüb-biçirdi:

– Yaxşı, yıxıl yat.

Əşrəf çırağın fitilini aşağı çəkdi. Şüşənin yuxarısından üfürüb işığı söndürdü. Yorğanın altına girib orada paltarını soyundu. Təzə ipək yorğan-döşək bir müddət xışıldadı. Meşənin nəmli, soyuq havasından buza dönmüş yataq ona doğma və xoş göründü. Bu sərinlik onun yorğun əzalarını dincəltdi. Əşrəf yerin içində yenə bir müddət anadillərə qulaq asdı və özü də hiss etmədən yuxuya gedib mışıldadı...

Cahandar ağa oğlunun yatdığını yəqin etdikdən sonra yerin içində dirsəkləndi. Həyətdəki iri palıd ağacının kölgəsi alaçığın üstünə sərilmişdi. Yarpaqlar xışıldadıqca bu kölgə xal-xal olur, ayın işığı tala-tala yerə sərilir və çadırın açıq qapısından içəri soxulub yorğan-döşəyin üstündə oynayırdı. Həmin bu işıq bəzən Əşrəfin üzünü işıqlandırır, bəzən də geri çəkilib çadırın divarına yapışırdı.

Cahandar ağa oğluna doğru əyildi. Bir xeyli heyran-heyran öz balasına tamaşa elədi. Əşrəfin ağ bənizi daha da ağarmışdı. Qaşları incəlmişdi. Dodaqları, çənəsi nazilmişdi. Kişi qüssələndi. O öz övladını qollu-budaqlı iri palıd ağacı kimi möhkəm görmək istəyirdi. O istəyirdi ki, oğlunun əlləri cod, baldırları möhkəm, kürəyi enli, sinəsi və qolları tunc kimi olsun. Duranda palıd kimi əzəmətli, yıxılanda da palıd kimi

nəriltili olsun. Ancaq, deyəsən, Əşrəf qız kimi zərifləşmişdi. Bəlkə oxumaq onu sıxırdı? Bəlkə onu daha məktəbə getməyə qoymasın?

Kişi bu cür düşüncələrlə xeyli oğlunun üzünə baxdı. Birdən ehtiyatla aşağı əyildi. Əşrəfin üzündən və alnından ehmalca öpdü. Onun heç nə hiss etmədiyini, yenə əvvəlki kimi mışıltı ilə yatdığını yəqin etdikdən sonra yerinə uzanıb yorğanı sinəsinə çəkdi. Gözünü ağacların başı üstündən o yana, səmadakı parlaq ulduzlara zillədi. Anadillər yenə həzin-həzin ötürdülər: "Tapdınmı?", "Yox"...

**3**

Tərtəmiz süpürülüb təmizlənmiş otaq başdan-başa gəbə ilə döşənmişdi. Pəncərənin pərdəsi asılmış, otuzluq çırağın fitili azacıq qaldırılmışdı. Yuxarı başda iki döşəkcə və zər bafta ilə işlənmiş qızıl qotazlı məxmər mütəkkələr qoyulmuşdu. Molla Sadıq çiynində əba, otaqda gəzinə-gəzinə təsbehinin iri, kəhrəba muncuqlarını şaqqıldadırdı. Ayağında təptəzə naxışlı corab var idi. Yumşaq gəbələrin üstündə səssizcə gəzdikdə elə bil bu rahatlıqdan ləzzət alırdı. Əslində, içə çox narahat idi.

Müridlərin axırıncı yığıncağı dağıldıqdan sonra o, iki gün evdən bayıra çıxa bilmədi. Türbədən gələn qonağı elə gecə ikən, bir dəstə atlı ilə yola saldı, qapıya tüfəngli keşikçilər qoydu. O, Cahandar ağanın bir də qayıdacağını, onun evinə basqın edəcəyini, çal-çəpərinə od vurub, evi gülləyə basacağını gözlədi. Əl altından qohumlarına və sadiq müridlərinə xəbər göndərdi, ehtiyatlı olmalarını tapşırdı. Ancaq ertəsi günü arvadlar ona xəbər gətirdilər ki, Şahnigar özünü asmışdır. Molla Sadığın qaşı çatıldı, xeyli fikrə getdi.

O günü camaatın başı dəfnə qarışdı. Hamı Cahandar ağanın qapısına toplandı. Ağlaşmaya gedən qonşu arvadları xəbər gətirdilər ki, Cahandar ağa bacısının cənazəsini özü götürdü, qəbrə ilk torpağı özü tökdü, kişilərdən biri qəbrin üstündə Quran oxumağa başlayanda kənara çəkildi, namaz qılanlara qoşulmadı. Nə cənazə qaldırılanda, nə qəbristanlıqda, nə də evdə, ehsan yerində bir kəlmə danışmadı. Başsağlığı verənlərə belə heç nə demədi.

Molla Sadıq iki gündən sonra öz arvadını və gəlinlərini yas yerinə göndərdi. "Eldən, obadan geri qalmaq ayıbdır, – dedi, gedin, hamının

ölüsü-dirisi olacaq". Onun məqsədi bu yolla ağız aramaq, Cahandar ağanın evində nələr danışıldığını öyrənmək idi. O istəyirdi ki, bu yolla özünə olan münasibəti aydınlaşdırsın.

Arvadlar yas yerindən razı qayıtdılar. Onlara ədəblə hörmət etdiklərini, ağlaşmadan sonra çay-çörək verib yola saldıqlarını söylədilər. Nəhayət, üçüncü gün Molla Sadığın özü cəsarətə gəlib, kəndin bir neçə ağsaqqalı ilə bərabər Cahandar ağanın evinə getdi. Əgər yas yerinə dəyməsə, özünün günahkar olduğunu boynuna almış olar, bəlkə də narazılıqla qurtarıb gedə biləcək bir incikliyi düşmənçiliyə çevirə bilərdi. Bəlkə Cahandar ağa onu görən kimi tüfəngi çəkdi, bəs onda nə olsun? Ara yerdə güdaza getsin? Yox, belə şey ola bilməz. Elin adəti var, qanlı düşmən qanlı düşmənin qapısına gələndə ona əl qaldırmazlar.

Molla Sadıq zənnində yanılmadı. Yas yerində ona heç nə demədilər. Görünür, ölüm adamları yumşaltmışdı. Qəlblərdəki kin, qəzəb bir az soyumuşdu. Bir də Molla Sadıq özü onun yanına gəlmişdi.

Yas gecəsi sakit keçdi. Hətta Molla Sadıqdan xahiş etdilər, o Quran oxudu. Mərhuməyə behişt arzuladı, "Allah rəhmət eləsin"

– dedi. Cahandar ağa bir kəlmə dinib-danışmadı.

Hüzr yerinə gələnlər ev sahibinə başsağlığı verib dağılanda Molla Sadıqla Cahandar ağanın baxışları ani olaraq bir-birinə sancıldı və bu ani baxış ona hər şeyi aydınlaşdırdı. O başa düşdü ki, Şahnigarın ölümündə Cahandar ağanın əli var, o, taqsırkardır, ona görə də bu qədər sükut edir. Kin, qəzəb, dərd, ələm, peşmançılıq onu əzir, ağırlaşıb qurğuşun yükü kimi qəddini əyir. Cahandar ağa canını dişinə tutub, özünü saxlayır, daxildən püskürüb çıxmaq istəyən, vulkan kimi alovlanmağa hazır olan qəzəbini hələlik boğur. Elə bil çiynini verib, uçub-tökülməkdə olan bir qayanı saxlayır. Yükün ağırlığından onun gözlərinə qan sağılır. Xırdaca damarlar az qalır ki, partlasın. Molla Sadıq dərk etdi ki, bu qəzəb bir gün püskürəcək, özü də xata ondan uzaq olmayacaq.

Evə gələndən sonra yata bilmədi. Yerin içində xeyli qovruldu. Onu başqa bir şey də narahat edirdi. O qorxurdu ki, bu hadisələrdən sonra camaat arasında hörmətdən düşər, müridlərin sayı azalar. Bəs onda türbədəkilərə nə cavab verərdi? Göytəpəlilər deməzdilərmi ki, ay Molla Sadıq, bəs hanı sənin qüdrətin? Bəs hanı türbənin qəzəbi? Bir yandan da bu rus Əhməd uşaqları tovlayıb məscidə gəlməyə qoymurdu. Onları xəlvəti yanına aparır, yazı-pozu öyrədir, "kafir" kitabları oxutdururdu. O saqqallı rus kəndə gəlib gedəndən sonra uşaqlar

adamın sözünə heç baxmaq istəmirdilər. Əhməd heç, onu kənddən qovmaq asan idi, bəs Cahandar ağa? Bəlkə divan-dərəyə xəbər versin ki, Cahandar ağa doğma bacısını öldürüb, qan töküb, hə, onda necə olar? Atlı kazaklar gəlib onu tutmazdımı, əl-qolunu bağlayıb birbaş Sibirə göndərməzdilərmi? Onun izi-tozu biryolluq itməzdimi? Mən də rahat nəfəs almazdımmı? Bəs sonra?

Molla Sadığı fikir götürdü. Bu işi sübut etməyin çox çətin olduğunu düşündü. Şahidin yox, dəlilin yox, nə edə bilərdin? Ölünü təzədən qəbirdən çıxarmayacaqdılar ki? Bir də, din var, şəriət var, camaat buna razı olarmı? Rusa nə var, dedin, o saat qəbri eşib tökəcəklər. Amma camaat buna yol verməz. Lap qılıncdan keçirsələr də onları qəbristanlığın həndəvərinə hərlənməyə qoymazdılar. Əgər bu iş baş tutsa belə, sonrası pis olardı. Yerlər qulaqlıdır, tez-gec xəbər tutarlar və mənim daşımı daş üstündə qoymazlar.

Molla Sadıq bu cür ağır düşüncələrlə yumşaq gəbənin üstündə gəzinir, təsbehinin iri, kəhrəba muncuqlarını şaqqıldadırdı.

Qaranlıq lap qarışmışdı. Əl-ayaq yığışılmışdı. Hamı mal-qarasını rahatlamış, itə yal verib zəncirdən buraxmışdı. Daxmaların çoxunda işıq sönmüşdü. Kənd yatmağa hazırlaşırdı.

Molla Sadığın doqqazında bir atlı dayandı. Xeyli ətrafına boylandı, yol ilə gedənlərə saymazyana baxdı və astadan həyətdəkiləri səslədi:

– Ay ev yiyəsi!

İtlər atlının üstünə cumdular. Qapıda hərlənən nökərlərdən biri doqqaza çıxdı və az qala atlını dartıb yerə salan itləri qovdu. Bir xeyli təəccüblə, başlıqla üz-gözünü bürümüş adama baxdı. Atlı yəhərin qaşındakı tüfəngin qundağını yapıncının altında gizlətmişdi. Onun gözlərindən başqa heç yeri görünmürdü.

– A bala, molla evdədirmi?

– Evdədir.

– Deynən zəhmət olmasa, doqqaza çıxsın.

– Sən kimsən?

– Allah qonağı. Deynən türbədən gəlirəm, axşama düşmüşəm.

Nökər yenə bir xeyli təəccüblə onun üzünə baxdı. Sonra ehtiyat edə-edə geri qayıtdı. Atlı gördü ki, nökər nədənsə qorxur, ona inanmır. Bu qorxu ona da sirayət etdi. Atı azacıq tərpədib evin böyrünə qısıldı. Şübhə ilə yan-yörəsinə boylandı. Əgər itlər onun qabağını kəsməsəydi, heç nəyə baxmadan, təklif gözləmədən atını birbaş həyətə sürərdi.

Nökər xeyli ləng gəldi. Eyvanda tüfəngli bir adam göründü:

– Molla deyir, Allah qonağıdırsa, atdan düşüb, evə gəlsin.

Atlı dərhal yəhərdən yerə endi. Cilovu nökərə verib evə doğru addımladı. İçəri keçməzdən əvvəl yolunu kəsən itlərə baxdı.

– Məni tutmazlar ki?

– Yox, qorxmayın, adam yanında dəyməzlər.

Qonaq yüngül addımlarla eyvana qalxdı. Nökərin göstərdiyi qapını açıb içəri keçdi. Hər yerin gəbə ilə döşəndiyini görüb ayaqqabılarını soyundu, yapıncısını çiynindən alıb küncə qoydu. Başlığını sürüşdürüb boynunun dalına saldı. Molla Sadıq qonağın sifətinə nə qədər diqqətlə baxsa da, tanıya bilmədi. Onun belə sərbəst hərəkətindən təəccüblənsə də, heç nə demədi. Evin ortasında dayanıb gözlədi. Qonaq tüfəngini də küncə qoyduqdan sonra iki addım qabağa gəldi:

– Xoş gördük, molla, – dedi və iki əli ilə onunla görüşdü.

Molla Sadıq evin yuxarı başındakı döşəkcəni göstərdi:

– Əyləş, Allah qonağı, dincini al.

Onlar yanaşı oturdular. Aradan ikicə dəqiqə keçməmiş çay gətirdilər. Molla Sadıq stəkanı qabağına çəkdi. Qonağa da təklif etdi.

– Deyəsən uzaqdan gəlirsən?

– O qədər də yox.

Yenə susdular. Molla Sadıq bir ev sahibi kimi gələnin kim olduğunu, nə istədiyini soruşmağı yersiz hesab etdi. Bu, adət deyildi. Gələn qonağın əgər bir işi vardısa, tez-gec özü deyəcək, yoxdursa da, doğrudan da axşamlayıb gecələməyə yer axtarırdısa, yatacaq, səhər tezdən də çıxıb gedəcəkdi.

Qonaq çayını içdi. Gümüş dəstəkli xəncərini düzəldib bardaş qurdu. Tütün qutusunu çıxardıb papiros eşdi. Çaxmaqla qovu yandırıb papirosunu odladı və yanıqlı-yanıqlı sümürdü. Hələ də təəccüblə onu süzən ev sahibinin üzünə belə baxmadan astadan dilləndi:

– Molla, deyirlər Cahandar ağanın bacısının ölümünə sən bais olmusan?

Kişini elə bil ilan sancdı. Yerindən dik atılıb ayağa qalxdı. Geri, divara doğru çəkildi:

– Bu nə sözdür, başına at təpib, nədir?

– Hirslənmə, molla, sözümün dalına qulaq as.

O, papirosunu yenidən tüstülətdi. Molla Sadıq dəhşətlə çırağın solğun işığında oturan adama baxdı. Papirosun tüstüsü onu duman ki-

mi bürümüşdü. Qıllı papağı, sifəti laylanmış göyümtül tüstünün içində güclə seçilirdi.

– Deyirlər, arvad özünü boğmayıb, qardaşının gülləsinə qurban olub.

– Sənin ağzından qan iyi gəlir, a kişi, bu nə sözdür danışırsan?.. Bir də, bunların mənə nə dəxli var?

– Olmasaydı, qapını açmazdım.

Molla Sadıq lap ehtiyatlandı. Bu adamın qəsdən gəldiyini, bəlkə də Cahandar ağanın göndərdiyini güman etdi. Ona elə gəldi ki, bu saat evin dörd tərəfini kəsiblər. Pusquda duranlar içəri göndərdikləri adamın nə edəcəyini gözləyirlər. Qonaq bu saat ayağa duracaq, xəncəri siyirib onu doğrayacaq, sonra da atılıb həyətə çıxacaq, atın belinə qalxıb dördnala çapacaqdır. Əgər molla uşaqlara göz eləsə, gələn adamı elə buradaca, evin içində öldürtsə, daha pis olacaqdır. Duyuq düşən düşmənlər şaraqqa-şaraqla evi gülləyə basacaq, arvad-uşağı qıracaq, ev-eşiyi də yandıracaqdılar. Molla Sadıq ehtiyatsızlıq etdiyinə, tanımadığı adamı içəri buraxdığına görə özünü danladı. “Yamanca yerdə axşamladıq. Bu namərd oğlu türbədən gəlirəm deyə məni yamanca yastığa qoydu”.

– Niyə oturmursan, molla?

Qonağın səsi kişini özünə gətirdi. Ürəyindən keçənləri büruzə verməmək üçün təsbehini çevirdi və gəzinməyə başladı:

– Sən otur, mənim baldırlarım ağrıyır.

– Mənim sözlərim sənə qəribə gəlir, eləmi?

– Ey Allahın bəndəsi, de görüm kimsən və bu axşam şərində məndən nə istəyirsən?

Mollanın səsi həm qəzəbdən, həm də qorxudan titrədi. Qonaq ancaq indi başını qaldırıb ev sahibinin üzünə baxdı. Onun hirsli-hirsli təsbeh çevirdiyini, həm də çox həyəcanlı olduğunu sezdi:

– Mən sənə təşəkkür eləməyə gəlmişəm, molla, sən mənim ürəyimdən tikan çıxartmısan, mənə dağ çəkənə dağ çəkmisən.

Molla Sadıq donub yerində qaldı. Eşitdiklərinə inanmaq istəmədi. “Bu kimdir? Necə yəni təşəkkür eləməyə gəlmişəm? Axı, bütün bunların mənə nə dəxli var? Yoxsa məni çəkiyə çəkir? Ağzımdan söz almaq istəyir? Boynuma bir şey qoymağa çalışır? Bu nə canlı-cinlidir mənim qapımı açdı? Gecə vaxtı xataya düşmədik?! Mən bunu necə rədd eləyim getsin?”.

– Molla, Cahandar ağanın təzə arvadı bilmirsən kimdir?

– Yox. Nəyimə də lazımdır?

– Lazımdır, molla, o mənim arvadımdır.

– Nə?

– Bəli. Halalca, kəbinli arvadımdır.

Molla Sadığın elə bil üstündən dağ götürüldü. Kişi dərindən nəfəs aldı. Gözünə işıq gəldi. Evin qaranlığı azalan kimi oldu. O yalnız indi, arxayınlıqla qonağını gözdən keçirdi. Onun rənginin avazıyıb kağız kimi ağardığını, xəncərin dəstəyindən yapışdığını və barmaqlarının titrədiyini gördü. O fasiləsiz olaraq papirosunu sümürürdü. Tüstü ağzından, burnundan fısqırıb çıxırdı. Gözünü haraya isə zilləmişdi. Ancaq heç yerə baxmır, heç yeri görmürdü. Az qalırdı ki, papirosun kötüyünü çeynəyib yesin. Onun gicgahlarından qalxan göy damarlar yanağına doğru uzanırdı. Molla dinmədi. O isə papirosunu kötüyünə qədər sümürüb söndürdü və qapıya tərəf atdı. Sonra da ayağa durub ev sahibinin qabağında dayandı.

– İndi bildinmi mənim dərdim nədir? Cahandar ağa mənim anamı ağladıb, papağımı yerə soxub, bütün nəslimin namusuna sataşıb. Mən başımı qaldırıb adamların üzünə baxa bilmirəm. Mərəkəyə çıxa bilmirəm. Tay-tuşun, qohum-əqrəbanın yanında dilim gödəkdir, gözüm kölgəlidir, heç kəsin üzünə baxa bilmirəm. Hamı arxamca mənə rişxənd edir. Məni ələ salırlar. “Biqeyrət köpək oğlu, arvadını əlindən verib, özü də utanmaz-utanmaz atın belində gəzir” – deyirlər, molla! Mən odsuz-ocaqsız yanıram. Nə qədər çalışıram, o namərd köpəkoğluna əlim çatmır. Onu tapa bilmirəm. Tüstüm təpəmdən çıxır. İndi sənin yanına gəlmişəm, mənə kömək elə, molla, mənə dağ çəkənə dağ çəkmək istəyirəm.

– Bir az yavaş, arvad-uşaq eşidər, – deyə Molla Sadıq qonağı sakitləşdirməyə çalışdı. – Belə söhbəti ayaqüstü eləməzlər. Otur görüm, otur. Özünə toxtaqlıq ver.

Onlar yenidən döşəkcənin üstündə yanaşı əyləşdilər. Molla Sadıq bu dəfə yerini rahatlayıb bardaş qurdu. Arxayın-arxayın təsbehini çevirdi. “Ay uşaq” – deyə kimi isə səslədi. Qızı Pakizə içəri girdi.

– A bala, bizə iki stəkan çay gətir. Anana da de, xörək tədarükü görsün, acmışıq. Atı da tövləyə çəksinlər.

Pakizə çay gətirdi. Qapını arxasınca möhkəmcə örtdü. Yalnız bundan sonra Molla Sadıq qonağı dindirdi:

– Qardaş, sən şir ürəyi yemisən, nədir, nə cürətlə bu tərəflərə ayaq basmısan? Deyəsən, sənin gözünü qan örtüb. Demirsənmi duyuq düşərlər, iri tikəni qulağın boyda eləyərlər?

– Namussuz yaşamaqdansa, ölmək yaxşıdır.

– Orası elədir, amma ehtiyat da lazımdır. Yoxsa ara yerdə qanın itər.

– Mən ölümdən qorxmuram, molla, hayıfımı ala bilməməkdən qorxuram.

– Yaxşı, çayını iç.

Stəkan-nəlbəki şaqqıldadı. Otağa horultu düşdü. Qəndlər dişin altında əzilib xırçıldadı. Molla Sadıq çay içmək bəhanəsi ilə fikirləşmək, ələ düşən bu fürsətdən istifadə etmək və ustalıqla tədbir tökmək istəyirdi. O, başa düşürdü ki, nə qədər Cahandar ağa sağdır, kənddə əl-qol aça bilməyəcəkdir.

– Onun qızına gülləni sənmi atmışdın?

– Bəli.

– Ot tayalarını da sənmi odlamışdın?

– Bəli.

– Ehtiyatsızlıq edirsən, qardaş, adın nədir?

– Allahyar.

– Allahyar, indi gələndə səni görüb-eləyən olmadı ki?

– Yox. Xır yolundan burulub saymazyana doqqazınıza gəldim, fikir verən olmadı.

– Yenə ehtiyatsızlıq eləyirsən.

– Bildim ki, başları qarışıqdır.

Molla Sadıq söhbətə ara verdi. Stəkanı boşaltdıqdan sonra geri itələdi. Ayaqlarını uzatdı. Mütəkkəyə dirsəklənib təsbehini çevirdi. Bir az bundan əvvəl gərili yay kimi dartılıb açılmağa hazır olan qonağının büzüşdüyünü gördü. Allahyar elə bil süstləşmişdi. Onun beli də azacıq donqarlanmışdı. O bu saat aylardan bəri qovrulan, nəhayət, gözünü yumub doyunca ağlayan, sel-su kimi yaş axıdıb sakitləşən bir qadının vəziyyətində idi. Molla Sadığa elə gəldi ki, uzun müddət tənha dərd çəkən, ürəyini boşaltmağa adam tapmayan və əsəbləri tarıma çəkilmiş sim kimi dartılı olan Allahyar indi, hər şeyi ona danışandan sonra, uzun sürən bir xəstəliyin taqətdən saldığı adamın vəziyyətindədir. Onu bu saat tərpətsən, heç yerindən də qalxa bilməzdi.

– Yaxşı, indi məndən nə istəyirsən?

Allahyar fikrindən ayılıb müsahibinin üzünə baxdı. Molla Sadıq onun gözlərindəki yalvarışı oxudu:

– Mənə kömək elə.

Molla Sadıq əslində Cahandar ağanın təzə arvadının ərini çoxdan axtarırdı. Onu tapıb əlbir olmağı, qızışdırıb Cahandar ağanın üstünə salmağı çoxdan arzulayırdı. Həm də bunu elə etmək istəyirdi ki, heç kəs ondan şübhələnməsin. İndi isə həmin adam özü öz ayağı ilə gəlib çıxmışdı. Molla Sadıq ürəyindən keçənləri ondan gizlətməyi və Allahyarı bir az çək-çevirə salmağı lazım bildi:

– Sən nəyə əsasən belə bir işi mənə təklif eləyirsən?

– Axı, o sənin də düşməninndir.

– Bunu sənə kim deyib?

– Molla Sadıq, sən məni uşaq yerinə qoyma. Mən hər şeyi bilirəm. Onu da bilirəm ki, Cahandar ağa bacısının hayıfını səndə qoymayacaq. Fürsət düşən kimi sənnən haqq-hesab çəkəcək. Mən gəlmişəm ki, köməkləşək. İndi özün bil.

Molla Sadıq təsbehini qoluna keçirib xeyli saqqalını tumarladı. Gözlərini qıyıb lampaya baxdı. Çırağın fitilindən ox kimi uzanan ziyalar onun gözlərinə sancıldı və kirpiklərinin arasına doldu. O nəyi isə xəyalında xeyli ölçüb-biçdi və nəhayət, astadan dilləndi:

– Yaxşı, mən sənə nə kömək edə bilərəm?

Allahyar bir az dirçəldi. Döşəkcəni sürüşdürüb lap mollanın yanına gəldi. Molla da yenidən bardaş qurub oturdu. Onlar baş-başa verdilər. Söhbətlərinin eşidilməsindən qorxurlarmış kimi az qala pıçıltı ilə danışmağa başladılar:

– Özün bilirsən ki, onlar dişli tayfadırlar. Həndəvərinə hərlənmək olmur. Tayalarına od vuranda az qalmışdı ki, məni öldürsünlər. Güclə qaçıb canımı qurtardım. Bu kənddə də heç kimim yoxdu. Heç kəslə tanış deyiləm. Elə öz kəndimizdə də fərli bir qohumum yoxdur. Ona görə də sənə pənah gətirmişəm.

– Yaxşı, – deyə molla onun sözünü kəsdi. – İndi mən nə eləyim? Sənin əvəzinə gedim onu öldürüm?

– Yox, molla, sən istəsən də mən buna razı olmaram. – Allahyar alışıb-yanan ocaq kimi yenidən alovlanmağa başladı. – Onunla haqq-hesabı özüm çəkəcəm. Sən ancaq fürsət düşəndə mənə xəbər çatdır. Qalanı ilə işin olmasın. Mən ona dağ çəkə-çəkə, sataşa-sataşa divan

tutacam. Sən ancaq məni xəbərdar elə. Harda, nə zaman, nə eləmək lazım olduğuna işarə elə.

– Mənim boynuma çətin iş qoyursan, qardaş.

– Özün bil, əl mənim, ətək sənin, əl çəkən deyiləm. Bir də, məsəl var, bardağa girdin, oldun bardaq suyu. Daha sən bu işdən boyun qaçıra bilməzsən. Belə eləsən gərək bu saat adam göndərib mənim burda olduğumu Cahandar ağaya xəbər verəsən. Bu da sənin xeyrinə olmaz. İndi özün bil, mən gəldiyim yolla da geri qayıda bilərəm.

Allahyar doğrudan da getməyə hazırlaşırmış kimi qalxmaq istədi. Ancaq Molla Sadıq onun çiynindən basıb aşağı oturtdu:

– İndi ki, belə oldu, dediklərimə qulaq as: sən bu kəndə hərlənmə. Buralarda gözə dəysən, onları duyuq salarsan. Bir iş tutanda da izi azdırmaq lazımdır, başa düşdünmü? Bunun dağı var, aranı var. Bu gün-sabah əkini-biçini olacaq. Nə vaxt lazım olsa, özüm xəbər çatdıraram. Ancaq bizim burda danışdıqlarımızı, görüşdüyümüzü gərək nə dil bilsin, nə dodaq. Eşitdinmi, bir daş altda, bir daş üstdə.

– Ürəyini buz kimi saxla, molla.

Kişi elə bil birdən-birə cavanlaşdı. Bayaqkı üzgünlük yox oldu. Onun belinin əyrisi də düzəldi. Gözləri ov üstünə atılmağa hazır olan yırtıcı gözü kimi parıldadı. Sıçrayıb ayağa qalxdı. Yüngül addımlarla küncə yaxınlaşıb tüfəngini götürdü. Yapıncısını çiyninə saldı. Başlığı boynuna doladı. Molla Sadıq onun gözlərinin qayır-qayır qaynadığını gördü.

– Di salamat qal.

– Dayan, çörək ye.

– Eviniz şən olsun, heç nə lazım deyil. Yolçu yolda gərək. Ay doğmamış aradan çıxsam yaxşıdır.

– Məsləhət sənindir. Ancaq qoy uşaqlar səni ötürsünlər. Kəsə yolla kənddən çıxartsınlar.

Bir neçə dəqiqədən sonra Allahyarın atının ayaq tappıltıları evdən uzaqlaşdı. Molla Sadıq xeyli pəncərə qarşısında dayanıb kəndi dinlədi. İtlərin hürüb-hürmədiyini, adamların duyuq düşüb hay-haray salıb-salmadıqlarını bilmək istədi. Ancaq gecə böcəklərinin cırıltısı və Kürün uğultusundan başqa heç nə eşitmədi. Qapını möhkəmcə bağlayıb otaqda gəzindi. Onun təsbehinin iri, sarı kəhrəba muncuqları gecəyarısına qədər şaqqıldadı.

## 4

Əşrəf meşənin qurtaracağında atın cilovunu çəkdi. Kürün lil qoxusu verən sərin havası onun üzünə vurdu. At bərkdən kişnədi. Tapdıq da yüyəni dartdı.

Kürün sahili köçərilərin düşərgəsinə çevrilmişdi. Arabalar bölük-bölük dayanmışdı. Yulğunluqların içi mal-qara ilə dolmuşdu. Uşaqlar dana-buzovları, sığırçılar isə malları bir-birinə qarışmağa qoymurdular. Yuxarılara yağan yağışdan sonra hava bürkülənmişdi. Nəfəs almaq olmurdu. Tələm-tələsik ocaq qalayıb qazan asan arvadların, arabaların yanında qaçışan tumançaq uşaqların, heyvanları sulayan sığırçıların səsi bir-birinə qarışmışdı. Milçəklər, göyöyünlər mallara dinclik vermirdi.

Tapdıq dərindən nəfəs aldı:

– Deyəsən yenə Kürün dəliliyi tutub.

– Yəni deyirsən, gəmi işləmir?

– İşləsəydi, suyun qırağında bu qədər adam olmazdı.

Arabalar gəlib çatdı. Cahandar ağa iri qovaq ağacının kölgəsində dayandı. Əlini gözünün üstünə qoyub, ağız-ağıza qovuşan sulara baxdı, sonra işarə etdi ki, arabaları açsınlar. Özü də atdan endi. Tapdıq yüyəni onun əlindən almaq istədikdə, mane oldu:

– Get, öyrən gör, çoxmu dayanasıyıq.

Tapdıqla Əşrəf lil basmış cığırla, yulğun kollarının arası ilə irəlilədilər. Onlar tez-tez başlarını aşağı əyir, şaxları əlləri ilə kənar edirdilər.

Açıqlığa çıxan kimi Əşrəf atını mahmızladı və keçidin yuxarı tərəfinə doğru irəlilədi. Keçidin aşağı tərəfində, suyun yayılıb dayazlaşdığı yerdə, bir dəstə cavan heyvanları şığayıb suya tökür, qorxub geri qayıtmaq istəyən inəkləri, danaları daşa basırdılar. Onlar malları hay-küylə ürəkləndirib o üzə keçirməyə çalışırdılar...

Kürün balaca bir qolu Əşrəfgilin yolunu kəsdi. Tapdıq bələdçilik etmək məqsədi ilə atını qabağa sürüb suya saldı. Əşrəf ondan geri qalmaq istəməyib, qamçını havada oynatdı. Atlar qoşalaşdı. Boz-bulanıq sular ətrafa sıçradı. Onlar çaparaq suyu keçdilər və cığıra çıxdılar. Yenə ötüşdilər. Döngəni burulmaq istərkən bir dəstə qızla qabaqlaşdılar. Dördnala çapan atların cilovunu nə qədər yığdılarsa da, yelini ala bilmədilər. Qızlar təlaşla qışqırışıb ətrafa dağıldılar. Onlardan biri az qaldı atın ayaqları altına düşsün. Əlindəki saxsı cürdəyi salıb sındırdı. Əşrəf acıqlı bir səs eşitdi:

– Ciyəri yanmışlar.

O, yəhərin üstündən qanrılıb geri baxdı. Qırmızı atlaz donunun sinəsindəki pullar və belindəki kəmərin toqqası parıldayan bir qız qaş-qabağını töküb onların arxasınca baxırdı. Saxsı qabın qırıqları cığırın ortasına səpələnmişdi. Əşrəf atın cilovunu dartıb dayandı. Qızı başdanayağa süzdü. O da yerindən tərpənmədi. Bir az əvvəl baş vermiş hadisəni unutmuş kimi atlı oğlana baxdı. Əşrəf qızın çatma qaşlarının ortasındakı düyünün açıldığını, uşaq ədası ilə büzüb salladığı dodaqlarının tərpəndiyini, gözlərindəki qəzəbin yox olub, ərkəsöyün bir məzəmmətə çevrildiyini gördü. Qız ani şaşqınlıqdan sonra hirsdən çox küskünlüyü andıran bir çevikliklə dabanı üstündə fırlandı və geri döndü. Onun hörükləri yellənib çiyinlərini öpdü və kürəyinin ortasında dayandı. Qız qaça-qaça Kürün balaca qolu üstə sərilib körpünü əvəz edən iri qovaq ağacının üstünə çıxdı. Suyu o üzə keçən qızların arxasından çatmağa tələsdi. Əşrəf onun yalın ayağının qabığı soyulmuş ağacın gövdəsinə saldığı izləri belə gördü. Qız körpünün ortasında dayandı. Əşrəfin hələ də onun arxasınca baxdığını görəndə qaşlarını çatıb dodaqlarını büzdü və birdən onu tanıdı:

– Bıy, dilim qurusun, bu, Əşrəf imiş ki.

Qız dabanı üstə fırlanıb körpünü keçdi və qızların arxasından çatdı. Əşrəf də atın başını çevirib Tapdıqla bərabərləşdi:

– O qız kim idi?

– Hansı qız?

– Bizə qarğıyan.

– Tanımadınmı? Pakizə idi.

– Hansı Pakizə?

– Molla Sadığın qızı.

Əşrəf onu yenidən görmək istəyirmiş kimi arxaya boylandı:

– O ki, lap balacaydı.

– Eh, qıza nə var. Gözünü yumub-açınca bir qamçı boyda uzanırlar.

– Salatın da böyüyüb?

– Maşallah, yekə qız olub.

Əşrəf yenidən susdu. Atlar addım-addım irəliləyir, bəzən lilli gölməçələrdən keçir, bəzən də ağızlarını uzadıb, ağacların yarpağını qoparırdı.

Sahilə çatdılar. Atlar ləpəli, boz-bulanıq suyun köpüklü sinəsini görən kimi dayandı. Qulaqlarını diklədib kişnədi. Əşrəf dodaqucu gülümsündü:

– Yazıq qız az qalırdı ağlasın.
– Hansı qız, ağa?
– Pakizəni deyirəm. Qabını sındırdıq. Suyu da dağıldı.
– O da əvəzində bizə qarğıyıb, ürəyini boşaltdı. Daha nə istəyir?
– Heç... elə-belə sözdü, dedim.
– Olmaya qızdan xoşun gəldi, ağa?
Əşrəf diksinib təəccüblə Tapdığın üzünə baxdı. O isə Əşrəfin qulaqlarının ucuna qədər qızardığını, həyadan alnına tər belə gəldiyini gördü. Zarafatyana başladığı söhbəti ciddiyyətlə qurtardı:
– Elə şeyi olmaya-olmaya ağlına gətirəsən, ağa. Molla Sadıqla atan bu saat xəncər-bıçaqdır.
– Niyə, nə olub ki?
– Bir-iki dəfə sözləri çəpləşib, az qalıb araya qan düşsün.
– Axı nəyin üstündə?
Tapdıq söhbətin gözlənilməyən bir istiqamət aldığını anladı. Vəziyyətdən çıxmaq üçün atını mahmızlayıb suyun yaxasıboyu sürdü.

* * *

Qoca kişi şalvarını dizinə qədər çirməmişdi. Gəminin dal tərəfində dayanıb vedrə ilə suyu boşaldırdı. Yağış suyu gəminin ortasından idi. Gəmi yarıya qədər aşağı çökmüşdü. Ləpələr onu tərpətdikcə ləngərlənir, bəzən sahilə toxunub burnu ilə xırdaca daşları xışıldadıb şaqqıldadırdı.
Əşrəf atdan düşdü. Bir xeyli gəmiçiyə, sahildə korun-korun yanan ocağa baxdı. Cilovu Tapdığa verib Qoca kişiyə yaxınlaşdı:
– Xoş gördük, ay Qoca dayı.
Kişi belini düzəldib dikəldi. Sahildə, yarğanın qaşında, iki-üç addımlıqda dayanan oğlana baxdı. Əşrəfi tanıyan kimi dodaqları qaçdı. Adəti üzrə ona şuxluqla cavab vermək istədi. Ancaq birdən-birə tutuldu. Qaşqabağını sallayıb könülsüzcəsinə dilləndi:
– Xoş gördük.
Əşrəf kişinin sifətindəki dəyişikliyi sezmədi. Yenə əvvəlki kimi gülə-gülə gəmiçiyə sataşdı:
– Qızlarla aran necədir?
Gəmiçi gözünü qıyıb diqqətlə Əşrəfin üzünə baxdı və hiss etdi ki, onun kənddə baş verən hadisələrdən xəbəri yoxdur. Qoca kişi bir an tərəddüd içində dayandı, sonra dodaqları qaçdı:

– Deyəsən kefin kökdür, ay nişanlısı göyçək?
– Niyə kök olmasın, ay qızı göyçək.
– Qızımda işin olmasın, sonra xalana söyərəm.
– Peşkəşdi. Qoca dayı, təki məni o üzə keçirəsən.
– Elə zarafat yoxdur.
– Niyə?
– Hələ canımdan bezməmişəm.
– Sudan qorxursan?
– Görmürsən?
– Görürəm. Burda nə var ki? Sən ki, çox belə sellər-sular yola salmısan.
– Sən indidən danış.
– Yoxsa qocalıbsan? Daha əlinin arxasını yerə qoyursan?
Qoca kişi qanrılıb qarşı tərəfdəki sahilə, hündür yarğanı döyəcləyən burulğanlı sulara baxdı:
– Düz deyirsən, bala, qollarım taqətdən düşüb. Daha gəmi sözümə baxmır.
Kişi köksünü ötürüb, gəminin arxa hissəsindəki taxtanın üstündə oturdu. Əşrəf onun boynunun qırış-qırış olmuş dərisinə, islaq köynəyinin yaxasından görünən dördkünc duaya baxdı. Gəmiçinin əllərindəki göy damarlar şişmişdi. Barmaqları xəfifcə titrəyirdi. Doğrudan da onun baxışlarından həyatdan usanmış bir adamın yorğunluğu tökülürdü. O, gözünü suya zilləmişdi. Ləpələr bir-birini qova-qova qarşıdakı sahilə qədər gedirdi. Kürün kükrəyən suyu eşim-eşim eşilir, lilli çiləkənlərin yanındakı iri burulğanlara qədər aparırdı. Orada isə qəzəblənmiş kimi hər şeyi basmarlayıb altına alır və yalnız bundan sonra ürəyi sakitləşmiş təki lal sükutla axırdı.
Əşrəf yüngülcə gəmiyə atıldı:
– Qoca dayı, sən böyük olarsan, yoxsa bu gəmi?
Kişi gözünü sulardan çəkib müsahibinin üzünə baxdı. Bir xeyli haraya isə, lap uzaqlara gedən fikrini toplamağa çalışdı. Bir-iki dəfə udqunduqdan sonra astaca dilləndi:
– Bu gəmi məndən çox böyükdür, bala, atam deyərdi ki, mənə də babamdan qalıb.
– Atan da gəmiçi idi?
– Biz dədə-babadan gəmiçi olmuşuq. Kəndimizin binəsi burda qoyulandan bizim nəslimiz gəmiçilik eləyib.

– Çərkəz də gəmiçi olacaq?

Kişi bir xeyli dinmədi. Solğun gözlərini Əşrəfin üzünə zilləyib dayandı:

– Bilmirəm. Məndən olsa, gəmiçilik eləməz.

– Niyə ki?

– Su sənəyi suda sınar, bala, gəmiçini ya sel aparar, ya da suda boğular. Bu gəmi babamı yola salıb, atamı yola saldı, bu gün-sabah da növbə mənimdir.

Qocanın sözləri Əşrəfi kədərləndirdi. O, bir anlığa Çərkəzi, onların qara damını gözünün qabağına gətirdi:

– Bəs fikrin nədir, Qoca dayı?

– Nə bilim, beş-altı tağarlıq yerimiz olsaydı, heç olmasa əkin-biçin eləyərdik. Allahın vergisindən o da yoxdur.

Əşrəf hiss etdi ki, Qoca kişi tamamilə ümidini itirmiş adamlar kimi səsi titrəyə-titrəyə danışır. Onu sakitləşdirmək, yeri gəlsə qocaya yardım etməyi belə xəyalından keçirdi. "Doğrudan da atama desəm, bu yazığa bir az torpaq verməzmi?" – deyə düşündü.

– Tapılar, Qoca dayı, fikir eləmə.

– Hardan tapılar, ay bala?

– Nə çoxdur Allahın torpağı?

– Allahın torpağını bəndələr çoxdan qamarlaşdırıblar. Ölsələr də əllərindən bir tikə verməzlər.

– Verərlər.

Kişi qarşısında dayanan bu yeniyetmə oğlanın sifətinin ciddiləşdiyini gördü. Ürəyində onun hələ dünya işlərindən bixəbər olduğuna güldü:

– Ay nişanlısı göyçək, ağzın isti yerdədir, onunçün belə danışırsan. Gəl, özünü yorma. Dünya belə gəlib, belə də gedəcək. De görüm işin-gücün necədir?

– Çox sağ ol, Qoca dayı, yaxşıdır. Bə sizlərdə nə var, nə yox?

– Salamatlıqdır.

– Çərkəz hardadır? Güləsər nə təhərdir?

Kişini elə bil birdən-birə dəyişdilər. Cəld ayağa durub gəminin böyrünə söykədiyi çəpi götürdü, dal tərəfdəki taxtanın üstünə qalxıb suya saldı. Var gücü ilə təkan verib gəmini geri itələdi:

– Gedəndə qardaşından soruşarsan...

Əşrəfin atı yüyənini dartdı. Qulaqlarını dikəldib bərkdən kişnədi. Gəmiçi əlini gözünün üstə qoyub meşəyə tərəf baxdı:

– A bala, bunlar kimdir? – deyə təəccüblə soruşdu.

Əşrəf gəmidən sahilə sıçradı. Atılıb yəhərə qalxdı.

Bir dəstə atlı kazak meşənin qurtaracağında dayandı. Öndəki zabit durbinlə sahildəkilərə, o tayda, yarğanın qaşında oturub köçü gözləyənlərə baxdı. Mal-qaranı, arvad-uşağı gözdən keçirdi. Sonra atını mahmızlayıb cığıra düşdü. Qalanları onun arxasınca gəldilər.

İtlər zəncirdə dartınıb ağız-ağıza verdilər. Aralıqda qaçışan uşaqlar qorxudan arabaların böyrünə qısıldılar. Camaat gözlənilmədən gəmi yoluna gələn kazaklara təşvişlə baxdı. Cahandar ağa isə sıçrayıb ayağa durdu. Nökərlərə dedi ki, "arabaları qoşun, kənara çəkin". Özü dərhal atın belinə qalxdı.

Kazaklar sahildə, düz gəminin bərabərində dayandılar. Zabit əvvəlcə gəmiyə, sonra Kürün qabarmış sinəsinə baxdı. Atını bir az da sürüb Qoca kişinin yanında saxladı:

– Bizi o taya keçir.

Kişi heç nə başa düşmədi. Çiynini çəkib zabitin üzünə baxdı. Atlılardan biri irəli çıxdı. Yəhərin üstündən əyilib Qoca kişinin qulağına bağırdı:

– Naçalnik deyir ki, bizi o taya keçir.

Qoca kişi gülümsündü:

– Nəçəlnik olanda nə olar, görmürmü su ağız-ağıza qovuşub?

– Bəs öz adamlarınızı niyə keçirirsən?

– Kim deyir onu?

– Mən.

– Yalançının atasına lənət.

Dilmanc atını irəli sürdü. Əlini qılınca uzatdı. Kişinin üstünə qışqırdı:

– Kəs səsini, qoca kaftar.

Əşrəf artıq dözə bilmədi:

– Bura bax, atan yaşında kişini niyə bihörmət eləyirsən?

– Sən kimsən?

– Onun sənə dəxli yoxdur.

Zabit dönüb ağ çərkəzi çuxalı, göy buxara papaqlı cavanın belindəki sallamalı kəmərinə, gümüş xəncərinə baxdı. Kazaklar zabitin işarəsini başa düşüb hazırca dayandılar. Tərcüman üzünü yenidən Qoca kişiyə tutdu:

– Buralarda səndən başqa gəmiçi varmı?

– Yox.

– O taya adam keçiribsənmi?
– Dedim ki, yox. İki gündür gəmi işləmir.
– Yalan deyirsən. Bəs dünən gecə keçirdiyin student yadından çıxıb?
– Student nədir?
– Başında rus şapkası, şalvarının balağı açıq bir adam görməyibsən? Toqqasında yazıları da var.
– Yox, bu tərəflərdə elə adam gözə dəyməyib. Necə məgər?
– A kişi, inkir-minkir başlama, de görüm belə bir adam görübsən, ya yox?
Əşrəf məsələni başa düşdü. Tapdıq da onların kimi axtardığını anladı. Yavaşca Əşrəfin qulağına pıçıldadı:
– Ağa, bunlar dünənkilərdir. Bizi axtarırlar, gəl aradan çıxaq.
Əşrəf onu eşitmədi. Üzünü dilmanca tutub gəmiçini müdafiə etdi:
– Onun üstünə niyə düşübsünüz, görmürsünüzmü heç nədən xəbəri yoxdur?
Zabit Əşrəfin ötkəmliyini xoşlamadı. Gözünü qıyıb diqqətlə onu bir də təpədən-dırnağa süzdü. Sonra dilmanca işarə etdi:
– Bəlkə elə bu özüdür?
Onların ətrafına toplaşan göytəpəlilər susdular. Böyük narahatlıqla bu höcətləşmənin nə ilə qurtaracağını gözlədilər. Cahandar ağa atı çapıb camaata yaxınlaşdı. Kazakların yanına getməzdən əvvəl adamları xəbərdar etdi:
– Arvad-uşağı aradan çıxardın.
Binələrə çaxnaşma düşdü. Bir neçə dəqiqədən sonra kişilərdən başqa heç kəs görünmədi. Mal-qara yulğunluğa dolduruldu, arabalar kənara çəkildi. Bütün bunları gözaltı süzən Cahandar ağa kazaklara yaxınlaşdı. Onun qohumları və kənd camaatı dərhal, ustalıqla, saymazyana ətrafı kəsdilər. Kazakların mühasirəyə alındıqlarından xəbərləri olmadı. Cahandar ağa gördü ki, hamı hazırdır. Əllər xəncərin dəstəyində, barmaqlar tüfəngin tətiyindədir.
O, tüfəngini yəhərin qaşına qoydu, çaxmağın dabanını açdı. Zabitə yaxınlaşıb astadan soruşdu:
– Uşaqdan nə istəyirsiniz?
Cahandar ağanın təmkinlə, amiranə bir tərzdə verdiyi sual zabitin xoşuna gəlmədi:
– Sən bu işə qarışma.
– Yenə soruşuram, uşaqdan nə istəyirsiniz?

Zabit artıq dözmədi. Onun qəzəbli səsi xırıldadı:

– Tutun bunları!

Elə bil Cahandar ağaya od vurdular. Atın cilovunu dartıb geri fırlandı. Qəmər qəfil təkandan dal ayağı üstə qalxıb kişnədi. Onun ayağının altındakı xırda, yumru daşlar şaqqıldadı. Cahandar ağanın burun pərələri genişləndi. Həbəşi dodaqları gömgöy oldu. Onun fısıltısı aydınca eşidildi:

– Rədd olun!

Adamlar sıxlaşdılar. Kazaklar gördülər ki, üzük qaşı kimi mühasirədədirlər. Azca hərəkət etsələr, tətiklər çəkiləcək, xəncərlər göydə parıldayacaqdır. Zabit ancaq indi dərk etdi ki, çox arxayın tərpənibdir. Əgər silaha əl atsalar, araya qırğın düşəcək, bəlkə də buradan salamat qayıdan olmayacaqdır. Gözləmədiyi bu vəziyyət onu sarsıtdı:

– Bizim sizinlə işimiz yoxdur. Bizə dünən gecə qoruğa girən adamlar lazımdır. Onlar bizim kazakları döyüb, əllərindən silahları alıblar. Onları tapıb verin.

– Bizim sizə veriləsi adamımız yoxdur.

Zabitlə dilmanc bir-birinin üzünə baxdılar. Dilmanc zabitin ürəyindən keçənləri duydu, səsini yumşaltdı:

– Nə üçün dava axtarırsınız? Əgər adamlar burda yoxdursa, açığını deyin, çıxaq gedək.

– Dedim ki, sizə veriləsi adamımız yoxdur.

– Elə isə salamat qalın.

– Yol açıqdır.

Zabit elə bil yaddan çıxartmamaq üçün diqqətlə Əşrəfin üzünə baxdı. Sonra Cahandar ağaya ötəri nəzər fırlatdı. Atını mahmızlayıb qabağa keçdi. Camaat aralanıb onlara yol verdi. Kazaklar yəhərin üstündə qalxıb düşə-düşə meşəyə tərəf çapdılar. Göytəpəlilər onlar meşədə gözdən itməmiş əllərini tətikdən çəkmədilər.

## 5

Pakizə Əşrəfi ilk dəfə yaxından hələ üç il bundan əvvəl görmüşdü. Onda qızın on dörd yaşı yenicə tamam olurdu. Bu elə o vaxt idi ki, Pakizə özündən böyük qızlara qoşulmağa çalışır, gəlinlərin söhbətindən, zarafatından xoşu gəlirdi. Onlar Pakizəni uşaq zənn etdiklərindən

çəkinmir, onun yanında öz ərlərindən baməzəliliklə danışır, hətta toy gecəsi xatirələrini bütün təfərrüatı ilə söyləyirdilər. Pakizə bihuşedici gül qoxulamış adamlar kimi məstliklə qızların öz nişanlıları ilə necə görüşdüklərini təsəvvüründə canlandırmağa və ilk öpüşün ləzzətinin nədən ibarət olduğunu duymağa çalışırdı. Nə isə dumanlı, eyni zamanda sehrli bir maraq onu özünə cəlb edirdi.

Pakizənin ömründə ilk dəfə oğlan baxışının, kişi təmasının nə demək olduğunu duyması da elə bu dövrə təsadüf edir. İndi o həmin anı aydın şəkildə tez-tez təsəvvüründə canlandırır, o vaxt olduğu kimi indi də dumanlı və sehrkar bir duyğunun şirinliyindən məst olurdu...

Novruz bayramı idi. Kənd uşaqları səbirsizliklə axşamın düşməsini gözləyir, tez-tez xırman yerinə topladıqları ota baxırdılar. Onlar qucaq-qucaq küləş, saman gətirib otun üstünə atırdılar. Bundan başqa əllərinə keçən quru çırpıları, odun qırıntılarını da buraya atırdılar. Onlar şər qarışan kimi tonqal yandıracaqdılar. Oğlanlar bundan başqa, meşədən uzun payalar kəsib gətirmişdilər. İri bir gərməni ortasından deşib həmin ağaca keçirmiş və lopa düzəltmişdilər. Tonqallardan başqa damın üstündə lopa da yanacaqdı.

Qızlar sakit oturmurdular. Özlərinə təzə paltar tikir, axşama qədər hazır edib geyməyə çalışırdılar. Gəlinlər yumurta boyayır, arvadlar tez-tez düyü arıtlayan qızlara göz yetirirdilər. Səmənilər süfrələrə düzülürdü. Hamı bayrama hazırlaşırdı. Varlı da, kasıb da çalışırdı ki, bu axşam süfrəsi boş qalmasın. Aylarla yığdıqlarını bir gecə üçün xərcləyənlər də var idi.

Pakizə evdə o yan-bu yana qaçır, anasına və gəlinlərinə əl-ayaq verir, həm də axşamın tez düşməsini gözləyirdi. O, nədənsə, bu il Novruz bayramını daha böyük həvəs və eşqlə qarşılamağa hazırlaşırdı.

Nəhayət, yenicə cücərib yaşıllaşan yamacları, torpaqdan baş qaldıran çiçəkləri isti nəfəsi ilə xumarlandıran günəş qərbə doğru əyildi, üfüqdəki pənbə buludlar çəhrayı rəngə boyandı. Kürün üstünə qanadını gərən axşam kölgəsi sürünə-sürünə kəndə doğru yeridi. Pəncərələrdən solğun işıqlar göründü. Ancaq heç kəs içəri, evə girmək istəmirdi. İlıq bahar havası hamını xumarlandırırdı.

Pakizə təzə paltarını geyindi, qapıda xeyli hərləndi, sonra damın belinə çıxdı. Əlini gözünün üstünə qoyub yasəmən rənginə çalan üfüqə boylandı. Kürə, yenicə yaşıllaşan meşəyə, sahilin göy otlarına baxdı. Hava ılıq idi. Kür tərəfdən əsən meh isti nəfəs kimi adamı məst edirdi.

Yaxındakı həyətlərdən birində tonqalı yandırdılar. Onun dalınca bütün qonşular tonqallara od vurdular. Əvvəlcə nəm küləş alışmadı, ağ tüstü layları burula-burula havaya qalxdı, kəndin üstünü elə bil duman bürüdü. Sonra otlar alışıb çatırdadı, alov ucaldı, tüstü bir müddət qığılcımlarla çarpışdı və çəkilib getdi. Kənd şəfəqlərə qərq oldu. Cavanlar lopaları yandırıb damların üstünə sancdılar. Oğlanlar neçə gündən bəri hazırladıqları fişəngləri mazuta buladılar. Üstünə bir az neft çilədilər, od vurdular. Fişənglər alovlandı. Gücləri gəlincəyə qədər fırlayıb havaya atdılar. Pakizə böyük heyranlıq və valehliklə havada bir-birini qovub daha yüksəyə qalxmaq istəyən fişənglərə baxdı. Oğlanlar bəhsə girişdilər. Onlar öz güclərini göstərir, fişəngləri var qüvvələri ilə yuxarı tolazlayırdılar. Vıyıltı ilə havaya qalxan fişəng güyültü ilə yerə düşürdü. Kəndi ahəngdar bir uğultu bürümüşdü. Pakizə lap aşağılarda, Kürün yaxası boyu məskən salan kəndlərin üstündə də göy üzünün qızardığını gördü. Elə bil hər şey alışmışdı. Hətta Kürün suları da qızartdaq idi.

Kəndin birdən-birə alova qərq olduğunu görən itlər qorxdular. Zəlzələ, ya da gün tutulan zaman ağız-ağıza verib ulaşdıqları kimi, indi də zingildəşib səs-səsə verdilər. Onlar azacıq sonra sakitləşdilər. Uşaqlar əl-ələ verib tonqalların ətrafında oynaşdılar. Hər şey nağıllardakı kimi qəribə idi. Kölgələr uzanıb yerlə sürünür, bəzən evlərin divarına düşür, bəzən də lap Kürün sahilinə qədər enirdi. Tonqallar qorlandıqca qığılcım göydə oynayırdı.

Bu hal çox davam etmədi. Tonqallar yandı, lopalar söndü, fişənglər öləzidi. Xoş bir yaz axşamı kəndin üstünə qanadını gərdi. Səs-küy azaldı. Sönüb qurtarmaqda olan tonqalların ətrafındakı uşaqlardan və bir də mal-qaranı rahatlayanlardan başqa bayırda heç kəs qalmadı. Hamı evə çəkildi. Pakizəni də çağırdılar. Qız getmədi. O, səhərə qədər damın belində dayanıb hər şeyə tamaşa edər, baharın ilk ılıq havasını udmaqdan doymazdı.

Çəpərin dibində bir dəstə qız dayandı. Pakizə qaça-qaça doqqaza çıxdı. Qızlara qoşuldu. Gülüşə-gülüşə evdən uzaqlaşdılar.

Bayram axşamı qapı pusmaq, iynəlik salıb bəxt sınamaq qızların adəti idi. Oğlanlar isə baca-baca gəzərdilər. Onlar balaca heybələrini götürüb damın üstünə çıxar, iplə bacadan içəri sallayardılar. Adət üzrə ev sahibi heybəyə şirniyyat qoymalı idi.

Qızlar qapıları pusa-pusa xeyli gəzdilər və nəhayət Pakizənin xalasıgilə gəldilər. Səs-küylə içəri doluşdular. Pakizənin xalası üstü

taxtapuşlu qara damı səliqə ilə süpürmüşdü. Taxtın üstünə gəbə salınmışdı. Ortaya iri bir sini qoyulmuşdu. Sininin çevrəsi boyu şam düzmüşdülər. Zəfəranlı plovun ətri evə dolmuşdu.

Pakizə xalasını öpdü, qoynundan konfet çıxardıb uşaqlara verdi, sonra ev sahibi kimi ərklə qızları süfrəyə dəvət etdi. Xonçadakı saçaqlı konfetləri xışmalayıb qızlara payladı.

Pakizənin xalası iri siniyə plov çəkdi. Taxtın üstünə qoydular. Qızlar sininin ətrafında hərləmə bardaş qurub oturdular.

Heç beş dəqiqə keçmədi ki, sini boşaldı. Süfrəni yığışdırdılar. Qızlardan biri gülə-gülə iri bir badyanı su ilə doldurub ortalığa qoydu.

– Gəlin iynəlik salaq.

Onlar iki iynə götürdülər. Uclarına pambıq doladılar. Sonra Pakizənin xalasına üz tutdular:

– Ay xala, sən de, bu iynə kimin olsun?

Arvad qızlara xeyli baxdı. Gözünü yaşı on altını ötmüş Fatmaya zillədi:

– Qoy onun olsun, hamınızdan böyükdür, – dedi. – Oğlanı da özünüz bilərsiniz.

Qızlar iynələri suya saldılar. Pakizə də onlara qoşuldu. Ancaq bir şey başa düşmədiyindən, təkrar soruşdu:

– Bu iynənin biri Fatmadır, bə o biri kimdir?

– Onu özü bilər. Ürəyində hansı oğlanı tutubsa, odur.

İynələr suda üzməyə başladı. Qızların nəfəsi suya toxunduqca iynələrdən gah biri qaçır, o biri qovur, gah da, əksinə, qaçan dayanır, qovan qaçırdı. Qızlar öz ürəklərində belə hesab edirdilər ki, əgər iynələr birləşsə, demək, oğlanla qız görüşəcək və evlənəcəklər.

Növbə Pakizəyə çatdı. Qızlar onu dürtmələdilər.

– Hansı oğlana gözün düşübsə, ürəyində tut, görək birləşəcəksinizmi?

Pakizə qızardı və heç nə demək istəmədi.

Elə bu vaxt itlər hürüşdü. Bir dəstə oğlan hay-küylə həyətə girdi. Azacıq sonra onların ayaq tappıltıları damın üstündə eşidildi. Qızlar səslərini kəsib təəccüblə bir-birilərinin üzlərinə baxdılar. Pakizənin xalası onları sakitləşdirdi:

– Qorxmayın, oğlanlardır. Baca-baca gəzirlər.

Doğrudan da aradan heç ikicə dəqiqə keçməmiş bacadan təzə, buxara ipəyindən tikilmiş, xoruz quyruğu kimi al-əlvan rəng çalan bir heybə sallandı. Pakizə xısın-xısın gülüb ayağa qalxdı. Az qala pıçıltı ilə:

– Ay qızlar, – dedi, – işiniz olmasın, bu saat onların başına oyun açacam.

Heybə evin ortasına düşdü. Pakizə onu götürüb işığa tutdu. Əli ilə sığalladı:

– Nə qəşəngdir!

Qızlar da yaxınlaşıb heybəyə baxdılar. Pakizənin xalası üzünü bacısı qızına tutdu:

– Gətir bura, paylarını verək.

– Yox, ay xala, sənin işin olmasın.

Pakizə küncdəki iri qara bülövü götürüb heybənin bir gözünə qoydu, taxtın üstündə yatan pişiyi də o biri gözünə saldı.

– Çəkin, – deyə qışqırdı.

Oğlanlar kəndiri dartdılar. Onların səsi aydınca eşidildi.

– Ə, nə yaman ağırdır! Əşrəf, bəxtin gətirib, sənin heybəni ağzınacan doldurublar.

Əşrəf heybənin ağzını açanda pişik movultu ilə kənara sıçradı. Qızlar qəşş edib taxtın üstünə yıxıldılar. Oğlanlar gurultu ilə damın üstündən həyətə endilər. Evin içinə torpaq töküldü. Pakizə qapının cəftəsini vurub dayandı.

Qapını döydülər. Açmadı. Yumruqla döyəclədilər, hətta təpiklə taqqıldatdılar. Qız qapının az qala dabanından çıxacağını görüb qorxdu. Kürəyini söykədi. Oğlanlardan biri bərkdən qışqırdı:

– Açın, payımızı verin!

– Olanımızı verdik, daha heç nəyimiz yoxdur.

– Onda qızınızı aparacağıq.

– Qızımız da yoxdur.

– Bəs sən nəsən?

– Mən? – deyə Pakizə duruxdu və kəkələdi. – Mən qonağam.

– Nə olar, qonaq daha əzizdir.

– Ölsəniz də qapını açmaram.

– Onda bacadan düşəcəyik.

Pakizə qorxdu:

– Ay xala, qoyma, – deyə qışqırdı.

Arvad gülməkdən yaşarmış gözlərini silib özünü güclə sakitləşdirdi:

– Ay günü qara, bizi xataya saldın, aç gəlsinlər, yoxsa əl çəkməyəcəklər.

Pakizə ehtiyatla cəftəni qaldırıb geri çəkildi. Qapı gurultu ilə açıldı. Əşrəf hamıdan əvvəl içəri girdi. Divara qısılan Pakizəyə baxdı və birdən onun qolundan yapışdı:

– Mənim heybəmə pişik salan sənsən?

– Tutaq ki, mənəm.

– Onda səni aparacam. Demək, mənim qismətim sənsən.

Pakizə qolunu dartdı. Biləyini onun əlindən çıxartmaq istədi. Oğlanın barmaqları daha da möhkəm sıxıldı. Qız acizliyini hiss edib altdan-yuxarı Əşrəfin üzünə baxdı. Onların nəzərləri bir-birinə sancıldı. Pakizənin bədəni gizildədi. Ona elə gəldi ki, başı gicəlləndi. Qızın səsi də yumşaldı:

– Burax, qolum ağrıyır.

– Deynən qələt eləmişəm.

– Niyə deyirəm?

Pakizənin xalası ayağa durdu. Gülə-gülə onlara yaxınlaşdı:

– A bala, höcətləşməyin, gəlin xörək yeyin. Yaxşı plovum var. Qayınananız sizi yaman çox istəyirmiş.

Əşrəf qızın qolunu buraxdı. Pakizə biləyini tutub ovxaladı. Qaşqabağını sallayıb astadan:

– Ciyəri yanmış.

Oğlanlar iştaha ilə plov yeməyə başladılar. Qızlar da taxtın bir küncündə oturdular. Ancaq Pakizə kənardaca dayanıb küskün nəzərlərlə Əşrəfə baxdı.

Oğlanlar plovu yeyib durdular:

– Ay xala, şirni payımızı da ver.

Arvad saçaqlı konfetlərdən onların heybəsinə tökdü. Əşrəf axıra qaldı. Getməzdən əvvəl dönüb Pakizəyə baxdı:

– Küsmə, taqsır özündə oldu.

– Bir buna bax, könül almaq da bacarır. Bircə eşiyə çıx!

Pakizənin xalası Əşrəfi gülə-gülə qovdu.

Onlar getdilər. Bu hadisəni qızlar, bəlkə Əşrəfin özü də unutdu. Ancaq Pakizə unuda bilmədi. Ondan sonrakı illərdə, Novruz bayramında yenə qapı pusdular, tonqalın üstündən atıldılar, şirni yedilər, ancaq Pakizə o ləzzəti ala bilmədi. O böyüdükcə, qolundan yapışmış barmaqların ilk təmasını daha tez-tez xatırlayır, bəzən həmin təması biləyində təkrar hiss etmək arzusunun qəlbinin dərinliklərindən baş qaldırdığını sezirdi. O bu dumanlı hissin nə demək olduğunu aydın

başa düşə bilmir, bu arzunun nədən irəli gəldiyini özünə etiraf etməkdən də qorxurdu. Çox vaxt da bu xatirəni yox etməyə, hafizəsindən silib atmağa çalışırdı, ancaq özünün özünə gücü çatmırdı.

Pakizə bu cür yarışirin, yarıxəyali xatirələrlə yaşadığı vaxt ikinci bir hadisə baş verdi...

Kəndə narın qar yağmışdı. Göytəpənin qara damları qarın altında qalmışdı. Bacalardan burula-burula havaya qalxan göyümsov tüstüləri qardan seçmək olmurdu. Arabir yenicə düşmüş izlə qonşuya od dalınca, ya da ələk, sac almaq üçün gedən qızlar olmasaydı, burda insan yaşadığını təyin etmək çətin idi.

Pakizə səhəngini götürüb, topuqlarına qədər qara bata-bata suya gedən qızlarla birlikdə Kürə endi. Kürün üstü ilə sürünən duman gah ortada birləşir, gah da lap aşağı yatıb hər yeri bürüyürdü. Arabir qızlar qaqqıldaşırdı. Su donmuşdu. Qalın buz suyun ortasına qədər gedib az qalırdı ki, ağız-ağıza qovuşsun. Pakizə sahildə ayaq saxladı. O taydakı meşəyə baxdı. Ağaclar iri ağ göbələklər kimi yan-yana dayanmışdı. Suyun buz bağlamamış açıq yerində ördəklər üzürdü. Pakizə onlardan gözünü çəkmədi. Ördəklər xeyli üzdükdən sonra baş vurub suya batdılar. Elə bu vaxt hardansa atılan tüfəng səsi yarğanda şaqqıldadı. Bir dəstə cavan, atı sürüb sahilə endi.

Qızlar suvadağa çatdılar. Səhəngin altı ilə buzu sındırıb su götürdülər. Fatma söhbətə başladı:

– Əşrəfi görəniniz varmı?

– Nə olub ki?

– Dünən qonaq çağırmışdıq, lap əməlli-başlı oğlan olub.

– Bığı çıxıbmı?

– Ona baxmadım.

Qızlar səhənglərini doldurub gülə-gülə sahildən uzaqlaşdılar.

Pakizə bütün yol boyu narahat oldu. Novruz bayramı gecəsi baş verən hadisə təkrar gəlib gözünün qabağında dayandı. Biləyini sıxan barmaqların təmasını yenidən hiss edən kimi oldu. Qız Əşrəfi xəyalında canlandırmağa çalışdı. Axı aradan iki il keçmişdi. Yəqin indi lap böyümüş olar. Görəsən xasiyyəti dəyişibmi? Məni görsə tanıyarmı? Tanısa da kim bilir, yəqin yan ötər. Pakizə birdən-birə onu uzaqdan da olsa görmək istədiyini duydu. Qız günah işləmiş kimi özünü danlamağa, yad bir oğlanı nahaq yerə görməyi xəyalından keçirdiyinə görə tövbə etməyə başladı.

Qızlar bir-bir evlərinə buruldular. Nəhayət, Pakizə də onlardan ayrıldı. Ayağının qarını eyvanda təmizləyib səhəngini yerə qoydu. Göynəmiş barmaqlarını hovxura-hovxura içəri girdi. Anası ocağa qazan asmışdı. Gəlinləri pəncərənin qabağında düyü arıtlayırdı. Həyətdə çatha-çat odun doğrayırdılar. Pakizə ocağa yaxınlaşan kimi anası onu səslədi:

– Əlini isit, evi sahmana sal, qonağımız olacaq.

– Bu zaman nə qonaq, ay ana?

– Hamı çağırır, ayıbdı, biz də çağırmışıq. Əşrəf gələcək.

– Əşrəf?

Qız öz səsindən hürkdü. Qorxaq baxışlarla gəlinə, sonra da anasına baxdı. Onların yenə əvvəlki kimi öz işləri ilə məşğul olduqlarını görüb sakitləşdi. Süpürgəni götürüb evi süpürdü. Divardakı gəbələrin tozunu aldı, fənərin şüşəsini sildi, pəncərə pərdələrini dəyişdi, qab-qacağı, stəkan-nəlbəkini suya çəkdi, hətta ağ samovarı həyətə çıxardıb qarla sürtdü. Bir yerdə toz, bir ləkə qoymadı qalsın. Döşəkcələri, mütəkkələri dönə-dönə çırpdı. Arada o biri otağa keçib özünə də baxdı. Ətlənmiş çiynini, qabarıq sinəsini görəndə təəccüb etdi. Qız bədənindəki dəyişikliyi birinci dəfə müşahidə etdiyindən, özünü tanıya bilmədi. Paltarını dəyişdi. Yenidən eyvanda, həyətdə fırlanmağa başladı. Arada paltar çırpmaq bəhanəsi ilə tövlənin üstünə çıxıb Cahandar ağagilə tərəf boylandı...

Günorta üstünə yaxın kəndin ortasındakı cığırda qaraltı göründü. Həmin qaraltılar asta-asta Molla Sadıqgilə yaxınlaşdılar. Pakizə eyvandan çəkilmədi. Qonaqlar doqqazdan içəri girəndə onlara ötəri nəzər salıb otağa keçdi. Pəncərənin pərdəsini azacıq aralayıb baxdı. Qonaqların eyvanda ayaqlarının qarını təmizlədiklərinə, üstlərini çırpdıqlarına fikir verdi. Şamxal çərkəzi paltar geyinmişdi. Ayağında uzunboğaz çəkmə vardı. Əşrəf isə paltolu idi. Əşrəf qaloşunu astanada çıxartdı.

Pakizə çayniki götürüb otaqdan çıxdı. Poqquldayan samovara yaxınlaşıb çay dəmlədi, çayniki dəmkeşin üstünə qoyub dəsmalla örtdü. Geri qayıdarkən ayaq saxlayıb Əşrəfin qaloşuna baxdı. Qız ömründə ilk dəfə qaloş görürdü. Onun parıltısından xoşu gəldi. Dönüb ləpirlərə baxdı. Qaloşun altındakı naxışların izi qarın üstünə düşmüşdü. Pakizə odun gətirmək bəhanəsi ilə qaloşun izinə baxa-baxa doqqaza qədər getdi. Dodaqlarında təbəssüm geri qayıtdı.

Xörək hazır oldu. Pakizə sarı aftafa-ləyən götürdü. Təzə sabun çıxartdı, dəsmalı qolunun üstünə salıb içəri girdi.

Molla Sadıq mütəkkəyə dirsəklənmişdi. Qonaqlar isə bardaş qurub oturmuşdular. Pakizə atasının üzünə baxdı. Kişi boğazını arıtlayıb dikəldi:

– A bala, əlinizi yuyun.

Pakizə irəli gəldi. Su tökdü. Qonaqlar növbə ilə əllərini yudular. Lap axırda Əşrəf əlini silib dəsmalı Pakizəyə verəndə gülümsündü:

– Daha heybəmə pişik qoymayacaqsan ki?

Qız qızardı. Qımışıb boynunu yana əydi. Dabanı üstə fırlanıb otaqdan çıxdı. Xörəyi anası apardı, süfrəni gəlin yığışdırdı, çay verməyi isə ona həvalə etdilər. Pakizə qara güllü podnosda stəkanları düzüb içəri girəndə gözü heç nə görmürdü. O bu saat ayağının dolaşıb yıxılacağından qorxurdu.

Pakizə çayı süfrəyə qoydu. Hamı gülüşürdü. Molla Sadıq qarnını tutub döşəkcəyə uzanmışdı. Şamxal dəsmalla gözünü silirdi. Pakizə saçının dibinə qədər qızardı və qapını açıb bayıra qaçdı. O, başa düşdü ki, Əşrəf Novruz bayramında olan əhvalatı nağıl etmişdir...

Demək, o da həmin gecəni yadından çıxarmamışdır. Demək, hər şey onun xatirindədir. Yəqin ki, o da mənim kimi həmin gecəni tez-tez yadına salmışdır. Mən onun barmaqlarının yerini indi də biləyimdə hiss edirəm, görəsən, o da belədirmi?

Pakizənin gözü kənd yollarında qaldı. Harda qaloş izi gördüsə oraya getdi. Gah su yoluna endi, gah qonşuya getdi, gah da kimi isə çağırmaq bəhanəsi ilə doqqaza çıxdı...

Əşrəf on gün kənddə qaldıqdan sonra Qoriyə oxumağa qayıtdı. O, yola düşəndə Pakizə samanlığın üstündə dayanmışdı.

Əşrəfi sahilə qədər ötürdülər. Burada o, ayaq saxlayıb qohumları ilə görüşdü. Sonra balaca qayığı suya saldılar, kürəkləyib sahildən aralandılar. Qayıq bəzən dayanırdı. Pakizə onların yolu kəsən buzları sındırdıqlarını başa düşdü. Nəhayət, o taya keçdilər. Meşənin kənarında yəhərli-yüyənli dayanmış atların belinə qalxdılar. Qarlı meşədə gözdən itdilər. Pakizə yalnız bundan sonra samanlığın üstündən aşağı endi.

Qayıq geri qayıtdı. Sahildə dayananlar da evə döndülər. Pakizə səhəngi tələsik çiyninə alıb birbaş Kürə endi. Qar hələ var idi. Gecə də bir az yağmışdı. Suyun buzu çox yerdə çatlamışdı. Sırsıralar xışıldaşa-xışıldaşa axıb gedirdi. Pakizə buzlu suya baxa-baxa özünü suvadağa yetirdi. Sahildəki ayaq izlərinə baxdı. Cığırın kənarında, qarın təmiz yerində qaloşun naxışı düşmüşdü.

Pakizə ehtiyatla ətrafa boylandı. Yaxında heç kəsin olmadığını yəqin etdikdən sonra nazik bir ağac götürdü. Qaloşun izinin ortasına sancdı. Tələsik suvadağa enib səhəngini doldurdu. Qaça-qaça evlərinə qayıtdı.

Bundan sonra Pakizə düz bir həftə, çiynində səhəng gündə üç dəfə suya endi. Qaloş izinin itib-itməməsini yoxladı. İz iki gün salamat qaldı. Üçüncü gün Pakizə gördü ki, kimsə qaloş naxışının bir tərəfini tapdalayıb. Qız həyəcanlandı. Onun əlacı olsaydı, ləpir düşən yerə çəpər çəkərdi. O biri gün iz daha da balacalaşdı. Altıncı gün lap az qaldı. Yeddinci gün Pakizə tezdən durdu. Tələsik paltarını geyinib səhəngi götürdü. Hamıdan əvvəl sahilə endi. Suvadağın bərabərində Salatına rast gəldi. Görüşdülər. Söhbət edə-edə Kürə endilər. Pakizə yarğanın qaşına çatanda arxada qaldı. Əşrəfin ləpirini axtardı. Qaloşun naxışı tamamilə silinmişdi. Pakizə özü də hiss etmədən əlini dizinə çırpdı:

– Bıy, gözünüz çıxsın.

Salatın ayaq saxladı. Qanrılıb çiyninin üstündən qıza baxdı:

– Nə olub?

– İzi təmiz ayaqlayıblar.

– Nə izi?

– Qaloşun izini.

– Kimin qaloşunun?

– Əşrəfin.

– Kimin, Əşrəfin?

Salatının təəccüb dolu sərt səsi qızı özünə gətirdi. Pakizə ürəyinin sirrini çölə saldığını, ağzından söz qaçırdığını başa düşdü. Ürkək baxışlarla Salatını süzdü. Onun ürəyindən keçənləri sifətindən oxumaq istədi. Pakizə Salatının gözlərində təəccüb qarışıq bir nifrət parıldadığını duydu. Elə bil Salatın dişlərini bir-birinə sıxıb "bura bax, sənin mənim qardaşımla nə işin var, onun qaloşunun izini niyə nişanlayırsan?" – demək istəyirdi.

Pakizə ani bir şaşqınlıqdan sonra özünü ələ aldı. Vəziyyətdən çıxmaq üçün hələ də ona təəccüblə baxan Salatının üzünə güldü:

– Qaloş izindən yaman xoşum gəlir, elə qəşəng naxışı var ki!

Salatın dinmədi. Sakitcə səhəngləri doldurub geri qayıtdılar.

## 6

Zərnigar xanım ərinə nə qədər nifrət etsə də, onun əlindən yanıqlı, ürəyi dağlı olsa da, kişini unuda bilmirdi. Hərdənbir xəlvətə çəkilib gizlincə ağlayır, Cahandar ağanın halını düşünürdü. O, hiss edirdi ki, kişi sınıqdır, daha əvvəlki hay-harayı yoxdur. Şamxalın ayrılıb getmə-

si, bacısının ölümü onun belini bükübdür. Zərnigar xanım bəzən onu görmək istədiyini, heç olmazsa uzaqdan boyuna baxmaq arzusunun ürəyindən keçdiyini hiss edirdi. Arvad qəlbinin ən ucqar bir guşəsində gizlənib cücərməyə çalışan bu duyğudan qorxsa da, onun qol-qanad açıb güclənə biləcəyi ehtimalından dəhşətə gəlsə də, özü ilə mübarizə aparmağı bacarmırdı. Bəzən ərinin paltarının qoxusu burnuna dəyirdi, səsi qulaqlarında canlanırdı. Cod barmaqların təmasını çiynində, saçında, sinəsində hiss edirdi. Belə hallarda az qalırdı ki, durub birbaş evinə qayıtsın. Arvad hiss edirdi ki, oğlunun yanında onun günü nə qədər xoş keçsə də, gəlini ilə qızı başına dolanıb onun əlini isti sudan soyuq suya vurmağa qoymasalar da, nə isə bir şey çatışmır. O, ərinin xiffətini edirdi. Bir qadın kimi kişi hərarətinin, kişi nəfəsinin həsrətini çəkirdi. Axı, o hələ o qədər də yaşlı deyildi!

Əşrəf gələndən sonra arvadın xəyalı daha da qarışdı. Oğlu məktəbdən qayıdanda onu Cahandar ağanın yanına buraxmayacağını qərara almış olsa da, ürəyi yumşaldı. O gördü ki, Əşrəf iki suyun arasında qalıb, nə atasından keçə bilir, nə də anasından. Bir də o, bu oğlunun da sınıq dolanmasını, atası ola-ola yetimlik çəkməsini istəmirdi. Ürəyindəki bütün kin və qəzəbə, qadın izzət-nəfsinin tapdalanmasına belə analıq hissi üstün gəlirdi. Zərnigar xanım hətta qəsdlənmişdi ki, oğlunu da götürüb geri, ərinin yanına, öz evinə qayıtsın. “Mən baş götürüb evdən çıxanda kimə nə eləyirəm? Günümün bundan ürəyimi ağrıyacaq? Bəlkə onlara da elə bu lazımdır? Əl-ayaqlarına heç kəs dolaşmaz. Zəhmət çəkib ev-eşik tikib cah-cəlal düzəldən mən, hazıra çıxan onlar? Ay Allah, sənin nə insafsız işlərin var! Mənim balalarımı niyə gül kimi soldurub ürəklərinə çal-çarpaz dağ çəkirsən? Mən nə günahın sahibiyəm? Yox, gedəcəm. Kişi məni evdən qovmayıb ki? Özüm çıxıb gəlmişəm. İndi də qayıdacam. Balalarımı başıma yığacağam... Bəs ona necə dözəcəm? Gözüm baxa-baxa nər kimi kişini əlimdən alıb qoynuna salan o həyasızla necə bir damın altında yaşayacam? Allah, sən özün mənə rəhm elə!”

Əşrəf heç nə soruşmasa da, anasının ürəyindən keçənləri duyurdu. Oğlunun atasının hərəkətlərindən razı qalmadığını Zərnigar xanım da hiss edirdi. Ancaq istəmirdi ki, ata ilə kiçik oğlunun da arası açılsın, üz-göz olsunlar. Şamxal da, Güləsər də dinmirdi. Salatın heç nəyə qarışmırdı...

İndi onlar yanaşı uzanmışdılar. Düz üç gün idi ki, Əşrəf anasından ayrılmır, gecələr həyətdə, çardağın altında yer salıb onunla yanaşı yatırdı.

Onlar susurdular. Əşrəf kəndə gələndən sonra evlərində baş verən hadisələri öyrənməyə çalışırdısa da, müəyyən bir aydınlıq əldə edə bilmirdi. Qəribə burası idi ki, heç kəs onunla açıq danışmaq istəmirdi. Gözlərdəki ürkək baxışlarda, dodaqlardakı ifadələrdə nə isə sirli, sehrli bir şey gizlənirdi. Onu ən çox maraqlandıran bibisinin qəfil ölümü idi...

Əşrəf anasının yatmadığını hiss etdi. Dönüb üzünə baxdı. Zərnigar xanım arxası üstə uzanmışdı. Gözlərini göyün üzünə zilləmişdi. Sonsuz ənginliklərdəki ulduzlar sayrışırdı.

– Ana, bibim nədən öldü?

Zərnigar xanım bu sakit sualdan diksindi. O dəhşətli gün gözünün qabağına gəldi. Cahandar ağanın adam göndərib onu çağırtdırdığını, Şahnigarın meyitinin yuyulmasını ona etibar etdiyini xatırladı. Arvad baldızının qanlı sifətini görəndə dəhşətə gəldi, güllə yarasına baxa bilmədi. Onu titrətmə götürdü və hər şeyi başa düşdü. Onu da anladı ki, Cahandar ağa bu sirrin açılmasını istəmir. Elə ona görə də köhnə arvadını çağırtdırıb, ona etibar edib.

Zərnigar xanım cəsədi özü yudu, özü kəfənlədi. Yalnız bundan sonra qohum-əqrəbanı meyitə yaxın buraxdılar. "Günahdır", – deyə kəfəni açmağa qoymadılar...

Zərnigar xanım bütün bu həqiqətləri açıb oğluna söyləyə bilməzdi.

– Taqsır özündə oldu, bala, müridlərə qoşuldu, axırda da özünü bədbəxt elədi.

Əşrəf anasının səsinin titrədiyini hiss etdi. Sezdirmədən onun gözlərinə baxdı. Arvadın kirpikləri islanmışdı. Yanağında yaş giləlәnmişdi.

– Deyəsən, atam mənim bildiyimdən də zalım adamdır.

– Yox, yox, dərdin alım, onda nə taqsır var? – arvadın səsi titrədi və çevrilib oğlunun üzünə baxdı. Onun bir şey duyub-duymadığını yəqinləşdirməyə çalışdı. – Özü öz suçunu başa düşdü. Görünür, bibinin qisməti buymuş.

Əşrəf dinmədi. Qəlbindəki şübhələr daha da çoxaldı. Aralığa yenidən ağır sükut çökdü...

– Bəs atam bu məsələyə necə baxır, Qoca kişi ilə barışıbsınızmı?

– Yox. Nə danışdığındır, ay bala, kişi Şamxalın əlindən zəncir gəmirir, heç barışar?

– Atam Şamxalla barışmasa, mən də o evə ayaq basmayacam.

– Elə söz danışma, dərdin alım, Şamxal ayrı, sən ayrı. Atan da yazıqdır. Tək qalıb.

Əşrəf yerin içində dirsəkləndi. Təəccüblə anasına baxdı:

– Bəs sənə elədiyi pislik?

– Qismətdən artıq yemək olmaz, bala, görünür, Allahın əmri beləymiş. Olacağa çarə yoxdur.

Arvad köksünü ötürdü. Əşrəf onun acizlikdənmi, mütilikdənmi, əlacsızlıqdanmı, yoxsa böyük bir qəlbə malik olub, hər şeyi bağışlamaq istədiyindənmi belə danışdığını ayırd edə bilmədi. O, anası ilə atasını müqayisə etdi. Arvad öz mətanət və alicənablığı ilə onun nəzərində daha da böyüdü. Ona elə gəldi ki, anası hər şeyi Allaha, taleyə bağlamaqla özünü sakitləşdirir, sarsıntılara qalib gəlmək üçün mənəvi təskinlik axtarır.

– Bəndə yoldan çıxanda Allah nə eləsin, ana?

– Elə demə, bala, hər şey Yaradanın əlindədir. Bir də sən belə şeylərə çox fikir vermə. Cahandar ağa sənin atandır, onu tək qoyma.

– Deyirsən, yanına qayıdım?

– Qayıt bala, Salatına da deyəcəm getsin.

– Yox.

– Sözümdən çıxsan, üzünə baxmaram.

Əşrəf dinmədi. Anasını qucaqlayıb, başını onun sinəsinə söykədi. Zərnigar xanım oğlunun qıvrım saçlarını sığalladı.

Külək şiddətləndi. İri damlalı yağış xırdalanıb çisəyə çevrildi. Otlar ağırlaşıb boynunu əydi. Buğumlanmış çiçəklərin, sünbülləşmiş taxılların yarpaqlarında damlalar giləlləndi. Cığırların tapdalanmış sarı torpağı sürüşkənləşdi. Əşrəf başıaçıq, düşüncələr içində haraya getdiyini özü də bilmədən xır yolu ilə irəlilədi. Onun ayağının altındakı xırdaca daşlar xırçıldadı, pırpızlanmış saçına narın çiskin qondu. O fikirli idi... Yolun ağımsov daşları yuyulmuşdu. Göyün üzündəki buludlar seyrəlsə də, hava tutqun idi. Axşam qaranlığının yaxınlaşması bu tutqunluğu daha da gücləndirirdi. Əşrəf üşürgələndiyindənmi, yoxsa islaq qanadlarını qurutmaq istədiklərindənmi, nədənsə tüklərini pırpızlandırıb çırpınan boz quşcuğazlara, çəmənlikdə dolaşan heyvanlara fikir vermədi. Yoldan burulub cığıra düşdü və asta addımlarla sahilə doğru endi.

Kürün yaxası boyu uzanan çəmənlikdəki ot adamın qurşağına çıxırdı. Cığırlar güclə seçilirdi. Suyun üstünü də duman bürümüşdü. Əşrəf yeridikcə şehə batmış otlar, toxumlamış sarı çiçəklər dizinə toxunur, onu isladırdı. Şalvarı müşəmbələnmiş kimi xışıldayırdı. Lakin o bunları sezmirdi. Əşrəf iki suyun arasında qalmışdı. O, anasına haqq

versə də atası ilə necə rəftar edəcəyini, ona nə deyəcəyini, evə təzə gətirilmiş analığı ilə necə oturub-duracağını aydınlaşdıra bilmirdi.

Quşlar pırıltı ilə onun ayağının altından qalxır, beş-on addım uçub yenə cığırın ortasına qonurdular. Taxılların arasında turac oxuyurdu. Dumana bürünmüş Kür isə uğultu ilə axırdı. Sahilboyu fikirli-fikirli xeyli dolaşan Əşrəf, nəhayət, dikdirə qalxdı.

Qarşı tərəfdən bir atlı gəlirdi. Əşrəf bunu görüb evlərinin qənşərindəki dikdirdə ayaq saxladı. Dayanıb gələnin yaxınlaşmasını gözlədi. Əhməd ona çatan kimi atın cilovunu çəkdi. Elə yəhərin qaşından əyilib Əşrəfin boynunu qucaqladı.

– Xoş gördük, Əşrəf koxa, nə var, nə yox, sən buralara xoş gəlmisən!

– Çox sağ olun, Əhməd lələ.

– Maşallah, yekə oğlan olmusan, deyəsən, oxumaq sənə düşüb?

Əşrəf dinmədi. Dodaqucu gülümsünüb başını aşağı saldı. Əhməd atdan endi. Onlar cığırla yanaşı addımladılar. Sahibinin yedəyində gedən at arabir ağzını uzadıb cığırın kənarındakı otlardan qoparırdı.

– Haçan gəlmisən?

– Beş-altı gündür. Dünən “Zayej”ə getmişdim. Yox idiniz.

– Mən də beş-altı gündür şəhərdəyəm. Elə oradan gəlirəm.

– Xeyirdimi?

– Xeyirdir, Əşrəf koxa, icazə verdilər.

– Nəyə?

– Məktəb açmağa.

– Yəni əməlli-başlı məktəb?

– Bəli. Lap əməlli-başlı. Bilirsənmi, Əşrəf, – o birdən dayandı. Diqqətlə Əşrəfin üzünə baxdı. – Axı sənin müəllimin bizim kəndə gəlib çıxmışdı. Sənə bir şey demədi?

– Dedi. Hər şeyi söylədi.

– Aleksey Osipoviç deyəsən sözünə düz adamdır, – deyə Əhməd söhbətinə davam etdi. – Gəlib bizim kənddən Tiflisə keçəndə “Zayej”də qaldı. Mənim işimi çox bəyəndi. Gedəndə söz verdi ki, mütləq Tiflisdə maarif müvəkkilinin yanına dəyəcək və Göytəpədə məktəb açılmasına kömək edəcək. Sənin xəbərin yoxdur. Düz iki il idi ki, hər yerə ərizə yazırdım, ancaq cavab verən yox idi. Nəhayət, indi çağırıb dedilər ki, icazə veririk. Daha bundan sonra gizlində yox, açıq-aşkar dərs keçəcəyik. Sən seminariyanı qurtarıb gələnəcən əməlli-başlı bir məktəb düzəldəcəm. Gərək kəndin ortasında təzə məktəb tikək. Axı təzə müəllim köhnə binada dərs deyə bilməz.

Əhməd həm sevinir, həm də Əşrəfin fikrini dağıtmaq istəyirdi. Ona görə söhbətini şirinləşdirir, arabir zarafata salıb Əşrəfə göz vurur, onun kürəyinə döyürdü:

– Hə, nə deyirsən, razısan?

– Siz olan yerdə mən dərs deyə bilmərəm.

– Deyəcəksən. Əsl müəllim sən olacaqsan. Mən kiməm? Poçt Əhməd, vəssalam. Amma sən Qori seminariyasını bitirmiş bir müəllim olacaqsan. Yox, sənin qabağında dayanmaq olmaz. Əşrəf koxa, yaxşı, bəs, yaylağa haçan gedirsən?

– Sabahda, biri gündə yola düşərlər. Ancaq mən getməyəcəyəm.

– Niyə?

– Qalıb sizə kömək eləyəcəm.

– Nə kömək, Əşrəf koxa?

– Uşaqları hazırlamağa. Bilirsinizmi, Əhməd lələ, Aleksey Osipoviç tapşırdı ki, Osmanı, Səlimi, bir də Həsəni mütləq hazırlayıb seminariyaya aparmaq lazımdır. Mən də söz vermişəm.

– Lap yaxşı eləmisən. Bu işi mən də bəyənirəm. Amma sən yaylağa gedəcəksən.

– Axı onlar aranda qalırlar.

– Bunun eybi yoxdur. Mən burdayam.

– Əhməd lələ...

– Sözümə qulaq as. Onları özüm hazırlayaram. Ancaq sən gərək başqa bir məsələdə mənə kömək eləyəsən.

– O nədi?

– Məktəb tikmək məsələsi. Əgər atan bu işə qol qoymasa, çətin başa gələn işdir.

Əşrəf susdu. Əhməd onun fikrə getdiyini görüb dinmədi. O başa düşdü ki, uşağın ürəyi atasından sınıqdır. Əvvəlki kimi ərkəsöyün deyil.

– Yaxşı, çox fikrə getmə. Sonra görüşüb danışarıq. Salamat qal.

– Yox, yox, gedək bizə.

– Sonra. İndi tələsirəm. Bir-iki məktub var, onları yazıb təcili yola salasıyam.

Əhməd atını minib xır yoluna doğru çapdı. Əşrəf onu gözü ilə xeyli müşayiət etdi və evlərinə sarı yollandı.

Cahandar ağa eyvanda oturmuşdu. Məhəccərə dirsəklənərək, həyətdə, talvarın altında, arabaların qolunu, tarını, taxtalarını yoxlayıb oxunu mazutlayan, dəyə tikmək üçün meşədən kəsib gətirdikləri çu-

buqların düyünlərini arıtlayan nökərlərə göz qoyurdu. Onun məqsədi iki gündən sonra köçmək idi. Ancaq Əşrəfin susması onu çaşdırırdı. Oğlunun kimin yanında qalmaq istədiyini bilmədiyindən, köçü iki gün də təxirə salmışdı. Cahandar ağa Əşrəfi yanından heç yana buraxmayacağını qət etmiş olsa da, hələ bir şey demir, oğlunun özünün söz açmasını gözləyirdi. Bir də o, Əşrəfi gözündən qoymağa qorxurdu. Axır vaxtlar kişi hər şeydən ehtiyat edirdi. Salatının səhənginə güllə dəyməsi, gecə ot tayalarına od vurulması boş-boşuna deyildi. Burada Allahyardan başqa da kiminsə əli var idi. Kim isə bu kənddə ona yol göstərir, hər şeyi nişan verirdi. Cahandar ağa ən çox Çərkəzdən şübhələnirdi. Şamxalla olan dalaşdan sonra bu beyni qan oğlan nə desən eləyə bilərdi. Onu aradan götürmək olmazdımı? Qabağını kəsib suya atmaq, ya da gecənin birində qara damın qapısına bir yaba ot basıb od vurmaq, onu diri-diri yandırmaq nə çətin iş idi? Bəs onda camaat nə deyərdi? Bu heç Cahandar ağaya yaraşardımı? Hamı onu daş-qalaq edib deməzdimi ki, gör kimə qoşulub, kimlə düşmənçilik aparır? Yox, bu, kişilikdən olmazdı. Bir də ki Şamxal... Axı biz onlarla qohum olmuşuq, kişi mənim qudamdır.

Cahandar ağa cığırla evə yaxınlaşan oğlunu gördü. Uzaqdan onun boy-buxununa həsrət və məftunluqla baxdı. Əşrəfin xeyli böyüdüyünün fərqinə indi vardı. Onun ağır, təmkinlə yeriməsindən xoşu gəldi. Ata ona doyunca baxa bilməmişdi. Onunla qabaq-qabağa oturub işıq gözünə söhbət etməmişdi. Qərib yerdə necə dolandığını soruşmamışdı. Oğlu da ona heç nə deməmişdi.

Əşrəf gəldi. Ayağına yapışmış palçığı divara söykədilmiş belin ağzı ilə silib təmizlədi. Pilləkənlə yuxarı qalxdı. Astaca salam verib bir kənarda, küncdəki dirəyə söykənərək dayandı. Cahandar ağa tərpənmədi. Əşrəf də dinmədi. Gözünü Kürün aşağısına, göydəki qara buludların qurtarıb havanın işıqlaşdığı səmtə, meşə ilə maviyə çalan ağımsov səmanın birləşdiyi yerə zillədi.

Qulluqçulardan biri samovardan çay süzüb, məhəccərin üstünə qoydu. Yaşmağını burnunun üstünə qədər qaldırıb Əşrəfin üzünə baxdı. İşarə ilə çay istəyib-istəmədiyini soruşdu. Əşrəf başını buladı. Cahandar ağa bu him-cimdən əsəbiləşib stəkanı götürdü. İkicə hortumda boşaltdı. Nəlbəkiyə qoyub geri, dirəyə doğru itələdi. Oğlunun nəfəsini arxa tərəfdə hiss etsə də dönüb baxmadı. Gümüş tütün qutusunu çıxartdı. Adəti üzrə tələsmədən papiros eşib müştüyə keçirdi. Yandırıb

sümürdü. Ağ tüstü lay-lay havaya qalxıb, onun başının ətrafında dolandı. O, oğlu ilə söhbət etmək istəyirdi. Ancaq sözü necə, nədən başlayacağını bilmirdi. Onun fikri də papirosundan çıxan tüstü kimi bir-birinə qarımışdı. Hamı ilə açıq söhbət edən Cahandar ağa indi Əşrəflə, bir parça uşaqla dil tapa bilmirdi. O elə zənn edirdi ki, Əşrəf Qoridən qayıdandan sonra yenə evdə qalmaqal olacaqdır. Ancaq onun gözlədiyinin əksinə, Əşrəf atasından heç nə soruşmadı. Anasının yanında üç gün qaldıqdan sonra evə qayıtdı. Sakitcə hərlənməyə başladı. Onun fikrindən nələr keçdiyini bilmək çox çətin idi. Cahandar ağanı da narahat edən elə bu idi. Baxışı ilə hamını titrədən bu zəhmli kişi bığ yeri yenicə tərləmiş bu uşağın lal sükutundan qorxurdu. Cahandar ağa papirosunu tüstülədib sussa da, həyəcan keçirirdi. O bu saat geri yanında da, bir cüt gözünün olmasını, oğlunun hər bir balaca hərəkətini nəzərdən qaçırmamağı arzu edirdi. Nəhayət, o bu sükuta dözə bilmədi. Oğluna tərəf üzünü belə çevirmədən astadan, lakin qəti tələbkarlıqla soruşdu:

– Hara getmişdin?

– Qəbristanlığa.

Cahandar ağanın altındakı stul cırıldadı. Kişi yıxılacağından qorxurmuş kimi dirsəklərini məhəccərə söykədi və yumruqlarını gicgahlarına dayadı. Onun sol yumruğundakı müştüyün ucunda yanan papirosun tüstüsü laylanıb papağının qıvrım tükləri arasına doldu. Əşrəf atasının daxili bir ağrıdan qovrulan adamlar kimi sinəsini məhəccərə söykəyib, bir az da büzüşdüyünü hiss etdi. Korun-koruna yanan papirosun külü uzandı. Od müştüyə çatdısa da, Cahandar ağa bunun fərqinə varmadı. Kül ovxalanıb onun çiyninə töküldü. Kişi yerindən tərpənmədi. Bunlara diqqətlə göz qoyan Əşrəf atasının gicgahlarındakı ağ tüklərin çoxaldığını gördü. Bir neçə ay əvvəl, qış tətili zamanı bunlar yox idi. Əşrəf atasının geri dönüb daha nə isə soruşacağını gözlədi. Ancaq Cahandar ağa dinmədi.

– Müştüyün yanır.

– Nə?.. Hə...

Cahandar ağa müştüyü qeyri-ixtiyari ağzına alıb sümürdü və bundan sonra başa düşdü ki, papiros çoxdan külə dönüb. O, kötüyü üfürüb çıxartdı. Müştüyü məxmər köynəyinin döş cibində gizlətdi. Əşrəf, cibinin düyməsini açanda da, bağlayanda da atasının barmaqlarının xəfifcə titrədiyini gördü. Kişi dönüb oğlunun üzünə baxdı. Əşrəf onun qıllı qaşları altındakı qan sağılmış gözlərində zəhmdən başqa nə isə bir

ürkəkliyin də olduğunu duydu. Cahandar ağa keçirdiyi iztirabların gözlərindən oxuna biləcəyini başa düşüb, nəzərlərini Əşrəfin üzündən yayındırdı və ani şaşqınlığa son qoyub, özünü toxtatdı. Bacısını yada salmamaq və bir daha bu söhbətə qayıtmamaq üçün ayağa durdu:

– Gedək arabalara baxaq.

Əşrəf dinməz-söyləməz atasının arxasınca həyətə endi.

Arabalar talvarın altında yan-yana düzülmüşdü. Tapdıq gah taxta yonan dülgərlərə, gah təkərləri yoxlayıb mazutlayanlara, gah da dəyə çubuğu seçib təmizləyənlərə göstəriş verirdi. Balta taqqıltıları, rəndə səsləri bir-birinə qarışmışdı. Arabir dəmir cingiltiləri də eşidilirdi.

Cahandar ağa işləyənlərə yaxınlaşdı. Onlara "yorulmayasınız" dedi. Təzə bağlanmış dördtəkərli arabanın yanında dayandı, ayağı ilə təkərlərin topunu, şinini yoxladı. Boyunduruğa, samıya, samı bağına belə diqqət yetirdi. Tapdığı yanına çağırdı:

– Şini boşalan təkər varmı?

– Var, ağa.

– Hamısını bir də yoxla. Sabah tezdən arabanı qoş, təkərləri dəmirçiyə apar, qoy təzə şin səksinlər. Sonra da get usta Müxəyin yanına, iki cüt təzə təkər bağlayıb, al gətir.

– Baş üstə, ağa, bu saat dörd araba hazırdır. Onları da düzəldərəm.

Tapdıq ondan aralanmaq istədi, ancaq Cahandar ağa nökəri saxladı:

– Bu təzə arabanın üstünün dəyəsini tikin. Səhər tezdən bir cüt saz kəl seç, hörüklü-zadlı apar ver onlara.

– Bəlkə götürmədi, ağa...

Cahandar ağa dönüb onun üzünə elə baxdı ki, Tapdıq dindiyinə peşman oldu. Kişi asta addımlarla samanlığa doğru gedənə qədər yerindən tərpənə bilmədi.

Onlar xırman yerində dayandılar. Cahandar ağa göyün üzünə baxdı. Narazılıqla başını buladı. Sonra saymazyana oğlundan soruşdu:

– Nə qərara gəldin?

– Nə barədə?

– Dağa kiminlə gedəcəksən, mənimlə, yoxsa ananla?

– Heç birinizlə.

– Niyə?

– İşim var.

Cahandar ağa oğlunu altdan-altdan süzdü. Onun belə şax və sərt danışması xoşuna gəlsə də, gülməyi tutdu. Hələ ağzının sarısı getmə-

yən bu uşağın ona cavab qaytarmağına qəribə baxdı. O da səsinin ahəngini dəyişdi. Yarızarafat, yarıkinayə ilə soruşdu:

– Damlara qarovul çəkəcəksən?

Əşrəf atasının gözünün içinə baxdı:

– Yox.

Cahandar ağanın iri həbəşi dodaqlarında qəzəb qarışıq bir istehza dolandı:

– Bəs nə eləyəcəksən, bostanda qalacaqsan?

– İş tapılar.

Kişi dinmədi, başa düşdü ki, oğlu xoşluqla danışmaq istəmir. Görünür, baş verən hadisələr, yəqin ki, anasının sözləri ona təsir etmişdir. Ona görə belə köntöy-köntöy cavab verir. O eyni zamanda hiss etdi ki, gicgahlarındakı damarlar şişməyə, əlləri əsməyə başlayır. Kişi nə qədər çalışdısa da, oğlunun cavab qaytarmasına dözə bilmədi. Bir az da belə getsə, özünü ələ ala bilməyəcəkdi. Yanında saxlamağa çalışdığı və nədənsə bir az hörmət etdiyi bu oğlunu da əzişdirəcəkdi.

Onlar samanlığın üstünə çıxdılar. Cahandar ağa sallağı oturub təzədən papiros eşdi. Əşrəf də onunla yanaşı oturdu. Cahandar ağa papirosunu yandırıb dərindən bir-iki nəfəs alıb sümürdükdən sonra özünü ələ aldı və sakitcə soruşdu:

– İşin adını bilmək olmazmı?

– Niyə olmur, məktəb məsələsidir.

Kişi heç nə başa düşmədi. Papirosunu sümürə-sümürə oğlunun üzünə baxıb dayandı. Əşrəf yenidən dilləndi:

– Gərək bizə kömək eləyəsən.

– Siz kimsiniz?

– Əhməd lələylə mənə. Elə oxumaq istəyənlərin hamısına.

– Nə kömək, bala?

Əşrəf atasının səsinin yumşaldığını, onun sualında qayğıkeşlik və maraq olduğunu duydu:

– Bilirsənmi, ata, padşahın əmri var, kəndlərin çoxunda məktəb açılacaq, kəndçi uşaqları oxuyacaq. Gərək bizim kənddə də məktəb açılsın.

– Açılsın, mən nə deyirəm...

– Kəndlərin çoxunda təzə məktəb tikirlər, bəs biz?

Cahandar ağa oğlunu yeni görürmüş kimi diqqətlə Əşrəfin üzünə baxdı. Gözünü Kürə tərəf zillədi. Əşrəf də atası kimi o tərəfə baxdı. Kürün bəri üzündəki çəmənlik onların idi. O taydakı meşədə də otlaq yerləri var idi. Kəndin üst tərəfində biçənəkləri, bir az o yandakı əkin

yerləri uzanıb gedirdi. Onların torpağını bir günə atla gəzib qurtarmaq olmazdı. Əşrəf çəmənlikdə otlayan mallara baxdı və birdən Qoca kişi yadına düşdü. Sahildə onunla elədiyi söhbəti xatırladı. Gözlənilmədən atasından soruşdu:

– Kəndimizdə səndən varlı adam varmı?

Kişi dayandı. Onun qaşının biri yuxarı qalxdı, o biri isə gözünün üstünə endi:

– Nə demək istəyirsən?

– Bizim neçə hektar yerimiz var.

– Sözünü de.

– Kəndimizdə elə adam varmı ki, heç torpağı olmasın?

– Dedim ki, sözünü de!

– Olmazmı öz torpağımızdan bir az kasıblara verək?

Kişi papirosunu kötüyünə qədər sümürdü. Dərindən nəfəs alıb, tüstünü burun deşiklərindən fısqırtdı. Tüstü havaya qalxıb laylandı. Əşrəf atasının tüstü arxasından ona necə tərs-tərs baxdığını gördü.

– Kimi deyirsən?

– Elə biri Qoca dayını.

Cahandar ağanın qalın dodaqları azacıq qaçdı. Əşrəf atasının gözlərində şimşək kimi çaxıb keçən qəzəbi gördü. Ancaq bu ani qəzəbi başqa bir hiss, təəssüf qarışıq istehza əvəz etdi:

– Bunu sənə kim öyrədib? Yoxsa qardaşın lüt qayınatasının qarnını mənim hesabıma doldurmaq istəyir?

Kişinin səsi xırıldadı. Yanağının əti səyriməyə başladı. Beyninə qan vuran adamlar kimi gözləri qıpqırmızı oldu:

– Bir də mənim yanımda belə sözlər danışma. Mənim sümüyümü it sümüyünə caladığınız bəsdir.

Cahandar ağa ayağa durub, samanlığın üstündən endi. Əşrəf də durdu. Dinmədilər. Cahandar ağa "uşağın başı xarab olub, nədir?

–deyə öz-özünə düşünməyə başladı. – Necə yəni kasıblara torpaq payla, məktəb tikdir, bunlar mənim nəyimə lazımdır?"

– Mən səni belə bilməzdim, ata.

Cahandar ağa dabanı üstə geri fırlandı. Rəngi tunc kimi bozardı. Qaşları gözünün üstünə endi. Onun iri, həbəşi dodaqları səyridi:

– Get hazırlaş. Yağış ara verən kimi yaylağa yola düşəcəyik.

– Mən getməyəcəyəm.

Kişinin sinəsi qabardı. Burun pərələri genişləndi:

– Söz güləşdirmə!

## 7

Qoca kişi nə qədər çalışdısa da, evdə dayana bilmədi. Qapını açıb içəri girmək, palaz atıb taxtın üstündə uzanmaq fikrindən daşındı. Qaranlıq və rütubətli daxma ona daha nəmli və tutqun göründü. İnsan nəfəsi ilə isinməyən evin soyuqluğu kişini üşütdü. Ömründə ilk dəfə özünü tam yalqız və kimsəsiz hiss etdi. Arvadı öləndən sonra da bir müddət evdən soyumuşdu. Ancaq bu hal çox çəkməmişdi. Qızı Güləsərin mehriban davranışı, oğlu Çərkəzin qapıda hərlənməsi onu ürəkləndirmişdi. Amma indi vəziyyət tamamilə başqa cür idi. Güləsər gedəndən sonra ev bomboş qalmışdı. Əvvəllər Kürün qırağından qayıdanda heç olmazsa qızı onu qarşılayardı. Azdan-çoxdan bir şey tapıb bişirər, atası ilə Çərkəzi yedizdirərdi. Qoca kişi bədəninin ağrılarını unudardı...

Kişi iri bir daş tapıb bayırda, çardağın qabağında oturdu. Həyəti ot basmışdı. Kürün sahilinə doğru uzanan cığırın torpağı çat-çat olub yarılmışdı. Üstünü çayır və ilanotu bürüyən bu kiçik yolcuğaz güclə seçilirdi. Qarışqalar bu yolla gediş-gəlişin olmadığını duymuş kimi qatarlaşıb, arxayın-arxayın yuvalarına yem daşıyırdılar.

Qoca kişi bir xeyli ot, ələf basmış həyətə, çiçəkləyən qanqallara, sirkənli kalafalıqlara boylandı. Səssizlikdən qulaqları güyüldədi. İsti yaz günəşinin təsiri ilə xumarlanan təbiət sanki mürgüləyirdi. Zəncirotlarının zərif, toz kimi yüngül lifləri havada uçuşurdu. Arabir çəyirtkələr otdan-ota atılırdılar. Xır yolundan o tərəfdə, dəmyə təpəliklərin ətəyindəki düzənlikdə uzunqulaqlar bir-birini qovaraq anqırışırdılar. Elə bil kənd bomboş idi.

Kişi darıxdı. Ayağa durub həyətdəki tənha saqqız ağacının kölgəsinə getdi. Orada dayanıb gözləri ilə sahilə doğru uzanan cığırı axtardı. Əvvəllər biçənəklərin otu qalınlaşıb qurşağa qədər çıxsa da, Güləsərin saldığı əyri-üyrü ağ cığır yaşıllıqları yarıb düz sahilə enərdi. Amma indi cığırı ot basmışdı. Bir az da belə getsə tamam itib-batacaqdı. Kişi qəhərləndi. Cığırla düz Kürə doğru yollandı. Nəzərlərini yerdən çəkmədən irəlilədi. Elə bil gediş-gəliş kəsilmiş bu yolda qızı Güləsərin ayaq izlərini axtarırdı. Kim bilir, bəlkə də buna rast gələcəkdi? Güləsərin bu yolla axırıncı dəfə suya getdiyi vaxt torpağa düşən ləpirini bəlkə də heç yağış yuyub aparmamış, mal-qara tapdalamamışdı? "Taqsır məndədir. Deyəsən ürəyim lap daşa dönüb. İndiyəcən bir kərə dalınca gedib onu axtarmamışam. Əgər Şamxalın qapısını açsam, məni qovacaqdılarmı? Bəs o yazıq neyləsin? Çərkəzdə də günah oldu. Dik-

başlıq eləyib dava salmasaydı, indi bəlkə birtəhər barışmışdıq. Amma innən sonra bu iş baş tutmaz, oğlumu ayaqlayıb onun qapısına gedə bilmərəm. Ancaq elə burada, suyun qırağında, Güləsərə rast gəlsəm, onunla görüşsəm, Çərkəz mənə nə deyəcək? Soruşsa, balıq tutmaqdan qayıdırdım, su yolunda qarşılaşdıq desəm, mənə inanmazmı? Bəlkə elə doğrudan da bu bəhanə ilə suyun kənarında gözləyim, axşama qədər evə getməyim, hə, necə olar? Bəlkə yazıq qızı heç evdən bayıra buraxmırlar? Bəlkə uşağın başında bir iş var?"

Kişi bu ağır düşüncələrlə, cığıra baxa-baxa, özü də hiss etmədən çəmənliyi keçib sahilə çatdı. Yarğanda əks-səda verən qaqqıltılar onu xəyaldan ayırdı. Qoca kişi suvadağda su dolduran qadınları gördü. Gəlinlər qəfəsdən buraxılmış quş kimi yalnız burada, Kürün sahilində sərbəst nəfəs ala bildikləri üçün cavan qızlardan geri qalmaq istəmir, bir-birini sulayır, arabir də onlara sataşan şıltaq qızları tutub çimdikləyirdilər. Onlar isə bədənləri göyərsə də, daha da şitənir, fürsət tapan kimi intiqam alır, işləri çətinə düşəndə isə cingiltili səs-küylə, qaqqıldaşa-qaqqıldaşa yarğanın dibi ilə qaçışırdılar. Qoca kişi arvadlardan birinin "ay gününüz qara gəlməsin, deyəsən mazaq axtarırsınız?" – dediyini belə eşitdi. Bu zarafatlar onun dərdini bir az dağıtdı. Kişi hətta adəti üzrə onlara qoşulmaq, yeniyetmə qızlara bir-iki baməzə söz də demək istədi. Ancaq qızlardan biri yarğanın qaşında dayanan Qoca kişinin suya düşən kölgəsini görən kimi "gələn var" – deyə pıçıldadı və tələsik səhəngini suya basdı. Gəlinlər yaşmaqlarını burunlarına qədər qaldırdılar. Elə bil suya daş atdılar. Yarğanda əks-səda verən gülüşlər kəsildi. Yalnız Kür əvvəlki kimi qıjıltı və uğultu ilə axmağında davam etdi...

Bu sükut və kədər kişinin qəlbində bir az əvvəl baş qaldıran sevincini qovub apardısa da, sahildən uzaqlaşmadı. Güləsərin də burada olacağı ümidi onu yerindən tərpənməyə qoymadı. Kişi birdən-birə dirçəldi. Qaçırılandan bəri üzünə həsrət qaldığı qızını heç olmasa uzaqdan görə bilmək, bəlkə də yaxınlaşıb kefini soruşa bilmək arzusu onun gözlərinə işıq gətirdi.

Suya gələnlər səhənglərini doldurub dikdirə çıxdılar. O, gözünü zilləyib arvadlara baxdı. Ona elə gəldi ki, Güləsər çiynində səhəng, bu saat suvadağdan yuxarı qalxacaqdır. Kişinin gözü alacalandı. Qarşısından keçənlərin sifəti dumana büründü, əvəzində isə məzlum çöhrəli Güləsər canlandı. Lakin qızlar durna kimi qatarlaşıb cığırla dikdirə

qalxanda, Qoca kişi ümidinin boşa çıxdığını anladı. O başa düşdü ki, həsrət qövr edən yaralar kimi qəlbinin başını göynədir. Kişi birdən-birə irəli qaçmaq, gəlinlərdən birini saxlayıb, Güləsəri görüb-görmədiklərini soruşmaq istədi. Ancaq susdu, bunu qüruruna sığışdırmadı. Torlanmış gözləri yaşardı, qolları yanına düşdü. Elə bu zaman hiss etdi ki, kimsə geri yanında astadan tövşüyür. Kişi çevrildi. Salatın çiynində səhəng, yarğanın qaşında dayanmışdı. Qızın gözləri gülümsəsə də, bir yerdə dura bilmir, civə kimi sağa-sola qaçırdı. O gah kirpiklərini çaxıb göz qapaqlarını aşağı salır, gah ötəricə kişiyə baxır, gah da nəzərini yerə zilləyirdi. Elə bil nədənsə çəkinir, qabağa gəlib söz deməyə cəsarəti çatmırdı. Qoca kişi də, demək olar ki, eyni halı keçirirdi. Salatını görəndən sonra necə hərəkət edəcəyini müəyyənləşdirə bilmirdi. Dinməz-söyləməz ötüb getsinmi, yoxsa qızı gülərüzlə dindirib Güləsəri soruşsunmu? Kişi xeyli susdu. Salatının yanaqları gah qızarır, gah da ağarırdı. Əgər Qoca kişi diqqətlə baxsaydı, onun gözlərində xəcalət çəkən bir adamın iztirablarını oxuyardı. Salatın ixtiyar bir adamı dərdə saldıqlarına görə qardaşının əvəzinə utanır, həm də eyni zamanda ona təsəlli vermək, sınıq könlünü şadlandırmaq istəyirdi. Kişi isə ürəyi dolu olsa da, susurdu.

– Nə var, nə yox, Qoca dayı?

Kişi baxışını yerdən qaldırdı. Gözünü Salatının üzünə zillədi. Onun yanları qırış-qırış olmuş gözləri yaşardı.

– Sən söylə, qızım, görək nə var, nə yox.

– Salamatlıqdır.

– Allaha şükür...

Kişi dərindən köksünü ötürüb, gözünü qızın çiyninin üstündən o yana, Kürün sahilindəki meşəyə doğru zillədi. Göyün o üzündə toplanan ağ buludlara baxdı. Salatın onun pilə kimi yumşaq, ağ saqqalının seyrək tükləri arasından hülqumunun bir neçə dəfə qalxıb-endiyini, dərisi qırış-qırış olmuş boynundakı damarların şişdiyini gördü. Kişi boğazında bir şey qalmış kimi udqunurdu.

– Onun fikrini çəkmə, Qoca dayı.

Salatının sözləri kişini haraya isə, lap uzaqlara uçub getmiş xəyaldan ayırdı. O, günahkar bir uşaq kimi gülümsündü:

– Olmur, qızım, dözə bilmirəm.

Salatın susdu. Kişinin kövrək səsi onu da qüssələndirdi. Güləsərin atasını yarğanın qaşında görən kimi qəsdən ləngiyib yoldaşlarından

aralanan Salatın onu təskin etmək üçün söz tapa bilmirdi. Elə bil kişinin də nitqi tutulmuşdu. Qız darıxdı. Qıvrıla-qıvrıla çəmənliyin ortasından keçib kəndə doğru uzanan cığırda dayananlar onu gözləyirdilər.

– Sözün, söhbətin, Qoca dayı?

Kişi Salatının getmək istədiyini anladı. Belə münasib fürsəti əldən verəcəyindən qorxdu. Boynunu yana doğru əyib qızın üzünə baxdı:

– Onu görmək istəyirəm, bala.

– Heç elə şey olarmı?

– Niyə olmur, qızım, səndən asılıdır, istəsən olar.

– Məndən asılıdır?

Kişi başını tərpətdi. Salatın üzünə zillənən gözlərdəki xırdaca nazik damarları gördü. Qarasının ətrafını bozumtul ağ basmış gözlərin həlqəsi yaşarmışdı. İslaq kirpiklərin dibi qızarmışdı. Bəbəklər ən ucqar ulduzlar kimi gah kiçilib solğunlaşır, gah da qığılcım kimi qorlanıb parıldayırdı. Ürəyinin çırpıntısına uyğun olaraq gah güclənib közərən, gah da zəifləyib güclə işıldayan gözlərə diqqətlə baxan Salatın dərk etdi ki, həsrətdən ürəyi zoqquldayan, balasından ötəri burnunun ucu göynəyən bu talesiz qocanın axıra qədər ayaq üstündə dayanıb-dayana bilməməsi onun cavabından asılıdır. Əgər Salatın onun xahişini rədd etsə, ayaq üstündə keçinəcəkdir. Qız iki od arasında qalmışdı. Bibisinin ölümündən sonra atasının gözünə görünmək olmurdu. Qardaşı Şamxalın qaşqabağı açılmırdı. Onlar dava üçün bir bəhanə axtarırdılar. Belə bir vaxtda qardaşından icazəsiz Güləsəri evdən bayıra çıxartsa, qızı gizlincə atası ilə görüşdürsə, Şamxal bundan xəbər tutsa, onun saçından yapışıb kəndin ortası ilə sürüməzmi? Güləsəri də ona qatıb çubuğun altına salmazdımı? Bəs bu yazıq Qoca kişi neyləsin, onun günahı nədir?

Salatının sükutu Qoca kişiyə bir il qədər uzun göründü. Qız xeyli tərəddüddən sonra onun yanından ötüb getmək istəyəndə kişiyə elə gəldi ki, ürəyini çəkib yerindən qopartdılar, nəfəsi daralıb sinəsinin başına yığıldı. Dillənmək istədisə də səsi çıxmadı. Salatın ondan aralanıb beş-altı addım gedəndən sonra bunları duymuş kimi qanrılıb geri baxdı.

– Qoca dayı...

Kişinin məyuslaşan sifəti birdən-birə canlandı:

– Nədi, bala?

– Heç yana getmə.

– Niyə ki?
– Bizi gözlə.
– Gözlərəm, dərdin alım.
Salatın yüngül addımlarla irəliləyib, cığırın ortasında onu gözləyən qızlara çatdı. Qoca kişi isə yüngülcə nəfəs alıb suvadağa endi. Bir xeyli xırdaca yumru daşları ayaqları ilə şaqqıldada-şaqqıldada sahillə, suyun axarı boyu irəlilədi. Yarğanın kölgəsində çömbəltmə oturdu. Papağını çıxardıb dizinə keçirdi. Əlini qoşalayıb sərin sudan doldurdu və üzünə çırpdı. Yaş əlini qırxıq başına çəkdi. Kişinin çiynindən elə bil dağ götürüldü. Hər şeyi unudub suyun qırçın ləpələrinə, az qala dibindəki daşları belə görünən çayda sürü ilə üzüşən bıçqıl balıqlara baxdı. Bir az o yanda, qarşıdakı adacıqda yulğun kollarının arasındakı iydələr çiçəkləmişdi. Suyun üzünü qaysaqlandıran həzin meh kolları xışıldadaraq, çiçəklərin ətrini havaya hopdururdu. Adam az qalırdı bihuş olsun...
Kişi beləcə, su ilə oynaya-oynaya xeyli gözlədi. Gəmini o taya keçirməli olduğunu, geri qayıdan binələri bəri üzə addadacağını unutdu. Hətta sahildə nə üçün dayandığını, kimi gözlədiyini belə yadından çıxartdı. Kişi birdən-birə təbiətə məftun olmuş yeniyetmə cavan kimi hər şeyə diqqət yetirir, axar sulara, süzən quşlara, yaşıl don geyinmiş meşəyə baxmaqdan doymurdu. Qoca kişinin başı o qədər qarışmışdı ki, kənardaca dayanıb ona tamaşa edən qızının gəldiyini belə hiss etmədi. Salatının xəbərdarlığına baxmayaraq, bütün yolu tövşüyə-tövşüyə gələn, az qala evdən su yoluna qədər qaçan, cığırın kələ-kötür yerlərində tez-tez ayağı büdrəyən Güləsər atasını sahildə görən kimi daşa dönüb yerindəcə qaldı. Nə qədər çalışdısa da, addımını ata bilmədi. Əgər Salatın yarğanın qaşından suya daş atmasaydı, bəlkə də onlar beləcə xeyli susacaqdılar. Lakin şappıltı kişini diksindirdi. O, xəyaldan ayrılıb ətrafına boylandı və Güləsəri gördü. Kişi ehmalca, sanki qarşısında dayanan bir xəyalın yox olacağından ehtiyat edirmiş kimi ayağa durdu. Papağının dizinin üstündən sürüşüb düşməsinin fərqinə varmadı. Dinməz-söyləməz qızına yaxınlaşdı. Kişi özünü itirdi. Onunla üzbəüz dayanan gəlinin öz qızı olub-olmadığına şübhə edirmiş kimi susdu. Güləsər arıq, qarayanız, açıq havada gəzdiyindən həmişə yanaqları və dodaqları qaysaq-qaysaq olan, nimdaş paltarlı, ayağı yalın, başıaçıq bir qız idi. İndi onun qarşısında dayanan gəlin isə ətli-əndamlı bir qadın idi. Belində iri gümüş kəmər var idi. Sinəsi atlaz koftanı dik tuturdu. Qırçınlı uzun ipək donu topuğuna qədər enir, az qala ayaqqa-

bısının üstünü örtürdü. Yaşıl yelənli qara kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Qızın qulağındakı qızıl sırğalar boynundakı damarların zərifcə vurmasına uyğun olaraq titrəyirdi. Zil qara saçı ortadan ayrılmışdı. Kişi duruxdu. Nə qədər çalışdısa da, əvvəlki Güləsəri xəyalından çıxarda bilmədi. Azca buxaq bağlamış ağ bənizli, qolu bilərzikli bu gəlinin öz qızı olduğuna şübhə etdi. Arıq bir qızın ərə gedəndən sonra, az bir vaxtın içində bu qədər gözəlləşməsini kişi ağlına sığışdıra bilmirdi.

Güləsər atasının yad bir adam kimi dayanıb boylanmasına dözə bilmədi. Qollarını açıb kişinin boynunu qucaqladı. Hıçqıra-hıçqıra atasının üz-gözündən öpdü. Onun damarları çıxmış əllərini yanağına yapışdırıb göz yaşı ilə islatdı.

– Qurban olum, ay dədə, nə yaxşı məni yadına saldın?

Kişi yalnız qızının səsini eşidəndən sonra dirçəldi. Güləsərin başını sinəsinə sıxıb, saçını sığalladı. Gözündən gilələnib süzülmək istəyən yaşını geri qaytarıb sinəsinə axıtdı. Susdu. Qızının da, özünün də sakitləşməsini gözlədi. Bir az əvvəl hiss etdiyi yadlıq yox oldu. Bərli-bəzəkli, telli-toqqalı gəlin gözünün qabağından çəkilib getdi, əvəzinə isə sinəsinə qısılmış dəcəl qızı Güləsər gəldi. Kişi onun titrək səsinin dəyişmədiyini, mışıltısının əvvəlki kimi doğma olduğunu duydu. Saçının qoxusundan, bədəninin ətrindən hiss etdi ki, onun qoynuna sığınan, həsrətini çəkdiyi doğma qızı Güləsərdir. O qətiyyən dəyişməyib, yenə əvvəlki kimi atasına mehribandır.

– Səni yaddan çıxartmaq olarmı, bala?

Onlar kənara çəkilib, yarğanın kölgəsində, daşların üstündə oturdular. Ürəkləri sözlə dolu olsa da, susdular. Bir az əvvəl başını sinəsinə sıxıb saçını sığalladığı qızını kişi təzədən diqqətlə nəzərdən keçirdi. Onun gözləri sanki bir az böyümüşdü. Dodaqları azca qalınlaşıb sulanmışdı. Sinəsi qabarıq idi. Kişi qızının yanaqlarının tozu silinmiş alma kimi allaşdığını, altı kölgələnmiş gözlərinin üstünə enən kirpiklərinin bir az da qalınlaşıb uzandığının fərqinə vardı. Hiss etdi ki, bu az müddətdə Güləsər bir az da yaşa dolub toxtamışdır. Kişi qızının gəlin olmasına, uşaqlıq dövrünü keçirib qadına çevrilməsinə inana bilmədi. Lakin o, başa düşürdü ki, Güləsər bir daha ayaqyalın, başıaçıq, taxılların arasında dolaşan qız olmayacaq, bir daha atasının qazma daxmasını silib-süpürməyəcək, bir daha geri, atası evinə qayıtmayacaqdır. O, əziz bir adamını əbədi itirdiyini indicə anladı. Nə edəcəyini bilmədi. Bilmədi ki, bu hala sevinsin, yoxsa kədərlənsin.

Güləsər atasının qəribə bir halla onu süzdüyünü hiss edib kəlağayını irəli çəkdi. Yanaqlarında qıvrılan saçlarını yığıb qulağının ardında gizlətdi. Kəlağayının ucunu sinəsindən aşağı salladı, ayağını yığıb uzun donunun altında gizlədi:

– Mənə niyə elə baxırsan, ay dədə?

– Heç özüm də bilmirəm, qızım, mənə nə olub. Danışmağa söz də tapmıram.

Yenə susdular. İndi də Güləsər atasını süzdü. Onun belinin azca əyildiyinin fərqinə vardı. Kişinin saqqalı daha da yuxalmışdı. Yanaqlarının almacıq sümükləri çıxmışdı. Həmişə qırmızı olan və yanaqlarındakı xırdaca damarları görünən bənizi solmuşdu. Gözlər elə bil şəffaflığını itirmişdi. Əyni-başı da tökülmüşdü. Alt köynəyinin yaxası qapqara idi. Üst paltarı didik-didik olmuşdu. Düymələr çözələnib tökülürdü. Qızın gözü yaşardı və başa düşdü ki, evdən gedəndən sonra atasının paltarlarını heç kəs yumamışdır. Güləsər birdən-birə sıxıldı. Özünün geyinib-kecindiyinə, atasınınsa yarımçılpaq vəziyyətdə olmasına görə xəcalət çəkdi. Görüşməyə gələrkən yaxşı paltar geyindiyinə peşman oldu. O, atasını sevindirmək, yaxşı gün görməsi ilə onun ürəyini açmaq məqsədi ilə belə etmişdi. İndi isə atasının birdən-birə tutulmasını görüb pərt oldu. "Bəlkə atam ürəyində məndən incidi? Biz nə gündəyik, bu nə kefdədir, deyə məni yamanladı? Bəlkə buna haqqı var? Bircə dəfə onları yada salmamışam". Güləsər evə qayıdan kimi Şamxalın paltarlarından gətirib atasına verəcəyini xəyalından keçirdi. "Nə olar, Şamxal buna nə deyəcək? Biz ki, qohum olmuşuq. Atam öz kürəkəninin paltarını geyinməzmi? Şamxal istəməzmi ki, qayınatasının əyni-başı abırlı olsun? Qızını istəyən oğul gərək qayınatasının da qeydinə qalsın. Elə lap Çərkəz özü də. Adam qohum olur ki, qaynayıb-qarışsın, daha düşmənçilik eləmək nə üçün? İndiyəcən gərək çoxdan barışıqlıq olaydı. Məndə də taqsır var. Gərək Şamxalı başa salıb inadından döndərəydim. Aralar düzəlsə nə yaxşı olar! Atamın bizə ayağı açılar, gediş-gəliş başlayar. Fürsət tapanda mən özüm də evimizə gedərəm., paltar-palazlarını yuyaram, biş-düşümüz olanda onların payını saxlaram".

Güləsər əlini yaxasına apardı. Koftasının iç tərəfindən iynə-sap çıxartdı.

– Gətir tikim.

– Nəyi, qızım?

– Köynəyin düymələrini.

Qoca kişi gözünü qızından çəkib özünə, düymələri çözələnmiş cırıq və çirkli köynəyinə baxdı. Balasını utandırdığındanmı, yoxsa övladı qarşısında ilk dəfə olaraq özünün yoxsulluğunu, abırlı paltar belə geyinə bilmədiyini, beləliklə də atalıq, insanlıq və nəhayət, kişilik qürurunun tapdalanmasından xəcalət çəkdiyindənmi, nədənsə azacıq qızardı. Hətta əlini yaxasına aparıb sinəsini örtmək və alt paltarının cırıq-sökük yerlərini gizlətmək istədi. Həmişə Güləsərdən çəkinmədən paltarlarını yuyulmağa verən Qoca kişi indi öz qızından həya etdi.

– Lazım deyil, bala.

– Niyə, məndən utanırsan?

– Yox, bala, zəhmətinə dəyməz. Onsuz da əyinə alınası deyil.

– Soyun, heç olmazsa düymələrini bərkidim.

– İstəməz.

Güləsər Qoca kişinin etirazına baxmayaraq, mehriban və doğma bir adam ərkyanalığı ilə əlini atasının yaxasına uzatdı:

– Yaxşı, soyunma, ancaq düymələrini tikəcəm.

Güləsər kişiyə dinməyə imkan vermədən işinə başladı. O, qızının nəfəsini sinəsində duydu. Saçının qoxusu burnunu qıdıqladı. Güləsərin barmaqları onun yaxasını açdı. Bir az əvvəlki yadlıq və utancaqlıq yox oldu. Hər ikisi özünü sərbəst hiss etdi. Hətta Güləsər əvvəllər olduğu kimi gülüb, zarafata başladı. Atasının könlünü almağa çalışdı:

– Ağzına çöp al, ay dədə, sonra şərə düşərsən.

Kişinin dodaqları qaçdı:

– Şərə düşəsi vaxtım çoxdan keçib, bala, heç nə olmaz.

Güləsər düyməni bərkitdi. Başını aşağı əyib, dişi ilə sapı kəsdi.

– Paltarlarınızı kim yuyur?

– Heç kim, özümüz suya çəkirik.

– Çərkəz də?

Güləsərin təəccübünə cavab olaraq kişi qızına sataşmağı, əvvəllər olduğu kimi onu cinlətməyi lazım bildi. Gözünü qıyıb gülümsündü:

– Yəni sənin qardaşın Çərkəz məndən artıq kişinin oğludur, mən paltarımı özüm yuya bilərəm, o yox?

– Mən elə demək istəmirəm, ay dədə...

Güləsərin qaşları çatıldı. Atasının zarafatı cavabsız qaldı. Kişi özü də bunu hiss edib susdu.

– Çərkəz nə təhərdir?

– Pis deyil. – Qoca kişi qızının gözlərini yerə dikdiyinə nəzər yetirdi. Güləsərin alnını tər basmışdı. Yanaqları pörtmüşdü. – Amma səndən yaman yanıqlıdır.

– Məndə nə günah var?

– Orası elədir, amma bizi yaman yetim qoydun.

Güləsər bir istədi “Mən beş gün tez, beş gün gec, əvvəl-axır çıxıb getməliydim” – desin. Amma dilinin ucuna gələn sözü geri qaytarıb söhbəti dəyişdi:

– Bəs fikrin nədir, ay dədə, Çərkəzin əlini başına yığmaq istəmirsənmi?

– Dindirmək olmur, bala, mən də qalmışam naçar.

Ata ilə balanın söhbəti nə qədər şirin olsa da, Salatın onları bir-birindən ayırmaq istəməsə də, suya enən qızları görəndə, şərtləşdikləri kimi, Kürə balaca bir daş atmalı oldu. Güləsər işarəni anladı, atasının boynunu qucaqlayıb tələsik üz-gözündən öpdü:

– Qurbanın olum, ay dədə, incimə, mən gedim. Sonra Şamxal bilər. Bax sabah günortaüstü yenə də burada gözləyəcəm. Paltarlarınızı gətirin yuyum. Sənə xörək də bişirəcəm. Çərkəzin də payını gətirəcəm, eşitdinmi?

– Zəhmət çəkmə, qızım, heç nə lazım deyil.

– Qağamın canı üçün ölənəcən üzünə baxmaram, ay dədə, sözümü yerə salma. Gözlərinə qurban olum, sabah gəlməmiş olma. Sənə ayrı sözüm də var.

Qoca kişi qızın ürəyini sındırmaq istəmədi. Onun evə qəlbi nisgilli qayıtmasına qıymadı:

– Yaxşı, baxarıq.

– Baxarıq yox, mütləq gəl.

Güləsər ayağa durdu. Qoca kişi də qalxdı. Bayaqdan kənara düşüb qalan papağını yerdən götürüb çırpdı. Güləsər gözünün yaşını silib, səhənglərin yanında dayanan Salatına yaxınlaşdı. Qoca kişi birdən-birə uşaq kimi kövrəlib qızının yolunu kəsdi.

– Gəl səni bir də öpüm, bala, dünya ölüm-itim dünyasıdır.

Güləsər hıçqırığını güclə boğdu. Atasını dönə-dönə öpdü. Salatının da gözləri yaşardı.

– Gəl səni də öpüm, bala, Allah səni də nə arzulayırsansa, ona çatdırsın.

– Sağ ol, Qoca dayı.

Qızlar dikdiri aşıb gözdən itəndən sonra Qoca kişi üzünü qabarıb köpüklənən Kürün adacıqların başına dolanan sularına, uçurumlu-yarğanlı sahillərə, bir-birini qovub çiləkənlərə çırpılan dalğalara, bütöv ağacları belə qatlayıb ovxalayan burulğanlara baxdı. Gözünü aşağıda, başı az qala buludlara toxunan qayalıqların alt tərəfindəki girməyə doğru zillədi. Orada onu burulğanlı, köpüklü sular, bir də əlli ildən bəri birlikdə bərkə-boşa düşdükləri gəmisi gözləyirdi...

## 8

Günorta üstünə yaxın xır yolunun aşağı tərəfindən, Acı dərənin yanındakı döngədən bir dəstə atlı kazak çıxdı. Onların ardınca zınqırovlu bir fayton dikdirə qalxdı. Arxadan yenə iki cərgə düzülmüş atlı gəldi. Xır yoluna səs düşdü. Daşlara toxunan nallar ahəngdar şəkildə çaqqıldadı. Azacıq toz qalxdı. Caydaq atlar yortmağa başladı. Qıllı papaqlı, uzunsaqqal kazaklar yəhərin üstündə qalxıb-endilər. Çəkmələrinin dabanlarındakı dişli dəmirlərlə atları mahmızladılar. Dəstə kəndə yaxınlaşdı. Göytəpəlilər təşviş və həyəcan içərisində dayanıb gələnlərə uzaqdan tamaşa etdilər. Uşaqlar damların üstünə çıxdılar. Kazakların böyründən sallanan və az qala yerə dəyən uzun qılınclarının dəmirləri və tüfənglərinin lülələri parıldadı. Onlar əyinlərinə şabalıdı rəngli yun çuxa geymiş, başlarına iri qıllı papaq qoymuşdular. Papaqlarının ortasındakı qırmızı və başlıqlarının qotazları aydın seçilirdi. Fayton qapqara idi. Gün vurduqca parıldayırdı. Onun içində oturanlar da elə bil qızıla bürünmüşdülər. Çiyinləri, döşləri işım-işım işıldayırdı.

Dəstə kənddən xeyli aralandı. Camaat onların Tiflisə ötüb keçdiklərini yəqin edib arxayınlaşdı. Ancaq atlılar gözlənilmədən burulub "Zayej"in qabağında dayandılar.

Əhməd səs-küyə evdən çıxdı. O, yarlı-yaraqlı kazakları görəndə ani olaraq Peterburqu xatırladı. Bədənindən soyuq bir gizilti keçdi. Onların nə üçün bura gəldiklərini anlamadığından, xəyalına yüz cür qorxulu fikir gəldi. Atdan enib əlində qamçı oynadan enlikürək, ucaboy, saqqalı sinəsinə yayılmış kazak ona yaxınlaşıb, birdən-birə bağırdı:

– Ey tatar, yakşı yaman, kladi karman. Ni bilmez, ni bum-bum?

Bu acı, təhqiramiz söz elə bil Əhmədi silkələyib ayıltdı. O, gözünü qarşısında dayanıb istehza ilə ona baxan kazakın üzünə zillədi və xalis rus dilində:

– Nə buyurursunuz? – deyə soruşdu.

Belini azacıq irəli əyib ayaqlarını aralayan və elə bil ki, Əhmədi udmağa hazırlaşan kazak qarşısındakı adamın təmkin və cavabından diksinib geri çəkildi. Gözləri qıyıldı və dönüb arxa tərəfdə dayanan yoldaşlarına baxdı. Əhməd onun şaşırdığını görüb daha qətiyyətlə dilləndi:

– Buyurun, mən sizi dinləyirəm.

Kazak vəziyyətini dəyişməli oldu.

– Gedək otaqları göstər, görmürsənmi pristav gəlib?

Onlar Əhmədi qabaqlarına qatıb içəri apardılar. Diqqətlə bir-bir otaqları gəzdilər. Hər tərəfi yoxladılar. Divardakı yazı taxtasını, skamyaları, xəritəni görəndə bayaqkı kazak yenidən bağırdı:

– Bu nədir?

– Özünüz görürsünüz.

– Onu demirəm. Bura "Zayej"dir, yoxsa məktəb?

– "Zayej"dir.

– Bəs nə üçün bunları buraya doldurmusan?

– Lazım olur.

– Lazım olur, lazım olur. Az danış. Stulları bayıra çıxart.

Kazakın sifəti dəyişdi. Az qaldı baxışları ilə Əhmədi yesin. Hətta əilini yuxarı qaldırıb şallağını belə hərləmək istədi. Ancaq pristavın eyvanda dayandığını görüb əlini saxladı.

Kazaklar stulları götürdülər. Eyvanda, məhəccərin qabağında kölgə yerə düzdülər. Pristav və yoldaşları əyləşdilər. Onlar kitellərinin yaxasını açdılar. Dəsmalla boyunlarını, şapkalarının içini quruladılar. Pristav hətta daz başının tərini sildi. Kür tərəfdən əsən sərin meh otları, çiçəkləri sığallaya-sığallaya "Zayej"ə qədər gəldi. Elə bil eyvanda oturanları yellədilər.

Kazaklar heç nə soruşmadan Əhmədin axşam biçib gətirdiyi göy otu qucaqlayıb atlarının qabağına tökdülər. Sonra divar boyu sallağı oturub papiros eşdilər.

Pristav sakitcə Kürə, o üzdəki meşəyə, aralıqlardakı cələyə baxdı. Biçənəklərin otu, yarpaq açmış ağaclar, göylüklərdə qaçışan atlar, çiling-ağac oynayan uşaqlar onun diqqətini cəlb etdi. Dodaqları azacıq aralanıb gülümsündü. Deyəsən, kəndin mənzərəsi onun xoşuna gəldi.

Bayaqkı kazak əyilib pristavın qulağına nəsə dedi. O bir xeyli başını tərpətdi, sonra Əhmədi yanına çağırdı. Bir az bundan əvvəl onun sifətini bürüyən təbəssüm yox oldu.

– Sən kimsən?
– Poçta işçisi.
– Ruscanı harda öyrənmisən?
– Peterburqda.
Pristav yerində qurcalandı. Onun altındakı stul cırıldadı. Qarşısında dayanan Əhmədi aşağıdan yuxarı, diqqətlə süzdü:
– Student olmusan?
– Bəli.
– Bəs sonra, sonra da qovublar, eləmi?
– Bəli.
– Nəyin üstündə?
– Bəzi kitablar oxuduğuma görə.
– Hm... da... tak... tak... Bəs buraya necə gəlmisən?
– Göndəriblər.
– Burada da o kitablardan oxuyursan?
– Yoxlaya bilərsiniz, cənab pristav.
– Hm... da... Bəs buranı nə üçün məktəbə döndərmisən?
– Cənab pristav, uşaqlar hərdənbir yanıma gəlir. Darıxanda onlara yazı-pozu öyrədirəm. Özünüz bilirsiniz ki, bizim kəndlərdə məktəb yoxdur.
– Sən onlara tatarca yazmağı öyrədirsən?
– Yox, rusca.
Pristavın sifətinin ifadəsi yumşaldı. Əhməd onun gözlərindəki narazılığın yavaş-yavaş silindiyini hiss etdi.
– Hm... da... tak... tak... Səndən xoşum gəldi. Bəs sizdə çay tapılmaz?
– Qonaq gələnlərə hər şey tapılar.
– Elə isə bir samovar.
Əhməd otağa girib samovarı çıxartdı. Pristav tərini silə-silə özünü yellədi. Əhmədin samovara su tökdüyünü görüb dilləndi:
– Sən təksən, arvad-uşağın yoxdur?
– Yoxdur, cənab pristav.
– Yaxşı, sən gəl bura, çayı onlar qoyarlar.
Kazaklar dərhal samovarı götürdülər. Çəlləkdən su doldurdular. Elə həyətin ortasındaca odun çıtıqlayıb samovara od saldılar. Pristav özünü xeyli yellədi, eyvanda gəzindi, sonra gəlib bayaqkı yerində oturdu. Üzünü Əhmədə tutub astadan dilləndi:
– Camaatı buraya yığmaq lazımdır, vacib məsələ var. Sən uşaqlarla get, bütün kişiləri buraya çağır. Özün də bizə dilmanc olarsan.

Atlı kazaklar kəndə doluşdular. İtlər yad adamları görəndə zəncirdə dartınıb çırpındılar. Torpaq yolun tozu göyə qalxırdı. Kəndin üstünə çöküb, duman kimi ətrafı kölgələndirdi. İsti yay günlərində tozu-torpağı göyə sovurub, burulğan kimi havaya qalxan bu boğanaqdan camaat vahiməyə düşdü. Kişilər daldalanmağa çalışdılar. Uşaqlar qaçıb gizləndilər. Arvadlar heç üzlərini də göstərmədilər. Kənd suyu soğulmuş dəyirman kimi birdən-birə susdu. Gün bərk qızdığından, ancaq cırcıramalar səs-səsə vermişdilər. Kür isə çağlayıb-uğuldayır, cilovunu gəmirən at kimi fınxırıb sahili döyəcləyirdi. Bu ölü sükutu hiss edən kazaklardan biri Əhməddən soruşdu:

– Camaat hanı, köçüblər?

– Yox.

– Bəs niyə görünmürlər?

– Sizdən qorxurlar.

– Niyə?

– Sizdən xeyir gözləmirlər.

Atlılar doqqazda dayandılar. Əhməd Cahandar ağanı çağırdı. Kişi onun səsini eşidən kimi sıçrayıb ayağa qalxdı. Tüfəngini əlinə aldı. Samanlığın belindən endi. Zəncirdə dartınan itlərə acıqlandı. Nökərlərdən qabaq özü doqqaza çıxdı. Bir xeyli yaraqlı kazaklara, sonra da Əhmədə baxdı.

– Xeyir ola, a bala?

– Pristav "Zayej"ə çağırır.

– Təkcə məni?

– Yox, bütün camaatı.

Cahandar ağa azacıq sakitləşdi. Sonra qanrılıb nökərlərə səsləndi:

– A bala, atı yəhərləyin.

Kazaklar uzaqlaşdılar. Cahandar ağa evə gedib paltarını dəyişdi. Xəncərini belinə bağladı. Qoltuqaltısını çiyninə keçirdi. Tüfənginin xəzinəsini yoxladı. Atı yəhərləyib həyətdə onu gözləyən Tapdığa yaxınlaşdı. Özü hər şeyi yoxladı, atın çəkilərini bərkitdi. Ayağını üzəngiyə qoymazdan əvvəl üzünü Tapdığa tutdu:

– Siz də atlarınızı yəhərləyin, yaraqlarınızı da götürün. Bizim tayfadan kim varsa, hamısına xəbər elə. Dalımızca "Zayej"ə gəlin.

Tapdıq kişinin həyəcanlandığını başa düşdü.

– Nə olub, ağa?

– Elə bir şey yoxdur. Ancaq ehtiyatlı oğulun anası ağlamaz, divana etibar eləmək olmaz.

Cahandar ağa sıçrayıb atın belinə qalxdı. Qəmər quş kimi səkib yola çıxdı...

"Zayej"in həyəti camaatla doldu. Göytəpə kəndində nə qədər başıpapaqlı vardısa, hamısı pristavın hüzuruna gəldi. Kəndlilər tayfa-tayfa bölünüb öz ağsaqqallarının başına toplaşdılar. Nökərlər yedəklərində at kənarda dayandılar. Hamı həyəcanlı idi. Pristavın gəlişini hərə bir cür izah edir, xatanın özündən uzaq olmasını arzulayırdı. Pristav isə eyvanda sakitcə çay içir, altdan-altdan camaatı süzürdü.

Nəhayət, o ayağa durdu. Aşağı düşüb camaata doğru gəldi. Kazaklar stulları gətirib həyətin ortasına qoydular. Bir qabaq stolu da tapdılar. Pristav kəndliləri yaxına çağırdı. Onlara işarə ilə oturmalarını əmr etdi. Camaat göy otluqda bardaş qurub çevrələndi. Cahandar ağa oturmadı. Yaxındakı ağaca söykənib dayandı. Pristav onu, bir az kənarda, çiynində əba, təsbeh çevirən Molla Sadığı və onlardan başqa da oturmaq istəməyən bir neçə adamı nəzərdən yayındırmadı.

Stolun üstünə bir qovluq qoydular. Pristav oradan möhürlü bir kağız çıxartdı. Oxumazdan əvvəl Əhmədi yanına çağırdı:

– Cahandar ağa kimdir? – deyə amiranə səslə soruşdu.

Hamı dönüb ona tərəf baxdı. O tayfadan olan adamlar ayağa qalxdılar. Nökərlər atların yüyənini hazırlayıb dayandılar. Cahandar ağa gözlənilmədən ağır zərbə alan adamlar kimi bir anlığa özünü itirdi. Yer elə bil ayağının altından qaçıbləngər vurdu. Onun qulaqları güyüldədi, gözlərinin qabağında qara dairəciklər oynadı. "Ağla gələn başa gələr", – deyə düşündü və ildırım sürəti ilə nə etməli olduğunu, aradan necə çıxacağını qərarlaşdırdı.

Pristav işarə ilə onu yanına çağırdı. Cahandar ağa tüfəngi çiynindən çıxartdı və ağır addımlarla mərəkənin ortasına gəldi. Kazaklar pristavın dövrəsində sıxlaşdılar. Onlar üz-üzə dayandılar. Cahandar ağanın qıllı qaşları gözünün üstünə endi, pristav onun zəhmli baxışlarının mənasını anlamasa da, başını tərpədib gülümsündü. "Xalis Şamildir", – deyə ürəyindən keçirdi. Sonra yanındakı stulu göstərdi. Cahandar ağa oturmaq istəmədi. Pristav üzünü Əhmədə tutub dedi ki, "onu başa sal, qoy otursun". Cahandar ağa Əhmədin izahından sonra stulu kənara çəkib əyləşdi. Bir az sakitləşsə də, səksəkəli qaldı. Gümüş qutusunu çıxardıb papiros eşdi. Pristavın səsi yenidən eşidildi:

– Molla Sadıq kimdir?

– Mənəm.

– Gəl bura.

Molla Sadıq əbasını düzəltdi. Təsbehini çevirə-çevirə o biri tərəfdən pristava yaxınlaşdı. Cahandar ağa ilə yanaşı düşmək istəmədi. Pristav ona da yer göstərdi. Sonra üzünü Cahandar ağanın, hələ də ayaq üstündə dayanan qohumlarına tutdu:

– Siz niyə qalxmısınız, oturun.

Əhməd onun dediklərini tərcümə etdi. Cahandar ağa baxışları ilə onlara icazə verdi.

Pristav kəndin bütün ağsaqqallarını çağırdıqdan sonra əlindəki kağızı yerə qoydu. Ətrafında oturanlara baxdı. O, yerli qayda-qanunları öyrənməyə çalışan məmurlardan idi. Bilirdi ki, hər xalqın zəif və qüvvətli cəhəti var. Bunları öyrənir və yeri gələndə onlardan bacarıqla istifadə etməyə çalışırdı. O başa düşmüşdü ki, kəndlərdə hələ tayfa və nəsillər var, onların ağsaqqalı nə desə, ona tabe olurlar. Bir də bu tayfaların özlərinin arasında da ziddiyyətlər var. Yeri gələndə bunlardan da istifadə etməyi pristav nəzərdən qaçırmamağın faydalı olduğunu yəqinləşdirmişdi. İndi, Göytəpəyə gəlməzdən əvvəl, pristav bu kəndin varlı və nüfuzlu adamlarını müəyyənləşdirmişdi. Onun məqsədi həmin adamları ələ almaq və nə iş görsə, onların yardımından istifadə etmək idi. O, fikrində yanılmadığını, elə siyahını götürüb Cahandar ağanın adını oxuyanda camaatın bir hissəsinin təlaşla ayağa qalxdığını görən kimi anladı. O həm də bu yolla kənddə kimin güclü, kimin zəif olduğunu müəyyənləşdirdi. Pristav çox yaxşı bilirdi ki, bu adamlarla hələ çox görüşəcəkdir.

Pristav ayağa durdu. Bir xeyli sükutla dayanıb, onun nə deyəcəyini gözləyən göytəpəliləri nəzərdən keçirdi:

– Camaat, Kürün o üzündəki meşə bundan sonra padşahın ov yeri olacaq. Oraya yaxın getmək, qoruğa girmək qadağandır. Sizi xəbərdar edirəm, kim qanunu pozsa, icazəsiz o tərəflərə hərlənsə, meşədə ov eləsə, cəzalanacaq. Ələ keçəni birbaş Sibirə göndərəcəyəm. Qoruğun keşikçilərinin sözünə baxmayanlar yerindəcə güllələnəcək.

Pristav susdu. Sözünün camaata necə təsir etdiyini yoxlamaq məqsədi ilə adamları bir-bir gözaltı süzdü. O gördü ki, hamı təəccüb içindədir. Ağsaqqallar fikirli-fikirli başlarını aşağı salmışdılar. Cahandar ağa isə papirosunu tüstülədirdi, Molla Sadıq isə təsbeh çevirməyə ara vermirdi. Elə bil camaatın üstünə su ələnmişdi.

Əhməd pristavın dediklərini tərcümə etdikdən sonra Molla Sadıq adəti üzrə əbasını çiynində düzəltdi, Quran oxuyacaqmış kimi bir-iki dəfə öskürüb boğazını arıtladı:

– Cənab pristav, o yerlər dədə-babadan bizim kəndin olub. Malımız, binələrimiz ora ilə dolanıb, indi camaat neyləsin?

Pristav molladan bu cavabı gözləmirdi. Ona görə bir az duruxdu. Doğru sözə cavab tapa bilmədiyindən, azca səsini ucaltdı:

– İndiyəcən nə olubsa, onunla işim yoxdur. Bu gündən sonra qoruq tərəfə heç kim ayaq basmamalıdır.

– Belə çıxır ki, biz sizə borcluyuq, – deyə Cahandar ağa sakitcə sözə başladı, – sizin dediyinizi necə başa düşək, cənab pristav, yersiz gəldi, yerli qaç?

– Cahandar ağa, mən sizi ağıllı adam hesab eləyirdim, bu nə sözdür, danışırsan? Bu mənim yox, qubernatorun əmridir. Mən buraya sizdən icazə almağa gəlməmişəm.

– Bə onda bizi buraya nəyə yığıbsan?

– Əgər siz dinc dayansaydınız, mən nə buraya gələrdim, nə də sizi çağırardım.

– Biz nə eləmişik?

– Bu saat bilərsiniz. – Pristav üzünü camaata tutdu və səsini ucaltdı:

– Sizin kənddən seminariyada oxuyan varmı?

Camaat dinmədi. Hamı bir-birinin üzünə baxdı. Göytəpəlilər başa düşdülər ki, pristav Əşrəfi axtarır. Bəlkə də bu qədər atlı kazak töküb gəlib ki, onu aparsın. Heç kəs, Cahandar ağanı istəyən də, istəməyən də buna razı olmazdı.

Cahandar ağa pristavın nəyə işarə etdiyini və söhbətin haraya gətirib çıxaracağını anladı. O hələ Kürün sahilində kazaklarla toqquşanda bilmişdi ki, bu məsələ belə qalmayacaq. Cahandar ağa heç nə sezdirmədən gözaltı öz adamlarına, lap kənarda dayanan Şamxala, Əşrəfə baxdı. Tapdığın həyəcanla ətrafa boylandığını gördü. O, başa düşdü ki, göytəpəlilərin heç biri onu ələ verməyəcək, heç kəs Əşrəfin adını çəkməyəcək. Kişi daha da ürəkləndi.

Pristav sualını təkrar etməli oldu:

– Yenə soruşuram, sizin kənddən seminariyada oxuyan varmı?

– Var.

– Kimdir?

– Mənim oğlum.

Pristav gözləmədiyi bu cavabdan sonra bir xeyli necə hərəkət edəcəyini müəyyənləşdirə bilmədi. Cahandar ağa gözünü zilləyib onun sonra nə deyəcəyini gözlədi. Pristav bunu duydu. Həm təəccüb, həm də qəzəb dolu səslə dilləndi:

– Onun nə iş tutduğunu bilirsənmi?
– Yox.
– Meşədə kazakların yolunu kəsib.
– Bəlkə kazaklar onun yolunu kəsib?
– Kazaklar quldur deyil.
– Mənim oğlum da quldur deyil.

Pristav elə bilirdi ki, Cahandar ağa oğlunun taqsırkar olduğunu boynuna alacaq, bəlkə də xahiş edəcəkdi ki, onun günahından keçsin. Ancaq Cahandar ağa pristavın gözlədiyinin əksinə, az qalırdı ki, onun özünü günahlandırsın. Pristav səsini bir az alçaltdı və sınayıcı nəzərlərlə Cahandar ağanın üzünə baxdı:

– Demək, onda taqsır yoxdur?
– Olsa, özüm tənbeh eləyərdim.

İndiyə qədər yalnız deyilənləri tərcümə edən və söhbətə qarışmayan Əhməd dözə bilmədi:

– Cənab pristav, torpaq kəndlinin çörəyidir. Bunu onun əlindən almaq böyük cinayətdir. Həmin meşə Kür ətrafındakı kəndlilərindir və onlar həmin meşə ilə dolanırlar.

– Sən bu işlərə qarışma.

– Axı mümkün deyil. Siz biçənəklərə keşikçi qoyubsunuz, yolları kəsibsiniz ki, burdan gəlib-getməyin. Bəs camaat neyləsin, göylə uçsun?

Pristavın əlləri xəfifcə əsdi. Boynundakı damarlar şişdi. Onun səsində qəzəbdən çox istehza duyuldu:

– Təklifin nədir, cənab Peterburq studenti?
– Bəs Sizin təklifiniz nədir, cənab pristav?
– Mənim təklifim aydındır: Bu gündən sonra heç kəs o tərəflərə ayaq basmayacaq.
– Bu mümkün deyil.
– Necə, hökumətlə hökumətlik eləyəcəksiniz? Könlünüzə Sibir düşüb? İstəyirsiniz ki, balalarınız yetim qalsın?
– Hədə-qorxu lazım deyil, cənab pristav, ayda, ildə canişinin kefi durub bir dəfə ova çıxacaq deyin, camaatın yerini əlindən almazlar. Bu, ədalətsizlikdir. Əgər padşah bunu bilsə, Sizi cəzalandırar.

Pristav Göytəpəyə yola düşəndə elə zənn etmişdi ki, camaatın üstünə təpinən kimi hamı qorxub geri çəkiləcək, kazakları meşədə ağaca sarıyan adamları dərhal tapıb tutacaq, kazakların qabağına qatıb həbsxanaya göndərəcəkdi. Amma indi gözləmədiyi bu vəziyyətdən çaşıb qalmışdı.

– Cənab student, bəlkə padşahı çağıraq, gəlib sizdən icazə istəsin?
– Nə olar, öz təbəələrinin qeydinə qalmaq padşahın borcudur.
– Kəs səsini! – Pristavın elə bil beyninə qan vurdu, gözləri az qaldı hədəqəsindən çıxsın. – Bu saat qollarını bağlatdırıb, sallam atın qabağına!
Əhmədin dodağı azacıq qaçdı. Gözlərində qəzəb qarışıq bir istehza dolaşdı. Özünü ələ aldı və səsinin titrəməsini büruzə vermədi:
– Məni hədələməyin, cənab pristav, belə şeyləri çox görmüşəm.
– Yox, az görmüsən. Vaxtında sənin başına ağıl qoysaydılar, indi belə danışmazdın.
Əhməd gərgin döyüşdən çıxmış adam kimi dərindən nəfəs alıb gülümsündü:
– Düz iş görmürsünüz, cənab pristav, adam gəmidə oturub, gəmiçi ilə dava eləməz.
Pristav başa düşdü ki, bu kənddə Əhmədlə belə açıq danışmaq onun xeyrinə olmayacaq. Camaatın gözü qabağında məğlub olub geri çəkilməsi isə mümkün deyildi.
Göytəpəlilərin ağsaqqalları Əhmədin cəsarətinə təəccüb edirdilər. Camaat indiyə qədər Əhmədə yazıq, qərib, öz başını dolandıran bir adam kimi baxırdı. İndi isə o birdən-birə göytəpəlilərin gözündə böyüyürdü. Elə bil pristav da bunları başa düşürdü.
– Nə demək istəyirsən?
– Bizi incitməyin.
Pristav susdu. Əhmədi sakit baxışlarla gözaltı süzdü. Əslində o elə kəndə gəlib Əhmədlə söhbət elədiyi ilk andan ondan şübhələnmiş və qərara almışdı ki, şəhərə qayıdan kimi onun adını şübhəli adamlar siyahısına yazsın, ayrıca bir qovluq düzəltsin və Əhmədin üzərinə nəzarətçi qoysun. O, belə bir əqidədə idi ki, əgər sənə tapşırılan qəzada rahatlıq olmasını istəyirsənsə, gərək məktəbdən qovulmuş studentləri gözdən qoymayasan. Xüsusən də Peterburq tələbələrini. Ancaq, deyəsən, pristav daha ciddi hərəkət etməli olacaq və Əhmədi elə indi cəzalandıracaqdı.
O, kazaklara baxdı. Bayaqkı qıllıpapaq, yekəpər kazak irəli çıxdı. Pristavın səsi xırıldadı:
– Bunun qollarını sarıyın.
Cahandar ağa sıçrayıb ayağa qalxdı. Göytəpəlilər işarə gözləyirmiş kimi yerlərindən atıldılar. Adamların cərgəsi sıxlaşdı. Bir az bundan əvvəl bölük-bölük, tayfa-tayfa oturan kəndlilər zəncir halqası kimi

birləşdilər. Cahandar ağa ilə kazak döş-döşə dayandı. Hər ikisinin qıllı qaşı aşağı enib gözlərinin üstünü örtdü. Onların bəbəkləri genişləndi.

– Biz onu verməri, cənab pristav.

– Necə yəni verməri, mən sənin oğlunu da, onun yoldaşlarını da istəsəm, bu saat qabağıma qataram. Özbaşınasınız?

– Özbaşına deyilik, amma elin qayda-qanunu da var.

– Siz mənə qanun öyrədəcəksiniz?

– Pristav, mən deyirəm, dava-dalaşsız, bir-birimizi başa düşək. Tərsinə çəksək, höcətləşsək, iş pis olar. Sən bizi ayağı çarıqlı görmə.

Pristav əlini geri yanında çarpazladı. Pəncəsi üstə qalxıb bir-iki dəfə yerində silkələndi. Onun döşündəki medallar bir-birinə dəyib cingildədi. Paqonunun zər baftalı qotazları parıldadı.

– İndi nə edək deyirsən, Cahandar ağa?

– İstəsəniz məsləhətləşib dil taparıq.

– Yaxşı, geri durun.

Kazaklar geri çəkildilər.

**9**

Cahandar ağanın yuxusu qaçmışdı. Gecə yarıdan keçməsinə baxmayaraq yerin içində çevrilir, bundan sonra necə hərəkət etməli olacağını fikrində ölçüb-biçirdi. Onun savadı yox idi. Ərəb əlifbası ilə azacıq yazı-pozudan başqa heç nə bilmirdi. Məktəblərin, oxumağın axırının haraya gedib çıxacağını o qədər də dərk etmirdi. O, dədə-baba qaydası ilə dolanmış, atın belində gəzib ağayanalıq etmişdi. Ancaq indi vəziyyət dəyişirdi. O başa düşürdü ki, deyəsən bundan sonra divandərə ilə çox oturub-durmalı olacaqlar. Əvvəllər bu tərəflərə hökumət adamlarından ayda-ildə bir dəfə hərlənən olmazdı. Amma indi bir şey olan kimi atlı kazaklar tökülüb gəlir. Belə getsə onlar buraları su yoluna çevirəcək, kəndi ayaq altına qoyacaq və hər işə qarışacaqlar. Bir az da keçəndən sonra lap kişiliyimizi də əlimizdən alacaqlar. Pristav həftədə bir gəlib bizi yığacaq, qabağına qoyub uşaq kimi danlayacaq, biz də mal təkin gözümüzü döyə-döyə baxacağıq. Yox, bu, kişilikdən deyil.

Bəs nə etməli? Pristav demişkən, hökumətlə hökumətlik eləmək də baş tutan iş deyil. Deyəsən, zəmanə dəyişir. Deyəsən, divan-dərədən qaçanlar yox, onunla yaxın olanlar, ona arxalananlar qazanacaqlar. Bu

dəfə birtəhər qurtardıq. Pristava söz verdik ki, bir də elə şeylər olmaz. Uşaqlar bilməyiblər, yoxsa kazaklara toxunmazdılar. O da boynumuza minnət qoydu, "bu dəfə bağışlayıram", – dedi. Demək, bundan sonra gərək onların dediyi ilə oturub-duraq, onlara boyun əyək. Görüm səni qara gələsən, ay zəmanə!..

Cahandar ağa yanı üstə çevrildi. Yorğanı yuxarı çəkdi. "Obaşdan köç yola düşəcək, bir az yatmaq lazımdır", – deyə düşündü. Yastığın ortasını çökəldib başının altına qoydu. Gözlərini yumdu. Ancaq yenə yata bilmədi. "Əhməd kimdir? Qəribin biri. Allah bilir, bəlkə heç əlinə tüfəng alıb bir güllə də atmayıb. Ancaq necə də diri-diri danışırdı. Heç nədən qorxmurdu. Deyəsən, Əşrəfin özü də dəyişib. Deyəsən, at çapıb, tüfəng oynatmağın vaxtı keçir, axı?!" Kişi dəhşətə gəldi. Yerinə qor dolmuş kimi bədəni alışdı. Beyni güyüldədi. Dərindən köksünü ötürdü. "Ay gidi dünya, gör axırın hara gəlib çıxdı!"

Cahandar ağa durub oturdu. Papiros eşdi. Yastığa dirsəklənərək acgözlüklə sümürməyə başladı.

O bu qarışıq fikirləri özündən qovlamaq üçün köç haqqında düşündü. Əşrəflə Salatının onunla gedəcəyini xatırladı. Oğlu Şamxalın da yaylağa köçəcəyini yadına salıb sevindi. Hamı dağa qalxacaqdı. Bəs... birdən-birə Şahnigar gəlib gözünün qabağında dayandı. Kişinin bədənini tər basdı. Papirosu tez-tez sümürüb kötüyünü atdı və yorğanı başına bürüdü. Orada xeyli çevrildi, yalnız səhərə yaxın gözünə çimir getdi. Bacısı yuxuda da ondan əl çəkmədi...

Şahnigar qapını açıb astanada dayandı. Boynunu büküb məlul-məlul qardaşının üzünə baxdı. "Qabağında ölüm, ay qardaş, nə yaman fikirlisən", – dedi. Sonra astaca, sanki kimisə oyadacağından qorxurmuş kimi, barmaqlarının ucunda içəri girdi. Gəlib taxtın aşağı tərəfində dayandı. Yazıq-yazıq dilləndi: "Dağa havaxt köçürsünüz, dərdin alım? Bə məni aranda qoyursunuz? Demirsənmi bacım aranda istidən bişər? Yoxsa elə bilirsən qara torpaq sərin olur?"

Cahandar ağa dillənə bilmədi. Daş kimi dayanıb bacısının üzünə baxdı. Birdən Şahnigarın gözlərində həyəcan göründü. Arvad diqqətlə qardaşını süzdü. Onun səsi titrədi. "Ömrüm, günüm, nə yaman sınıxmısan? Niyə belə qaşqabaqlısan? Allah mənciyəzi yerə soxsun, səni də dərdə saldım. Deyəsən, yuxusuz qalıbsan, rəngin-rufun qaçıb. Gözün də yaman qızarıb. Bilirəm. Şamxal düz iş tutmadı. Amma acığına gəlməsin, ay qardaş, səndə də bir az taqsır oldu. Adam da öz

doğma balasını yad qızından ötəri ayağının altına salıb çığnayardımı? Arvad-uşağını evindən didərgin salardımı? Vallah, Zərnigarda günah yoxdur. Onun yerinə kim olsa, elə lap mən özüm də olsam, evə dava-dalaş salardım. Adamın üstünə günü gəlməyi sənə asanmı gəlir, ay qardaş? Axı sən onunla neçə ildir bir yastığa baş qoyurdun! Sən onun gözünün ilk ovu, qəlbinin ilk çiçəyi idin. İndi nə eləmək olar? Olan olub, keçən keçib. Ancaq özünü üzmə, ay qardaş. Allah sənə insaf versin, acığın tutub gözün qızışanda heç irəlini-gerini fikirləşmirsən? Yoxsa mənim sözlərimdən inciyirsən? İncimə, mən sənin heç ayağına da daş dəyməsini istəmirəm. Bacın ölsün, ay qardaş, üzüm ayaqlarıyın altına, özünü üzmə. Bilirəm məndən də yanıqlısan. Elə hey fikirləşirsən ki, görəsən Şahnigarın taqsırı varmı, müridlərdən əl-ayağı dəyən olubmu? Mənim namusumu ləkələməyiblər ki? O bircə canına and olsun ki, mən gül kimi tərtəmizəm, ay qardaş, heç elə şey olarmı? Heç sənin kimi bir kişinin bacısı da pis yola düşərmi? Özünü üzmə, dərdin alım, məndə heç nə yoxdur. Sən xasiyyətimi bilmirdinmi, elə uşaqlıqdan deyib-gülməyi sevmirdimmi? Başım batsın, bir az lateyr danışmağı, şit-şit zarafat etməyi tərgidə bilmirdim. Nə eləyim, Allah verən xasiyyət idi. Bir də görüm tanrının gözü tökülsün, pis-yaxşı bir kişiyə ərə getmişdim. Onu vaxtsız əlimdən almasaydı, bəlkə də bu işlər başıma gəlməzdi. Yoxsa sözlərimdən incidin, ay qardaş, niyə qaşqabağını turşaltdın? Mən sənin dərdini artırmağa gəlməmişəm. İstəyirəm hər şeyi bilib bir az yüngülləşəsən. Yoxsa peşmançılıq çəkirsən, mənim ölümümə dözmürsən? Heç elə şeyi ağlına da gətirmə, ay qardaş, mənim səndən başqa kimim var? Heç səndən inciyərəmmi? Lap xəncərlə tikə-tikə doğrasan da uf deməzdim, o handa da güllə ola. Dərdin alım, elə şey nədir ki, ondan ötəri fikir eləyirsən, bir bacı bir qardaşa qurbandır. Mənim min canım olsaydı, təzədən sənə qurban deyərdim. Ürəyinə heç nə gəlməsin, ay qardaş, mən səndən zərrə qədər də inciməmişəm, ancaq gərək bir az səbr eləyəydin. Amma yaman insafsızsan. Qanqallar dizimə dolanda, mən ufuldayıb ağlayanda, atını saxlayıb bircə kərə halımı da soruşmadın".

Cahandar ağa dözmədi. Üzünü əlləri ilə qapayıb ağzı üstə döşəndi. Birdən saçında bir əlin gəzdiyini hiss etdi.

– Dərdin ürəyimə, niyə ağlayırsan?

Cahandar ağa dinmədi. Hıçqırığını boğmağa çalışdığından çiyinləri qalxıb-endi.

– Elə eləmə, yoxsa özümü öldürərəm. Di yaxşı, bəsdi, məni də ağlamaq tutur.

Cahandar ağa başını yuxarı qaldırdı. Qızarmış gözlərini bacısının üzünə zillədi:

– Keç günahımdan, Şahnigar, məni halal elə.

Şahnigar duruxdu. Cahandar ağa onun buz kimi soyuq, şüşə kimi cansız, heç nə ifadə etməyən gözlərini gördü. Arvad elə bil birdən-birə dəyişdi. Onun baxışlarında anlaşılmaz bir ifadə yarandı və daş kimi donub qaldı. Cahandar ağa bunun qəzəbmi, yalvarışmı, inciklikmi, məzəmmətmi, ya da süstləşdiyindən heç bir məna verməyən bir baxışmı olduğunu anlaya bilmədi. Əlini uzadıb bacısını qucaqlamaq istədi. Ancaq Şahnigar duman içində geri, qapıya doğru çəkildi və narazılıqla başını buladı:

– Yox, yox, dərdin alım, adam ölü ilə öpüşməz...

Kişinin nəfəsi darıxdı. Yorğanı üstündən nə vaxt atdığını, "Şahnigar, getmə, dayan, sənə sözüm var", – deyə nə vaxt qışqırdığını bilmədi. Gözünü açanda Mələyin təşvişlə ona baxdığını gördü.

– A kişi, sənə nə olub, özünə toxtaqlıq ver.

Cahandar ağa keyikmiş kimi ətrafına xeyli boylandı. Sonra qorxa-qorxa qapıya baxdı, ona elə gəldi ki, orada kimsə dayanıb nəfəs alır. Mələk çırağın fitilini azca qaldırdı. Otaq işıqlandı. Cahandar ağa bundan sonra bir az özünə gəlib toxtadı. Üzünü arvadına tutub acıqlandı.

– İşığı niyə çoxaltdın?

– Nə bilim, yaman sayıqlayırdın.

– Sarsaq-sarsaq danışma, yıxıl yat.

Mələk dinmədi. Cahandar ağa təzədən papiros eşdi, gözünü tavana zilləyib susdu.

Kəndin ucqarında xoruz banladı. Onun yoğun və kallaşmış səsi mürgüyə gedən Göytəpənin bütün xoruzlarını oyatdı. Həyətlərdə qanad şaqqıldadı.

Cahandar ağa pəncərənin taxtasını azacıq araladı. İşıqlaşırdı.

O, yorğanı üstündən atıb yavaşca durdu, asta-asta paltarını geyindi. Üzünə bir-iki ovuc su vurdu, həyətə çıxdı.

Arabaları qoşmuşdular. Atlar yəhərlənmişdi.

Cahandar ağa otaqları dolandı, talvarın altına baxdı, sonra samanlığın üstünə çıxdı. Kür tərəfdən əsən səhər küləyi yorğunluğunu, yuxusuzluğunu bir az dağıtdı. Kişi Kürün qıjıltısına qulaq asdı...

Bütün kənd ayağa qalxmışdı. Qapı-bacalarda hərlənən qadınların səsi, uşaq ağlaması bir-birinə qarışmışdı. Arabir kişilərin acıqlı səsi eşidilirdi.

Cahandar ağa özü atın belinə qalxdı. Tərpənmək vaxtı olduğunu bildirdi.

Sığırçılar malları haylayıb xır yoluna çıxartdılar. Camışlar, inəklər hürküdülmüş kimi ora-bura qaçışıb mələşdilər. İlxı yerindən tərpəndi. Kəndə hay düşdü.

Arabalar yola çıxandan sonra Cahandar ağa özü hər şeyi bir də yoxladı. Qapıların qıfılını, sönmüş ocaq yerini nəzərdən keçirdi. Üzünü onun yanında kölgə kimi dolaşan Tapdığa tutdu:

– Mən sənə ümidliyəm, buraları sənə tapşırıram.

– Arxayın ol, ağa.

Cahandar ağa atını arabaların dalınca çapdı. Bütün kənd təkər üstündə yolda dayanmışdı. Arabalar məhəllə-məhəllə qatarlaşmışdı. Arvadlar dəyələrin içində yer salıb uşaqlarını rahatlayırdılar. Arabalarını xır yoluna çıxardanlar təkərləri, boyunduruğu, samıları yoxlayırdılar, kəllərin, öküzlərin necə qoşulduğunu nəzərdən keçirirdilər. Dan yeri işıqlansa da, ay hələ batmamışdı. Arabaların kölgəsi uzanıb yolun alt tərəfinə sərilirdi.

Cahandar ağanın köçü dəstənin önündə idi. Onun arxasınca qohum-əqrəbaları düzülmüşdü.

Əşrəf lap qabaqkı arabanın boynunda oturmuşdu. Salatın da onun yanında idi. Hər ikisinin yuxusu qaçmışdı. Onlar danışmırdılar.

Salatın bərk yorulmuşdu. Köçməzdən iki gün əvvəl anası onu atasının yanına göndərmişdi. Salatın həm Şamxalgilin yerini dar eləməmək, həm də Əşrəfi tək qoymamaq üçün anasının sözündən çıxmamışdı. Cahandar ağa da onlara ayrıca araba qoşdurmuşdu. Salatın özü qolunu çirməyib farmaşları, un çuvallarını, yorğan-döşəyi arabalara dolduranlara kömək etmişdi. Hər şeyi sahmana saldıqdan sonra arabanın içini gəbə ilə döşəmiş, arxa tərəfi isə kilimlə örtmüşdü. Yolda rahat yatmaq üçün əldə yastıq və mütəkkə saxlamışdı. Arabanın içi geniş və yumşaq idi.

İşıqlaşırdı. Quşlar oyanıb oxuyur, otların arasından pırıltı ilə qalxıb yolun ortasına qonur, sonra qanad çalıb yenə uçurdular. Onları səhərin ala-toranında torpaqdan güclə seçmək olurdu. Hamı susmuşdu. Görünür, neçə gündən bəri köçə hazırlaşıb əldən düşmüş arvadlar arabanın

içinə uzanan kimi yuxuya getmişdilər. Uşaqları da araba beşik kimi silkələyib yatırtmışdı.

Üfüq şərq tərəfdə əvvəl maviyə çaldı, sonra süd kimi ağardı, nəhayət, çəhrayı rəngə boyandı. Bu solğun qızartı getdikcə gücləndi, şəffaflaşdı və səmanın böyük bir parçası başdan-başa alovlanan kimi oldu. Kür tərəfdən olduqca sərin, lakin adamın bədənini üşürgələndirən səhər küləyi gəlib keçdi. Bu külək elə bil günəş çıxmamışdan əvvəl gecənin son qalıqlarını qabağına qatıb uzaqlara qovdu.

Əşrəf gözünü üfüqə zillədi. Salatın onun böyrünə qısılıb, yenicə çıxan və hələlik ancaq qövsvari balaca bir hissəsi görünən günəşə baxdı:

– Ay qağa, elə bil yer, göy alışıb-yanır, nə gözəldir!

Əşrəf dinmədi. Salatın əllərini onun çiyninə qoydu, sonra da başını söykədi. Bir xeyli beləcə dayanıb üfüqə baxdılar.

Axırıncı arabalar kənddən aralanıb xır yoluna çıxdı. Çubuqlar, qamçılar havada şaqqıldadı. Kəllər güc verib ağır arabaları yerindən tərpətdi. Təkərlər xır yolunun xırdaca daşlarını əzib qıcırdadı. Cərgə seyrəlib daha da uzandı. Köç kənddən aralandı. Dağa köçə bilməyib aranda qalanların itləri xır yolu ilə uzaqlaşıb gözdən itən arabaların dalınca acı-acı ulaşdılar.

## 10

Göytəpəlilər iki gündən sonra Çayqovuşan adlı səfalı bir yerdə düşərgə saldılar. Arabaları yoldan kənara çəkib köpüklü dağ çayının sahilindəki çəmənlikdə açdılar. İstidən təntimiş kəllər boyunduruğun altından çıxan kimi özlərini suya verdilər. Fısıldaşa-fısıldaşa ləzzətlə çimdilər. Yol boyu arabaların silkələyib yorduğu uşaqlar sevinə-sevinə qaçışmağa, yumru qara çay daşları ilə camışları yalamalamağa başladılar. Arvadlar arabaların kölgəsində palaz saldılar, yastıq, mütəkkə çıxartdılar. Kişilər balta götürüb yolun o üzündəki meşəyə, odun qırmağa getdilər. Molla Sadıqgil arabaları köçün o başında, Cahandar ağagil isə aşağı tərəfdə iri bir palıd ağacının altında açdılar. Ocaqlar qalandı, samovarlar çıxarıldı, kənddən tədarüksüz yola düşənlər xəmir yoğurub sac asdılar. Bəzi arabaların yanında qazan danqıldadı, yağda qızardılmış soğan iyi ətrafa yayıldı.

Əşrəf pencəyini çiyninə salıb yola doğru getdi. Cahandar ağa kölgədə mütəkkəyə dirsəklənib fikirli-fikirli oturmuşdu. Ağız-ağıza qovuşan dağların arası ilə axıb gələn çaya tamaşa edirdi. Ayaq səsi eşitdikdə dönüb oğluna baxdı:

– Hara gedirsən, a bala?

– Bulağa tərəf.

– Çox ləngimə.

Əşrəf dikdirə çıxdı. Asta addımlarla, cığırla, dərənin o başındakı bulağa doğru yollandı. Bulağın axarına yenicə çatmışdı ki, kiminsə tövşüyə-tövşüyə arxasınca gəldiyini hiss edib geri döndü. Salatın təngnəfəs halda özünü ona yetirdi:

– Mən də gedirəm.

Əşrəf çiyni səhəngli qıza baxdı. Onun əynində boz kofta vardı. Halbuki həmişə dağ yolunda qırmızı atlazdan don geyinərdi, ağ kəlağayı örtərdi. İndi isə sandıqda qat kəsmiş qara kəlağayını boynuna dolamışdı. O, bibisinin yasını saxlayırdı. Əşrəf bunu başa düşdü və heç nə demədi. Onlar yanaşı addımladılar.

Bulağın suyu göy otların arası ilə şırıldaya-şırıldaya axırdı. Yarpızların ətrindən nəfəs almaq olmurdu. Əşrəf hərdən ayaq saxlayıb onlara baxır, dərindən nəfəs alıb bu təmiz ətir qoxuyan havanı udurdu. Hardansa uçub gəlmiş bal arıları gah yarpızlara qonur, bir müddət dayanıb nə isə axtarır, sonra da vızıltı ilə havaya qalxıb bənövşə rəngli güllərin başına dolanırdı. Təbiətin bu sakit ahəngi elə bil zümzümə edir və adama layla çalırdı.

Əşrəf ayağının islanmasına fikir vermədi. Aşağı əyilib kökü suda olan yarpızları dərdi. Salatın ondan geri qalmadı.

– Ürəyin dovğa istəyirmi, ay qağa?

– Lap burnumun ucu göynəyir.

– Dağa çatan kimi özüm sənə ləzzətli bir ayran dovğası bişirəcəm. Yarpızını da çox eləyəcəm. Oxuduğun yerdə sizə dovğa bişirirlərmi?

– Yox.

Xəngəl necə?

– Yox.

– Bəs plov?

– Həftədə bir dəfə.

– Elə bu?

– Bu azdır?

– Azdı, bə nə? Heç fikir eləmə. Bu yay sənə özüm qulluq eləyəcəyəm. Gərək səni o qədər kökəldəm ki, lap motala dönəsən.

– Sonra partlayaram.

– Bıy, iraq canına, elə demə, ay qağa. – Salatın sözünə ara verdi. Bir xeyli tərəddüd içində dayandı. Sonra astadan qardaşına müraciət etdi:

– Ay qağa?

– Nədi?

– Bir söz soruşsam inciməzsən ki?

– De görüm.

– Orada paltarlarınızı özünüz yuyursunuz?

– Niyə özümüz yuyuruq? Məktəbdə paltaryuyanlar var.

– Demək, hər şeyinizi hazır verirlər?

– Hamısını.

– Sandıqda saxladığın paltarları da məktəbdən veriblər?

– Hə.

– Ay qağa, onu bə niyə geyinmirsən? Xəlvətcə sandığı açıb baxmışam. Elə yaxşıdır ki, düymələri par-par parıldayır. Kəmərin üstündə yazı da var. Mən səni heç o paltarda görməmişəm.

– Kişi qoymur.

Əşrəf qabağa düşmüşdü. Salatın qardaşının dalınca irəliləyirdi. O, gözünü Əşrəfin kürəyinə zilləmişdi. Bir anlığa onu seminariya paltarında təsəvvüründə canlandırmağa çalışırdı. Qardaşı “kişi qoymur” – dedikdə xeyli təəccüb etdi. Niyə qoymur, pis paltar deyil ki? – deyə xəyalından keçirdi. Ancaq aşkarda bir şey deyə bilmədi, başa düşdü ki, doğrudan da qardaşı kənddə məktəb libasını geyinməyəcəkdir. Ancaq o, Əşrəfi həmin paltarda görmək, ona necə yaraşdığını bilmək arzusu ilə alışıb-yanırdı. Elə bu məqsədlə də xeyli susduqdan sonra təzədən dilləndi:

– Ay qağa, bilirsən nə eləyək? Dağa çatan kimi həmin paltarlarını geyin, mən baxım. Gözləriyin ağrısını alım, yaxşımı?

– Yaxşı, daha bundan ötəri niyə yalvarırsan?

– Ay qağa, bir söz də soruşmaq istəyirəm.

Əşrəf geri döndü. Sevincdən və dağların sərin, təmiz havasından yanaqları qızaran bacısına, onun fərəhdən alovlanıb-yanan gözlərinə baxdı:

– De görüm, nə soruşmaq istəyirsən, ay şeytan?

– Siznən qız da oxuyurmu?

– Yox, qızların ayrıca məktəbi var. – Əşrəf bacısının qolundan tutdu. Özü kənara çıxıb onu cığıra saldı. Yanaşı getməyə başladılar. Bir xeyli

heç biri dinmədi. Salatın susub onun nə deyəcəyini gözlədi. Əşrəf isə ürəyindəkiləri ona necə izah etməyi fikirləşdi. O, Qori müəllimlər seminariyasından, direktor Semyonovun, Çernyayevskinin, Kipianinin verdiyi dərslərdən, onların könüllü olaraq qızlar üçün gimnaziya açdıqlarından, orada pulsuz dərs demələrindən bacısına nağıl etmək istədi. Hərdənbir hər iki məktəb tələbələrinin birlikdə müsamirələr təşkil etmələrindən, qızların oğlanlarla bərabər səhnəyə çıxıb şer oxumasından, kiçik səhnəciklər göstərdiklərindən bacısına danışmaq istədi. Ancaq bunların Salatına çox qəribə təsir bağışlayacağını düşünüb, bu söhbəti başqa vaxta saxlamağı qərara aldı. – Bilirsənmi, Salatın, oxumaq yaxşı şeydir. Adam çox şey öyrənir. Xasiyyəti də dəyişir. Mən oxumuş qızları görmüşəm. Onların paltarları da qəşəngdir, özləri də. Danışanda adam qulaq asmaqdan doymur. Əgər bizim qızlar oxusalar, onlardan da gözəl olarlar.

– Ay qağa, heç elə şey olar?

– Niyə olmur?

Salatın dinmədi. Əşrəf sezdirmədən bacısının haraya isə zillənmiş fikirli gözlərinə baxdı. Bu gözlərdə əfsanəvi nağıllarda söylənən sehrli, eyni zamanda olduqca cazibədar bir aləmə qovuşmaq həsrəti ilə qovrulub-yanan, lakin bu mümkün olmadığını dərk edib məyuslaşan bir adamın keçdiyi halı müşahidə etdi. Qız xəyalən çox uzaqlara getmişdi. O özü də hiss etmədən yuxulu uşaq kimi gah gülümsünür, gah da qaşlarını çatıb ciddiləşirdi. Əşrəf onu şirin xəyallardan ayırmaq istəmədi. Salatın birdən köksünü ötürdü:

– Görəsən, mən də oxuya bilərəmmi?

– Niyə bilmirsən?

Qız bu sözləri ürəyində söylədiyini zənn edirdi. Ancaq Əşrəfin səsini eşidəndə diksindi və başa düşdü ki, qardaşı onun dediklərini eşitmişdir. O dayanıb Əşrəfin üzünə baxdı:

– Bacararammı?

– Niyə bacarmırsan?

– Sənin, bir də özümün adını yaza bilsəydim, dünyada heç dərdim olmazdı.

– Burda nə var, ay dəli, yaylağa çatan kimi sənə bütün hərfləri öyrədəcəyəm. Arana köçənə qədər təkcə bizim adımızı yox, ürəyindən keçənlərin hamısını yazmağı bacaracaqsan. Amma bir şərtim var. Gərək əvəzində hər gün mənə ləzzətli xörək bişirəsən.

– Belə mənim gözüm üstə.

Bacı-qardaş qol-qola verib bulağa yaxınlaşdılar. Elə bu vaxt qarşıdakı döngədən, meşə tərəfdən iki qız çıxdı. Əşrəf onun birini dərhal tanıdı. Deyəsən, qız da onu gördü. Tez kəlağayısını irəli çəkdi. Başını aşağı saldı. Sakitcə onların yanından ötmək istədi. Ancaq Əşrəf:

– Pakizə, – deyə onu çağırdı.

Qız ayaq saxladı. Əşrəfin sonra nə deyəcəyini gözlədi. Salatının isə təəccübdən qaşları çatıldı.

– Bir dolça su ver.

Pakizə qıpqırmızı oldu. Gözünü qaldırıb Əşrəfə, sonra da Salatına baxdı. Onlardan bir az aralı dayanıb gözləyən qız qaş-göz oynatdı. Him-cimlə başa salmağa çalışdı ki, dayanma, ancaq Pakizə yerindən tərpənmədi. Salatının hirsindən dişləri kilidləndi.

– A qağa, xalqı yolundan saxlama, onsuz da bulağa çatmışıq.

– Yox, mən Pakizənin səhəngindəki sudan içmək istəyirəm.

Pakizənin dodağı azca qaçdı. Dişləri parıldadı. Kəlağayısı sürüşdü. Onun ağ boynu, qulağındakı qızıl sırğası göründü, sinəsinin üstünə qədər sallanan iki qatar mərcan Əşrəfin diqqətini cəlb etdi. Qızın nəzərə güclə çarpacaq qədər zərif olan buxağı sifətini daha da gözəlləşdirirdi.

– Dolça hanı?

Əşrəf onun səsinin titrədiyini duydu. Salatının əlindən dolçanı aldı. Pakizə qolunu çiynindəki səhəngin qulpuna keçirmişdi. O azacıq aşağı əyildi, tıxacı çıxartdı. Xırda, qırmızı alçalar taqqıltı ilə bir-bir dolçaya töküldü, bir xeyli də ətrafa səpələndi. Pakizə qonur gözlərini süzüb Əşrəfin üzünə baxdı. Dodaqları astadan tərpəndi. Az qala pıçıltı ilə dilləndi:

– Bəsdirmi?

– Bəsdi, bəsdi, sonra özünə qalmaz.

– Səhəng doludur.

Salatın Pakizənin hərəkətlərinə heyrətlə baxsa da, səhəngdən su yerinə alça töküləndə təəccüblə dilləndi:

– A – az, ətin tökülməsin, bu nədir?

– Bulağın üstündən o yanda bir ağac var, üstü doludur, istəyirsiniz siz də gedin, dərin.

Pakizə camaat bilməsin deyin, qəsdən səhəngə su əvəzinə alça doldurduqlarını və gizlicə aradan çıxmaq istədiklərini izah etmədi. Sakitcə səhəngin ağzını tıxadı. Gülə-gülə Salatının üzünə baxdı. Geri dönüb cığıra düşməzdən əvvəl, ani sezilməyəcək dərəcədə sürətli bir çevik-

liklə gözünün ucu ilə Əşrəfi süzdü. Əşrəfə elə gəldi ki, qız ayaq saxlayıb daha nə isə demək istəyir. Özü də hiss etmədən cəsarətləndi:

– Məndən inciməyibsən ki?

– Nədən ötəri?

– Kürün qırağında səni qorxutdum.

– Tək məni qorxutmadın ki. Hamını hürkütdün. Adam atı yavaş sürər.

– Dalımızca çoxmu qarğadın?

Pakizənin yanaqları daha da qızardı. Gözlərində sevinc qığılcımı oynadı. Dodağını dişləyib yerində silkələndi:

– Olmaya mənim sözlərim xətrinə dəyib?

– Yox, elə-belə soruşuram.

– Mən küsməmişəm. Səni bilmirəm.

Pakizə ərkyana Əşrəfin gözünün içinə baxdı və qələbəsinə əmin olan adamlar kimi dabanı üstə fırlanıb, o biri qızın dalınca yüyürdü. Əşrəf heyrətlə onun arxasınca baxdı. Pakizə yoldaşına bərabərləşəndə qız onu məzəmmətə başladı. Əşrəf onların sözlərini aydınca eşitdi.

– Bizi niyə biabır elədin, a günü qara, indi Əşrəfin üzünə necə baxacaqsan?

– Nə eləyim, o su istədi, mən də olanımı verdim.

Salatın qardaşının yerindən tərpənmədiyini, qızları köçün bərabərinə qədər gözü ilə müşayiət etdiyini görəndə lap heyrətləndi. Əşrəfin bu halı onu hürkütdü. Yavaşca qardaşının qoluna toxundu:

– Sənə nə oldu?

– Hə... heç... nə... gedək.

Onlar bulağın üstündə də, geri qayıdanda da heç nə danışmadılar...

Axşam oldu. Göytəpəlilər düşərgədən tərpənmədilər. Onlar burada bir xeyli dincəlməyi qərara aldılar. Onsuz da yollar tutulmuşdu. Sürü ilə yaylağa qalxan qoyunların, qatarlaşan arabaların, ilxıların, atlı-piyada hərəkət edən aran adamlarının əlindən tərpənmək olmurdu. Yolların üstünü bulud kimi bürüyən toz axşama qədər yerə çökmür, sürülərin ardınca sürünə-sürünə yuxarılara qədər qalxırdı. Bir az gözləmək, heyvanlara da rahatlıq vermək lazım idi.

Arabaların yanında ocaq qaladılar. Dağların quru fıstıq odunu çatırdadı, qığılcımlar ətrafa sıçradı, alovlar dilim-dilim olub göyə qalxdı. Ətrafda hərlənənlərin kölgəsi uzandı, çayın üstünə sərildi. Alovların işığı bir-birinə qarışdı. Qaranlıqda mürgüləyən dağların döşünə işıq düşdü, qıjıltı ilə axan çayın sinəsi parıldadı. Göyün üzündə şəfəq oynadı.

Cahandar ağa arabaların yanında ocaq qalamağa icazə vermədi. İşıqda hər şeyin nəzərə çarpacağından ehtiyat etdi. Onun nökərləri mal-qaranı bir az kənarda saxladılar, elə oradaca ocaq qaladılar.

Cahandar ağa palıd ağacının dibində oturdu. Əşrəf onun geri yanında əyləşdi. Sakitcə düşərgəyə baxdı. Ocaqlar olmasaydı, iki addımlıqda nələr baş verdiyini təyin etmək çətinləşərdi. Göyün üzünə ulduzların səpələnməsinə baxmayaraq, çayın vadisi qaranlıq idi. Dağlar o qədər uca idi ki, səmanın bir parçasından başqa heç nəyi görmək mümkün deyildi. Sıldırım qayaların və dağların qatı kölgəsi gecənin qaranlığını daha da tündləşdirirdi.

Axşamdan xeyli keçdi. Arabaların dal taxtasına bağlanan itləri açdılar. Uşaqlar və arvadlar dəyələrə doluşdular. Ocaqların alovları azaldı. Əl-ayaq yığışıldı. Gecə oyaq qalıb, növbə ilə keşik çəkəsi adamlardan başqa hamı rahatlandı. Əşrəf də arabaya gəldi.

Salatın yer salıb qardaşını gözləyirdi. Onlar yanaşı uzandılar. Xeyli sükut içində dayandılar. Suyun qıjıltısına, meşə quşlarının səsinə qulaq asdılar. Hərdənbir hardansa şaqqıltı gəlir, qayalar dığırlanıb çaya düşürdü. Görünür, mal-qaranın iyini duyan ayılar yaxınlarda dolaşırdı...

Kimsə tütək çalmağa başladı. Əşrəf gözlərini yumub lap uşaqlıqdan sevə-sevə qulaq asdığı havaları dinlədi. Cəmi səkkiz deşiyi olan adi, nazik mis tütəyi dodaqlarına yaxınlaşdırıb çalan adamı gözlərinin qarşısında canlandırmağa çalışdı. Kənd arasında hamının şümşad adlandırdığı bu tütəyin səsində qəribə, ürəyə yol tapan və xəyalı uzaqlara aparan bir hüzn var idi.

Tütəkdə əvvəlcə çobanbayatı çaldılar, sonra da zarafata başladılar. Əşrəf tütək çalanların tütəklə adamlara çataşdıqlarını, qız-gəlinlərə söz atdıqlarını çox gözəl bilirdi. Nədənsə bu sadə və səmimi zarafatdan heç kəs incimirdi. Əşrəf uşaqların, yeniyetmələrin, hətta yaşlı kişilərin belə tütək çalanlara cavab verdiklərini, bir-iki baməzə söz dediklərini indi də xatırlayırdı. O, balacalıqdakı kimi diqqətlə tütəyə qulaq asdı və onun nə dediyini ürəyində təkrar etdi: "Ədə, ədə, o yolnan gedən oğlan, qurban olum telli bacına, qələm qaşlı, incə belli bacına".

Əşrəf arabanın boynuna doğru gəldi. Mütəkkəni sinəsinin altına qoyub ağzı üstə uzandı. Ocağın ətrafında toplaşanlar buradan aydın görünürdü. Salatın da onun yanına gəldi. Tütək çalan ara verdi. Ətrafdakılar gülüşdülər. Sonra da oyun havası çaldılar. Uşaqlardan birini ayağa qaldırıb ortaya saldılar, əl çalıb oynatdılar. Onların gülüşü, hay-harayı

dalğa-dalğa olub çayyuxarı yayıldı, dərəni doldurdu. Salatın dirsəyi ilə Əşrəfə toxundu:

– Ay qağa, xoşuna gəlirmi?

– Yaman. Məni qınayan olmasaydı, bu saat qaçıb oynayanlara qoşulardım.

– Bu da bayaqkı deyil, bizi biabır eləmə.

– Niyə, oynayanda nə olar ki?

– Necə nə olar? Heç seminariyada oxuyan onlara qoşularmı?

– Niyə, mən onlardan artığam?

– Bə nə, heç onların tayısan?

– Bilirsən nə var, Salatın, Allah hamını bərabər yaradıb.

– Bircə kiri, kiri, axşam vaxtı Allahda-zadda işin olmasın. Qulaq as, mahnı oxuyurlar. Batmışın gör nə yaxşı səsi var.

Oturmuşdum bulaq üstə,
Qızlar gəlir dəstə-dəstə.
Qoy məni öldürsünlər,
Bir alagöz qız üstə.
Aman ovçu vurma məni,
Mən bu dağın maralıyam,
Yar əlindən yaralıyam.

Elə bil hamı susmuşdu. Nəfəsini içəri çəkib bu həzin nəğməyə qulaq asırdı. Mahnı isə qayalarda əks-səda verib gecənin qaranlığında daha uzaqlara yayılırdı...

Bacı-qardaş düşərgədə səs-səmir kəsilənə qədər beləcə uzandılar. Tütək susandan sonra arabanın içinə çəkilib, yatmağa hazırlaşdılar. Arxası üstə yanaşı uzandılar. Hər ikisi gözünü dəyənin üstündəki keçəyə zilləyib susdu. Qaranlıqda bir-birinin üzünü görməsələr də, nəfəs almalarından yatıb-yatmadıqlarını bilirdilər. Salatın bulağın üstündəki hadisəni unuda bilmirdi. Pakizənin ayrılarkən Əşrəfin üzünə necə baxdığı yadından çıxmırdı. Qızın gülüşü, kirpiyini çaxması, Əşrəfi necə həvəslə süzməsi gözünün qabağından getmirdi. "Günü qara gəlmişin gözü elə bil ilan gözü kimi ovsunludur. Az qalmışdı bircə dəqiqənin içində gədənin dilini, ağzını bağlasın". Salatın Pakizənin qonur gözlərinin necə süzüldüyünü və gözlənilmədən adama necə qıyqacı baxdığını yadına saldı. Onun dodaqlarından silinməyən gülüşü, sol yanağının

azacıq çökəldiyini nəzərində canlandırdı. Pakizənin titrək səsini belə eşidən kimi oldu. Özü də hiss etmədən köksünü ötürdü. “Qardaşım neyləsin, mən qızlığımla ölmüşə baxa bilmirəm. Gözü qayır-qayır oynayır. Qımışanda adamın tüstüsünü təpəsindən çıxardır. Bəxtəvərin qızının sümükləri şırt-şırt şırtlayır. Batmış elə bil qaraçı gözəlidir, qaşgözü adamı yandırır, beli də ki, üzükdən keçər. Özü də deyəsən qağamdan kəsir. Ürəyində şıltaqlıq olmasaydı, onun qabağında mum kimi əriyib axmazdı”. Salatının ürəyində birdən-birə qardaşının boyuna qovalanan bir bacının iftixarı baş qaldırdı. O, kəndin ən gözəl qızlarından birinin Əşrəfdən ötəri qovrulub yandığına sevindi. “Qoy ağzının suyu axsın, qoy qardaşımın dalınca sürünsün, boyuna qurban olduğumun boyuna vurulsun, – deyə xəyalından keçirdi. – Hə, deyəsən ürəyin tökülür, hələ harasıdır, çoxlarınız qardaşımın dalınca sürünəcəksiniz, dilinizi bir qarış çıxardıb mənə yalvaracaqsınız, dörd yanımda şırvanacaqsınız ki, məni alın, mən sizin gelininiz olmaq istəyirəm. Amma onu görməyəcəksiniz. Hamınıza dağ çəkəcəm. Qardaşımın boyuna qurban olum, hələ çox qızlar onun ayağına döşənəcək”.

Lakin bu fərəhli düşüncələrin dalınca gələn başqa fikirlər onu sarsıdırdı, onun sevincini sel kimi yuyub özü ilə aparırdı.

Salatın bir anlığa bibisinin ölümünü gözünün qarşısına gətirdi. Onun müsibətini yadına saldı. “Onun qanlısı Molla Sadıqdır, – deyə düşündü. – Əgər onun fitnəsi olmasaydı, bibim nə müridlərin meyxanasına gedərdi, nə də başına bu iş gələrdi. Dədəm bu dərdi heç unudarmı? Elə bundan əvvəl də onların sözü düz gəlmirdi. Dədəmin Molla Sadıqdan zəndeyi-zəhləsi gedir, həmişə ona “dınqıra süzən qurumsaq” deyir. İndi də onlar lap xəncər-bıçaqdadırlar. Heç belə işə dədəm qol qoyarmı? Yoxsa Pakizə ilə Əşrəfin elə əvvəldən him-cimi var, bizim xəbərimiz yoxdur? Belə olmasaydı xısın-xısın danışmazdılar. Onların bir-birinə üstüörtülü dedikləri nəydi? Yoxsa Əşrəf də dədəmin sözündən çıxacaq? Razılıq almadan gedib özbaşına evlənəcək? Yoxsa bu qardaşımın da toyunu görməyəcəm?”

Salatın lap darıxdı. Düşüncələrinə ara verib, qardaşının nəfəsinə qulaq asdı.

– Ay qağa, yatmayıbsan ki?

– Yuxum gəlmir.

– Mənim də.

Yenə susdular. Hər ikisi bir-birinin necə nəfəs almasını eşitdi.

– Pakizə ilə üstüörtülü danışdığın nəydi?

Əşrəf dönüb Salatının üzünə baxdı. Qaranlıqda onun nələr düşündüyünü sifətindən oxumağa çalışdı.

– Elə buna görə yuxun qaçıb? Gözünü yum, yıxıl yat.

– Deməsən əl çəkən deyiləm.

Əşrəf bacısının doğrudan da həyəcan keçirdiyini duydu və onu sakitləşdirmək məqsədi ilə Kürün sahilində Pakizə ilə necə rastlaşdıqlarını ona danışdı. Salatın azacıq rahatlansa da, Pakizənin hərəkətini bağışlaya bilmədi.

Aradan xeyli keçdi. Düşərgəyə tam sükut çökdü. Ocaqların közü sönüb kül oldu. Çayın qıjıltısı çoxaldı.

– Ay qağa?

– A günü qara, yatmamısan?

– Pakizədən xoşun gəlir?

– Sənin xoşun gəlir?

– Nə bilim, sir-sifəti pis deyil.

– Qəşəngdir.

Salatın susdu. Birdən ağlına qəribə bir fikir gəldi. Qız vahimələndi. "Deyəsən gədəyə cadu eləyiblər. Bəlkə elə o alçalara cadu yazılmışdır? Günü qara qəsdən yolumuzun üstünə çıxdı? Su yerinə Əşrəfə alça verdi? Allah, amandır, köpək uşağı qağamı dərdə salmasalar yaxşıdı".

Salatın qalxıb oturdu. Həyəcanından tövşüyə-tövşüyə, təlaşla dilləndi:

– Ay qağa, alçadan yedinmi?

– Lap ləzzətnən. Bəs sən yemədin?

– Yox.

– Nədi, ay dəli, niyə tövşüyürsən?

– Caduya inanırsan?

Əşrəf üstündəki yorğanı atıb oturdu. Arabanın qabaq tərəfindən ayın işığı içəri düşmüşdü. İndi o, bacısının üzünü bir balaca görürdü. Salatın qorxudan əsir, diqqətlə qardaşının üzünə baxırdı:

– Cadu nədir?

– Nə bilim, ay qağa, deyirlər Molla Sadıq cadugərdir. Arpanı dirəyə dırmaşdırır.

– Deyək ki, bunlar doğrudur, nə olsun?

– Nə bilim, ay qağa, dilim-ağzım qurusun, ağlıma gəlir ki, birdən sənə cadu eləyərlər, səni yolundan azdırarlar. Ondan sonra günümüz

qara olar. Özün bilirsən ki, atamın onları görməyə gözü yoxdur. Heç belə işə razı olarmı?

– Niyə olmur, ay Salatın?

– Nə bilim, ay qağa, qorxuram. Sən Allah, onlardan uzaq ol. Alçadan da yeyibsən, heç ürəyim rahatlanmır.

– Yəni deyirsən, alçalar cadulu olar, hə?

– Gülmə.

– Durub qalanını da yeyəcəm.

– Məni ələ salma, qağamın canı üçün, sənciyəzi cadulayıblar.

– Ovsunlanmışam, bacı, Kərəm kimi yanıram, qoyma.

– Əşrəf, məni qorxutma.

Əşrəf gülə-gülə bacısını qucaqladı. Yastığın üstünə yıxıb yorğana bürüdü. Özü də onun böyrünə uzandı. Səsini ciddiləşdirdi:

– Yaxşı, elə sözlər danışma. Ağılsız ha deyiləm, hər şeyi bilirəm. Özüm səni cinləndirirdim. Gecə keçir. Yatmaq lazımdır.

– Düz deyirsən, gəl yataq.

Onlar bir-birinin qoynuna qısıldılar. Azacıq sonra dəyənin içini məsum bir mışıltı doldurdu.

* * *

Səhərə yaxın dalbadal iki güllə açıldı. Ağaclar əks-səda verib şaqqıldadı. Bütün dərə uğuldadı. Ocaqların kənarında mürgüləyənlər dik atıldılar. Düşərgə silkələnib yuxudan oyandı. Qarmaqarışıq halda hərə bir tərəfə qaçdı. Hələ nə olduğunu başa düşə bilməyən arvadlar uşaqlarını tez qucaqlarına aldılar. Kişilər dərhal öz mallarını yoxladılar. Qonşular bir-birilərini səsləyib nə olduğunu soruşdular. İtlər yolun o üzündə meşənin dərinliyinə cumdular.

Cahandar ağanın oyanması ilə paltarını geyinməsi bir oldu. Çaxmağını hərləyib gülləni lüləyə verdi. Ancaq arabadan çıxmadı. Tüfəngli, çomaqlı yola doğru qaçanların qayıtmasını gözlədi. Əşrəf də hövlnak yuxudan oyandı və tüfəngini götürüb meşəyə getmək istədi. Ancaq atası onu saxladı. Bir az da keçdi. Üfüq qızardı. Bulağın alt tərəfindəki çəmənlikdən, çayın lap yaxınlığından qumrov səsi gəldi. Sonra da inilti eşidildi. Nökərlər yaralı maralı palıd ağacının dibinə gətirdilər. Əşrəf dözmədi. Sıçrayıb arabadan çıxdı.

Maralın sinəsindən qan axırdı. Heyvan qalxmaq istəsə də bacarmır, çapalayıb buynuzunu yerə döyür, taqətdən düşəndə isə ayaqlarını

uzadıb yazıq-yazıq ətrafına boylanırdı. Hamı susurdu. Neçə ildən bəri əldə bəsləyib böyütdükləri maralın bu cür, gözlənilmədən hansı bir mərdimazarınsa gülləsinə qurban olması onları kədərləndirirdi.

Cahandar ağa gələndə nökərlər geri çəkildilər. Maral sahibini görən kimi son qüvvəsini toplayıb durmaq istədi. Gücsüzlüyünü hiss edib inildədi. Onun gözləri yaşaran kimi oldu. Bu gözlərdə sanki imdad istəyən bir canlının yalvarışı vardı. Cahandar ağa bulud kimi tutuldu. Başa düşdü ki, kimsə yenə ətrafında dolanır. Bu təsadüfün nəticəsi deyil. Bu, düşmənçilik idi.

Arabasını köçün lap kənarında, atasından xeyli uzaqda açmış olan Şamxal da yuxudan səksəkəli oyanmışdı. Hətta atasını gec görəndə təşvişə də düşmüşdü. İndi də nəzərə çarpmadan kənarda, ağacların dalında dayanmışdı.

Onun dodaqları təpimişdi. Bığının ucunu ağzına alıb çeynəyirdi. Barmaqları əsirdi: "Bu nə idi? Kişiyə sataşan kim idi? Yoxsa onu tək görüb üstünə ayaq alırdılar? Camaat arasında hörmətdən salmaq istəyirdilər?" Şamxalın birdən-birə ürəyi kövrəldi. Az qaldı ağlasın. O ən çox hirslənəndə, lakin nə edəcəyini bilməyib acizləşəndə ağlamaq istəyirdi. İndi də belə oldu.

Maralı kimin vurduğunu müəyyən etmək çətin idi. Əgər o bir adamdan azca şübhələnsə, bu işdə əli olduğunu bilsə, dinməz-söyləməz tüfəngi üzünə qaldırıb tətiyi çəkməyə hazır idi. Şamxal işinin yalnız maralla qurtarıb gedəcəyinə arxayın deyildi. O bu saat kiminsə ağacların dalından, ya da qayaların birinin dibindən köçə atəş açacağından, bəlkə də daha böyük bir bədbəxtliyin üz verəcəyindən qorxurdu. Ona görə də kənardaca gizlənib ətrafı güdürdü. Atası ilə küsülü olsa da, onu gözündən qoymurdu. Gizlicə onun keşiyini çəkirdi. Zərnigar xanımsa arabanın içində üz-gözünü cırır, bu işin nə ilə qurtaracağını gözləyirdi.

Əhvalatın nə yerdə olduğunu bilənlər yavaş-yavaş ağacın dibinə toplandılar. Can verən marala baxıb heyfsiləndilər.

Nökərlərdən biri marala baxıb köksünü ötürdü:

– Ağa, necə olubsa gözümüzdən qaçıb suyun qırağındakı çəmənliyə gedib. Hansı köpək oğlusa elə bilib çöl maralıdır. Yoxsa əl heyvanına güllə atmazdılar.

Bayaqdan qovrula-qovrula qalıb, nə edəcəyini, camaata nə deyəcəyini müəyyənləşdirə bilməyən Cahandar ağa bu sözdən yapışmağı qərara aldı. O beləliklə hələlik izi itirmək, həqiqəti bilənə qədər susmaq istəyirdi.

Meşəyə doğru gedənlər də, kimi isə lap uzaqlara qədər qovanlar da qayıtdılar. Cahandar ağa zəhmli baxışlarını nökərlərin üzünə zillədi:

– Nə oldu, bir şey gözünüzə dəymədi?

– Yox, ağa, itlərin dalınca lap o yanlara getdik. Heç kəs yox idi. Görünür, duyuq düşüb vaxtında aradan çıxıblar.

Cahandar ağa özünü sındırmamaq üçün maralın üzünə baxmadı. Qorxdu ki, heyvanın halı onu kövrəldər. Qutusunu çıxardıb papiros eşdi.

– Sizə tapşırmamışdımmı səhərə qədər oyaq olun, yol-izdir, gəlib-gedən olur?

– Vallah yatmamışdıq, həm də işıqlaşırdı.

– Kəs səsini, axmaq, sizin kimi maymaqlar olan yerdə adamın maralına da güllə atarlar, itinə də daş. Daha bəsdi, gözünüzü döyməyin. Tez olun, arabaları qoşun.

Yarımca saat keçməmiş köç yola düşdü. Əvvəlcə malları hayladılar, sonra isə arabalar qatarlaşdı. Cahandar ağa həmişəki kimi atını çapıb qabağa düşmədi. Fikirli-fikirli arabaların yanı ilə getdi.

## 11

Əhməd "Zayej"in qabağında təkcə oturmuşdu. Tez-tez tərini silir və zəhlətökən bir səslə cikkildəşən boz sərçələrə baxırdı. Onlar gah divarın daşları arasındakı ovuqlara girir, gah da eyvanın məhəccərinə qonur, gah da bir-birini didə-didə çəpərə doluşurdular. Onların zil səsi adamın beynini deşirdi. Nədənsə Əhməd isti yay günlərində sərçələrin cikkiltisinə qulaq asanda qüssələnirdi. O hamı tərəfindən unudulmuş bir adam kimi yalqızlıq hiss edirdi.

Sərçələr hay-küylə havaya qalxdılar. Onların səsi eşidilməz oldu. Əhmədin qulaqları cingildədi. O darıxdı. Ayağa durub xır yoluna boylandı. Uşaqlar onun yanına gəlməli, dünən öyrəndiklərini bu gün təkrar edib yoxlamalı idilər. Vaxta az qalırdı. El dağdan qayıdanda Əhməd onları Qoriyə, seminariyaya imtahana aparmalı idi. "Yazıqlar yəqin yenə istinin əlindən özlərini Kürə veriblər, axşama qədər sudan çıxmayacaqlar", – deyə düşündü. Onun da ürəyindən çimmək keçdi. Eyvana getdi. Elə bu vaxt bir şey tappıltı ilə onun qabağına düşdü. Əhməd diksinib geri çəkildi. Yumaq kimi yumrulanan qızıl ilan qıvrılıb açıldı və dərhal quyruğu üstə qalxıb fısıldadı. Əhməd onun soyuq üzünü, açıq

ağzını, tez-tez çıxardığı qara dilini və qarmaq dişlərini aydınca gördü. O bircə an da geciksə ilan üstünə atılacaqdı. Əhməd ona imkan vermədi. Divarın dibindəki yabanı götürüb, başını əzdi. Bir xeyli ilanın qıvrılan quyruğuna baxdı. "Ulduz görməsə ölməyəcək", – deyə düşündü. Yaba ilə götürüb çəpərin üstünə atdı. İlanın qarnının altı parıldadı.

Sərçələr hay-küylə çəpərə qondular. İlana baxıb cikkildədilər. Qanadlarını çırpıb boğazlarını pırpızlaşdırdılar. Elə bil onu didib-parçalamaq, nəyinsə intiqamını almaq istəyirdilər.

Əhməd yalnız indi başa düşdü ki, bayaq sərçələri qorxudan, onları qaçırdan bu ilan imiş. O gülümsündü. "Deyirlər qızıl ilanın yeddi qardaşı olur, birini öldürəndə o biriləri qardaşlarının intiqamını alır", – deyə xəyalından keçirdi. Otağa girmədi. Geri dönüb kəndə doğru addımladı.

Hava təndir kimi qarsalayırdı. İsti adamın boğazına dolub onu boğurdu. Cırcıramalar belə təntiyib susmuşdular. Onlar ancaq axşamüstü, sərin düşəndən sonra oxuyacaqdılar.

Əhməd torpaq yola buruldu. Uşaqları evdə tapmaq ümidi ilə kəndə girdi. Ayağı topuğa qədər narın, yumşaq toza batdı. Kənd xarabaya oxşayırdı. Qapı-bacada heç kəs gözə dəymirdi. Görünür, dağa köçə bilməyib aranda qalanlar da iş-güc dalınca getmişdilər, bir də qaranlıq qarışanda geri qayıdacaqdılar. Qara damları nazik tel kimi bir-birinə bağlayan cığırları gediş-gəliş kəsildiyindən ot basmışdı. Elə xırman yerlərini də çayır örtmüşdü. Kalafalıqlardakı qanqallar saralıb-solmuşdu.

Əhməd kəndin bomboş olduğunu görüb sahilə endi. Hələ suvadağa çatmamışdan səs-küy eşitdi. Yarğanın qaşında ayaq saxlayıb, çimişən uşaqlara tamaşa etdi. Onlar üzmək öyrənirdilər. Tumanlarının başını və ayağını bağlayıb, tuluq kimi üfürmüşdülər. Sinələrinin altına qoyub, əlləri və ayaqları ilə suyu şappıldadırdılar. Balıq qovuğu kimi ortadan boğmalanıb köprüyən bu ağ tuluqlar onların qoltuqlarının altından dik qalxıb bellərinin ortasında qoşalaşmışdı. Uşaqlar qanadlı çəyirtkələrə oxşayırdılar.

Əhməd suya daş atdı. Uşaqlardan Osmangili soruşdu. Dedilər ki, bir az bundan əvvəl çimişirdilər, yəqin bostana gediblər. O, istidən təntisə də çimmədi. Sahildən uzaqlaşdı.

Bostanın ətrafını kalış basmışdı. Qalan yerləri isə göy ot bürümüşdü. Yalnız cığır ağarırdı. Qarpızlar qoyun sürüsü kimi tağların üstündə yatmışdı. Yemişin ətri hələ xeyli uzaqdan adamı vururdu. Əhməd cığırla bostanın ortasındakı talvara sarı yollandı. O arabir dayanıb, üstü

otla basdırılmış böyrü nişanlı qarpızlara, şirinliyindən qabığı çat-çat olan boz yemişlərə baxırdı. Birdən dayandı. Tağların arasındakı bala şamamanı gördü. Qeyri-iradi aşağı əyilib qopartdı. Kimsə talvarın yanından qışqırdı.

Əhməd bostançıya yaxınlaşdı. Salam verib dayandı. Kişi ona cavab verəndən sonra talvarın dirəyinə söykənib domuşuqlu oturdu. Uzun qəlyanını çıxartdı. Kisənin içinə salıb xeyli eşələdi, gözəyarı tütünlə dolduğunu müəyyən edib çıxartdı. Baş barmağı ilə basıb hamarladı. Damağına aldı. Bundan sonra arxalığının cibindən bir parça qov çıxardıb daşın üstünə qoydu. Tələsmədən çaxmağı bir neçə dəfə çaxdı. Alışdırıb qəlyanını odladı. Ordu çökələ-çökələ sorub tüstülətdi.

– Bərəkətli olsun, Rüstəm əmi, yaxşı bostanın var.

Kişi talvarın kölgəsində, arxın qırağında oturan Əhmədin üzünə belə baxmadan dilləndi:

– Sağ ol, bala, ömrün uzun olsun.

– Molla ilə şəriklimi əkibsən?

– Hə, demək olar ki, şərikliyik.

– Neçədən biri sənindir?

– Yeddidən.

Əhməd dinmədi. Dikəlib bostanın eninə, uzununa baxdı. Ürəyində bu boyda bostandan bostançıya nə qədər pay düşə biləcəyini hesabladı. Kişi gözünü qıyıb onun üzünə baxdı və elə bil ürəyindən keçənləri duyub gülümsündü:

– Başı mollanın, döşü mollanın, yeddidən beşi mollanın, yerdə qalan iki payı, onunla da var işi mollanın. Heç belə söz eşidibsənmi?

– Eşitmişəm, niyə eşitməmişəm. Hər yerdə belə deyilmi?

Rüstəm kişi dərindən köksünü ötürdü və səsinin ahəngini dəyişdi:

– Allah bərəkət versin, a bala, hələ yaxşı ki, bu var. Bu olmasa nə edərdik?

Əhməd kişinin Allaha təvəkkül eləyib susduğunu gördü.

– Molla bu qədər qarpızı, yemişi neyləyəcək?

– Satacaq, bala, hamısını şəhərə göndərəcək.

Əhməd susdu. Rüstəm kişi yerindən qalxıb ağır-ağır talvara doğru addımladı. Kalışlığın arasındakı qarpızlardan birini götürüb geri qayıtdı.

– Al kəs, bala, yaman istidir, ye, ürəyin sərinləsin.

– Zəhmət çəkməyin, heç nə lazım deyil, əmi, mən ayrı işdən ötəri gəlmişəm.

– Adətdir, bala, bostan üstünə gələn adam gərək qarpızdan, yemişdən kəssin. O ki qaldı, sənin nədən ötəri gəldiyini bilirəm. Yenə deyəcəksən ki, Səlimi ver, oxumağa aparım. Başını ağrıtma, bala, baş tutan iş deyil.

– Niyə ki, Rüstəm əmi, axı biz şərtləşmişik?

– Yox, bala, bu kol biz girən kol deyil. Sonra fikirləşdim, mənim gücüm çatmaz.

– Bu olmadı. Neçə vaxtdır əziyyət çəkirik, dərs keçirik. Səlim çox zehinli uşaqdır. O mütləq oxumalıdır. Əşrəf oxuyur, pisdirmi?

– Əşrəfə baxma, bala, o Cahandar ağanın oğludur, var-dövləti var, mən kiməm?

Əhməd qarpızı geri itələdi:

– Axı mən səni başa saldım ki, hər şey hökumətin hesabına olacaq. Yeməyi də, yatmağı da, oxumağı da, əyninin paltarı da müftə olacaq. Yol xərci də verəcəklər. Daha nə istəyirsən?

– Divan işidir, a bala, inanmaq olmaz. Sənin dediklərindən ağlım bir şey kəsmir.

– Vallah, billah səhv eləyirsən. Mənə inan, əgər bir pislik olsa, mən cavabdeh.

– Sənin yaxşılıq eləmək istədiyini başa düşürəm, amma...

– Amması-zadı yoxdur. Səlim mənimdir, vəssalam, onu oxudacağam.

Rüstəm kişi bir xeyli susdu. Qəlyanını sümürüb xoruldatdı. Gözünü qıyıb tüstüsünün arasından Əhmədin üzünə baxdı:

– Yaxşı, qarpızını kəs, sonra fikirləşərik.

– Burda fikirləşməli bir şey yoxdur. Bu barədə söz ola bilməz. Mən ayrı bir işdən ötəri sənin yanına gəlmişəm, özün heç, gərək başqalarını da başa salasan.

– O nə işdir, a bala?

– Səlimi yaylağa aparmaq istəyirəm.

– Yaylağa, xeyir ola?

– Bilirsənmi, Rüstəm əmi, hava çox istidir, – deyə Əhməd izaha başladı. – Burda uşaqlara bir şey öyrətmək olmur. Vaxta da az qalıb. Mən belə qərara gəlmişəm ki, onları götürüb yaylağa aparım. Orda həm bir az sularını dəyişsinlər, həm də gecə-gündüz dərs keçim. El dağdan dönəndə də aparım seminariyaya. Ağlın nə kəsir?

Kişinin alnının qırışları yığıldı. Xırdaca gözləri fikirli-fikirli bir xeyli yerə zilləndi. Baş barmağı ilə qəlyanının külünü basdı. Bərkdən sümürdü. Onun ovurdları çökəldi. Göyümsov tüstü saqqalı boyu aşağı yatıb sinəsinə yayıldı:

– A bala, məsəl var deyərlər, avazın yaxşı gəlir, oxuduğun Quran olsa. Bacarsaydıq uşaqlarımızı elə özümüz yaylağa aparardıq, aranın istisində qalıb bişməzdik.

– Bilirəm, Rüstəm əmi, hər şey mənə aydındır. Hər şeyi ölçübbiçmişəm. Yol xərci də, lap yemək-içmək də mənim boynumadır.

– Ay oğul, – deyə kişi bu dəfə həm təəccüb, həm də heyrətlə Əhmədə müraciət etdi. – Nə yaman arxayın danışırsan, axı sənin nəyin var? Qərib adamsan. Eşitdiyimə görə, heç bir dəst yorğan-döşəyin də yoxdur, bu uşaqları yığıb haraya aparmaq istəyirsən?

– Dedikləriniz düzdür. Ancaq bir az pulum var. Hər ay donluğumdan artırıb saxlamışam. Bir furqon tutacağam.

– Sonra?

– Sonra da biriniz çətən verərsiniz, biriniz keçə. Bir-iki dəst də yorğan-döşək taparıq. Birbaşa qalxarıq yaylağa. Vəssalam.

Rüstəm kişi başına bir qıymaça çəkmişdi. Tərdən və torpaqdan parçanın rəngi qapqara qaralmışdı. Əhmədin son sözlərindən sonra o, əlini uzadıb qıymaçanı açdı. Bir xeyli fikirli-fikirli ülgüclə tərtəmiz qırxılmış başını ovxaladı:

– A bala, Əhməd, mən bir şey başa düşə bilmirəm.

– O nədi elə?

– Bu uşaqlar sənin qohumun deyil, tanışın deyil, heç bir kənddə də anadan olmayıbsınız, sənə nə düşüb ki, özünü öldürürsən? İndiki zamanda heç qardaş qardaşa bir tikə çörək vermir.

– Eh, əmi, – deyə Əhməd dərindən köksünü ötürdü, – elə dərd də burasındadır ki, bir-birimizə kömək eləmirik. Qalxan yıxılana baxmır. Kim güclüdürsə, hər şeyi qamarlayıb alır. Biri var-dövlətini qoymağa yer tapmır, o biri acından ölür. Biri gecə-gündüz dəridən çıxıb işləyir, o biri at belində gəzir.

– Bunlar hamısı Allahın işidir, a bala.

– Allahın yox, bəndənin işidir. Allah heç vaxt göydən yerə enib bu torpaqları bölüşdürməyib.

Rüstəm kişi susdu. Əhmədi birinci dəfə görürmüş kimi heyrətlə süzdü. Sonra da nəzərə çarpmayacaq dərəcədə astadan başını tərpətdi. “Suyun lal axanı, adamın yerə baxanı buna deyiblər. Gör nələr danışır! Deyəsən heç iki ölünü bir qəbirdə qoyana oxşamır, ağzı çox odludur. Amma insafa qalsa, dediklərinin hamısı düzdür. Deyəsən, irəlini, gerini fikirləşən adamdır”, – deyə düşündü. Qəlyanını təzədən doldurub tüstülətdi:

– Yaxşı, indi sən nə eləmək istəyirsən?

– Camaatıma kömək.

– Bayaq dedim, a bala, sənin əlində nə var ki, camaata da kömək eləyəsən?

– Mənim əlimdə heç nəyim olmasa da savadım var. Mən camaata bununla kömək eləyəcəm. Əgər hamı oxusa, savadlı olsa, belə haqsızlıqlar baş verməz. Biz cəhənnəm, heç olmasa bizdən sonra gələnlər yaxşı dolansınlar, xeyiri şərdən seçə bilsinlər. Bax, mənim istədiyim budur, Rüstəm əmi, mən istəyirəm ki, sənin oğlun Səlim oxusun, savadlı olsun. Xeyir-şərini başa düşsün. Daha onun-bunun əvəzinə işləməsin. Aydındırmı?

Qoca çiyinlərini çəkdi:

– Nə bilim, a bala, dediklərin düzdür. Amma dünya belə gəlib, belə də gedəcək. Bu işlər düzələn deyil.

– Düzələcək. Mən bu uşaqları oxudacağam. Onların da hərəsi beş uşaq oxudacaq. Belə-belə hamı savadlanacaq, nadanlıq aradan qalxacaq. Elm dediyin işıq kimi bir şeydir, çoxaldıqca qaranlığın ömrü azalır, adamın gözünə nur gəlir.

– Yaxşı, deyəsən, məni bağladın, a bala, bə o biri uşaqlarla da danışıbsanmı?

– Hələ heç kəsi tapmamışam.

– Qarpızını kəs, oğul, indi ki, belə oldu, arvada deyərəm, çörəkdən-zaddan bişirər, Allah köməyiniz olsun, gedin...

* * *

Göytəpənin üstünə boğucu, ağır qaranlıq çökmüşdü. Bir budaq, bir ot, bir yarpaq belə tərpənmirdi. Mal-qaranın torpaq yoldan qaldırdığı toz havada boğanaq kimi dayanmışdı. Gündüzlər haraya isə çəkilib yox olan ağcaqanadlar Kürün üstündən bulud kimi qalxıb kəndə dolmuşdu. Onların vızıltısı bütün Göytəpəyə yayılmışdı. Arançılar damların üstündə, talvarlarda özlərinə yer salmışdılar. Qazma daxmalarda oturmaq mümkün deyildi. Birələr zəli kimi adamın bədəninə daraşırdı. Elə bayırda da rahatlıq yox idi. Ağcaqanadlar elə sancırdılar ki, onların xortumu dəyən yer bir saat göynəyirdi. Hamı təzək yandırmışdı. Təzəyin acı tüstüsü bütün kəndə yayılmış, onsuz da ağır olan havanı kəsifləşdirmişdi.

Əhməd əlində iri bir budaq, özünü ağcaqanadlardan qoruya-qoruya kəndin arası ilə xeyli dolaşdı, nəhayət, gəmiçi Qocanın həyətində ayaq saxladı. Həyətdə it olmadığından, birbaş çardağın üstünə çıxdı.

Qoca kişi Kürün qırağından yenicə qayıtmışdı. Çardağın üstündə təzək yandırıb oturmuşdu. Yorğunluğuna baxmayaraq, yuxusu gəlmirdi. Təklik onu yaman darıxdırırdı. Bədənini üşütmə götürmüşdü. Deyəsən, zəhrimar qara qızdırma yenə başlayacaqdı. Yazıq kişi neçə il idi ki, əlləşir, bu dərddən yaxasını qurtara bilmirdi.

– Axşamın xeyir, ay Qoca dayı.

Kişi qəfildən onun başının üstünü kəsdirən adamı əvvəlcə tanıya bilmədi.

– Axşamın xeyir, a bala, kimsən? – O, gözünü ovuşdurdu, tüstü boğazına dolduğundan çeçədi. – Bıy səni zəhrimara qalasan!

– Mənəm, Qoca dayı, poçt Əhmədəm.

– Ay səni xoş gördük, bəri gəl, yanını yerə qoy görək, nə var, nə yox, nə əcəb səndən?

– Elə belə gəldim kefini soruşum.

– Çox yaxşı eləyibsən. İstilərlə necəsən?

– Birtəhər yola veririk.

Onlar yanaşı oturdular. Qoca kişi ağacla təzəkləri qurdaladı. Tüstü daha da çoxaldı. Ağcaqanadlar bir az kənara uçdular. Onlar vızıltı ilə ətrafa dolanıb, qorxularından tüstüyə yaxın gələ bilmədilər.

– Bəs Çərkəz hanı?

Qoca kişi köksünü ötürdü. Elə bil yazığın yaralı yerinə toxundular.

– Nə bilim, a bala, axır vaxtlar heç evə yovuşmur. Bacısı qaçırılandan sonra isə heç dindirmək olmur. Bir söz soruşan kimi “kənddən baş götürüb gedəcəyəm” – deyir.

– Haraya, Qoca dayı?

– Nə bilim, şəhərə, fəhləliyə.

– Bəs sən nə deyirsən?

– Nə deyim, a bala, özü bilir. Mənim hay-hayım gedib, vay-vayım qalıb. Bu gün-sabahlığam.

– Sənə nə olub, ay Qoca dayı, maşallah qırğı kimisən.

– Ay xalayın toyu olsun, mənə təsəlli verirsən?

– Vallah düz sözümdür. Allah qoysa bu gün-sabah Çərkəzə də toy eləyib gəlin gətirərsən.

– Elə mən də onu deyirəm, amma Çərkəz ipə-sapa yatmır.

– Yatar, niyə yatmır, gözaltısı var?

– Mən hardan bilim? Heç ürəyinin sözünü adama açır ki?

Əhməd kişinin dərdini dağıtmaq üçün söhbətini bir az da şirinləşdirməyi qərara aldı:

– Mən bu sirri öyrənsəm, əvəzinə nə verərsən?
– Nə verəcəyəm, ay nişanlısı göyçək, görmürsənmi dilənçidən pay diləyirəm?
– Dünya varından ötəri ürəyini niyə sıxırsan, ay Qoca dayı, Çərkəzin canı sağ olsun.
– Orası elədir, a bala, amma yoxdan Allah da bezardır. Görmürsənmi, yanıma gəlibsən, heç bir stəkan quru çayım da yoxdur ki, sənə verəm.
Tüstü azacıq seyrəldi. Bundan istifadə edən iri bir ağcaqanad Əhmədin boynuna qondu. İri, uzun xortumunu birdən-birə sancdı. Əhməd diksinib şappıltı ilə boynuna vurdu. Onun ovcu qana bulandı.
– Allah kökünü kəssin, yaman şeydir. Üstünə keçə salırsan, onu da deşib adamı dişləyir.
Qoca kişi yanındakı təzəklərdən götürüb ocağa qoydu. Əlindəki ağacla közü eşib üfürdü. Tüstü kəsifləşən kimi ağcaqanadlar vızıldaşıb yenidən kənara çəkildi.
Bir xeyli yenə susdular. Qoca kişi gecə vaxtı Əhmədin onun yanına boş-boşuna gəlmədiyini, nə isə bir söz demək istədiyini anlamışdı. Amma soruşmağa ürək etmirdi. Əhməd isə doğrudan da kişinin kefini bir az açmaq, sonradan fikrini söyləmək istəyirdi.
Kişi yenə təzəyi qurdaladı. Əhməd onun boğulub çeçədiyini görüb ağacı aldı. Təzəyi çevirdi. Korun-koruna yanan ocağın gözünü deşdi:
– Qoca dayı, sabah yaylağa gedirəm, sözün yoxdur ki?
– Xeyirdimi, a bala?
– Uşaqları aparıram.
– Hansı uşaqları?
– Seminariyaya hazırladıqlarımı. Sizin Osmanı da aparmaq istəyirəm. Gəlmişəm səndən icazə alım.
Kişi azacıq sükutdan sonra soruşdu:
– Anası nə deyir?
– Sənin razılığın olsa, sözü yoxdur.
– Osman özü getmək istəyirmi?
– Niyə istəmir?
Qoca kişi yetim qalmış qardaşı oğlunun oxumaq arzusunda olduğunu çoxdan bilirdi. Ancaq nə özünün, nə də yetim uşağın anasının imkanı olmadığından susurdu. İndi ki, bir Allah bəndəsi bu işdə Osmana kömək etmək istəyirdi, ona nə üçün mane olaydı? Kişi bir xeyli susduqdan sonra dərindən köksünü ötürüb astadan dilləndi:

– Özünüz bilən yaxşıdır, mən bir şey demirəm. Gedin, Allah köməyiniz olsun.

Əhməd onun əlini sıxıb ayrıldı. Çardağın üstündən endi. Bir xeyli cığırla getdi. Qoca kişinin onu səslədiyini eşidib ayaq saxladı. Gəmiçi ona yaxınlaşana qədər gözlədi. Kişi gəldi. Bir müddət tərəddüd içində dayandı. Əhməd onun nə isə bir şey demək istədiyini, ancaq qəti qərara gələ bilmədiyini hiss etsə də dinmədi. Qoca dayının sözə başlamasını gözlədi.

– İşdi, yaylaqda bizim uşaq gözünə dəysə, deynən nigaran olmasın, salamatlıqdır.

– Deyərəm, Qoca dayı, arxayın ol. Başqa bir sifarişin yoxdur ki?

– Yox, dərdin alım, dünəndən bilsəydim bəlkə bir-iki yemişdən, qarpızdan tapardım. İndi əlim heç yana çatmaz.

– Mən apararam. Sənin əvəzindən pay verərəm.

– Çox sağ ol, a bala, ata payının ləzzəti başqa olur. – Kişi çiynini çəkdi. Sanki bununla "Yoxsulluğun üzü qara olsun, nə eləyim?" – demək istədi. – Yaxşı yol, bala, uşaqlardan muğayat ol.

Əhməd, kişinin səsindəki titrəyişdən duydu ki, kövrəlmişdir. Onun qəlbi riqqətə gəldi. Bu saat Qoca kişi ilə özünün arasında bir yaxınlıq olduğunu hiss etdi. Qoca kişi doğma kəndində yaşasa da, tamamilə tək və yalqız idi. Əhməd başa düşdü ki, kişi qızından çox oğlunun dərdini çəkir. Çərkəzin onu qoca vaxtında qara damın altında tək qoyub şəhərə gedəcəyindən qorxur. Əhməd bu anda Qoca kişiyə haqq verdi. Çünki özü çox yaxşı bilirdi ki, təklik ağır dərddir.

Əhməd yavaşca onun çiynini qucaqladı. Yumaq kimi büzüşüb balacalaşmış bu ixtiyar kişini öpdü. Başını sinəsində xeyli saxladı.

## 12

Əşrəf pencəyini çiynindən götürüb geydi. Kitabı yan cibinə qoydu. Ağacların kölgəsindən kənarda, güneydəki qalın yarpaqların arasında qızaran çiyələkləri dərmək üçün dizi üstə çökdü. Çiyələklərin ətri dərhal onu vurdu. Əşrəf hər şeyi unutdu. Xallı kəpənək dalınca qaçan uşaq kimi yarpaqları aralayıb qırmızı çiyələkləri dərə-dərə meşənin dərinliyinə doğru irəlilədi. Onun başı qarışdı. Meşədə nə qədər qaldığını bilmədi.

Qarşıdan səs gəldi. Cingiltili qız gülüşləri onu ayağa qalxmağa məcbur etdi. Əşrəf talaya yaxınlaşdığını başa düşdü. Budaqları aralayıb çəmənliyə baxdı.

Molla Sadıqgilin məhəlləsinin qızları nəhəng bir qarağacın budağından yelləncək asmışdılar. Əşrəf bir az da irəli gəlib, yarpaqlardan seçilməz bir yerdə dayandı. Yellənən Pakizə idi.

Qız yenə Kür qırağındakı paltarını geyinmişdi. Yelləndikcə donun ətəyi dalğalanıb çətir kimi açılır, boynundakı pullu muncuqlar cingildəyirdi. Kəlağayı çiyninə düşmüşdü. Hörükləri gah kürəyinin ortasında qıvrılır, gah da sürüşüb köksünə düşürdü.

Talanın alt tərəfi uçurum dərə idi. Qız həvəsə gəlib yelləndikcə yelləncək onu yuxarı qaldırır, sıldırım qayaların bərabərinə qədər ucaldırdı. Əşrəf gözünü Pakizədən ayırmırdı. Bəzən ona elə gəlirdi ki, bu saat sapanddan çıxan daş kimi süzüb göyə qalxacaq, dərənin üst tərəfindəki açıq mavi səmaya toplaşan ağ buludlara qədər ucalacaqdır. Ancaq Pakizə bunu hiss etmirdi. O hətta dərənin üstünə qalxanda belə aşağı baxmırdı. Qız gözünü səmaya zilləmişdi. Ləzzətlə yuxarı qalxır, sürətini daha da artırır və elə bil əlini uzadıb buludları tutmaq istəyirdi.

Göylükdə, ağacın kölgəsində oturan qızlar ayağa qalxdılar. Onlardan biri əlinə nazik çubuq aldı. Qalanları isə gicitkən götürüb ətrafı kəsdilər. Pakizə yelləncəklə bərabər aşağı enəndə çubuqla onun baldırlarına vurdular.

– Nişanlının adını de.

– Nişanlım yoxdur.

Pakizə cingiltili səslə gülüb onların yanından keçdi. Yelləncəyin küləyi qızları vurdu. Otlar titrəşdi. Qızlar daha da sıxlaşıb yelləncəyin geri qayıtmasını gözlədilər.

– Deməsən, əl çəkən deyilik.

Gicitkənlər Pakizənin topuğunu, budunu yandırdı. Qız qışqırdı, ancaq gülməyinə ara vermədi.

– Dedim ki, yoxdur.

– Onda ürəyindəkinin adını de.

– Demərəm.

– Deyəcəksən.

– Deməyəcəm.

Qızlar inada düşdülər. Doğrudan da Pakizədən söz almayınca əl çəkmək istəmədilər. O hər dəfə aşağı endikcə gicitkənlə döyəclədilər. Pakizənin topuğu, baldırı göynədi. Gicitkən dəyən yerlər qızarıb şişdi. Ancaq demədi. Gah ufuldadı, gah güldü, gah da qışqırıb qızları hədələdi, sonra da onların zərbəsindən yaxasını qurtarmaq üçün sürətini daha da

artırdı. O hər dəfə təkan verdikcə, yelləncək bir az da yuxarı qalxır və az qalırdı ki, dövrə vurub budağa dolansın. Görünür, o hər şeyi unudaraq, uçurum dərənin üstünə qalxdığını, əli kəndirdən bir balaca boşalsa gurultu ilə sıldırımdan yuvarlana biləcəyini ağlına belə gətirmirdi.

Əşrəf həyəcanlandı, özü də hiss etmədən ağacların arxasından çıxıb irəli gəldi. Bayaqdan Pakizə ilə zarafat edən qızlar da gülməklərinə ara verib dayandılar. Onlardan biri əlindəki gicitkəni kənara atıb qışqırdı:

– Aaz, bəsdir, havalanma, kəndir qırılar.

Pakizə döyüşdən qalib çıxdığına fərəhləndi və bərkdən qəhqəhə çəkdi. Onun səsi qayalarda əks-səda verib meşədə uğuldadı.

Birdən budaq şaqqıldadı. Buğumundan çatlayıb aralandı. Qızlar dəhşətlə çığırışıb kənara çəkildilər. Pakizə nə olduğunu başa düşənə qədər ağac bir az da çatladı. Qız təlaşla ətrafına boylandı. Özünü yelləncəkdən atmaq istədi və gördü ki, dərənin üstündədir. Ora düşsə tikəsi ələ keçməz. Qorxu içində gözünü yumdu və kəndirdən yapışıb yelləncəkdə oturdu.

Budaq yavaş-yavaş aşağı enirdi. Yelləncək iki-üç dəfə də gedib-gəlsə ağac sınacaq və qız birbaş dərəyə yuvarlanacaqdı.

Əşrəf irəli atıldı. Yelləncək ona yaxınlaşanda sıçrayıb kəndirdən yapışdı. Ayağını nə qədər yerə dayadısa da, yelləncək şahə qalxmış at kimi onu sürüyüb arxasınca apardı. Budaq şaqqıltı və gurultu ilə yerə düşdü. Əşrəf Pakizəni güclə kənara çəkə bildi.

Pakizənin dizi yerə dəydi. Qız ufuldayıb qışqırdısa da, Əşrəfi görən kimi özünü ələ aldı. Tez donunu aşağı çəkdi. Oturdu. Təəccüblə oğlanın üzünə baxdı. Qız belə ağır dəqiqədə onun birdən-birə hardan çıxdığını başa düşə bilmirdi. Ona elə gəldi ki, onu qara basır. Gözü alacalanır. Onun qarşısında duran Əşrəf deyil, bir xəyal, bəlkə də kölgədir.

Əşrəf qızın keçirdiyi halı gördü. Gülümsünüb astadan soruşdu:

– Adam da dəli kimi yellənərmi?

Əşrəfin səsi Pakizəni özünə gətirdi. Qız onun gömgöy olmuş dirsəklərinə və şalvarının dizinə baxdı. Bədəninin ağrılarını və iki addımlıqda dayanan qızları unutdu. Az qaldı özünü Əşrəfin üstünə salsın, onun pencəyini soyundurub dirsəklərinə baxsın:

– Bir yerin siyrilməyib ki?

Əşrəf gülümsündü. Bir yanının əzildiyini, dirsək və dizindən qan sızdığını ona bildirmədi:

– Mən heç, sənin bir yerin əzilməyib ki?

Qızlar irəli gəldilər. Pakizənin qolundan yapışıb qaldırdılar. Təəccüb və təşvişlə Əşrəfə baxdılar.

– Tez ol, gedək, görən olar.

Pakizə heç nə demədi. Üstünü çırpdı. Qızların dalınca getdi. Əşrəf onun azacıq axsadığını hiss etdi.

Qızlar getdilər. Əşrəf xeyli sınmış budağa, Pakizənin bir az bundan əvvəl yelləndiyi yelləncəyə, qarşıdakı dərəyə baxdı. Əlini gözünün üstünə qoyub səmadakı ağ buludların süründüyü səmtə boylandı. Başını bulayıb gülümsündü və cığırla dərəyə endi. Çayın kənarına çatan kimi qarşıdakı sal daşın üstündə oturdu. Qayanın dibində burulan ağ köpüklü suya nəzər saldı. Xırdaca çay balıqlarının sürü ilə şütüyüb üzdüklərini gördü. Birdən suya girmək, uşaqlıqda olduğu kimi suyun qabağını kəsmək və qolunu dirsəyə qədər çirməyib daşların altında gizlənən balıqları axtarıb tutmaq həvəsi onu yerindən tərpətdi. Əşrəf şalvarını çirməmək istəyəndə dizinin sızıltısını hiss etdi. Soyundu. Köynəyini də çıxartdı. Əvvəlcə soyuq suda yuyundu. Bədəninin siyrilmiş yerlərin yoxladı. Bir-iki bağa yarpağı tapıb yarasının üstünə qoydu. Çayı keçib paltarlarını geyindi. Üstünü səliqəyə saldı. Dolama cığırla yavaş-yavaş dərədən qalxdı.

Haradasa, lap yaxında, talanın bərabərində, tüfəng atıldı. Meşə uğuldadı. Qayalar səs-səsə verib şaqqıldadı. Əşrəf ayaq saxladı. Dönüb geri, səs gələn tərəfə boylandı. Heç nə görə bilmədi. Sürətini artırıb dikdiri qalxdı. Dərənin qaşındakı qayaların bərabərinə çatanda daşların arxasından bir adam çıxdı. Əşrəf diksinib geri sıçradı.

– Şamxal?

– Yerə uzan.

Şamxal qardaşının yaxasından dartıb qayanın daldasına uzatdı. Şamxal tövşüyürdü. Onun sifətində qan qalmamışdı. Əlləri, dodaqları səyriyirdi.

– Sənə nə olub?

– Əcəb adamsan!

Şamxal özünü ələ alıb papiros eşdi. Bir-iki dəfə dərindən sümürüb tüstülətdi. Əşrəf əli ilə tüstünü özündən uzaqlaşdırdı. Şamxal gözaltı onu süzdü. Başını bulayıb bayaqkından xeyli yumşaq tərzdə dilləndi:

– Hara getmişdin?

– Meşəyə.

Şamxal yenə sakitcə papirosunu sümürdü. Çiyninin üstündən dönüb qayaların arasından o tərəfə, Əşrəfin gəldiyi səmtə baxdı.

– Az qalmışdı ürəyim partlasın.
– Niyə?
– Elə bildim sənə güllə atırlar.
– Mən kimə neyləmişəm?
Şamxal bu dəfə qardaşını tərs-tərs süzdü. Onun sifətində əvvəlcə bir qəzəb sezildi. Sonra dodaqları qaçdı. Gözləri qıyıldı. Onun təbəssümündə istehzamı, yoxsa daxili bir nifrətin ifadəsimi olduğunu Əşrəf sezə bilmədi.
– Deyəsən oxumaq sənin ağlını azaldıb?
– Bu nə deməkdir?
– Bilmirsənmi atam düşmənlidir?
– Bilirəm.
– Bə onda niyə veyil-veyil gəzirsən?
Əşrəf qardaşının gözlərinə baxdı. Bu dəfə o həmin gözlərdə qəzəb qarışıq bir nifrət olduğunu aydınca hiss etdi. Şamxal yenidən dilləndi:
– Qızlar da yelləncək salmışdılar, eləmi?
– Sən hardan bilirsən?
– Necə yəni hardan bilirsən? Səhərdən burda ürək-göbəyimi yemişəm. Sənin xalqın yad qızları olan yerdə nə işin var? Bilirsənmi o tərəflər kimin məhəlləsidir?
– Bilirəm.
– Bilirsənsə niyə o tərəflərə ayaq basırsan?
– Ordakılar da bizim kəndin adamları deyilmi?
Şamxal hirslə tüpürdü. Sonra dabanı ilə göy otluğu döyəcləyib çökəltdi.
– Qeyrətsiz adama oxşayırsan!
Əşrəf artıq dözə bilmədi. Qardaşının bu cür yekəxanalığı, onu uşaq yerinə qoyması şəstinə toxundu. O da səsinin ahəngini dəyişdi:
– Qeyrətsiz olsaydım, mən də atamın üzünə ağ olub, evdən gedərdim.
– Nə?!
Şamxal ilan kimi fısıldayıb ayağa qalxdı. Əşrəfin boynundan yapışdı. Onu çəkib qaldırdı. Göz gözə dayandılar. Şamxalın isti nəfəsi Əşrəfin yanaqlarını yandırdı, üzünü təndir hənirtisi kimi qarsaladı, hətta nəfəsini darıxdırdı. Əşrəf dözdü. Sakitcə qardaşının daha nələr edəcəyini gözlədi. Onun baxışlarındakı təmkin və məzəmmət Şamxalın qolunu boşaltdı.

– Bir də mənə belə söz desən, qardaşım olduğuna baxmaram.

Şamxal Əşrəfin yaxasını buraxdı. Qayanın kölgəsindəki tüfəngini götürdü. Sallamalı kəmərini daraltdı. Xəncəri yana çəkdi. Heç nə demədən qabağa düşüb dolama cığırla dəyələrə doğru addımladı. Əşrəf qardaşı ilə yanaşı getməyə çalışdı. Onun Şamxala deyiləsi sözü çox idi. O, istəyirdi ki, qardaşı geri, atasının yanına qayıtsın, yenə əvvəlki kimi bir yerdə yaşasınlar, kişi tək qalmasın. O hiss etmişdi ki, anası da ürəyində peşmançılıq çəkir, ancaq eldən aralandığına görə evinə dönə bilmir. Bəlkə də gözləyir ki, Cahandar ağa onun dalınca gəlsin, arvadına minnət eləsin. Elə Salatının özü də iki od arasında qalmışdı. Əşrəfi incidən o idi ki, bu topdağıtmaz ev, bu böyük ailə göz qabağında parçalanıb dağılırdı. Əşrəf əvvəl bu barədə bir-iki dəfə söz salmaq istəmişdisə də, Şamxal imkan verməmişdi. İndi isə fürsət idi. Söz düşmüşkən hər şeyi axıra çatdırmaq lazım idi.

– Acığın tutmasın, Şamxal, heç adam da atasını tək qoyarmı?

– Bə ata da mən boyda kişinin anasının üstünə arvad alarmı? Təzə arvadın gözünün qabağında oğlunu təpiyin altına salarmı?

Şamxalın səsi qəzəbdən xırıldadı. Hülqumu bir neçə dəfə qalxıb-endi. Əşrəf onun da atası kimi gicgahlarındakı xırdaca damarların vurduğunu gördü:

– Bəs fikrin nədir? Onu biryolluq atalıqdan çıxartdın?

– Yox. O mənim atamdır. Onun namusu mənim namusumdur. Onun ayağına daş dəyəndə ürəyimin başı göynəyir, eşitdinmi, bir adam onun itinə daş atanda hirsimdən ürəyim partlayır, başa düşürsənmi, mən buna dözə bilmirəm.

Şamxal lap qəhərləndi. Üzünü yana çevirdi. Gözünün yaşardığını qardaşına sezdirmək istəmədi. Əşrəf özü də doluxsundu:

– Yaxşı, indi nə eləyək deyirsən?

– Nə eləyəcəksən, kişi ol. Atamın namusu bizim namusumuzdur. Onun düşməni bizim də düşmənimizdir.

Susdular. Əşrəf qardaşının nəyə işarə etdiyini başa düşdü. O çox gözəl bilirdi ki, Cahandar ağa Molla Sadıqla barışmayacaq. Onu da hiss edirdi ki, Pakizənin tez-tez yolunun üstünə çıxması qohumlarının xoşuna gəlmir. Əslində Əşrəf özü də bütün bunların nə demək olduğunu özünə aydınlaşdıra bilmirdi.

– Demək, geri qayıtmaq istəmirsən?

– Yox.

– Niyə?
– Çünki sən varsan.
– Mən oxumağa gedəcəyəm.
– Getmə.
– Bu mümkün deyil.
– Niyə? – Şamxal ayaq saxladı. Sınayıcı nəzərlə qardaşına baxdı. Onun dediklərinin nə qədər ciddi olub-olmadığını bilmək istədi.
– Dədə-babamız oxumayıb, acından ölmüşük?
– Sən yenə dədə-baba qaydası ilə yaşamaq istəyirsən?
– Yoxsa oxumaqdan təzə qayda-qanun gətirmisən?
– Eh, Şamxal, – Əşrəf köksünü ötürdü. Elə dərd burasındadır ki, nə elədiyini özün də bilmirsən. Bir yandan köhnə qaydaları müdafiə eləyirsən, bir yandan da ona tabe olmaq istəmirsən.
– Kim deyir onu?
– Mən. Atam dədə-baba qaydası ilə ikinci dəfə arvad alıb, bə sən niyə buna dözmürsən, hə?
– Bu ayrı şeydir. Sən hər şeyi bir-birinə qatma.
– Görürsənmi, məsələ özümüzə gələndə, sənə toxunan bir şey olanda dözmürsən, bu ayrı şeydir deyirsən, amma başqasının tüstüsünü təpəsindən çıxardırsan, vecinə də gəlmir.
– Mən kimə nə eləmişəm?
– Qoca kişinin qızını gətirmisən, amma atası ilə barışmırsan, qardaşı Çərkəzi özünə düşmən eləmisən. Güləsəri də evdə dustaq kimi saxlayırsan. Bəs onlar insan deyil? Onlar bir-birini görmək istəmir? Başqasının ürəyinə çalın-çarpaz dağ çəkə bilirsən, özünə isə bir balaca toxunanda göynəyirsən. Bu insafdırmı?
– Mən Güləsərə nə pislik eləmişəm? Bir qarın çörək də tapmırdı, indi əyni də doyub, qarnı da.
– Məsələ çörəkdə deyil, gərək insanın ruhi aləmi də tox olsun.
Şamxal ürəyində qardaşına azacıq haqq versə də, onun dediklərini tam qəbul edə bilmirdi. Bir də, Əşrəfin Qoca kişini də, Çərkəzi də özünə tay etməsi onun xoşuna gəlmirdi. Belə getsə, Əşrəf hər iti-qurdu gətirib Cahandar ağanın süfrəsinə çıxardıb, yuxarı başda oturdardı.
– İndi nə eləyək deyirsən, qapımızda tayamızı yandırsınlar, naxırımızda maralımızı vursunlar, biz də oturub baxaq?
– Kimdir taqsırkar?
– Necə yəni kimdir taqsırkar? Sən nə danışırsan? Hələ indiyə kimi bizim həndəvərə hərlənən olmayıb, bundan sonra da olmayacaq!

– Olacaq. Atam başqasının kəbinli arvadını gətirəndə bilmirdimi başı ağrıyacaq? Sənin başına belə iş gəlsə, dözərsənmi?

Şamxal dabanı üstə fırlanıb səsini ucaltdı:

– Biqeyrət-biqeyrət danışma, kəs səsini.

Susdular. Şamxal qaşqabağını sallayıb qabağa düşdü. "Bu gədə lap zayıllayıb, – deyə öz-özünə düşünməyə başladı. – Hər iti-qurdu gətirib bizə tay eləyir. Hamını bir gözlə görür. Mənim atamı Qoca kişiyə tay tutur. Nə olsun ki, mən onun qızını almışam, atam hara, o hara? Qızıl quşun öz yeri var, qarğanın başqa. At-atdır ki, seçəndə cinsini, əslini axtarırlar. Yox, oxumaq onun olan-qalan ağlını da aparıb. Necə yəni biz köhnə qaydalarla yaşaya bilmərik? Necə yəni bizim əsl düşmənimiz elə dədə-baba qaydalarıdır. O nə demək istəyir? Mənim atama sataşacaqlar, mən də durub baxacam? Gündə kəndə beş-on atlı tökülüb gələcək, divan-dərə adamları görünəcək deyin mən qorxacam? Yox. Mən axtardığımı tapım, onda baxarıq kimin anası ağlar qalacaq. Deyəsən, bu gədə zənnimi itirəcək. Lap xoşqeyrət olub. Eşitdiyimə görə, mollanın qızının tumanını iyləməyə hazırdır".

Dikdirə çatdılar. Burda ayrılmalı idilər. Şamxal öz dəyəsinə doğru addımlamaq istədi. Ancaq ayaq saxladı. Əşrəfin üzünə baxmadı. Zəhər tökülən qaşqabağını daha da turşaltdı:

– Bura bax, ağlını başına yığ, bir də belə sözlər danışma.

– Çalışaram, ancaq evdə papağını qabağına qoy, mən dediklərimi əməlli-başlı fikirləş.

– Mən fikirləşmişəm, sən fikirləş.

Əşrəf ona yenə nəsə demək istədi. Ancaq Salatının qaça-qaça onlara yaxınlaşdığını görüb susdu. Qız əvvəlcə dinmədi. Gözaltı Şamxala, sonra da Əşrəfə baxdı. Başa düşdü ki, qardaşları nədənsə hirslidirlər.

– Atam səni çağırır.

Şamxal tüfəngi çiyninə keçirdi. Bacısını tərs-tərs süzdü. Onun axır günlər gah atasının yanına, gah da anasının yanına gedib-gəlməsini xoşlamırdı. İndi onun Əşrəfin dalınca gəlməsi də Şamxalı hirsləndirdi.

– Nə çox o yan-bu yana qaçırsan?

– Neyləyim, atam göndərdi.

– Başqa adam yoxdur?

Qız dinmədi. Şamxal elə bil Əşrəfin də acığını Salatından almaq istəyirdi.

– Bir də səni buralarda görsəm, ətini şişə çəkəcəm.

O, hirsli-hirsli öz dəyəsinə getdi. Salatının dodaqları səyridi. Nə qədər çalışdısa, hıçqırığını boğa bilmədi. Birdən önlüyü ilə üzünü örtüb hönkürdü. Əşrəf onun boynunu qucaqladı.

– Ay dəli, niyə ağlayırsan, adama qardaşı acıqlanar.

– Axı mənim günahım nədir?

– Yaxşı, yaxşı, gözünü sil, ayıbdır, görən olar.

Salatın özünü güclə toxtatdı. Əşrəf təmiz dəsmal çıxardıb, onun göz yaşını sildi. Yenə boynunu qucaqladı.

– Yaxşı, gedək.

Yanaşı addımladılar. Salatın yanağına yapışmış saçını geri itələdi. Hələ yaşı qurumamış gözünü qardaşının üzünə zillədi:

– Bilirsən kim gəlib?

– Kim?

– Uçitel Əhməd.

* * *

Cahandar ağa döşəkcənin üstünə uzanıb mütəkkəyə dirsəklənmişdi. Əhməd isə onunla üzbəüz, döşəkcədə bardaş qurub oturmuşdu. Onların qabağında çay vardı.

Cahandar ağa oğlunu görən kimi stəkanı qabağına çəkdi. Əşrəfin üzünə belə baxmadan, astadan dilləndi:

– Sənə neçə dəfə tapşırmışam, bir yana gedəndə özünlə tüfəng götür.

– Nə olub ki, ata?

– O nə səs-küy idi, deyəsən, güllə atırdılar?

Əşrəf tutuldu. Onunla görüşmək üçün ayağa qalxmaq istəyən Əhməd də pərt oldu.

– Elə bir şey yox idi.

Kişi rahatlandı. Çayını götürüb hortuldatdı. Əhməd hiss etdi ki, Cahandar ağanın qəzəbi oğlundan ötəri narahat olan bir atanın hirslənməsindən başqa bir şey deyil.

– Qapının ağzında durma.

Əşrəf içəri keçdi. Əhmədlə görüşdü və onun yanında bardaş qurub sakitcə oturdu.

Bir xeyli heç kəs dinmədi. Cahandar ağa çay içə-içə gözünü alaçığın qapısından o tərəfə – üfüqdəki dağlara doğru zillədi. O öz məhəlləsində yad adamların olmasını istəyən kişilərdən deyildi. Ancaq

qapısına gələnləri, ona pənah gətirənləri də geri qaytarmazdı. İndi o nə etsin? Əhməd xəbərsiz-ətərsiz kəndin yetim-yesirini də yığıb birbaş yaylağa gətirmişdi. Özü də furqonu onun məhəlləsinə sürdürmüşdü. Əgər o bir adama arxalanmasa, belə etməzdi. Görəsən Əşrəf nə düşünür?

Kişi gözaltı oğluna baxdı. Bəlkə elə belə yaxşıdır? Bəlkə bundan sonra təkbaşına dağ-daşı gəzməyib, Əhmədlə bərabər dəyələrin birində oturacaq? Beş-altı gündən sonra arana, peşqurda gedəcəm, onda Əşrəfin yanında bir kişinin olması pisdirmi?

Sükut uzun çəkdi. Əhməd çayını içib ayağa durdu:

– Sağ olun, mən gedim. Uşaqları rahatlamaq lazımdır.

Əşrəf də ayağa durdu.

– Hara gedirsən?

– Görək harda yer tapırıq, uşaqlara dəyədən-zaddan tikək.

Onlar alaçıqdan çıxmaq istədilər. Ancaq Cahandar ağa onları saxladı.

– A bala, siz oturun, uşaqlar gedib furqonu gətirər.

– Cahandar əmi...

– Sözümə qulaq as. Mənim qapıma gələn adam geri qayıtmaz.

Cahandar ağa papirosunu sümürdü. Göyümsov tüstü alaçığın içinə yayılıb laylandı və sonra bulud qatları kimi sürünüb qapıdan bayıra çıxdı.

## 13

Salatın çətəni çəkib dəyənin qapısını örtdü. Küncə, yük yerinin yanına bir döşəkcə atdı. Ayaqlı duağı ortaya qoydu. Döşəyin altından dəftər-qələm çıxartdı. Bardaş qurub oturdu. Yaylağa gələndən bəri öyrənib yazdığı hərflərə xeyli baxdı. Onları səssizcə oxudu. Sonra da duağın üstünə əyilib iri, naşı hərflərlə sözlər yazmağa başladı. O, xəttinin gözəl olmasına çalışdığından qələmi kağıza daha möhkəm basırdı. Qız elə bilirdi ki, qələmi gücü gəldiyi qədər sıxsa hər şey düzələcəkdir.

Salatın gün günorta yerinə gələnə qədər üç səhifə yazıb doldurdu. Sonra boynunu yana əyib diqqətlə yazdıqlarına baxdı. Əllərini boynunun arxasında çarpazlayıb bərkdən gərnəşdi. Onun sümükləri şaqqıldadı. Ayağa durub kağız-qələmi yığışdırdı. Döşəyin altında gizlətdi. Dəyədən çıxdı.

Gün qızmışdı. Arxacda iri göy çibinlər vızıldaşırdı. Arvadlar yorğan-döşəyi günə sərmişdilər. Həyətdə nehrə çalxalayırdılar.

Salatın səhəngini götürüb bulağa endi.

Qarşı tərəfdəki dağın döşündə, iri fıstıq ağacının dibində cavanlar toplaşmışdılar. Onlar göy otluğa uzanmışdılar. Bir nəfər isə ortada saz çalıb oxuyurdu. Salatın cığırla enə-enə mahnıya qulaq asdı. Oxuyanın səsi pis deyildi. Saz çalmağı da yaxşı idi. Ancaq arada zəngulə vuranda naşılığı bilinirdi.

O, bulağa endi. Suyun üstü qız-gəlinlə dolmuşdu. Onların bir qismi iri ağac novda paltar yaxalayır, bir qismi qab qumlayır, bir hissəsi isə kənardaca oturub, səsi dalğa-dalğa dərəyə yayılan saza qulaq asırdı. Onlardan arabir şaqqıldayıb gülənlər də var idi.

– Ölmüş yaman oxuyur, deyəsən ürəyini yandıran var.

– Gör necə də boğazında qaynadır.

– Zarafat deyil, haqq aşığıdır.

Qızlardan biri üzünü dağın döşündə toplaşanlara tərəf tutdu:

– Yandıran yansın, ədə, özünə divan eləmə.

Qızlar şaqqıldayıb gülüşdülər.

Salatın səssizcə onlara yaxınlaşdı. Bulağın gözündən səhəngini doldurub kənara qoydu. Ətəyini çırmayıb suyun axarı ilə aşağı getdi. Yarpız dərib önlüyünü doldurdu. Geri, bulağın üstünə qayıtdı. Səhəngini götürüb yola düşmək istədi. Bu vaxt qızlardan biri onun qolundan yapışıb qəhqəhə ilə güldü:

– Ay qız, ağzın, burnun niyə bu kökdədir?

Salatın dayanıb mat-mat onun üzünə baxdı:

– Nə olub?

– Dodağın gömgöydür, nə yeyibsən?

Salatın əlinin arxası ilə ağzını sildi. Diqqətlə barmaqlarına baxdı və başa düşdü ki, dişi, dodaqları gömgöydür.

– Qələmdən olub.

– Nə qələm, sən də yazı yazırsan?

– Yox, Əşrəfin qələmidir, – Salatın tələsik cavab verdi və donunun ucu ilə ağzını silməyə başladı. Dodağını təmizləmək əvəzinə, qələmin rəngini üzünə yaymaladı. Qızlar yenidən gülüşdülər. Salatın səhəngi yerə qoyub, bulaqda üzünü tərtəmiz yuyası oldu.

– Aaz, ala, qumla sürt.

– Dua da yazırsanmı?

– Bircə əl çəkin. Sizin kefiniz gəlib, mənim işim var.

Salatın qızlardan ayrılıb dolama cığırlarla yuxarı qalxdı. Cavanlar yenə çalıb-oxuyurdular. Onlardan xeyli aralıda isə qızlar yelləncək sal-

mışdılar. Sazın səsi daha aydın eşidilirdi. Aşığın sözləri qayadan-qayaya düşüb dərə aşağı yayılırdı:

Sallana-sallana gələn Salatın,
Gəl elə sallanma, söz dəyər sənə.
Al-yaşıl geyinib çıxma qarşıma,
Sağın bədnəzərdən göz dəyər sənə.

Qız adının çəkildiyini eşidəndə özünü itirdi. Addımlarını yeyinləşdirib dərədən tez uzaqlaşmağa çalışdı. "Bıy, ciyərin yansın, məni biabır elədi" – deyə xəyalından keçirdi. Sürətini bir az artırdı. Aşıq ortada fırlandı. O sanki qızın hər şeyi eşitdiyini başa düşdü. Sazı sinəsinə basıb üzünü binələrə doğru çevirdi:

Əylən, əylən, görüm kimin yarısan?
Hansı bəxtəvərin vəfadarısan?
Kölgədə bəslənmiş quzey qarısan,
Səhərin günəşi tez dəyər sənə.

Salatın qəribə hal keçirirdi. O bir tərəfdən addımlarını yeyinlədib tez dəyələrə çatmağa çalışır, digər tərəfdən də mahnının sözlərini axıra qədər eşitmək istəyirdi. Hərdənbir dodaqları aralanır, qımışırdı. Mahnının sözləri onu həm əsəbiləşdirir, həm də xumarlandırırdı. Salatın başa düşürdü ki, aşıq bu sözləri boş-boşuna oxumur, doğrudan da onu tərifləyir, onun gözəlliyini mədh eləyir. Salatın adının dilə, ağıza düşməsini istəmirdi. Ancaq tərifdən də xoşu gəlirdi. Bütün qızlar kimi onu da şirin sözlər meyxoş edirdi. Elə bil aşıq da bunu başa düşmüşdü:

Aşıq deyər, heç kəs yarın öyməsin,
Düymələ yaxayın çarpaz düyməsin.
Dəstələ zülfünü yerə dəyməsin,
Yollar qubarlıdır, toz dəyər sənə.

Aşıq son misranı deyərkən bərkdən zəngulə vurdu. Sazı yuxarı qaldırıb ortada fırlandı. Salatın onun səsinin qayalarda əks-səda verib təkrar olunduğunu eşitdi. Qız bu dəfə özünü lap itirdi. Ona elə gəldi ki, bulaq başındakı qızlar qaqqıldaşdılar. Dönüb geri baxmağı ürəyindən

keçirsə də, cəsarəti çatmadı. Güc-bəla ilə özünü dəyələrə yetirdi. Səhəngi yerə qoyub dərindən nəfəs aldı. Alnının tərini sildi.

Zərnigar xanım onun dəyənin yanında ləngidiyini görüb əl elədi. Salatın anasının yanına yüyürdü.

– A bala, nə oldu, yarpız dərdinmi?

– Dərmişəm, ana, bax gör, bəsdirmi?

– Bəsdi. Di tez ol, dəyəni yığışdır, uşaqlara çörək apar.

Salatın qayıdıb dəyəyə girdi. Ətəyindəki yarpızı boşaltdı. Koftasının qoynundan balaca bir güzgü çıxartdı. Əvvəlcə sifətindəki mürəkkəbin gedib-getməməsini yoxladı. Sonra saçının islaq qıvırcıqlarını sığalladı. Hörüyünü çiyninin üstündən aşağı salıb diqqətlə baxdı. "Ciyəri yanmış düz deyirmiş, heç indiyəcən fikir verməmişdim, deyəsən, saçım doğrudan da uzundur". Sonra yorğan-döşəyi çırpıb təmizlədi, səliqə ilə qatlayıb bir küncə yığdı. Dəyənin çubuğundan asılmış pencəyi götürüb qatlamaq istədi. Elə bu vaxt pencəyin yan cibindən yerə bir qutu düşdü. Papiros dəyənin ortasına səpələndi. Salatın dizi üstə çöküb onları yığdı, səliqə ilə qutuya doldurdu. Bir xeyli əlində saxlayıb baxdı. Qutunun üstündəki zərli yazıları oxumaq istədi. Hərflərin bəzisini tanısa da, sözləri başa düşə bilmədi. Qutunu burnuna yaxınlaşdırıb qoxuladı. Tütün tozu burnunu qıcıqlandırdı. Qız bir-iki dəfə asqırdı. O birinci dəfə bu cür yaraşıqlı papiros görürdü. Atası da, Şamxal da eşmə çəkirdilər. Amma bu qutulu papiros adamın gözünü oxşayırdı. Salatın birdən nə fikirləşdisə, papirosu qoynunda gizlətdi. Qaça-qaça öz dəyələrinə getdi. Sandığı ehmalca açdı. Əşrəfin oxumaqdan qayıdanda alıb gətirdiyi ətir şüşəsini çıxartdı. Qapağını açıb papirosun üstünə çilədi. Dəyəni xoş bir rayihə doldurdu. Qız, əlində bir qutu, bir xeyli beləcə dayandı. "Görəsən, çəkəndə başa düşəcəkmi ki, papirosuna ətir çilənib? Görəsən, ağlına nə gələcək? Yəqin mən heç xəyalına da düşməyəcəm. Çox məzəli iş olacaq. Fikirləşə-fikirləşə qalacaq ki, görəsən bunu kim eləyib?"

Salatın qutunu burnuna yaxınlaşdırıb qoxuladı. Ətirli tütünün iyi onun ciyərinə doldu. Qız astadan gülüb ayağa durdu. Dəyədən çıxmaq istədi. Sonra nə fikirləşdisə geri qayıtdı. Duağı çəkib qabağına qoydu. Papiros qutusunu boşaltdı. Qələmi götürdü. Çox ehtiyat və çətinliklə qutunun içinə "Əhməd" sözünü yazdı. Dönə-dönə oxudu. Papirosları yenidən səliqə ilə qutuya doldurdu. Aparıb pencəyin cibinə qoydu. Dəyədən çıxdı. Çətəni çəkib qapını bağladı.

Gün günorta yerindən əyilmişdi.

Salatın anasının hazırladığı bağlamanı götürdü. Binələrin önündəki təpəyə doğru addımladı. Onun yanaqları alışıb-yanırdı. Bir az bundan əvvəl tutduğu işdən peşman olmuşdu. Yol gedə-gedə özünü danlayırdı. "Deyəsən, axmaqlamışam. Getdikcə ağlım azalır. Xalqın papirosuna durduğum yerdə niyə ətir çilədim? Yad oğlanla mənim nə işim var? Heç qız tanımadığı adamla belə zarafat eləyərmi? Durduğum yerdəcə özümü işə saldım. Bəlkə papirosu yerli-dibli gizlədim? Onda da fikirləşəcək ki, görəsən bunu kim götürüb. Yəqin uşaqlardan şübhələnəcək. Bəlkə Əşrəfə deyim ki, bilmədim, şüşə əlimdən düşdü, papirosun üstünə ətir səpələndi. Bəs yazı? Axı, mən axmaq qutuya onun adını da yazdım. Yox, qayıdan kimi gərək papirosu gizlədim. Allah eləməmiş, bu işdən dədəm xəbər tutsa, böyük tikəmi qulağım boyda eləyər. Elə Şamxal da ətimi şişə çəkər".

Salatın təpənin dikdirinə çatıb nəfəsini dərdi. Əlini gözünün üstünə qoyub uzaqlara boylandı. Üstü mamırlı yalçın qayalara, dağların döşündəki dolama cığırlara, arana doğru uzanan torpaq yollara baxdı. Buradan hər şey, sinəsi dalğalanan yaşıl yamaclar, otları saralan talalar, dərə ilə axan köpüklü sular aydınca görünürdü. Qarşıdakı dağın döşündə bir dəstə uşaq vardı. Onlar çiyələyi ota düzüb əllərində sallamışdılar.

Qız köksünü ötürdü. Cığıra düşüb irəlilədi. Ot qurşağa çıxırdı. Sarı qaymaqçiçəkləri, qramafon gülləri yaşıllığı daha da gözəlləşdirirdi. Çəmənliyin ortasında ucalan qayanın üstü xınalı idi. Onun ətrafını kəkotu bürümüşdü. Salatın özü də hiss etmədən göytəpəlilərin "Ərim gəldi" adlandırdıqları yerə gəlib çıxdı. Bura həmişə qız-gəlinlə dolu olardı. Qızlar kəkotu dərib buradaca qurudar, gəlinlər baş-başa verib xısınlaşar, arabir qayınanalarından gileylənib, dad çəkərdilər. Arana doğru uzanan yollara həsrətlə boylanmaq, hər qaraltıya göz qoymaq onların adəti idi. Aşağılarda bir araba, bir atlı görünən kimi ürəkləri döyünərdi. Sevinclərini bir-birilərindən gizləyən gəlinlər qaraltı yaxınlaşana kimi özlərini sakit aparmağa çalışardılar. Gələnin kim olduğunu biləndən sonra isə sakitcə ayağa durar, "ərim gəldi" – deyə qımışardılar. Yaşmaqlarını burunlarına qədər qaldırıb dəyələrə doğru qaçardılar. Əri gəlməyənlər isə bir-birinə qaş-göz edib, gələnlərin dalınca gülərdilər.

Bu gün nədənsə bura boş idi. Binədəki kişilər beş-on gün idi ki, arana, biçinə getmişdilər. Onların qayıtmaq vaxtı idi. Bəs nə üçün

yollara boylanan yox idi? Salatın təəccüb etdi. Ancaq birdən qayanın alt tərəfindən, kölgə düşən yerdən cingiltili bir səs eşitdi:

Şəkidən furqon gəlir,
Atları yorğun gəlir...
Bir gecə mehman etsən,
Gör necə çervon gəlir.

Mahnının dalınca qaqqıldaşıb gülüşdülər. Salatın anladı ki, bura boş deyil. Binədəki qız-gəlin qayanın kölgəsinə toplaşıb yollara baxır. Doğrudan da dərənin dibi ilə üç at qoşulmuş furqon gəlirdi.

Qayanın dibindən yenə gülüş eşidildi. Kimsə ucadan qışqırdı:

– Ay gəlinlər, özünüzü hazırlayın, hansınızınsa əriniz gəlir.

– Ay çəpəl, nə bilirsən, bəlkə ər deyil, nişanlıdır.

– Daha yaxşı.

Salatın qızardı. Ürəyində "Allah abrınızı töksün", – deyə gülüşənlərin qarasınca deyindi və addımlarını yeyinlədib burdan uzaqlaşdı. Beş-on addım getməmiş öz-özünü danlamağa başladı: "Mən də qəribə olmuşam. Xalqı qınayıram, ancaq özümün tutduğum işdən xəbərim yoxdur".

Əşrəfgil qayanın kölgəsində idilər. Əhməd iri bir daşın üstündə oturmuşdu. Osman qayanın divarına kömürlə nə isə yazırdı. Əşrəf bir az o tərəfdə, kölgədə Səlimə şer əzbərlədirdi. Qayada salamat yer qalmamışdı. Hər tərəf yazıq-yazıq olmuşdu. Hətta torpaqda da əyri-üyrü xətlər var idi. Onların başı lap qarışmışdı. Osman birdən dayandı. Əlində kömür qayaya baxıb fikrə getdi. Alnının damarı şişdi. Onun qəribə görkəmi var idi. Sifəti kömür tozuna bulaşmışdı. Saçının dibindən axan tər yanağından qara zolaq salmışdı.

Osman gözünü yuxarı dikib xəyalında nəyi isə hesabladı. Kömürlə qayanı yazdı. Dərhal da əli ilə sildi. Səlim şerə ara verib, ona nə isə işarə etdi. Əhməd bunu gördü və Səlimə gözünü ağartdı:

– İşin olmasın, bu saat özü tapacaq.

Doğrudan da Osman birdən qayaya yaxınlaşdı. Əlindəki yaş əski ilə daşı sildi və danışa-danışa od kimi yazmağa başladı. Əhməd ayağa durub əlini Osmanın kürəyinə vurdu:

– Bax, indi arxayınam, hesabdan imtahan verəcəksən.

Osman qolu ilə alnının tərini sildi. Onun sifəti qapqara oldu.

– Səlim, sən necə?

– Hamısını bilirəm. Bütün dörd əməliyyatı lap yuxulu-yuxulu danışaram.

– Çox yaxşı. Əşrəf, bəs şeri bilirmi?

– Bilir, – deyə Əşrəf gülə-gülə cavab verdi. – Biz bugünkü işimizi qurtarmışıq.

– Mən də sizə çörək gətirmişəm.

Onlar dönüb, əlində bağlama, qayanın üstündə duran Salatına baxdılar. Əşrəf tez qızın yanına qaçıb bacısının çiynini qucaqladı.

– Lap gözəl iş görübsən, tez ol, bağlamanı aç, görək nəyin var.

Salatın qayanın kölgəsində, yaşıl otluqda süfrə açdı. Təzə isti çörəyin ətri ətrafa yayıldı. Əşrəf çörəyin birini dərhal götürüb kəsdi. Arasına pendir qoyub dürməklədi.

– Əhməd lələ, tez ol, motal pendiri ilə təzə çörəyin ləzzəti ayrı olur.

Əhməd sakitcə süfrəyə yaxınlaşdı.

Salatın Əşrəfin böyrünə qısıldı.

– Axşam dovğamız olacaq.

– Özü də yarpıznan, eləmi?

– Elədir.

Əşrəf uşaqları da çağırdı. Onlar bardaş qurub hərləmə oturdular. Salatın Osmanın sir-sifətinə baxıb güldü.

– Əyə, üz-gözün nə kökdədir, lap kömürçüyə oxşayırsan.

Hamı gülüşdü. Əslində o biri uşaqlar da toz-torpaq içində idilər.

– Tez olun, özünüzü bulağa salın. Görüm kim tez gedib gələcək. Dalda qalana çörək verməyəcəyik.

Uşaqlar bir-birini qova-qova dərəyə, bulağın üstünə endilər.

## 14

Binələrin üst tərəfindən səs-küy qalxdı. İtlər çaxnaşıb bir-birinə dəydi. Dana, buzov böyrüşdü. Yenicə yuxuya gedən arvad-uşaq oyandı. Kimi isə vurdular. Sonra da it zingiltisi eşidildi. Hamı səksəkəli halda daha nə olacağını gözlədi.

Gələnlər dəyəyə yaxınlaşdılar. Arvad qışqırtısı uşaq ağlamasına qarışdı. Kimi isə söydülər. Kimi isə itələdilər. Çətən şaqqıldadı. Birinci dəyədə baş verən hal eyni ilə ikinci, üçüncü dəyədə təkrar olundu.

Zərnigar xanım yerin içində, yuxarı məhəllədə baş verən bu səs-küyə qulaq asdı. Yorğanı üstünə çəkdi, böyrünə qısılıb titrəyən Salatının saçını sığalladı. Səs-küy yavaş-yavaş binələrin üst tərəfindən aşağı endi. Zərnigar xanım məsələni başa düşdü. Dəyələrə basqın etmişdilər. Ancaq çapqınçılar mal-qara aparmağa gəlməmişdilər. Belə olsaydı, birbaş xalxalı açar, heyvanları qabaqlarına qatıb aparardılar.

Gələnlər dəyələri axtarırdılar. Zərnigar xanım onların içəri necə girdiklərini, arvad-uşağın üstündən yorğanı necə atdıqlarını, qızların qolundan yapışıb necə qaldırdıqlarını təsəvvüründə canlandırdı. Arvadın canına vahimə düşdü. Axşamüstü bulaq başında arvadlardan biri ona eyham vurmuşdu ki, "ehtiyatlı olun, binədə xısınlaşma var, qulağıma bəzi sözlər dəyir", Zərnigar xanım buna əhəmiyyət verməmişdi. Hətta bu məsələni Əşrəfə belə bildirməmişdi. "İndi mən nə edim? Sığırçılardan başqa başı papaqlıların hamısı arandadır, kimə əlim çatacaq? Yox, gərək qızı işıq gözünə bir tərəfə qaçırdaydım. Ya da Əşrəfin yanına göndərəydim. Uşaq da olsa, kişi xaylağıdır, ölərdi, amma bacısını verməzdi. Bu günü qara da həmişə qardaşının yanında qalardı, bu gecə tərs kimi qaçıb bura gəldi. Bəlkə elə Allahın istəyi budur. Qız Əşrəfin yanında olsaydı, uşağa xətər dəyərdi. Bəlkə heç bizim dəyələrə yaxın gəlməyəcəklər?"

Lap yaxından kobud, xırıltılı kişi səsi eşidildi. Arvad-uşağı dəyədən bayıra tökdülər. Kimsə bərkdən söydü:

– Ay köpək uşağı, nə gəzirsiniz, arvad-uşaqdan nə istəyirsiniz?

– Qız hanı?

– Qız nədir, ay qanmaz köpək uşağı?

– Səsini kəs, ləçər, qızın yerini de.

Zərnigar xanım qarışıqlıqda Salatının adını eşitdi. Arvadın bədəninə elə bil soyuq ilan dolandı. Dizlərindən sızıltı qalxdı. Nə qədər çalışdısa da, dişlərinin şaqqıltısını kəsə bilmədi. Bir ana sövq-təbisilə qızını qucaqladı. "Bu saat gələcəklər, el içində biabır olacağıq. İndi mən nə eləyim? Allah, sən özün kömək ol. Görüm səni peşman olasan, a Cahandar ağa, sənin ucundan bu azara düşmüşük". Arvadın nəfəsi darıxdı. Bir istədi çılım-çılpaq ayağa dursun, qızın qolundan yapışıb dərəyə qaçsın, birbaşa üzüaşağı getsin, ya da Əşrəfi köməyə çağırsın. Arvad özünü lap itirdi. Oğlunu səsləməyə ürək etmədi. Əşrəfin başına xata gələcəyindən qorxdu.

Səs-küy lap yaxınlaşdı. Çənəsi şaqqıldayan Salatının bədəni uçundu. O, anasının böyrünə qısılıb yorğanı başına çəksə də, hər şeyi eşidir

və vəziyyətini başa düşürdü. O da çıxış yolu axtarırdı, lakin tapa bilmirdi. "Bəlkə farmaşa girim, ya da keçəyə bürünüb çətənin böyründə dayanım? Nəmiyə girsəm necə olar?"

Basqınçılar Cahandar ağagilin dəyələrinə yaxınlaşdılar. Nökərlər çomaq götürüb yolu kəsdilər. Əlbəyaxa vuruşma başladı. Ağac şaqqıldadı, xəncər cingildədi. Zərnigar xanım da, Salatın da başa düşdü ki, gələnlərin qabağını saxlamaq mümkün deyil.

Qız birdən yorğanı üstündən atdı. Elə alt köynəkdə, ayaqyalın, başıaçıq bayıra qaçdı. Əvvəlcə dərəyə enmək istədi. Sonra dəyələrin qabağındakı palıd ağacının altına getdi. Birtəhər ağaca çıxmağı, orada, budaqların arasında gizlənməyi qərara aldı. Ancaq nə qədər çalışdısa, şaxdan yapışa bilmədi. Onun ayaqları əsir, əlləri titrəyirdi.

Basqınçılar, nəhayət, Şamxalın dəyəsinə yaxınlaşdılar. Çətəni kənara atdılar. Keçəni dartıb saldılar. Yorğan-döşəyi bir-birinə qatdılar. Salatın anasının qışqırtısını eşitdi.

– Gəlinə dəyməyin, ay binamuslar.

– Qızı harda gizlədibsən, yerini de.

– Qız yoxdu.

– Tez ol, yoxsa saçını biləyinə dolayaram.

– Arvada əlmi qaldıracaqsan, ay köpək oğlu?

– Səsini kəs, tez ol, qızın yerini de.

Salatın qışqırtı eşitdi. Ona elə gəldi ki, anasını vurdular. Qızın ürəyi dözmədi. Ağacın dalından çıxıb onun yanına qaçmaq istədi. Ancaq özünü saxladı.

Basqınçılar Zərnigar xanımı da, Güləsəri də qolundan tutub bayıra atdılar. Yorğan-döşəyi, palazları çölə tulladılar. Farmaşları, sandığı ələk-vələk elədilər. Nəmini gəzdilər, tejənləri ayaqladılar. Əllərinə heç nə keçmədi. Yenə kim isə qışqırdı:

– Qızı harda gizlədibsən?

– Sənə dedim ki, qız yoxdur.

– Yerini de.

– Çoxdan binədən qaçırtmışam.

– Ay qarı, bizim başımızı əkmə.

– Axtarın tapın.

Onlar yenə fırlandılar. Yorğan-döşəyin bir də altını üstünə çevirdilər.

– Ə, bu necə oldu?

– Heç yana gedə bilməz, buralarda olacaq, – deyə basqınçılardan biri dilləndi.

Ürəyi sakitləşmək üzrə olan Salatının bədəninə yenidən lərzə düşdü. O elə bildi ki, basqınçılar ağaca doğru gəlirlər. Qız ələ keçməmək üçün sürünə-sürünə xalxala girdi. Böyür-böyürə verib yatışan inəklərin arasında uzandı. Heyvanlar kövşəklərini saxladılar. Bir xeyli qulaqlarını şəkləyib təəccüblə baxdılar. Salatın tərpəndi. Yaxındakı inək ilan kimi fısıldayıb yerindən qalxdı. Salatın onun qarnının altında daldalanmaq istədi. İnək bu ağ paltarlı qızı görəndə daha da hürkdü. Geri çəkilib qorxunc bir səslə mələdi. O biri inəklər də hürküb ayağa durdular. Xalxala çaxnaşma düşdü. Salatın nə qədər çalışdısa da, daldalanmağa yer tapmadı. İnəklər onu buynuzlarına götürüb xalxaldan atmağa hazırlaşdılar.

Basqınçılardan biri ayaq saxladı. İnəklərin çəpərə sıxışdırdığı ağ paltarlı qızı gördü. Dərhal o biri yoldaşlarını səslədi:

– Əyə, tapmışam.

Salatın dözə bilmədi. Qışqıra-qışqıra dərəyə qaçdı. Onun dalınca töküldülər. Zərnigar xanım da saçını yola-yola dərəyə endi. Qızın ayağı dolaşdı, ağzıüstə yerə sərildi. Bir-iki dəfə yumalandı. Dirsəyi daşa dəyib qanadı, ancaq səsini çıxartmadı. Sürünüb özünü gicitkən kolluğuna saldı. Elə bil bədəninə duz basdılar, ayaqları qora düşdü. Qolları, üz-gözü şişdi. Ancaq canını dişinə tutub susdu. Addım səsləri yaxınlaşdı. Salatın ələ keçəcəyini görüb sinə-sinə gicitkənlikdən çıxdı. Asırqallıqda gizləndi. Buradan o yana qaçmağa yer yox idi.

Basqınçılar xeyli gəzdilər. Hətta bir-iki dəfə lap Salatının yanından keçdilər. Qız bir an içində bir neçə dəfə ölümdən qayıtdı.

– Əyə, bir də gəzin, buralardadır.

Asırqalları qatlayıb ayaqlarının altına aldılar. Onları şartaşartla sındırdılar. Salatını üzük qaşı kimi qamarğaladılar. Qız atılıb aradan çıxmaq istədikdə onu tutdular. Qolunu qanırıb ağzını bağlamağa çalışdılar. Salatın tükürpərdici səslə qışqırdı:

– Ana!!! Haradasan, ay qağa dadıma çat, ay qardaş!

Onun əl-qol atıb çapalamağına fikir vermədilər. Yaxın gələnlərin üz-gözünü cırıb əllərini dişləməsinə baxmadılar. Basqınçılardan biri onu yumaq kimi büküb qoltuğuna vurdu, Salatın çapaladı, sürüşüb yerə düşdü. Qızın bu hərəkətindən qəzəblənən kişi onun əllərini, ayaqlarını iri ovcunun içində sıxıb qoyun kimi çiyninə aldı. Basqınçılar qayalığa doğru getdilər. Qarşı tərəfdən at kişnədi. Salatın yenidən qışqırdı. Zərnigar xanım əlini dizinə çırpdı və aşağıdakı dəyələrə doğru qaçdı.

– Vay, evim yıxıldı, Əşrəf, qızı apardılar.

Bu qışqırtını Əşrəfdən qabaq Əhməd eşidib dik atıldı. Şalvarını geyinməsi ilə tüfəngi götürüb dəyədən çıxması bir oldu. Birbaş səs gələn tərəfə yüyürdü. İtlər qayalığa basqın edirdilər. Sığırçılar hay-haray salmışdılar. Qarmaqarışıq səs gəlir, arabir at kişnəyirdi. Əhməd cığırla qayanın üst tərəfinə yüyürdü. Basqınçıların qabağını kəsmək istədi. Ancaq ondan qabaq özünü yetirən Əşrəf qayalığa dalbadal iki güllə atdı. At kişnədi. Basqınçılar da güllə atdılar. Əhməd qayalıqda ayaq üstə dayanan Əşrəfi dartıb yerə yıxdı. Tövşüyə-tövşüyə soruşdu:

– Nə olub?

– Salatını aparırlar.

Əşrəf yerindən sıçrayıb ayağa qalxdı. Səsi gəldikcə bağırdı:

– A köpək uşağı, bu saat hamınızı qıracam.

O heç nəyə baxmadan irəli cumdu. Nökərlər də onun dalınca qaçdılar. Əhməd bir xeyli sakitcə dayanıb qaranlıqda ətrafı dinşədi. Basqınçıların hansı tərəfə getdiklərini təxmin etdikdən sonra "Ərim gəldi" təpəsinə doğru yüyürdü. Daşlardan birini özünə mətəris edib gözlədi. Basqınçılar yenicə atlanırdılar. Əhməd çaxmağı hərlədi. Qayalar şaqqıldadı. Tüfəngin dalınca özü də qışqırdı:

– Əyə, qoymayın, qabaqlarını kəsin.

Atışma başlandı. Basqınçılar bir xeyli qayaların ətrafında fırlandılar. Sonra atların tappıltısı dərədə eşidildi. Kim isə inildədi. Əhmədin qulağının dibindən iki güllə vıyıldayıb keçdi. O, yerə yatdı. Əşrəfi gözdən itirdi. Artıq itlər dərənin o tərəfində hürürdülər. Atlar uzaqda kişnəyirdi.

Əhməd Əşrəfi o tərəfdə, dağın döşündə tapdı. O doluxsunmuşdu.

– Aradan çıxdılar, Əhməd lələ, indi nə eləyək, qız əldən getdi!

– Dallarınca düşmək lazımdır.

Onlar bir azdan atları dördnala çaparaq dərədə gözdən itdilər.

* * *

Allahyar Köçəri kəndinin binələrində, Həsən ağanın alaçığında oturub böyük intizar və təlaşla Salatını qaçırtmaq üçün göndərdiyi adamların qayıtmasını gözləyirdi. Onun fikri dağınıq idi. Düz bir həftə idi ki, nə gözünə yuxu gedir, nə də boğazından bir tikə çörək keçirdi. Allahyar, nəhayət, əlinə fürsət düşdüyünə və düşmənindən intiqam

alacağına sevinirdi. Tez-tez ürəyində Cahandar ağanı yamanlayırdı: "Adamın anasını belə ağladarlar. Sən mənim arvadımı apardın, mən də əvəzində sənin doğma qızını gətirib rüsvay eləyəcəyəm".

Əslində Salatını götürüb qaçmağı onun ağlına Molla Sadıq salmışdı. On gün bundan əvvəl Allahyara sifariş yollamışdı ki, "başını orada islat, burada qırxdır". Allahyar bu xəbəri eşidən kimi atını minib, birbaş yaylağa gəlmişdi. Onlar dağ kəndlərinin birində görüşmüşdülər. Molla Sadıq binələrdə kişilərin az olduğunu, hamının arana, biçinə getdiyini ona xəbər vermişdi. Cahandar ağa yox idi. Belə fürsət ələ düşməzdi. Allahyar mollanın məsləhəti ilə on nəfər adam tapıb danışmış, onları qızın dalınca göndərmişdi. Özü isə Həsən ağanın yanına gəlmişdi. Onun məqsədi bir neçə günlüyə buralarda daldalanmaq idi. O çox gözəl bilirdi ki, qızı axtaracaqlar. Əgər Salatını öz kəndlərinə aparsa, dərhal ələ keçərdi. Burada, ağlagəlməz yerdə isə bir neçə gün qala bilərdi. Ona elə bu da bəs idi. Allahyarın məqsədi Salatını özünə arvad eləmək deyildi. O istəyirdi ki, Cahandar ağa onun arvadı ilə kef çəkdiyi kimi, bu da bir həftə, on gün Salatınla kef çəksin, sonra isə qızı üzüqara halda geri qaytarsın. Bəlkə də başına daha betər pisliklər gətirsin.

Allahyarın çayı çoxdan soyumuşdu. Həsən ağa sakitcə onu süzür, arabir də dodaqaltı gülürdü. O özü də belə hal keçirmişdi. Arvadı Yəmən xanımı ona verməK istəməyəndə götürüb qaçmağa adam göndərmişdi. Əslində qız özü də qaçmağa hazırlaşmışdı. Ancaq qızı gətirənə qədər Həsən ağa durub dincələ bilməmişdi.

– Ə, nə olub, nə qəm dəryasına batıbsan?

– Qorxuram əliboş qayıdalar.

– Beh veribsənmi?

– Hərəsinə bir qızıl onluq.

– Onda ürəyini buz kimi sərin saxla. Ölərlər, amma puldan keçməzlər. Onların peşəsi mal oğurlayıb, qız qaçırtmaqdır.

– Orası elədir, amma yenə ürəyim narahatdır.

– Narahat olma.

Onlara yenə çay verdilər. Allahyar stəkanı götürüb bir-iki qurtum içdi. Elə bu vaxt səs-küy qalxdı. İtlər bərkdən hürdü. Bir dəstə atlı binəyə yaxınlaşdı. Onlar alaçığın qapısında dayandılar. Salatını yerə düşürdülər. Həsən ağanın arvadı gəlini ilə köməkləşib əli, ayağı bağlı Salatını öz dəyəsinə apardı. Basqınçıların başçısı alaçığa girdi. Allahyar dərhal ayağa durdu.

– Gətirdinizmi?
– Gətirdik, amma bizə yaman baha tamam oldu.
– Necə?
– Atımızın birini vurdular. Yoldaşlarımızdan da ikisi yaralandı.
– Heç nə olmaz.
– Yaxşı, bizim haqqımızı ver, qaranlıqkən aradan çıxaq.
– Qız hanı?
– Xanım dəyəyə apardı.
Allahyar əlini cibinə saldı. Əvvəlcədən ayırıb hazırladığı pulu çıxartdı:
– Al, özünüz bölüşərsiniz.
– Bu azdı. Yaralananlar heç, gərək atın da pulunu verəsən.
– O mənim işim deyil.
– Sonra peşman olarsan.
– Nə demək istəyirsən?
– Bir sözdü, deyirəm, fikirləş.

Allahyar qarşısında dayanan adamın saçaqlı papağına, tüklü sifətinə baxdı. Bir xeyli tərəddüd içində dayandı. Onun fikrindən nələr keçirdiyini bilmək istədi. Həsən ağa araya çökən sükutu zarafatyana tərzdə pozdu:

– Kişini yola sal, könlü balıq istəyən gərək suya girsin.

Allahyar dinməz-söyləməz əlini cibinə saldı. Atın pulunu da verdi. Yalnız bundan sonra basqınçıların başçısı onlarla xudahafizləşdi.

– Salamat qalın.

Onlar gedəndən sonra Allahyar bir az sakitləşdi. Həsən ağa qonağının gözlərində vəhşi bir hərisliklə sevincin qarışığını gördü. Dodaqaltı gülümsəyib döşəkcənin üstünə uzandı.

## 15

Cahandar ağa ayağının ikisini də yəhərin üstündən sağ tərəfə aşırıb, atın belində yanaşı oturmuşdu. O, papirosunu sümürür və qırçın-qırçın olub dalğalanan zəmilərə tamaşa edirdi. Dəmyədəki taxıllar kəhrəba kimi saralmışdı. Sünbüllər ağırlaşıb boynunu əymişdi. Üfüqlərə qədər uzanıb gedən zəmiləri arabir Kür tərəfdən əsən meh yerindən oynadıb dəniz kimi ləpələndirirdi. Çöllərə ahəngdar bir xışıltı yayılırdı. Qərb tərəfdəki dağların sinəsi belə saralmışdı. “Buranı da biçdirib, dərzləri

qapıya daşıtdırsam, atın başını qanırıb yaylağa qayıdaram, – deyə Cahandar ağa düşünməyə başladı. – Oralar da yiyəsiz qalıb, aranda çox ləngimək olmaz, zamana əlləm-qəlləm zamanasıdır, sonra nə olar, nə olmaz. Şamxal zənnimi itirdi, Əşrəfdən isə ağlım bir şey kəsmir, onlara arvad-uşaq tapşırmaq olmaz”.

Kişi axır vaxtlar baş verən hadisələri xatırladı, nəhayət, maralın öldürülməsini yadına saldı. Bunların hamısı düşmənçilik idi. Onu izləyir, hər addımbaşı sataşırdılar. Cahandar ağa əvvəllər buna o qədər də əhəmiyyət vermək istəmirdi. Hər gəda-güdəyə baş qoşmağı şəninə sığışdırmırdı. Belə olmasaydı, düşmənin qapısına atını sürər, onu bayıra çağırar və gülləni sinəsinə sıxardı. Bir də, o, heç ağlına gətirmirdi ki, cəsarət edib onun həndəvərinə hərlənən olar. Ancaq, görünür, zaman dəyişmişdi. Hər başına papaq qoyan özünü kişi hesab eləyir, əlinə tüfəng alıb camaat arasına çıxır. “Yox, bu işi belə qoymaq olmaz. Elə dağdan arana enən kimi o köpəkoğlunun izini itirmək lazımdır. Belə eləməsəm, bundan sonra da əl-ayağıma çox dolaşacaq”.

Cahandar ağa başını qaldırıb üfüqə, sonra da Kürün o üzündəki meşəyə baxdı. El dağa köçməzdən əvvəl kazakların kəndə gəlməsini, pristavla olan söhbəti xatırladı. Meşədəki əhvalatı yadına saldı. Köksünü ötürüb başını buladı: “Bu divan-dərə də amanımızı qırıb. Deyəsən, bundan sonra əl-ayaq tərpətmək çox çətin olacaq. Həftənin bir bu başında, bir də o başında pristav atını çapıb gələcək, kor kimi qapını kəsəcəkdir. Qorxuram axırda bizi lap kəbinli arvada döndərsinlər”.

At, sahibinin fikrə getdiyini başa düşdüyündən, özü yoldan döndü, taxılların arasındakı cığıra keçdi, zəmilərin ortasındakı tənha çinar ağacına doğru addımladı. İri qaraqılçıq sünbüllər Cahandar ağanın ayağına toxunsa da, kişi vəziyyətini dəyişmədi. Çinarın o üzündəki biçinçilərə gözünü zillədi. Oraqlar havada parıldayırdı, kim isə astadan bayatı deyirdi:

Eləmi qar qalandı,
Qış gəldi, qar qalandı.
Qarğalar laçın oldu,
Laçınlar qarğalandı.

Cahandar ağa sakitcə mahnıya qulaq asdı. Bayatının sözləri onu daha da məyuslaşdırdı. Kişi birdən-birə istiləndi. Əlini atıb köynəyinin yaxasını açdı. Taxılların bürküsü onu vurdu. Bir az bundan əvvəl Kür

tərəfdən əsən meh birdən-birə dayandığından, çöllərin üstünə boğanaqlı hava çökmüşdü. Adam nəfəs aldıqca boğazı quruyur, ciyərlərinə isti təndir hənirtisi kimi bir şey dolurdu.

At çinarın kölgəsində dayandı. Qulaqlarını şəkləyib astadan kişnədi. Cahandar ağa sıçrayıb yəhərdən yerə düşdü. Atı ağaca bağlayıb, kölgədəki daşın üstündə oturdu. Bircə yarpaq da tərpənmirdi. Ağacın gövdəsinə yapışmış cırcıramalar ağız-ağıza verib ötüşürdü. Onların zil səsi az qalırdı adamın beynini deşsin. Cahandar ağa bir xeyli daşın üstündə sakitcə oturub nəfəsini dərdi. Gün onu qaraltmışdı. Kişi güclə nəfəs alırdı. O, papirosunu son dəfə sümürüb atdı. Kövşənə od düşməsindən ehtiyat edərək, ayağı ilə tapdayıb söndürdü. Bundan sonra ətrafa boylandı. Ağacın kölgəsində, otun altında gizlədilmiş cürdəyi görən kimi ayağa qalxdı. Qabı götürüb suyu başına çəkdi. Su qan kimi ılıq idi. Ancaq kişi buna əhəmiyyət vermədi. Doyunca içdi. Cürdəyi yenidən otun altında gizlətdi. Qolu ilə ağzını silərək, biçinçilərin yanına getdi.

Onlar taxılın içində qatarlaşmışdılar. Gün yandırmasın deyə, dəsmallarının ucunu düyünləyib başlarına keçirmişdilər. Köynəkləri islanıb kürəklərinə yapışmışdı. İsti olmasına baxmayaraq, həvəslə işləyirdilər. Cahandar ağa onlara yaxınlaşdı: "Yorulmayasınız!" – deyə ucadan biçinçiləri salamladı, sonra da dəstənin ağsaqqalı Sərkis kişi ilə görüşdü.

– Taxıl necədir, ay kirvə?

Kişi belini düzəldib dayandı. Orağı sol əlinə alıb, alnının tərini sildi:

– Allah bərəkət versin, yaxşıdır, ağa, uşaqlara azuqə çıxacaq. Amma yaman istidir.

– Elə ona görə də çalışın tez qurtaraq, bulaqların suyu bizi gözləyir.

– Biz sizdən də çox tələsirik, ağa, arvad-uşağı töküb gəlmişik, indi gözləri yoldadır.

– Heç nə olmaz, az qalıb.

Cahandar ağa susdu. Bir xeyli biçinçilərə baxdı. Kənardakı dərz tayasına yaxınlaşdı. Sərkis kişinin oraqlarından birini götürüb əlilə ağzının ovxarını yoxladı və gülümsündü:

– Gəlsənə ötüşək?

– Sizə əziyyət olar, ağa.

– Deyəsən qorxursan.

– İndiki belə oldu, özünü gözlə.

Cahandar ağa üst köynəyini soyundu. Dəsmalının ucunu düyünləyib başına keçirtdi. Ötən günləri yadına salmaq və biçinçiləri həvəs-

ləndirmək məqsədi ilə orağı havada oynadıb, sarı sünbülləri qucaqladı. Sərkis kirvə bir xeyli ona göz qoyduqdan sonra peşəkar bir ustalıqla orağı hərlədi. Başqa biçinçilər də yarışa qoşuldular. Cahandar ağa cəldliklə orağı hərləyir, hər dəfə az qalırdı ki, bir dərz taxıl biçsin. Onun dalınca gəlib dərz bağlayan oğlan Cahandar ağanın arxasınca güclə çatırdı. Sərkis kirvə ondan geri qalmaq istəmədiyindən, orağı tez-tez hərləyir, arabir də "a başına dönüm, qoyma", – deyə qışqırırdı. Hamı həvəsə gəlmişdi. Elə bil taxılın bürküsü də, qızmar günəşin istisi də bir anlığa yox olmuşdu.

Onlar xeyli beləcə, bir-birini qova-qova taxıl biçdilər. Cahandar ağanın köynəyi tərə batdı, yarımca saatdan sonra kürəyinə yapışdı. Taxılın tozu ağ köynəyi qapqara etdi. Kişinin özünün də rəngi kömürə döndü. Tunc sifətində tər zolaq saldı. Ancaq orağı əlindən buraxmadı. Zəminin ortasındakı xəndəyə çatan kimi geri döndü, orağı hərləyə-hərləyə çinar ağacına doğru gəldi. Sərkis kirvə də ona aman vermədi. Dabanbasaraq irəlilədi. Cahandar ağa zəminin kənarına çatanda belini düzəldib dikəldi. Orağı kənara atıb qaliblər kimi qürurla Sərkis kişiyə baxdı:

– Hə, deyəsən, dalımdan çata bilmədin?

Biçinçi gülümsündü. "Yarım saat işləməyə nə var, hesab odur ki, bu cırcırama yay günündə həftələrlə belini qaldırmayıb, taxıl biçəsən", – demək istədi. Ancaq dilinin ucuna gələn sözü geri qaytardı:

– Ağa, əməlli-başlı biçinçisənmiş ki?

– Bəs nə bilmişdin?

Cahandar ağa orağı dərzin dibinə atıb köynəyini götürdü. Paltarını geyinmək istədi. Elə bu vaxt bayaqdan biçinçilərə su paylayan Tapdıq ona yaxınlaşdı:

– Ağa, əl-üzünüzü yumasanız sərinləməzsiniz.

– Suyun varmı?

– Var. Gedək ağacın kölgəsinə.

Onlar zəmidən aralandılar. Cahandar ağa çim suya batmış köynəyini soyundu. Tapdıq onu ağasının əlindən alıb möhkəm sıxdı və günə sərdi. Sonra da cürdəyi götürdü:

– Ağa, aşağı əyilin.

Cahandar ağa ovcunu su ilə doldurub üzünə çırpdı. Boynunun dalından şoralanıb tökülən su ilə qollarını və tüklü sinəsini yudu. Başını da islatdı. Yalnız bundan sonra bədəni bir az sərnidi. Cürdəyi Tapdığın əlindən alıb, başına çəkdi. Bir xeyli ağacın kölgəsində gəzindi. Elə bil

hava da dəyişdi. Yarpaqlar tərpənən kimi oldu. Tapdıq Cahandar ağanın qurumuş köynəyini gətirdi. Kişi əlini bədəninə çəkdi, qupquru olduğunu görüb paltarını geyindi. Kəmərini, xəncərini bağladıqdan sonra Sərkis kişini yanına çağırdı.

– Fikriniz nədir, ay kirvə, gecə kəndəmi qayıdacaqsınız?

– Yox, ağa, elə burada çinarın dibində yatarıq. Obaşdan durub sərinkən taxıl biçmək daha faydalıdır.

– Ağıllı sözdür, yeməkdən korluq çəkmirsiniz ki?

– Yox, çəkmirik. Amma bir az ürək sərinlədən şey olsa, pis olmaz.

– Elə şeyin fikrini çəkməyin, düzələr.

Sərkis kişi qayıdıb biçinə başladı. Cahandar ağa ilə Tapdıq ağacın kölgəsində tək qaldılar.

– Biçinçiyə yaxşı qulaq asmasan iş yeriməz. Bu saat uşaqlardan birini göndər bir çəllək sərin su gətirsin. Sonra da özün bostana get, bir-iki xurcun qarpız gətir, qoy yesinlər, dağ adamlarıdır, ürəkləri sərnisin. Çörək bişirtdirmisənmi?

– Bişirtdirmişəm. Bir azdan qatıq, süd də gətirəcəklər.

– Lap yaxşı. Di durma, tərpən. Günorta çörəyinə qədər dediklərimi düzəlt. Mən də o tərəflərə baş çəkim.

Cahandar ağa yaşına uyğun olmayan bir çeviklikə sıçrayıb atın belinə qalxdı. Elə bil bir az əvvəlki yorğunluqdan və əzginlikdən heç nə qalmamışdı. Kişi işləyəndən sonra sanki dirçəlmişdi. At da sahibi kimi yüngülləşmişdi. Cahandar ağa ayağını üzəngiyə qoyan kimi, cilovu gəmirib yorğa addımlarla ağacın kölgəsindən uzaqlaşdı. Beşcə dəqiqə keçməmiş taxılların arasından çıxıb, kəndin üstünə enən torpaq yola düşdü.

Hər tərəfdə qızğın iş gedirdi. Zəmilərin arasındakı cığırlarla yüklü arabalar irəliləyib kəndin üst tərəfindəki yola çıxırdı. Xır yoluna çatana qədər qatarlaşan arabaların təkərlərindən qopan toz laylanıb havada dayanmışdı. Artıq kənd evlərinin qabağında taxıllar tayalara vurulmuşdu. Kəndlilərin çoxu xırman açıb vəl qoşmuşdu. Hamı peşqurda hazırlaşır, biçilmiş taxılları qapıya yığıb tezliklə yaylağa qayıtmağa tələsirdi.

Cahandar ağa zəmilərin arasından keçib birbaş xır yoluna endi və orada atın başını qanırıb evə gəldi. Burada da iş qaynayırdı. İki yerdə vəl qoşmuşdular. Samanlıq tərəfdə isə yenicə xırman salmışdılar. Nökərlər dərzlərin bəndini qırıb sünbülləri xırmana tökmüşdülər.

Cahandar ağa atdan endi. Bu dəfə nökərləri yaxına qoymadı. Özü atın yəhərini alıb çardağın altına, kölgəyə çəkildi, əli ilə Qəmərin

yalını sığalladı, döşünün tərini sildi. Onun qabağına bir qucaq göy ot tökdükdən sonra dərz tayalarına yaxınlaşdı. O, nədənsə, bu gün işləməyə həvəs göstərdiyindən, burada da sakit dayanmadı. Yeni salınmış xırmana dərz daşıyan nökərlərə kömək etdi. Öküzləri qoşdular, vəli xırmana saldılar. Cahandar ağa özü atılıb vəlın üstünə çıxdı. Çubuğu havada yellədib öküzləri səslədi. Heyvanlar dizə qədər kövşənə batdılar. Vəl kələ-kötür dərzlərin üstündə ləngərləndi. Ləpələrin atıb-tutduğu qayıq kimi gah çökəyə endi, gah da yuxarı, dərzlərin üstünə qalxdı. Sünbüllər xışıltı ilə ovxalandı, kövşən əzilməyə başladı. Cahandar ağa böyük bir zövqlə öküzləri hayladı. Vəl beş-on dəfə xırman boyu fırlandı və dərzlər yapıxdı. Xırman boyu dairəvi cığırlar düşdü. Cahandar ağa hər dəfə vəli yeni yerdən sürdü və xırman tamam yapıxana qədər vəlin üstündən düşmədi.

Nəhayət, çubuğu onun əlindən aldılar. Cahandar ağa sıçrayıb kənara çıxdı və samanlığın üstündə dayanıb, işləyənlərə xeyli tamaşa etdi. Dəsmalını çıxardıb tərini sildikdən sonra talvarın altına, ata yaxınlaşdı. Qəmər quyruğu ilə çibinləri qova-qova xımırt-xımırt göy ot yeyirdi. İsti atı da təntitmişdi. Onun sinəsi köpüklənmişdi. At tərin içində idi. Qəmər sahibini görəndə başını tərpədib oxrandı və gözünü zilləyib sahibinin üzünə baxdı. Sanki "bizi bu istidə niyə öldürürsən?" – demək istədi. Cahandar ağa onun yalını sığalladı, boynunu qaşıdı, başını sinəsinə sıxıb gözünü oxşadı. At sahibinin nəvazişini duydu və nazlı gəlinlər kimi cilvələndi. Cahandar ağa az qaldı Qəməri köksünə basıb üz-gözündən öpsün. Onların arasındakı ünsiyyət bir heyvanla insan arasında olan dostluqdan daha çox iki sirdaşın, ağır gündə bir-birinə kömək durub haraya çatan iki adamın mehribanlığına bənzəyirdi. Məhz buna görə də Cahandar ağa özü atına qulluq edir, onun otunu, suyunu özü verir, hörüyünü özü dəyişir, yəhərini, yüyənini özü alırdı. Kişi sanki bununla atın ona elədiyi yaxşılıqların əvəzini geri qaytarmaq istəyirdi.

İndi o, atın çim tərə batmasına dözmədi. Heç kəsə heç nə demədi. Ata buruntaq verib yalından yapışdı və sıçrayıb belinə qalxdı. Qəmər sahibinin fikrini başa düşdü və birbaşa cığırla sahilə endi. At suvadağa çatan kimi özünü Kürün dayaz yerinə saldı. Daşları şaqqıldada-şaqqıldada su yuxarı irəlilədi. Ayağının altından qalxan su ətrafa sıçradı. Cahandar ağanın paltarı islandı, kişi bundan daha da xoşhallandı. Nəhayət, bir az sərniyəndən sonra dayandı, Cahandar ağa yerə düşdü,

üst paltarını soyunub atı çimizdirməyə başladı. Qəmər sakit dayandı. Sinəsi, qulaqlarının dibi qaşındıqca xoşhallandı və arabir astadan sahibini qoxuladı.

Cahandar ağa atı tərtəmiz yuduqdan sonra evə qayıtdı. Atı yenə talvarın altına bağlayıb qabağına ot qoydu. Bir xeyli Qəmərin iştahla ot yeməsinə tamaşa etdi. Bir az dincini almaq üçün otağa girib taxtın üstünə uzandı. Qulluqçulardan biri onun dirsəyinin altına mütəkkə qoydu, qabağına süfrə saldı, bir şey yemək istəyib-istəmədiyini soruşdu. Cahandar ağa çay içəcəyini bildirdi. Ona dalbadal bir neçə stəkan çay gətirdilər. Kişi onları birnəfəsə içib, dincəlməyi qərara aldı. Bərkdən gərnəşib uzandı. Heç beşcə dəqiqə keçməmiş onu yuxu apardı. Qulluqçunun süfrəni yığışdırdığını görmədi, gün düşməsin deyə pəncərənin taxtalarını örtməsindən xəbəri olmadı. Otaq sərin olsa da tər onu basdı. Nəfəs alması belə çətinləşdi. Sinəsi qalxıb endi. Otağa tövşüyə bənzər bir səs yayıldı. Kişi qəribə bir yuxu gördü.

O gördü ki, qapı astadan aralandı. Şahnigar səs salmadan içəri girdi. Astanada dayanıb ayaqqabısını soyundu və barmaqlarının ucunda taxta yaxınlaşdı. Bir xeyli qardaşının yastığının yanını kəsdirib, onun necə nəfəs almasına qulaq asdı. Cahandar ağa bacısının ona necə həsrət və məzəmmətlə baxdığını gördü. Şahnigar əlini qoynuna qoyub, başını azacıq yana əymişdi. Sinəsi astadan titrəyirdi. Burun pərələri güclə seziləcək dərəcədə səyriyirdi, elə bil için-için ağlayırdı. Cahandar ağa ayağa durub bacısından nə üçün ağladığını soruşmaq istədi. Onun qolundan yapışıb taxtın üstündə oturtmağa çalışdı. Ancaq yerindən tərpənə bilmədi.

Şahnigar bir müddət beləcə dayandı, sonra önlüyünün ətəyi ilə gözünü qurdaladı və aşağı əyilib qardaşının yastığını düzəltdi. Elə bu vaxt onun əli Cahandar ağanın alnına toxundu. Kişi tərpəndi. Şahnigar dalı-dalı geri çəkilib qapının ağzına getdi. Cahandar ağa durub oturdu. Bacısını yanına çağırdı. O gəlmədi. "Dərdin alım gedəcəm, tələsirəm, işim var, burda çox qala bilmərəm, – deyə cavab verdi. – Gəldim sənə deyim ki, onda taqsır yoxdur. Xasiyyətini bilirəm, eşidən kimi dəli olacaqsan. Ancaq, Allah haqqı, düz sözümdür, sənin qızın tərtəmizdir, onda günah yoxdur. Salatın gül parçası kimi bir uşaqdır. Onu da mənim kimi bədbəxt eləmə, ay qardaş, özünü də, balanı da odsuz-ocaqsız yandırma, atam balası, eşitdinmi? Di salamat qal, gözünə qurban olum, görürəm yaman dərd çəkirsən, ancaq fikir eləmə, olan-olub, keçən-keçib. Özünü üzmə".

Şahnigar ayaqqabısını əlinə götürdü. Donunun ətəyini yuxarı qaldırdı, gəldiyi kimi də sakitcə qapını aralayıb otaqdan çıxdı. Cahandar ağa onu saxlamaq, geri qaytarıb yanında oturtmaq, göz-gözə dayanıb doyunca söhbət etmək istədi. Nə qədər qışqırdısa da, səsi çıxmadı. Elə bil sinəsinin üstünə ağır bir qaya yıxmışdılar. Kişi boğulmuş kimi xırıldadı...

Cahandar ağa hövlnak ayıldı. Harada olduğunu bir xeyli aydınlaşdıra bilmədi. Gözünü döyüb maddım-maddım boylandı. Gözü otağın qaranlığına alışdıqdan sonra yuxuya getdiyini anladı. "Lənət şeytana", – deyə öz-özünə söyləndi və taxtın üstündən düşdü. Ağır addımlarla qapıya yaxınlaşdı. O bir az bundan əvvəl Şahnigarın dayandığı küncdən gözünü çəkə bilmirdi. Kişiyə elə gəlirdi ki, bacısı orada dayanmışdır. Bu saat tərpənəcək, bəlkə də atılıb qardaşının boynuna sarılacaqdır. Günün günorta vaxtı kişini elə bil qara basırdı. Bu boyda adamı vahimə götürmüşdü.

O özünü topladı. Əlini cəftəyə uzatdı və qapını açıb cəld eyvana çıxdı. Orada da dayanmadı, birbaşa xırman yerinə gəldi və bir xeyli gəzindikdən sonra toxtadı.

Artıq sərin düşmüşdü. Xırmanların çoxunda vəli açmışdılar. Hətta lap tezdən xırman döyənlərdən indi taxıl sovuranlar da var idi. Cahandar ağanın xırmanlarından ikisi hazır idi. Nökərlər taxılı yığıb, xırmanın ortasına toparlaşmışdılar.

Cahandar ağa fikrini dağıtmaq məqsədi ilə nökərlərdən qabaq şananı əlinə aldı, tığın bir yanında dayanıb taxılı sovurmağa başladı. İri sarı buğdalar bir yana töküldü, saman qırıntılarını külək xeyli uzağa apardı. Nökərlər də ona qoşuldular. Gün batana qədər xırmandakı taxılları sovurdular. Arvadlar sarı buğdanı xəlbirdən keçirdilər. İri çuvallar doldurulub yan-yana düzüldü. Cahandar ağa axıra qədər işlədi. Nökərlər samanı yığıb samanlığa tökəndə isə üstünün tozunu çırpıb bir tərəfə çəkildi və hündür bir yerdə sallağı oturub papiros eşdi.

Doqqazda at kişnədi. Kim isə Cahandar ağanı səslədi. Kişi ayağa qalxıb üst-başını düzəltdi və asta addımlarla çağıran adamın qabağına çıxdı.

– Ə, xoş gördük, yaylaqdan nə vaxt gəlibsən?

– Elə indi.

– Bizim uşaqları görmədin ki?

– Gördüm. Yaxşıdırlar... Amma yaylağa qayıtsan, pis olmaz.

Cahandar ağanın qaşları çatıldı. O, gözünü atlının üzünə zilləyib dayandı. Kişi hiss etdi ki, əlləri titrəyir. Özünü ələ almaq və keçirdiyi həyəcanı qarşısındakına bildirməmək üçün papirosunu sümürdü.

– Nə olub, xeyirdimi?

– Elə bir şey yoxdur, amma deyəsən sizin binələrə basqın eləmişdilər.

– Kim? Nə vaxt?

– Dünən gecə.

– Bədbəxtlik-zad olmayıb ki?

– Vallah, düzünü bilmirəm.

– Məndən söz gizlətmə, ürəyimə damıb.

– Elə bir şey yoxdur, bilsəm deyərdim.

Cahandar ağa papirosunu kötüyünə qədər sümürdü. Kəhrəba müştük çatırdadı və az qaldı ki, alışıb yansın. Atlı papirosun işığında kişinin ağarmış sifətini gördü. Onun yanağında bir damcı qan qalmamışdı. Gicgahlarındakı damarlar vururdu. Barmağının arasındakı müştük titrəyirdi.

## 16

Salatın xeyli özünə gələ bilmədi. Yəmən xanım dəyənin ortasında huşsuz uzanan qıza təlaşla baxdı. Onun əlini, ayağını açdı. Ağzına tıxanmış dəsmalı açdı. Üzünə, sinəsinə su çilədi. Qızın paltarı didik-didik olmuşdu. Bədəni qıpqırmızı idi. Bəzi yerlərinə qan sağılmışdı. Saçına pıtraq dolmuşdu. Sifəti şişmişdi. Yəmən xanım əlində çıraq, bir müddət qızın tərpənməsini gözlədi. Arvadın ürəyi kövrəldi. Kəlağayının ucu ilə yaşarmış gözünü sildi. Qızın salamat yeri yox idi. Tikan onun bədənini deşik-deşik etmişdi. Arvad çırağı kənara qoydu. "İnsafsızlar, gör yazığı nə kökə salıblar, – deyə öz-özünə deyindi.

– Deyəsən, uşağın saçından tutub sürüyüblər. Görəsən, yazığın ata-anası varmı?" Tələsik ayağa durub qıza yer saldı. Salatını qucağına götürüb döşəyin üstünə uzatdı. Onu yorğana bürüdü. Sonra da qızın baş tərəfində oturub saçını sığalladı, yenə üzünə su çilədi, qız inildədi. Azacıq sonra isə gözlərini açıb döyükdü. Heç nə anlamadan sakit-sakit baxdı. Arvad başa düşdü ki, qızın huşu hələ tamam özünə gəlməyib. Gözü baxsa da heç nə görmür. Yəmən xanım Salatının başını qaldırıb dizinin üstünə qoydu. Suyu onun dodaqlarına yaxınlaşdırdı:

– İç, bala, huşun özünə gəlsin.

Qız dinmədi. Sudan qurtum-qurtum içdi. Gözünü zilləyib arvadın üzünə baxdı və birdən hıçqırmağa başladı. Bədəni dartılı yay kimi gə-

rilib titrədi. Qızın yenidən huşunu itirəcəyindən qorxan Yəmən xanım onun qolundan yapışıb sinəsinə sıxmaq istədi. Yəmən xanımın gəlini də irəli gəldi. Köməkləşib qızı yenidən yorğan-döşəyə uzatdılar. Salatın taqətdən düşdü, solğun dodaqları titrədi, için-için ağladı:

– Ay xala, qurbanın olum, mən hardayam?

– Qorxma, qızım, özünə toxtaqlıq ver.

– Məni öldürün, amma onlara verməyin.

– Heç nə olmaz, bala, özünü ələ al.

Salatın sürünüb Yəmən xanımı qucaqladı. Uşaq kimi onun boynuna sarılıb hönkürtü ilə ağladı:

– Xala qurbanın olum, məni evimizə qaytar, yoxsa dədəmin hirsindən ürəyi partlayar. Amanın bir günüdür, ay xala, mənə yazığın gəlsin. Məndən sonra anamın günü qara olacaq, qardaşım bu dərdə dözə bilməyəcək. Məni çevir balalarının başına, ay xala!

– Yaxşı, qızım, ağıllı ol, gözünün yaşını sil.

Yəmən xanım qəhərləndi. Salatının yanağındakı göz yaşını sildi, saçından öpdü:

– Kimin qızısan, bala?

– Cahandar ağanın.

Arvad diksindi. Salatının başını sinəsindən ayırıb diqqətlə üzünə baxdı:

– Kimin?

– Cahandar ağanın.

Yəmən xanım susdu. Salatının intizar və təlaş dolu gözlərinə baxdı. Qız ev sahibəsinin sükutundan daha da həyəcanlandı. Onun nələr düşündüyünü ayırd edə bilmədiyindən bədəni buza döndü. Ürəyi üşüdü:

– Niyə dinmirsən, ay xala?

– Yaxşı, qızım, sən uzan, mən bu saat gəlirəm.

Yəmən xanım tələsik dəyədən çıxıb alaçığa yaxınlaşdı. Ərini çağırdı. Həsən ağa ağır addımlarla arvadının yanına gəldi.

– Dəyəni boşaltdınmı?

– Bəri gəl, sənə sözüm var.

– Nə söz? Kişi gözləyir. Dəyəni boşalt, yer düzəlt.

– Bir az səbr elə, dediklərini düzəltmək asandır.

Onlar alaçıqdan xeyli aralandılar. Yəmən xanım pıçıltı ilə sözə başladı:

– Bilirsən sənin qonağın kimin qızını gətirib?

– Nə bilim, yəqin yetimin biridir.
– Mən də elə bilirdim, amma...
– Uzun eləmə, de görüm kimin qızıdır?
– Cahandar ağanın.
– Nə?! Arvad, nə danışdığındır? Elə şey olmaz!
– Olar, niyə olmur, namərddən hər nə desən çıxar.

Həsən ağa dinmədi. Həmişə çətinə düşəndə etdiyi kimi indi də saqqalını qaşımağa başladı.

Allahyar onun uzaq tanışlarından idi. Binəyə gələndə kimin qızını qaçırmaq istədiyini ona deməmişdi. Elə Həsən ağa da soruşmamışdı. Qız götürüb qaçmaq ona o qədər də təəccüblü görünmədiyindən, heç nə ilə maraqlanmamışdı. Bir də, ona pənah gətirən adamı sorğu-suala tutmaq Həsən ağanın adəti deyildi. Kişi ancaq indi başa düşdü ki, məsələ heç də onun fikirləşdiyi kimi deyil. Allahyar arvad almaq məqsədi ilə qız gətirməmişdir. Onun fikrində nə isə qara bir niyyət var, həm də Cahandar ağa Həsən ağanın yaxın dostlarından biri idi. Neçə ildi aralarında haqq-salamları var.

– İndi fikrin nədir, a kişi?
– Qız nə təhərdir?
– Lap əldən düşüb. Bədənində salamat yer yoxdur.
– Get qızı rahatla, özünə də yeməkdən-zaddan ver.
– Bəs sonra?
– Sonrasını mən özüm bilirəm.

Həsən ağa dinməz-söyləməz alaçığa qayıtdı. O, içəri girən kimi Allahyar döşəkcənin üstündə bir az yayxandı. Həsən ağanın bu saat "hər şey hazırdır, dur get" deyəcəyini gözlədi. Lakin gördü ki, kişinin qaş-qabağından zəhər tökülür. Allahyarın təbəssümü dodaqlarında qaldı.

– Qız nə təhərdir?
– Dur paltarını geyin, dinməz-söyləməz çıx bayıra.

Həsən ağanın xırıltılı səsi Allahyarı çaşdırdı.

– Ə, sənə nə oldu?
– Mənim evim oğraşxana deyil, qurumsaq.
– Ə, təmiz danış.
– Ə, sən kimə sataşırsan?

Allahyar işin nə yerdə olduğunu sezdi. O, başa düşdü ki, Həsən ağa qızın kim olduğunu bilib. O da ciddiləşdi. Yavaşca ayağa durdu. Həsən ağa ilə üzbəüz dayandı:

– Bə o mənə sataşanda yaxşıdımı?

– Bura bax, sən mənim qonağımsan. Neçə gündü evimdə duz-çörək kəsirsən. Ona görə də sənə bir şey eləmirəm. Əl-ayağım sənə dəyməmiş, üzüsulu ikən çıx get.

– Ə, kişiliyin budur?

– Rədd ol, qurumsaq!

Allahyar gördü ki, məsələ ciddidir. Onunla danışmaq deyəsən fayda verməyəcək. O, sərt hərəkətlə yapıncısını götürüb çiyninə atdı. Alaçığın qapısına yaxınlaşdı. Nökərlərdən biri onun atını yəhərləyib gətirmişdi.

– Yaxşı eləmirsən, ay Həsən ağa, adam qonağı evindən qovmaz.

– Namərd adama mənim evimdə yer yoxdur.

– Yaxşı, qoy sən deyən olsun. Mən səni belə qorxaq bilmirdim. Cahandar ağanın adı gələn kimi özünü nə yaman itirdin?

– Allahyar, əcəl səni hərləməsin, çıx get.

– Yaxşı, gedirəm. Deynən qızı gətirsinlər.

– Nə qız?

Allahyar dabanı üstə fırlanıb fısıldadı. Həsən ağa onun nəfəsini üzündə hiss etdi.

– Qızı ver! Yoxsa, araya qan salaram.

Həsən ağanın dodaqları səyridi. Allahyarı sinəsi ilə itələyib atın böyrünə sıxışdırdı:

– Bu saat rədd ol burdan, haramzada, yoxsa dalına bülöv çaldırram!

Allahyar tüfəngini hərləmək istədi. Ancaq nökərlər onun qolunu tutub qanırdılar.

– Tez olun, əlini-ayağını bağlayıb, atın belinə sarıyın bu köpək oğlunu!

Allahyar nə qədər çapaladısa da, yaxasını qurtara bilmədi. Onu yerə yıxıb xəncərini, tüfəngini əlindən aldılar. Yapıncıya bürüyüb sarıdılar, sonra da atın belinə aşırdılar. Bir-iki şallaq çəkib cilovu buraxdılar.

Yəmən xanım səhərə qədər yatmadı. Çırağı yandırıb qızın bədəninə dolmuş tikanları çıxartdı. Onun göyərmiş yerlərinə təpitmə qoydu. Hörüyünü açıb pıtraqları təmizlədi. Gəlinin paltarlarından gətirib, Salatını geyindirdi. Ancaq qız sakit olmadı. Yəmən xanım ona nə qədər ürək-dirək verib, "bir az yat, dincəl" dedisə də, mümkün olmadı. Qız bütün gecə gözünü yummadı. Yalnız səhərə yaxın, dan yerinə səda düşəndə, Yəmən xanımın qucağında mürgülədi. Arvad onun başını ehmalca dizinin üstünə qoydu. Özü də elə beləcə, oturduğu yerdə çimir etdi...

Gün xeyli qalxdı. Uşaqlar oyanıb səhər-səhər şehli otlarda ayaqyalın qaçışmağa başladılar. Sığırçılar malları harayladılar, ancaq Salatın oyanmadı. Həsən ağa bir-iki dəfə içəri girib arvadından nə isə soruşmaq istədi. Yəmən xanım ərini geri qaytardı. Bir az da keçdi...

Binələrin üst tərəfində itlər hürüşdü. Qız diksinib ayıldı. Qorxulu-qorxulu ətrafına boylandı. Gözünün həlqəsi böyüdü. Sinəsi qalxıb-endi və birdən qışqırdı:

– Qurbanın olum, ay xala.

– Qorxma, qızım, səni heç kəsə verməyəcəyəm. Sən mənim balamsan, anan Zərnigarla uşaq vaxtı bacılıq olmuşuq.

Salatın arvadın dediklərinə o qədər də inanmadı. Ürkək baxışlarla dəyəni süzdü. Yorğan-döşəyə, kilimin üstündə oturub gülümsəyən gəlinə və nəhayət, Yəmən xanıma baxdı.

Arvad onun saçını sığalladı.

– Dur əl-üzünü yu, çay-çörək ye.

– Heç nə istəmirəm, məni evimizə çatdırın.

– Tələsmə, Həsən ağa dayın özü səni aparacaq.

Salatın arvadın mehribanlığı qarşısında susdusa da, ürəyi yenə səksəkəli qaldı.

Onun əl-üzünü yudular. Süfrə açdılar. Salatın iştahsız idi. Yediyi tikələr boğazından güclə keçirdi. O tez-tez çətənin arasından bayıra boylanırdı. Yolda gəlib-gedən olub-olmadığını bilməyə çalışırdı.

Qız birdən dik atıldı. Əlindəki çörək yerə düşdü.

– Ay xala, qardaşım gəldi.

Yəmən xanım sakitcə ayağa durdu. Salatını geri itələdi.

– Heç yana çıxma, otur burda.

Yəmən xanım alaçığın qabağında hərlənən ərinə yaxınlaşdı. Binələrin üst tərəfindəki yolda dayanan atlıları göstərdi.

– A kişi, uşaqları göndər, qoy onları çağırsınlar. Deyəsən, Cahandar ağanın adamlarıdır.

Həsən ağa çuxasını çiynindən götürüb geydi. Özü yola doğru getdi. Əl eləyib atlıları çağırdı:

– A bala, bəridən gəlin.

Onlar dəyələrə yaxınlaşdılar. Əşrəf Həsən ağanın bərabərində atdan düşdü. Əhməd də atını yedəklədi. Əşrəfin gözləri qıpqırmızı idi.

– Hara gedirsiniz?

Həsən ağa Əşrəfin dodaqlarının səyridiyini, boğazında düyünlənən yaşını geri qaytardığını sezdi.

– Cahandar ağanın oğlu hansınızsınız?
– Mənəm.
– Bə bu oğlan kimdir?
– Mənim dostumdur.
– Atan hardadır?
– Arana, biçinə gedib.
– A qırışmal, bə adam bacısını beləmi qoruyar? – Kişinin sözü Əşrəfi bərk tutdu. O heç nə deyə bilmədi. Gözünün həlqəsinə yığılan yaşı geri qaytarıb udqundu:
– Siz hardan bilirsiniz?
– Yaxşı, gəlin evə gedək. Çaydan-zaddan için, sonra danışarıq.
– Çox sağ olun, gərək gedək. Bəlkə qızı buralardan keçirəndə görüb-eləyən olub, bir şey bilmirsiniz ki?
– Bəri gəlin, tapılar.
– Sağ olun, yolçu yolda gərək.
Həsən ağa Əşrəfin ümidsizləşdiyini görüb gülümsündü.
– Bacını sənə göstərsəm nə verərsən?
Əşrəf qarşısında dayanan bu gülümsər çöhrəli kişiyə diqqətlə baxdı. Onun belə arxayın danışması Əşrəfi həm sakitləşdirdi, həm də təşvişə saldı. "Bəlkə qızı elə bunun özü qaçırdıb? İndi də məni uşaq görüb ələ salır? Ya da atamın düşmənlərindəndir, ona görə də bu işə sevinir".
Əşrəf sakitcə geri döndü. Atın yalından yapışıb yəhərə qalxmaq istədi. Həsən ağa onu saxladı:
– A bala, lap dədən kimi dəymədüşərsən, hara gedirsən?
– Dədəmi hardan tanıyırsan?
– O mənim dostumdur, oğul, atınızı bəri çəkin.
– Dostsansa kömək elə, qızı tapaq.
– Sənə dedim ki, taparıq.
Əşrəf qanrılıb səhərdən sakitcə dayanan Əhmədin üzünə baxdı. Əhməd razılıq verdi. Onlar atlarını yedəkləyib alaçığa girdilər. Nökərlər cilovu onların əlindən aldılar. Həsən ağa qonaqlarını içəri dəvət etdi. Onlar ev sahibinin sözündən çıxa bilmədilər. Döşəkcənin üstündə oturdular. Həsən ağanın gəlini, ağzında yaşmaq içəri girdi. Ortaya süfrə saldı. Çay-çörək gətirdi. Stəkanlara çay süzdükdən sonra sakitcə alaçıqdan çıxdı. Əşrəfgil təzə camış qaymağından bir-iki qaşıq götürdülər. Elə bu vaxt Yəmən xanım içəri girdi. Bir xeyli ərinin üzünə baxdı. Kişi arvadının nə demək istədiyini başa düşdü:

– Uşaqlara tapşır atları yəhərləsinlər.
– Qız özünü öldürür.
– Gətir bura.
Əşrəf dik atıldı. Həsən ağa onun qolundan tutub yanında oturtdu.
– Əyləş.
– Salatın burdadır?
– Burdadır.
– Necə olub o buraya gəlib?
Həsən ağa gülə-gülə bütün əhvalatı danışdı.
– İndi fikrin nədir? İstəyirsən, qız atan gələnə qədər bizdə qalsın?
– Yox, dədəm harda olsa özünü yetirəcək. Qızı evdə görməsə bağrı çatlayar.
– Yaxşı, çörək yeyin.
Yəmən xanım Salatının qolundan tutub alaçığa gətirdi. Qız quş kimi qanadlanıb özünü Əşrəfin üstünə saldı:
– Qurban olum, ay qağa...
Əşrəf ayağa qalxdı. Salatın qardaşının qolları arasına yıxılıb hıçqırdı.
Əhməd cibindən papiros çıxartdı. Əlləri əsə-əsə kibrit yandırdı. Otağa tüstü ilə bərabər xoş ətir qoxusu yayıldı.

## 17

Cahandar ağa bütün gecəni at belində yol gəldi. Qalın meşələrdən necə keçdiyini, köpüklü çayları nə vaxt adladığını, dolama cığırlarla bələnləri haçan aşdığını bilmədi. Qəmər arada addımlarını yavaşıdanda onu mahmızladı, atın yorulmasına fikir vermədi. Bütün yolu çaparaq gəldi. O, mənzilə yaxınlaşdıqca daha da həyəcanlanırdı. Ürəyi yumaq kimi bükülür, nəfəsi darıxırdı. Kişi qorxurdu. Yaylağa yetişən kimi binədə bədbəxt bir hadisə ilə qarşılaşa biləcəyini xəyalına gətirdikcə bədəni buz kimi soyuyur, alnına tər gəlirdi. O, evdəkilərin birinin ölümünə, mal-qaranın oğurlanmasına dözə bilərdi. Ancaq arvad-uşağın namusuna sataşılmış olsaydı... Aman Allah, sən belə bir rüsvayçılıq eləmə!!!
Cahandar ağa istəyirdi ki, lap tezdən binələr yuxudan ayılmamış özünü yaylağa yetirsin, heç kəsin gözünə görünmədən alaçığa girsin, əhvalatın nə yerdə olduğunu öyrənsin. Əgər bir bədbəxtlik üz veribsə, onun keçirdiyi iztirabları heç kəs görməsin. Camaatın gözü qabağında zərbə almaq və qovşurulub-qıvrılmaqdan dəhşətli nə ola bilərdi?

At səhərə yaxın lap yavaşıdı. Sal daşlı yoxuşu çıxandan sonra astadan kişnəyib dayandı. Cahandar ağa atın köpük içində olduğuna yalnız indi fikir verdi. Bir az belə getsə, Qəmər heç tərpənə bilməzdi.

Kişi atdan düşdü. Onun sinəsinin, paçasının tərini əli ilə sildi. Çuxasının ətəyi ilə belini quruladı, bir xeyli yedəyində gəzdirdi ki, atın təri soyusun, dağ yerinin səhər havasında soyuqlayıb qançır olmasın. Qəmər sahibinin qayğısını hiss edib oxrandı, onun əlini, sifətini iylədi. Cahandar ağa atı çəmənliyə hörüklədi, Qəmər çiçəkli göy otluqda dincini alıb otladı. Kişi isə kürəyini qayaya söykəyib papiros eşdi...

Dağların döşünə duman çökmüşdü. Meşələr elə bil nazik, ağ tülə bürünmüşdü. Qayalar çiskin içində idi. Yollar sürüşkənləşmişdi. İki addımlıqdakı cığırı seçmək olmurdu. Qəmər ehtiyatla addımlayır, həmişə yolun dib tərəfi ilə gedirdi. O hiss edirdi ki, alt tərəf sıldırımdır, dərənin dibi ilə qıjıltılı çay axır. Sualtı daşlar bir-birinə dəyib uğuldayır. Əgər addımını düz atmayıb sürüşsə, bir balaca büdrəsə, gurultu ilə sıldırım aşağı yuvarlanıb parça-parça olacaqdır. Cahandar ağa isə heç nə görmür, heç nə eşitmirdi. Atın cilovunu da buraxmışdı.

Qəmər sürüşkən sal daşlı cığırı şaqqıldada-şaqqıldada xeyli irəlilədi, qayanı burulub dikdirə çıxdı. Dumanın seyrəldiyini görüb kişnədi. Cahandar ağa cilovu yığışdırdı. At, sahibinin fikrini başa düşdü. Yorğa yerişə keçdi və bir göz qırpımında qarşıdakı gədiyi aşdı.

Cahandar ağa binələri, dəyələrin qabağında qaçanları, xalxaldakı dana-buzovu, inək sağan arvadları aydınca gördü. Gün xeyli qalxmışdı. Hər yerə şeh çilənmişdi. Uşaqlar ayaqyalın qaçışırdılar.

Qəmər mənzilə çatdığını hiss edib sevindi. Sahibinin işarəsini gözləmədən, çaparaq, binələrə doğru endi. Cahandar ağa gözünü alaçıqdan çəkmədi. O hələ yolda ikən gözəyarı hər şeyi öyrənmək, evində nələr baş verdiyini bilmək istəyirdi. Birdən ürəyi dəhşətlə çırpındı, kişi nə qədər çalışdısa da, sinəsi dolu nəfəs ala bilmədi, gözünü alaçığın qabağındakı yəhərli atlardan çəkmədi...

Nökərlər onun qabağına yüyürdülər, üzəngini basdılar, atın yüyənini əlindən aldılar. Kişi hirsindən və yuxusuzluqdan qan çanağına dönmüş gözlərini onlara zillədi:

– Bu atlar kimindir?

– Həsən ağa bizə gəlib.

Kişinin qaşları dartıldı. Ömründə ilk dəfə adəti pozub qonağın nə üçün gəldiyini soruşdu:

– Xeyirdimi?

– Xeyir olmayanda nə var, ağa!

Cahandar ağa susdu. Ətrafdakıları sınayıcı nəzərlərlə bir də süzdü. Evdə nələr baş verdiyini onların sifətindən öyrənmək istədi. Həyəcanlı bir şey sezməyib azacıq sakitləşdi. Ağır addımlarla alaçığa getdi.

Əşrəf dik atıldı. Oturanlar yerlərindən qalxdılar.

Həsən ağa gülə-gülə Cahandar ağa ilə görüşdü:

– Arançı qardaş, xoş gördük, oralarda nə var, nə yox?

– Xoş günün olsun. Nə əcəb bizi yada salıbsan?

– Binələrin yanından ötürdüm, yadıma düşdün.

Onlar yanaşı oturdular. Cahandar ağa gözaltı Həsən ağanı süzdü, Əşrəfin üzünə baxdı. Sakitlik idi. Kişi süfrəyə nəzər saldı. Ortada bir şey yox idi. Oğlunu məzəmmətlə süzüb başını buladı:

– A bala, niyə durubsunuz?

Onun nə demək istədiyini başa düşdülər. Dərhal alaçığın qabağında ocaq qaladılar, heyvan kəsdilər. Azacıq sonra kabab iyi ətrafa yayıldı...

Həsən ağa ertəsi günü evinə getdi. Cahandar ağa qonağını yola saldıqdan sonra Mələyi yanına çağırdı. Arvad qorxu içində onun qarşısında dayandı. Cahandar ağa baxışlarını onun sifətində, sinəsində gəzdirdi. Mələyin boyun damarlarının necə vurduğu, qulağındakı sırğaların necə titrədiyi aydın görünürdü. Arvadın ürək döyüntüsündən qabaq sinəsi də ehtizaza gəlmişdi.

– Nə olmuşdu?

– Qızı qaçırmaq istəyirdilər, saldırdıq.

– Kim saldırdı?

– Uşaqlar, bir də Həsən ağa.

– Düzünü de!

– Düzü budur.

Mələk artıq birinci səddi aşdığını duydu, əvvəlki qorxaqlığı bir az azaldı və ərinə şax baxdı. Cahandar ağanın qan sağılmış gözləri də arvadına zilləndi. O az qala baxışları ilə Mələyin beynini burğu kimi burub içəri girmək, sinəsindən ürəyinə keçmək və onun dedikləri ilə düşündüklərinin nə qədər eyni olduğunu bilmək istəyirdi.

– Qız hardadır?

– Əşrəfin dəyəsində.

– Çağır bura.

– Dəlilik eləməyəcəksən ki?

– Tez ol.

Mələk ayağını sürüyə-sürüyə alaçıqdan çıxdı.

Cahandar ağanı birdən-birə titrətmə götürdü. Kişi nə qədər çalışdısa da, əllərinin, çənəsinin əsməsini dayandıra bilmədi. Sanki onu şaxtalı, boranlı qış günündə buzlu suya saldılar. Bir neçə saniyə nəfəsini çəkə bilmədi. Alnından qalxan sızıltı beynini dolanıb boynunun dalına keçdi. Onun qaramtıl çöhrəsi avazıdı, sonra boğulub qaraldı.

Salatın səssizcə, kölgə kimi gəlib içəri keçdi. Atasının önündə dayandı. Kəlağayısını irəli çəkdi, başını köksünə endirib susdu. Kişi gözünü qızına zilləsə də, onun sifətini aydın seçə bilmədi. Ona elə gəldi ki, günəş qaralıb, ətrafı zülmət bürüyüb.

Keçənin deşiklərindən, çətənin arasından içəri işıq süzülüb düşmüşdü. Həmin işıqlar yerə döşənmiş palazı zolaq-zolaq etmişdi. Elə bil şəffaf, iti bir qılınc alaçığın havasını ortadan parçalamışdı. Salatın o üzdə, atası isə bəri tərəfdə, qaranlıq bir aləmdə qalmışdı. Aranı odlu bir qılınc kəsmişdi.

Keçədən süzülən zolaqlardan biri Salatının çiynindən sallanıb, düz ayağının üstünə düşmüşdü. Cahandar ağa baxışlarını məhz buraya, qızın ayağına zilləmişdi.

Salatın ayaqyalın idi. Günəş şüası onun ayağını daha da şəffaflandırmışdı. Onun ağ dərisi, göy damarları cızılıb qızarmış topuğu aydınca görünürdü. Cahandar ağaya elə gəldi ki, şəffaf işıqda qızının ayaq sümükləri, damarlarında axan qanı belə seçilir. İşıq zolağı hər şeyi aydınlaşdırır, güzgü kimi göstərir. Kişi həmin zolağın yuxarı qalxdığını, qızın baldırı, budu boyunca yüksəlib sinəsinə, üzünə düşdüyünü anladı. Baxışlarını həmin zolaq boyu yuxarı qaldırmaq, Salatını izləmək, onun bütün əzalarını işıqdan keçirmək və nəhayət, gözlərinin içinə baxmaq istədi. Lakin qorxdu. Kişiyə elə gəldi ki, həmin işıqda qızına vurulmuş ləkəni dərhal görəcək, onun tapdalanmış isməti aşkara çıxacaqdır.

Elə bil birdən şimşək çaxdı. Odlu qılınclar hərəkətə gəlib çarpazlaşdı, alaçığın divarlarını doğradı, yer ləngərləndi. Cahandar ağanın gözlərində od parıldadı. O səndirləyib dəyənin çubuğundan yapışdı.

– Sənə nə oldu, ata?!

Salatının yaşdan boğulmuş titrək səsi onun qulaqlarında cingildədi. Beynindəki güyültü azaldı. Gözünün qabağında oynayan işıq dairəciklər çəkildi. Kişi özünü tarazlayıb qızına baxdı. Salatın diz çökmüşdü. Kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Yanağında iki zolaq parıldayırdı.

– Sənə əl dəyibmi?
– Ata!!!
– Cavab ver!
Salatın ağzı üstə döşəndi. Əlləri ilə üzünü qapayıb hıçqırdı:
– Mən ləkəsizəm.
– Yalan deyirsən.
– And içirəm.
– İnanmıram.
Salatın başını qaldırıb atasının üzünə baxdı. Onun gözü, dibindən quruyan bulaq kimi şəffaflığını itirdi. Bəbəkləri genişlənib hərəkətsiz qaldı.
Cahandar ağa qızının titrəyən sinəsinə baxdı. Yavaş-yavaş xəncəri siyirdi.
Elə bu vaxt qulağına səs gəldi: "Qurbanın olum, ay qardaş, nə yaman insafsızsanmış. Sənə demədimmi Salatın gül parçası kimi tərtəmizdir, ondan nə istəyirsən? Yoxsa onu da günahsız yerə mənim kimi bədbəxt eləmək fikrindəsən?" Şahnigar onun gözü önündə dayandı. Şüşə kimi soyuq gözlərini qardaşının üzünə zilləyib narazılıqla başını buladı.
Alaçığı heybətli bir səs götürdü:
– Rədd olun, ikiniz də itilin gözümdən!!!
Salatın dik atıldı. Dəhşətlə atasının üzünə baxdı. Onun ayaqlarını qucaqlayıb, üzünü çəkmələrinə sürtdü.
– Qurbanın olum, ay dədə, sənə nə oldu?
...Cahandar ağa iki gün alaçıqdan çıxmadı. Titrətmə və qızdırma içində ağzı üstə yatdı. Üçüncü gün durub paltarını geyindi. Mələk samovarı içəri gətirdi. Süfrə saldı, özü də kişinin dizinin yanında oturdu. Çay süzdü. Gülə-gülə ərindən soruşdu:
– Nə təhərsən, əyə?
Cahandar ağa gözünü hərləyib tərs-tərs Mələyə baxdı:
– Nə olub ki?
– Kefini soruşmaq olmaz?
Mələk isti çörəyi, təzə pörtlədilmiş quzu ətini irəli, ərinin qabağına çəkdi.
– Ye, özüm təzəcə bişirmişəm.
Cahandar ağa çörək götürdü. Bozartmanın üstünə sarımsaqlı qatıq tökdü. Əlini cama uzatmazdan əvvəl dirsəyi ilə Mələyin böyrünə toxundu:
– Sən də ye.

Mələk sevindi, ancaq süfrəyə əl uzatmadı:

– Sən ye, mən sonra yeyərəm.

Kişi əvvəlcə könülsüz, sonra isə iştahla yeməyə başladı. Mələk əli çənəsində, ərinin çörək yeməsinə tamaşa etdi. Bunu Cahandar ağa sezdi:

– Gözünü niyə zilləyibsən?

– Heç... Əşrəf səni görmək istəyir.

– Nə olub?

– Getmək istəyir. Deyir oxumağın vaxtıdır.

Cahandar ağa dinmədi. O, uzaq və üzücü səfərdən qayıtmış kimi özünü çox yorğun hiss edirdi.

Xörəyi yedi. Camı geri itələdi. Döşəkcəyə uzanıb dirsəkləndi. Çay içə-içə oğlunu düşündü. "Deyəsən, zəndimi itirəcək. Elə oxumağın quyruğundan yapışıb, buraxmaq istəmir. Ata-ana vecinə deyil".

Cahandar ağa istəyirdi ki, oğlu onu belə yorğun və əzgin görməsin. O özünün mənən sarsıldığını, köməksiz bir adam kimi acizləşmək üzrə olduğunu heç kəsə bildirmək istəmirdi. Oğlunun qabağında atanın sınması əlçatmaz bir yüksəklikdən enməkdən də dəhşətli idi.

– Nə vaxt gedir?

– Sabah yola düşmək istəyirlər. Əhməd də gedir. Uşaqları da aparırlar.

Ertəsi gün araba qoşdular. Bütün binə gedənləri yola saldı. Cahandar ağa onları tək buraxmadı. Beş-altı silahlı adam qoşdu. Ancaq özü dəyədən çıxmadı. Çətənin arasından Əşrəfin anası ilə, qardaşı Şamxalla və bütün qohumları ilə necə görüşdüyünə baxdı. Onlar gözdən itincəyə qədər gözünü çətənin arasından çəkmədi.

## 18

Cahandar ağa səhər tezdən atın örüyünü dəyişdirmək üçün dəyədən çıxdı. Tüfəngini əlinə alıb, binələrin aşağı tərəfindəki çəmənliyə getdi. Çisəkləyirdi. Hər yeri duman bürümüşdü. Beş-on addımlıqdakı qaraltılar güclə seçilirdi. Otlar yuyulub sürüşkənləşmişdi. Havanın soyuqluğunu adam nəfəs aldıqca ciyərlərində hiss edirdi. Dəyələrin ətrafında dolaşan itlər tənbəl-tənbəl hürürdü, xalxaldakı dana-buzov mələşirdi. Binə mürgüləyirdi.

Cahandar ağa səksəkəli idi. Axşam, əl-ayaq yığışdırılandan sonra itlərin arasına çaxnaşma düşmüşdü. Sığırçılar kimi isə qıya basmış-

dılar. İtlər binələrin üstündəki yola qədər getmişdi. Nökərlər hər yeri, arxacı, xalxalı dönə-dönə yoxlamış, atın örüyünü dəyişmiş, hər şeyin yerində olduğunu söyləmişdilər. "Yəqin yol adamları imiş", – deyə kişini sakit etmişdilər.

Cahandar ağanın çiynindəki yapıncı nəmləndi. Xırdaca çiskin üzünə qondu. Papağını, qaşını, bığını və saqqalını qırov kimi bürüdü. Uzaqdan Qəmərin qaraltısı göründü. At bir yerdə dayanmışdı. Həmişə Cahandar ağanın ayaq tappıltısını eşidəndə bərkdən kişnəyərdi. İrəşməni dartıb ora-bura qaçar, sonra da dal ayağı üstündə şahə qalxıb dayanardı. Ancaq bu dəfə tərpənmədi. Cahandar ağa ona yaxınlaşanda könülsüzcəsinə oxrandı. Kişi təəccüb etdi. Qəmər boynunu bükmüşdü, yazıq-yazıq sahibinin üzünə baxırdı.

Cahandar ağa mıxçanı yerdən çıxartdı. İrəşməni yığdı və atın yanına gəldi. Onun belini sığalladı. Tüklərində gizlənib muncuq kimi yumrulanan damlaları sildi. Nədənsə lap fağırlayıb süst düşən atın boynunu qucaqlayıb üzündən öpdü. Onun gözlərinə baxdı. "Sənə nə olub, Qəmər", – deyə pıçıldadı. At başını azacıq tərpədib qabaq ayağı ilə yeri eşdi. Cahandar ağa ürəyində özünü danladı: "Gərək atı axşamdan çullatdıraydım. Belə havada erkək atı tez soyuq alır, yəqin ki, qançır olub, – deyə xəyalından keçirdi. – Bəlkə də ağnayıb qabırğasını-zadı sındırıb".

O, atın ətrafına dolandı, dal tərəfə keçdi və daş kimi donub yerində qaldı. Kişinin başına elə bil ağır zərbə endirdilər. Gözlərini qırpmadan təəccüb, heyrət və dəhşətlə ata baxdı. Əlini onun belində, boynunda gəzdirdi. Elə bil əlinin altında soyuq bir ilan tərpəndi. Kişi diksinib geri çəkildi. Bədənini üşütmə götürdü. Bir xeyli gözlərinə inanmadı. Sərxoş kimi iki-üç dəfə atın dövrəsinə fırlandı. Əlini bir də atın yalına çəkdi. Cod və biz-biz tüklər onun ovcunu daladı.

Hər şey aydın idi. Atın yalını, quyruğunu qırxmışdılar. Onlar bir daha sataşmışdılar, onu təhqir etmişdilər, onun qüruruna toxunmuşdular. Kişinin namusu üç şeydir: at, arvad, bir də papaq. Bunlara toxunmaq, onun namusunu ayaq altına atıb tapdalamaq demək idi. Onu diri gözlü qəbrə soxmaq, sinəsinə çal-çarpaz dağ çəkmək idi. İndi o buna necə dözəcəkdi? Maral vuruldu, birtəhər susdu. Qızı Salatını götürüb qaçmaq istədilər, indi də bu. Bu atı ortaya çıxarmaq olardımı? Onun yalının, quyruğunun qırxıldığını bir adama demək olardımı? Camaat bunu bilsə, Cahandar ağa sussa, onu ələ salmazdılarmı? O, başına papaq qoyub mərəkəyə çıxa bilərdimi?

Kişi lap sarsıldı. Hiss etdi ki, hətta bacısının ölümü belə ona bu qədər ağır gəlməmişdi. Arvadı Zərnigarın, oğlu Şamxalın küsüb getməsi də onu bu qədər yandırmamışdı. Cahandar ağaya elə gəldi ki, ürəyi partlayır. Kişi hövlündən nəfəs belə ala bilmirdi.

O dönüb Qəməri bir də təpədən-dırnağa süzdü. Hava azacıq işıqlaşdığından, duman seyrəldiyindən, at indi daha aydın görünürdü. Bu vəziyyətdə o, quyruğu, qanadı yolunub lüməklənmiş bir quşa oxşayırdı. Atın əvvəlki şahanə vüqarı yox olmuşdu. İpək, qız teli kimi sürüşüb boynuna tökülən yalı dibindən qırxıldığından, tüklərin dibi dərz dalı kimi biz-biz dayanmışdı. Atın dal tərəfinə baxmaq mümkün deyildi. Qırğı təkin cəld, tərlan kimi vüqarlı, sığallı gəlin kimi yaraşıqlı olan Qəmər indi ağlar günə qalmışdı. Elə bil at özü də bunu duyurdu. Onu kim bu hala salmışdı? Ona kim əl qaldırmışdı? Bəs harda yatmışdıq, bunu niyə bilməmişik? Niyə vaxtında xəbər tutmamışıq?!

Cahandar ağa tüfəngini çiyninə keçirdi. İkiəlli atın belindən yapışdı. Başını Qəmərin böyrünə söykədi. Sifətini yumşaq tüklərə sürtdü. O fırlandı, çevrildi, gah o üzünü, gah bu üzünü, başını atın böyrünə çırpdı. Başını gizlətmək istəyirmiş kimi atın qarnının altına əydi. Ayağının altındakı nəm torpaq eşim-eşim oldu. Göy otlar kökündən çıxıb əzildi. At isə tərpənmədi. Boynunu büküb sahibinə baxdı, nəfəsi ilə onun sifətini isitdi. Sakitcə oxrandı. Elə bil at Cahandar ağanın ürəyindən keçənləri duyur, onun dərdinə şərik olmaq istəyirdi.

Kişi bir xeyli beləcə çapaladı. Sonra əlini yaxasına apardı. Çuxanın qaytanları, düymələri qırıq-qırıq oldu. Çarpazlardan biri onun dırnağına keçdi, sədəf dibindən düşdü. O bunu hiss etmədi. Sudan kənara atılmış balıq kimi ağzını açıb tövşüdü. Burun pərələri genişləndi, sinəsi qalxıb-endi, köks qəfəsi az qaldı partlasın. Qan sağılmış gözünün həlqəsi qızardı. Ona elə gəldi ki, bu saat, elə buradaca ürəyi partlayacaq, atın dırnağının altına düşəcək. Bəlkə bu daha yaxşı idi? Bu cür təhqirlərə dözməkdənsə ölüm münasib idi?!

Hava işıqlaşırdı. Binələri bürüyən çiskin yerə yatıb seyrəlir, dərə aşağı sürünüb gedirdi. Qayalar, iri palıd ağacları, güneydəki çəmənlər üzündəki örtüyü atırdı. Ağacların yarpaqları, çəmənliklərin otu şehə batdığından, günəşin ilk şüalarını əks etdirib parıldayırdı. Dəyələrin ətrafındakı səs-küy çoxalırdı. Arvadlar inək sağır, sığırçılar dana-buzov qovurdu. Bir azdan hər şey aydınlaşacaqdı. Duman tamam çəkilirdi.

Cahandar ağa xeyli, ata baxa-baxa, sal qaya kimi sükut içində, heç nə anlamadan, heç nə düşünmədən dayandı. Kişi keyimişdi. Necə hə-

rəkət edəcəyini bilmirdi. O hər şeyi – qorxunu, ehtiyatı unutmuşdu. Bu saat qayaların arasında adam gizlənə biləcəyini, elə bu fürsətdən istifadə edərək onu öldürə biləcəyini belə unutmuşdu. O ancaq bircə şeyi, bu vəziyyətdən necə çıxmağı fikirləşirdi. O bircə şeyi qət etmişdi ki, atın yalının və quyruğunun qırxıldığını kənddə, hətta evdə də heç kəs bilməməlidir, bu bir sirr olaraq qalmalıdır. Bəs bu boyda atı necə gizlətmək olar? Bir azdan bütün binədəkilər buralarda dolaşacaqdı. Bir adam bu işdən xəbər tutsa, kifayət idi. Bəlkə atı gizlincə arana göndərsin? Onda da deməzdilərmi bunun səbəbi nədir? Bir də, bu boyda atı yolda görən olmayacaqdımı? Elə onu kəndə aparan nökərin özünün bu işi bilməsi rüsvayçılıq deyildimi? ` Cahandar ağa dodaqlarını kip qapayıb, dişlərini bir-birinə sıxdı. Onun alnını, bədənini soyuq tər basdı. Sakitcə irəşməni yığdı. Asta addımlarla cığırla dərəyə endi. O dönüb geri baxdı. Çiskin yox olmuşdu. Qarşıdakı dağın sinəsi işıldayır, binənin üstünə çökən duman geri çəkilirdi.

Cahandar ağa tələsdi. Lap aşağı, dumanın hələ çəkilmədiyi, əksinə daha da qatılaşdığı yerə enməyi qərara aldı. O heç kəsin gözünə görünməmək, heç kəsə rast gəlməmək üçün dumanın altı ilə getməyə və binələrdən uzaqlaşmağa çalışdı. İndi o bir az toxtamışdı.

Cahandar ağa dərəyə endi. Oradan da cığırla qarşıdakı qayanın üstünə qalxdı. Uçurumun kənarına qədər gəldi. Lap aşağıda çay axırdı. Köpüklü suların qıjıltısı qayalara düşüb, əks-səda verirdi. Çayın o üzü də sıldırımlıq idi. Qayaların üstünü mamır basmışdı. Daşların arasından təkəm-seyrək ağac çıxmışdı. Çayın vadisini uğultu bürümüşdü. Hirsli sular iri, qara, yuvarlaq daşları yumalaya-yumalaya gətirdikcə, bir-birinə toxunub şaqqıldayırdı.

Kişi köksünü ötürüb atın irəşməsini yerə atdı. Qutusunu çıxardıb tələsmədən, fikirli-fikirli papiros eşdi. Qəmər sakitləşib otlamağa başladı. Cahandar ağa tüfəngini dizinin üstünə qoyub donmuşdu. Tüstüduman içində ata baxdı. “İndi mən nə edim, Qəmər? Axı, sən mənim sirdaşım, dar günümdə harayçım idin. Sən məni çox dardan çıxartmısan. Sən mənim ürəyimdən keçənləri balaca bir işarədən başa düşürdün. Sən quşdan ayıq və ehtiyatlı bir atsan, Qəmər. Çox qaranlıq gecələrdə, məndən qabaq, yolda təhlükə olduğunu sən başa düşübsən. Qulağını yapıxdırıb sakitcə dayanmısan və məni başa salmısan ki, irəli getmək olmaz. Məndən qabaq özün yolu dəyişmisən, Qəmər. Bir toyda, bir nişanda geri qalmamısan, hələ indiyəcən cıdırlarda səni keçən olmayıb. Məni utandırmamısan, başımı uca eləmisən. Neçə dəfə mən sənin

yalına yatıb, “gözlərinə qurban, Qəmər, əlac sənə qalıb” demişəm. Sən quş kimi qanad açıb məni güllənin altından çıxartmısan. Mən səni özümə qardaş, sirdaş bilirdim, Qəmər, sən kişnəyəndə ürəyim dağa dönürdü. Şahə qalxıb fırlananda elə bilirdim yeri, göyü mənə bağışlayırlar. Qəmər, indi mən nə edim, sənin rüsvayçılığına necə dözüm?”

Kişi papirosunu dalbadal sümürdü. Acgözlüklə tüstünü ciyərlərinə çəkdi. Kötüyü atıb ayağa durdu. Ata yaxınlaşdı. Onun yalını, belini sığalladı. Cibindən iri bir dəsmal çıxardıb Qəmərin bədənini sildi, hər yerini tərtəmiz quruladı. Qulağının dibini qaşıdı, atın başını sinəsinə sıxdı. At bu nəvazişi hiss etdi. Sahibinin qucağında xumarlandı. Cahandar ağanın gözü Qəmərin gözlərinə sataşdı. Bu iri gözlərdə olduqca mülayim və mehriban bir baxış var idi. Elə bil bu dilsiz heyvan lal baxışları ilə onu sakitləşdirmək istəyirdi, sahibinə demək istəyirdi ki, mən də ləkəli, gözükölgəli yaşamaq istəmirəm. Mən yaşayanda da, öləndə də mərd olmaq istəyirəm.

Günəşin işığı aşağılara endi. Dərələrə çökən qatı kölgə dağların döşü ilə yuxarı qalxdı. Cahandar ağanın dayandığı yer birdən-birə günəşin nuruna qərq oldu. Otlar parıldadı. Şehlər göz qamaşdırdı. Kişi atın başını yuxarı qaldırdı. Onun gözlərinə baxdı. İri, həbəşi dodaqlarını atın sifətinə yaxınlaşdırdı. Qəmərin gözlərindən öpdü. Boynundakı ipi açdı. Ehmalca qayanın kənarına doğru hayladı.

Qəmər ayaq saxladı. Ceyran kimi boynunu dik tutub boylandı. Onun gözü elə bil yaşardı. Burun pərələri genişləndi.

Cahandar ağa çaxmağı hərləyib tüfəngi üzünə qaldırdı. Qəmərin alnındakı qaşqanı nişan aldı. Onun yaşla dolmuş və torlanmış gözü atı güclə seçdi. Tətiyi çəkdi.

Qəmər dal ayağı üstə şahə qalxdı. Bir xeyli beləcə dayandı. Cahandar ağaya elə gəldi ki, at yerindən tərpənməyəcək, elə beləcə, dal ayaqlarının üstə daşa dönüb qayanın üstündə qalacaqdır. Ancaq Qəmər birdən müvazinətini itirdi. Onun qabaq ayaqları havada oynadı, arxası üstə çevrildi və birbaş sıldırım aşağı yuvarlandı. At bərkdən kişnədi. Onun səsi dərəyə yayıldı. Qayalar səs-səsə verib şaqqıldadı, bütün ağaclar, sıldırımlar bir-birini harayladı, dərəni ümumi bir uğultu bürüdü. Bu uğultu yaxındakı dağların döşündə əks-səda verib xeyli uzaqlara yayıldı. Elə bil dərədəki köpüklü dağ çayı nəfəsini içəri çəkib susdu.

Cahandar ağa tüfəngini yanına saldı. Sıldırımın qaşında daş kimi dayandı. Uğuldayan dərəyə, qıjıltı ilə axan köpüklü sulara baxdı.

## DÖRDÜNCÜ HİSSƏ

### 1

Axşam qaranlığı qatı bir kölgə kimi Qorinin üzərinə çökmüşdü. Yarımca saat bundan əvvəl zirvəsində günəşin son sarılıqlarını əks etdirən dağlar boyun-boyuna verib mürgüləyirdi. Buranın təbiəti şimala bənzəmirdi, nə bəyaz gecələr, nə də uzun sürən yay axşamları var idi. Birdən-birə zil qaranlıq çökür, birdən-birə də dan yerində şəfəqlər oynaşırdı.

Semyonov artıq bunlara vərdiş etmişdi. Əvvəllər Peterburqun bəyaz gecələrinə vurğun olan Dmitri Dmitriyeviç indi də cənub axşamlarına məftunluq göstərirdi. O hər axşam pəncərə qabağında dayanıb qüruba tamaşa etməyi sevirdi. Bu gün də adəti üzrə, həmişəki yerində durub üfüqlərə baxırdı, bağ-bağat içində itən Qorinin kiçik daxmalarında yanan çıraqlar qaranlıqda parıldayan yarpız qurdları kimi işıldayırdı.

Semyonov əllərini sinəsində çarpazlayıb şəhərin kənarında Kürlə qucaqlaşan Liaxva çayının qıjıltısına qulaq asırdı. Pəncərədən içəri dolan xəfif külək onun ağarmaqda olan saçını oynadır, çənəsinin aşağısında haçalanmış topa saqqalının yumşaq tükləri arasında dolanırdı. O tərəfdə, dağların ətəyində yerləşən balaca dəmiryolu vağzalının solğun işıqları görünürdü. Qatarlar ötdükcə təkərlər yeknəsəqliklə taqqıldayır, parovozlar kəsik-kəsik fit verirdi.

Qapı döyüldü. Olqa Konstantinovna əlindəki tikişi kənara qoyub, asta addımlarla dəhlizə yaxınlaşdı. Qapını açarkən Aleksey Osipoviçlə qarşılaşdı. Boynunu azacıq yana əyib, qonağı içəri dəvət etdi:

– Buyurun, Aleksey Osipoviç, xoş gəlmisiniz.

Qonaq şlyapasını çıxardıb Olqa Konstantinovnanın əlindən öpdü. Ev sahibəsi qırçınlı uzun donunun yanından yapışıb, ətəyini azca yuxarı qaldırdı və Aleksey Osipoviçə yol göstərdi. Onlar içəri keçdilər. Dmitri Dmitriyeviç fikrə getdiyindən, evin ortasında dayanın Aleksey Osipoviçin gəlişindən xəbər tutmadı. O isə dinmədi. Direktorun geri dönməsini gözlədi. Ancaq Olqa Konstantinovna ayaqlarının ucunda ərinə yaxınlaşıb, ehmalca onun çiyninə toxundu:

– Dmitri, gör kim gəlib!

Semyonov qanrılıb geri baxdı və hər cür rəsmiyyəti unudaraq, qollarını açıb dostunu qucaqladı:

– Aleksey Osipoviç, xoş gəlmisiniz, Sizi görməyimə çox şadam.

Onlar evin küncündəki yazı masasının yanına getdilər. Dmitri Dmitriyeviç öz yerində əyləşdi və qonağa kürsüdə oturmağı təklif etdi. Bir xeyli susdular. Aleksey Osipoviç cibindən dəsmal çıxardıb bığını səliqəyə saldı. Ev sahibi şamdanı qabağa çəkdi. Şamın altısını da yandırdı və dostunun üzünə baxdı:

– Söyləyin görək, nə var, nə yox? Səfəriniz necə keçdi?

Aleksey Osipoviç ona cavab vermək istəyirdi ki, qonşu otağın qapısı açıldı. Olqa Konstantinovna yerindən durana qədər balaca Lida qonağın böyründə dayandı. Yüngülcə təzim etdi:

– Xoş gördük, cənab inspektol.

Aleksey Osipoviç dərhal yerindən qalxdı. Ayaqlarını cütləyib balaca Lidanın önündə dayandı:

– Xoş gördük, Lida Dmitriyevna, necəsiniz?

– Diqqətinizə gölə minnətdalam.

Aleksey Osipoviç aşağı əyilib Lidanın balaca, zərif əlindən öpdü. Lida daha da nazlandı:

– Mənə nağıl söyləməyə gəlmisiniz?

– İstəsəniz söylərəm.

– Özü də gələk təzəsi olsun.

– Lap təzəsini söylərəm.

– Amma əjdaha olmasın, mən ondan qolxulam...

– Yox, qorxma, – Aleksey Osipoviç qızın önündə sallağı oturdu. Onun saçını sığallayıb, əllərini dönə-dönə öpdü. – Mən sənə çoxlu, məzəli və şirin nağıllar danışacam.

Semyonov dostunun Lida ilə oynayarkən dəfələrlə gözünün yaşardığını və sezilmədən dəsmalla onu quruladığını görmüşdü. O başa düşürdü ki, dostu övladsızlıq dərdi çəkir. Onun bu halı Semyonovu qəhərləndirdi.

Olqa Konstantinovna Aleksey Osipoviçlə ərinin vacib işi olduğunu bildiyindən, Lidanın yanına gəldi:

– Qızım, indi gecdir, gedək yataq, nağıla başqa vaxt qulaq asarsan.

Lida qaşqabağını salladı. Altdan-yuxarı anasının üzünə baxdı və yerində silkələndi:

– Yuxum gəlmil.

– Adam anasının sözünə baxar. İndi get yat. Havaxt istəsən gəlib sənə nağıl danışaram.

– Allatmılsınız ki?

– Mən sizə heç yalan demişəm?

– Yaxşı, ancaq gözləyəcəm.

Lida anasının əlindən yapışıb, o biri otağa doğru getdi. Qapının yanında dayandı. Geri dönüb əl elədi:

– Gecəniz xeylə qalsın.

– Yuxun şirin olsun, qızım.

Lida qapını örtüb getdikdən sonra Aleksey Osipoviç bir xeyli evin ortasında dayanıb uşağın dalınca baxdı. Adəti üzrə dəsmalını çıxardıb bığını sığalladı. Sonra keçib əvvəlki yerində əyləşdi.

– Söyləyin görək haralarda oldunuz?

– Dərbənddən başlayıb İrəvana qədər gəzdim.

– O, qardaş, bütün Qafqazı dolaşmısan ki?

– Elədir, Dmitri Dmitriyeviç, üç min beş yüz verst yol getmişəm.

– Çoxunu da piyada?

– Piyada getdiyim yerlər də oldu. Ancaq ən çox atla, furqonla gəzirdim. Vəziyyət çox ağırdır. Qəzaların əksəriyyətində məktəb açılmayıb, açılanlarda da oxuyan yoxdur. Bir təsəvvür edin, İrəvan quberniyasında yüz yetmiş min müsəlman yaşayır, ancaq onlardan seminariyaya oxumağa bircə nəfər də gəlmək istəmədi.

– Bəs Bakı quberniyası necə?

– Yalnız bircə şagird razılıq vermişdi, onu da atası buraxmadı. Şamaxıda da vəziyyət pis oldu. Qəza rəisi mənimlə getmişdi. Camaat onu görən kimi uşaqlarını oxumağa göndərməkdən qəti boyun qaçırdı. Nədənsə müsəlmanlar bizə etibar eləmirlər. Xüsusən də pristavları, naçalnikləri görəndə yaxına gəlmək istəmirlər.

– Onlarda taqsır yoxdur. Aleksey Osipoviç, pristavlar kəndə gələndə ya adam döyürlər, ya da tutub Sibirə yollayırlar. Camaatın gözü qorxub. Yoxsa heç kəs xeyrindən qaçmaz.

– Müsəlman ruhanilərinin böyük bir qismi də yeni açılan məktəblərə qarşı çox amansızdır.

– Bəs rəsmi idarələr Sizə kömək etmədi? Qafqaz valisi onlara göstəriş vermişdi.

– Eləyənlər də oldu. General Roslavlov mənim Naxçıvana getmək istədiyimi bildikdə qəza rəisinə tapşırdı ki, özü şəxsən məni müşayiət etsin və general Kəbləxanla görüşdürsün. Kəbləxan çox nüfuzlu adamdır, mənə xeyli xeyri dəydi. Zənnimcə, camaat arasında nüfuzu olan adamlardan istifadə etmək lazımdır.

– Mütləq! – Dmitri Dmitriyeviç fikirli-fikirli dilləndi. Aleksey Osipoviç sözünə davam etdi:

– Cəmi otuz şagird seçə bilmişəm. Naxçıvandan üç nəfər gələcək. Şuşa rus-tatar məktəbində səksən nəfər oxuyur, onlardan on üç nəfəri bizim məktəbə daxil olmaq üçün ərizə yazıb. Şəkidən iki, Gəncədən beş, Dərbənddən üç uşağın gəlməsi yəqindir. Qazaxdan da dörd-beş nəfər gələsidir. Görək sözlərinin üstündə duracaqlarmı?

– Demək, uşaqların hamısı gəlsə, müsəlman şöbəsinin nəzdində hazırlıq qrupları da aça biləcəyik. Bu lap yaxşı oldu. Aleksey Osipoviç, seminaristlər təcrübə dərslərini orada keçərlər, sonra da həmin uşaqların özləri seminariyada oxuyarlar. Tərtib etdiyiniz proqram layihəsini də nəzərdən keçirdim. Xoşuma gəldi. Pedaqoji şurada təsdiq edərik. Ancaq məni başqa bir məsələ düşündürür.

– O nədir, Dmitri Dmitriyeviç?

– Dərslik. De görüm müsəlmanların öz ana dillərində dərslikləri varmı? – O, ayağa durdu. Həmişə fikirli olanda etdiyi kimi otaqda gəzindi. – İbtidai təhsil üçün dərslik vacib məsələdir. Bunu Siz məndən yaxşı bilirsiniz.

– Yoxdur. Mollaxanalarda ancaq Quran əzbərlədirlər, bir də Sədinin didaktik “Gülüstan”ını öyrədirlər. Vəssalam. – Aleksey Osipoviç ayağa durmaq istədi. Ancaq Dmitri Dmitriyeviç onun çiynindən basıb qalxmağa qoymadı.

– Bax, bu barədə düşünmək lazımdır.

– Dmitri Dmitriyeviç, – deyə Aleksey Osipoviç astadan dilləndi.

– Cəsarətimə görə üzr istəyirəm, mən balaca bir dərslik tərtib etmişəm. Ancaq müzakirəyə verməyə ürəyim gəlmir. Bilirsinizmi, ilk təşəbbüsdür, qorxuram müvəffəq olmayam.

– Qurddan qorxan meşəyə girməz. Hanı kitab, göstər görüm.

Aleksey Osipoviç bir qədər tərəddüd içində dayandı. Əlyazmasını vermək istəmədi. Ancaq başının üstünü kəsdirən direktorun səbirsizliyi onu cəsarətə gətirdi. Qovluqdan əlyazmasını çıxartdı. Dmitri Dmitriyeviç eynəyini gözünə taxıb elə ayaq üstündəcə kitabı vərəqlədi. Dostunun zərif xətlə, olduqca səliqəli şəkildə yazdığı səhifələrə xeyli baxdı. Kitabın üstünü oxudu: “Vətən dili”. Onun dodaqları qaçdı.

– Çox şairanə addır. Demək, belə. Siz məndən də uzaqgörənsinizmiş, cənab eks-poçtalyon, bəs bu kitabı indiyəcən niyə müzakirəyə təqdim etməmisiniz?

– İstəyirdim bir az gözləyim. Əlyazmasını tam təkmilləşdirdikdən sonra ortaya çıxardım.

– Yox, gözləmək olmaz. Elə günü sabahdan pedaqoji şurada baxarıq. Lazımi məsləhətlər verərik, sən də beş-on gecə yatmayıb hər şeyi düzəldərsən. Tələsmək lazımdır, əziz dost, tələsmək. Bu kitaba indi böyük ehtiyac var. Hətta çalışarıq ki, çap olunsun, başqa yerlərdə də ondan istifadə etsinlər. – O, gözünü qıyıb diqqətlə Aleksey Osipoviçin üzünə baxdı, sonra birdən əlini onun çiyninə qoydu. – Heç bilirsinizmi nə böyük iş görürsünüz? Bu hərəkətiniz təqdirəlayiqdir. Gələcək nəsil bunu unutmayacaq.

Aleksey Osipoviç azacıq qızarıb başını aşağı saldı. Köynəyinin boynunu boşaltdı, dəsmal çıxardıb alnını quruladı. Dmitri Dmitriyeviç fikirli-fikirli otaqda gəzindikdən sonra yenə pəncərənin qabağında dayandı. Gözünü ulduzlara zillədi. Sinəsi dolusu nəfəs aldı:

– Cənab eks-poçtalyon, yaxın gəlin, Bir səmaya baxın. Orada, zülmət içində parıldayanları görürsünüzmü? Bir baxın necə də sayrışırlar! Elə bil qaranlıq gecə Yer kürəsinin üzərinə qara pərdə salmaq, onu bürüyüb örtmək istəyir. İşıq isə onu deşir, ordan-burdan süzüb parıldayır. O, tabe olmur, iynə ulduzu boyda da olsa yer tapır, özünə yol açır, kimə isə işıq verir. Maraqlı deyilmi, hə, Aleksey Osipoviç, necə bilirsiniz, nə qalib gələcək, işıq, yoxsa qaranlıq?

– Əlbəttə işıq.

– Mütləq, – deyə o qətiyyətlə dilləndi. – Qığılcımlar qorlandıqca çoxalacaq, alovlanıb ətrafa işıq saçacaq. Qığılcımlardan od törəyəcək. Bilirsinizmi, Aleksey Osipoviç, mən hər axşam bu qaranlıq cənub gecələrində daxmalarda yanan işıqlara baxanda özümüzü, öz zəhmətimizi xatırlayıram. Biz qaranlıq gecədə, zülmət səltənətində yaşayırıq, deyilmi? Bizim hər bir əməlimiz qaranlıqda ildırım kimi çaxacaq, şimşək kimi parıldayacaq. Niyə susursunuz? Yoxsa mənim dediklərimi təsdiq etmək istəmirsiniz? Qorxmayın, mən inqilabçı deyiləm.

Qapı döyüldü. Olqa Konstantinovna o biri otaqdan çıxıb dəhlizə getdi. Dmitri Dmitriyeviç sözünə ara verib, vaxtsız gələn qonağın kim olduğunu bilmək məqsədi ilə gözünü qapıya zillədi. Olqa Konstantinovna geriyə dönüb təlaşla ərinin üzünə baxdı. Ucaboy və namərbud hərəkətli bir polis nəfəri içəri girdi. Bir an dayanıb gözləri ilə kimi isə axtardı. Dmitri Dmitriyeviçi görən kimi dabanlarını bir-birinə vurub hərbi qaydada təzim etdi. Döşəmə silkələndi. Yoğun bir səs otağın divarlarını cingildətdi:

– Cənab direktor, Sizə qayət məxfi bir məktub var. Zati-aliləri şəxsən Sizə təqdim etməyi əmr etmişdir.

O qoltuq cibindən ağzı surğuclu bir məktub çıxartdı. Hələ də pəncərə qarşısında hərəkətsiz dayanan Dmitri Dmitriyeviçə uzatdı:

– Məktubu almanız barədə qəbz verin, cənab.

Semyonov əsəbi hərəkətlə məktubu ondan aldı. Yazı masasına yaxınlaşıb zərfin çatması barədə polisə kağız verdi. O yenə dabanlarını cütləyib əlini gicgahına apardı. Fırlanıb geriyə döndü. Döşəməni taqqıldada-taqqıldada, iri addımlarla dəhlizə yaxınlaşdı. Olqa Konstantinovna polisin arxasınca qapını bağladı, intizar və təşviş içində ərinə baxdı. Çiynindən sürüşüb düşən nazik, ağ yun şalı düzəltdi, əlini uzadıb boynunun dalında topladığı gur saçını sahmana saldı. Dmitri Dmitriyeviçsə taxta pilləkənlə aşağı enən polisin nallı çəkmələrinin taqqıltısına qulaq asdı. Onun böyründən sallanan uzun qılıncının yeridikcə pilləkənlərə toxunduğunu görən kimi oldu. Addım səsləri uzaqlaşdıqdan sonra dərindən nəfəs aldı və beş yerindən surğuclanmış zərfin o üz-bu üzünə baxdı. O, hiss etdi ki, Olqa Konstantinovna təlaş içindədir, elə Aleksey Osipoviç də intizardadır.

Semyonov kürsüdə əyləşdi. Şamdanı qabağına çəkdi. Zərfi işığa tutub diqqətlə baxdı. Sonra adəti üzrə siyirtmədən balaca qayçı çıxardıb zərfi ehmalca kəsdi. Eynəyini gözünə taxdı. Peşəkar bir katibin əli ilə yazılmış səliqəli məktubu oxuduqdan sonra məktubu kənara atdı və barmaqları ilə masanı taqqıldatdı.

Divar saatının zəngi aramla on bir dəfə danqıldadı. Dmitri Dmitriyeviç düşüncələrdən ayrıldı. Onu sakit etmək üçün "qulluq kağızıdır", – deyə cavab verdi. Olqa Konstantinovna rahat nəfəs alıb, o biri otağa, uşaqların yanına getdi. Aleksey Osipoviç də getməyə hazırlaşdı. Məktubun gəlməsi ilə birdən-birə halı dəyişən Semyonova mane olmamağı, onu tək buraxmağı qərara aldı. Ancaq Dmitri Dmitriyeviç ona icazə vermədi. Yenidən otaqda var-gəl etdi. Birdən Aleksey Osipoviçin qarşısında dayanıb düz onun gözünün içinə baxdı:

– Nə üçün məktubla maraqlanmırsınız?

– Sizə aid olan məxfi bir...

– Mən Sizdən heç nə gizlətmirəm. Alın, oxuyun.

Aleksey Osipoviç məktubu götürüb nəzərdən keçirdi.

"Mərhəmətli ağa!

Siz cənablara məlumdur ki, Sizin təhdi-himayənizdə olan seminariyada, gürcü dilindən dərs demək üçün cənab Kipianiyə rəsmi olaraq bu şərtlə icazə verdik ki, Siz daim ona nəzarət yetirəsiniz və onu gözdən qoymayasınız. Bu işə məsul olasınız. Buna baxmayaraq, Qoridə

yaşayan etibarlı və rəsmi bir şəxs məlumat vermişdir ki, Kipiani şübhəli işlərlə məşğul olur, evinə müxtəlif adamlar yığıb hökumət əleyhinə kitablar oxuyur.

Həşəmətli cənab, bu məlumatı Sizə verməklə bərabər, artıq dərəcədə xahiş edirəm ki, Kipianinin həyat tərzi və nələr düşünməsi barədə əldə etdiyiniz məlumatları olduqca məxfi tərzdə mənə göndərəsiniz"!.

Aleksey Osipoviç məktubu oxuduqdan sonra möhürə, Qafqaz Maarif müvəkkilinin imzasına, tarixə və kağızın yuxarısındakı "qayət məxfidir" sözlərinə baxdı. Aralığa yenidən sükut çökdü. Saatın taqqıltısı gücləndi.

Semyonov əlləri dalında, pəncərənin qarşısında dayanmışdı. Aleksey Osipoviç onun azacıq irəliyə doğru əyilmiş kürəyinə baxdı. Semyonov əllərini ovuşdurur, barmaqlarını çarpazlayır, bununla da daxili narahatlığını sakitləşdirməyə çalışırdı:

– Fikriniz nədir?

– Kipiani gözəl müəllim və yaxşı vətəndaşdır.

– Onlara da belə yazaq?

– Mən yazardım.

Dmitri Dmitriyeviç yaşına uyuşmayan bir cəldliklə dabanı üstündə fırlanıb geri döndü:

– Bəs bu danosbaz kimdir?

Aleksey Osipoviç çiyinlərini çəkdi.

**2**

Damların və çardaqların üstündə axşamdan təzək yandırmışdılar. Gecədən xeyli keçməsinə baxmayaraq, hava durğun olduğundan kəsif tüstü layları kəndin üstünə çökmüşdü. Bir yarpaq, bir ot belə tərpənmirdi. Ağcaqanad sürüsünün vızıltısı bir-birinə qarışıb kəndə züy tuturdu. Hər şey susmuşdu. Anası Osmana axşamdan damın üstündə yer salmışdı. O, yatıb yuxuya qalmamaq üçün tezdən yorğan-döşəyə girmişdi, ancaq gözünə yuxu getmirdi.

Mina xala oğlunun yanında oturmuşdu. Arvad Osmanın köynəyini dizinin üstünə qoyub yamayırdı. Düz üç gün hər yeri gəzmiş, qonum-qonşuya ağız açmış, hətta şəhərə gedənlərə yalvarmışdı ki, ona beş-altı metr parça alsınlar, sonra əlinə pul düşən kimi borcu qaytarar. Ona əl tutan olmamışdı. Axırda hər yerdən əlacı kəsildiyindən, oğlundan xəlvət qapılarındakı yeganə xoruzu tutmuş, qonşu kənddəki dükana gedib parça istəmişdi. Dükançı bir arşından artıq parça verə bilməyəcəyini

söylədikdə isə "ağrım ürəyinə, xoruzu sənə verməkdənsə, kəsərəm, uşağım yeyər" – demiş və birbaş evə qayıtmışdı. O, oğlunun əynini təzələməyə çalışmış, yoldaşlarının yanında Osmanın utanmasını istəməmişdi. İstəmişdi ki, Osman qərib yerə ürəyi sınqın, əyni çılpaq getməsin. Ancaq nə edəsən ki, yoxdan Allah da bezardır.

Mina xala indi oğlunun yanında oturub köhnə paltarları yamayırdı. Arvad dodaqaltı mızıldanıb ağlayırdı. Tez-tez dişi ilə sapı kəsir, oğlu hiss etməsin deyə yaşını udub, burnunu çəkirdi. "Allah işini avand eləmiş uçitel Əhməd də heç bilmirəm hardan gəlib çıxdı? Əlimizə keçəndən tapıb yeyirdik. Uşağı yerindən oynatdı. İndi mən damın altında təkcə necə dolanacağam? Elə anası ölmüş Osmanın özü qəribliyə dözəcəkmi? Burada əlimə düşəni boğazımdan kəsib ona yedizdirirdim. Orda kim uşağa baxacaq? Gecədə üç-dörd dəfə oyanıb üstünü örtməsəm, ürəyim sakitləşməzdi. İndi kim bilir, harda yatacaq? Eh, Allah özü bilən yaxşıdır, bircə balamı ona tapşırmışam. Onu xata-baladan saxlasın".

Arvad paltarı yamadı. Səliqə ilə qatlayıb heybəyə qoydu. Ağcaqanadları qovmaq üçün təzəyin gözünü deşdi, ətəyi ilə bir-iki dəfə yellədi. Ocaq közərib tüstüləndi. Mina xalanın boğazı acışdı. Arvad donunun ətəyi ilə gözünü sildi. Dönüb ehmalca Osmanın üzünə baxdı. Onun gözü açıq idi. Yanı üstə uzanıb kəndin üst tərəfindəki silsilə təpələrə baxırdı. Təpələrin zirvəsinə elə bil işıqlı zeh çəkilmişdi. Zehdən o yana, səmaya işıq çilənmişdi. Təpələrin o tayında elə bil şəffaf bir şey yanırdı. Bəri üz isə zülmətə qərq olmuşdu.

Mina xala Osmanın üstünü örtmək istədi. Əlini yorğana uzatdı. Ancaq dayandı. Başa düşdü ki, oğlu bu saat heç nə eşitmir, heç nə hiss etmir. Onun xəyalı çox uzaqlardadır.

Arvad ehmalca ayağa durdu. Barmaqlarının ucunda damın üstündən endi. Həyətin ortasındakı ocaq yerinə gəldi. Qazanı kənara çəkdi. Oğlunun yoluna kəsib soyutma bişirdiyi xoruzu çıxardıb siniyə qoydu. Çardağın altına gəldi. Taqətsizləşmiş kimi taxtın üstündə oturdu. "İndi heç, hava istidir, bəs qışda nə olacaq? Uşağın nə çuxası var, nə ayağına geyməyə bir şeyi. Bir çarıqlıq gön də qəhədə çıxıb".

Mina xala qara çırağı yandırdı. Torpağı şappıldada-şappıldada qazma dama girdi. Birələr onun yalın ayağına və baldırına daraşdı. Arvad bunlara fikir vermədi. Əlində çıraq, evin ortasında dayandı. Onun iri kölgəsi divara, sonra da küncə düşdü. Əri öləndən bəri yaxına gedib ağzını açmadığı sandıq gözünə sataşdı. Bədənindən soyuq gizilti keçdi. "Bəlkə kişinin paltarlarından uşağa..." – deyə fikrindən keçirdi.

Arvad titrədi, əlindəki çıraq da titrədi, sandığın üstünə sərilən kölgə də. Mina xalaya elə gəldi ki, küncdə nə isə tərpənir. Arvad vahimələndi, dilinə kəlmeyi-şəhadət gətirdi: "Sənə ağır gəlməsin, ey yeri-göyü yaradan, nə eləyim, əlacım yoxdur, uşaq çılpaqdır, – deyə özünə təskinlik verdi. – Özgə ha deyil, öz balasıdır, bəlkə elə atasının ruhu da şad olacaq?".

Arvad asta-asta ayağının altında bir şey qalıb sınacağından qorxurmuş kimi ehmalca sandığa yaxınlaşdı. Çırağı irəli tutdu. Kölgə geri çəkildi. Mina xala dayandı, baxdı və bir anın içində on-on beş illik yola gedib qayıtdı. Titrək əlini uzatdı. Barmağını sandığa toxundurdu. Narın toz örtmüş qapaqda onun barmağının izi qaldı. Arvad diz çökdü. Çırağı tərcəyə qoydu. Donunun ətəyi ilə sandığın tozunu sildi. Əri öləndən qapağı qaldırmamışdı. Kişinin paltarına toxunmamışdı. Mina xala dayandı. Yaş gözlərinin həlqəsinə yığıldı, sonra daşıb gilə-gilə yanağına süzüldü. Onun dodaqları səyridi. Nə qədər çalışdısa da, hönkürtüsünü boğa bilmədi. Birdən üzü üstə sərilib sandığı qucaqladı: "Hardasan, ay kişi, niyə köməyimə gəlmirsən? Niyə gəlib oğlunu yola salmırsan? Demirsənmi, arvadım təkdir, damın altında köməksiz qalıb? Allah sənə insaf versin, niyə tez getdin? Niyə məni odsuz-ocaqsız yandırdın? Axı mən sənə nə pislik eləmişdim ki, etibarsız oldun, a kişi? Nə olar, bircə dəfə başını qaldır, bax, gör oğlun nə boyda olub! Sözümə baxmayıb oxumağa gedir, a kişi, sən buna nə deyirsən?"

Mina xalanın kölgəsi divarda bir xeyli titrədi. Sinəsi bulud kimi boşalıb sakitləşdi. Dikəldi. Saçını islaq yanağından geri elədi. Əlini qoynuna salıb, boynundan asdığı açarı çıxardı. Qapaq cingilti ilə açıldı. Kif atmış paltar iyi evə yayıldı. Arvad bihuşdarı qoxulamış kimi sərməst oldu. Ona elə gəldi ki, ərinin bədəninin qoxusu burnuna dolur. Kişi işdən gəlib paltarını yenicə soyunmuşdur. Onun tərinin iyi paltara hopmuşdur. Bu qoxu təptəzədir, kişi ölməyib, aradan illər keçməyib, fəsillər dolanmayıb. Mina xala hər şeyi – paltardakı miras soyuqluğunu, ölünün vahiməsini unutdu. Ərinin çuxasını, köynəyini, şalvarını sinəsinə basdı, qərib bir həsrətlə öpdü...

Elə bil bu göz yaşları onu yüngülləşdirdi. Arvad ağır yük altından çıxmış kimi ayağa durdu. Ərinin paltarını götürüb taxtın üstünə qoydu. Oğlunun əyninə gəlib-gəlməyəcəyini gözəyarı ölçdü. Xəyalən Osmanı atası ilə yanaşı qoydu. Osman onun çiynindən idi. Çuxanı geyinsə ətəyi yerlə sürünəcəkdi, şalvar da boğazına çıxacaqdı. Bəs nə etsin? Bəl-

kə qayçını götürüb kəssin, uşağı yuxudan qaldırıb onun üstünə ölçüb-biçsin? Səhərə qədər yatmayıb tiksin? Bəs Osman özü buna nə deyər?

Mina xalanı yenidən fikir götürdü. O başa düşdü ki, oğlu anasının fikri ilə razılaşmayacaq. Üstəlik onunla savaşıb uzaq səfərə küsülü gedəcək. Arvad köksünü ötürdü. Paltarları qatlayıb yenidən sandığa yaxınlaşdı. Nə isə tappıltı ilə yerə düşdü. Mina xala əyildi, əlinə yumşaq bir şey dəydi. İşığa gətirib baxdı. Barmaqları əsə-əsə kisənin ağzını açdı. Əli soyuq və yuvarlaq bir şeyə toxundu. Bu soyuq təmas arvadı titrətdi. Azacıq sonra isə həmin soyuqluq isindi, el bil Mina xalanın damarlarına ılıq qan vurdular. Arvadın bədəni qızışdı, gözləri işıqlandı. Çırağı yaxına çəkdi, ovcuna baxdı. Soyuq metal parıldadı.

"Görünür, sən məndən tədbirlisənmiş, a kişi, cibində pul gizlədib dar günə saxlayırsanmış. Elə bil sümüyün duyubmuş ki, bir gün oğlun məktəbə gedəcək, ona xərclik lazım olacaq. Sən nə yaman yerdə harayıma çatdın, a kişi, mən başı batmışsa səni etibarsız bilirdim".

Mina xala paltarı səliqə ilə qatlayıb sandığa qoydu. Tələsik həyətə çıxdı. Yüngülcə damın belinə qalxdı. Osmanı oyatmaq istədi. Ancaq onun mışıltı ilə yatdığını görüb dayandı, oğluna qıymadı. Oturdu. Əlini onun saçına çəkdi, yorğanı qaldırıb ehmalca oğlunun yanına girdi. Osmanı qucaqladı, başını ehtiyatla qaldırıb qolunun üstünə qoydu. Osman çevrildi. Üzünü anasının köksünə sıxıb, yenidən mışıldadı. Mina xalanın barmaqları onun saçının arasında dolaşdı. Oğlunun ılıq nəfəsi arvadın sinəsini isitdi...

Ağcaqanadlar uçub haraya isə dağılmışdılar. Laylanıb kəndin üstünə çökən tüstünü səhər mehi qovub uzaqlara aparmışdı. Hava təmizlənmişdi. Kürün qıjıltısından başqa heç nə eşidilmirdi.

* * *

Qoca kişi yuxusunu dağıtmaq üçün üzünə bir-iki ovuc su vurdu. Belini düzəldib dikəldi. Köynəyinin ətəyi ilə yaş sifətini sildi. İslaq əlini başına çəkdi. Gəmiyə getdi. Səhər mürgüsü onu təntitmişdi. Kürün üstünə qaranlıq çökmüşdü. Yaxındakı cələdən qanad səsi gəlməsəydi, quşlar budaqlarda cikkildəməsəydi, axşamın təzəcə düşdüyünü zənn etmək olardı.

Kənddən boğuq və yorğun xoruz səsi gəldi. Hardasa it hürdü. Qoca kişi sinəsini açdı. Kürün sərin mehi onun saqqalının arasında oynadı. Kişi üfüqə baxdı. Dan yeri qızarırdı.

Gəmi yarğanın dibində idi. Xırdaca ləpələr onu yırğaladıqca, təknəyə toxunan su şappıldayırdı. Arabir balıqlar sudan havaya atılırdı. Bir az aşağıdakı gölməçələrdə isə qurbağalar quruldayırdı.

Qoca kişi gəminin kəndirini yoxladı. Suyun daşıb-daşmadığını bilmək üçün sahilə, yarğanın dibindəki ləpədöyənə baxdı. Ağac qırıntıları və boz köpük zehi əvvəlki yerində idi. Kişi solğunlaşan ulduzlara fikir vermədən atılıb gəmiyə mindi. Çəpi, kürəyi yoxladı. Dal tərəfə keçib heybəni götürdü. Bir tayı yarımçıq qalmış çarığı çıxartdı. Bizi, kövşəni əlinə aldı.

Dünən yuxarıdakı dağ kəndlərindən gəmi ilə keçirdiyi kəndlilərdən bir ona bir cüt gön vermişdi. Kişinin ayağı yalın idi. Bu gön onun əlinə göydən düşmüşdü. Qoca kişi qaranlıq qarışan kimi ocağın işığında gönü köyşələmiş və özünə çarıq tikməyə başlamışdı. Ancaq ağcaqanadlar ona aman verməmişdi.

Qoca kişi çarığı götürdü. Suvadağa adamlar gələnə qədər tikib geymək istədi. Gün xeyli qalxdı. Yarğanın kölgəsi geri çəkildi. Sular qızardı. Kişi heç nəyə fikir vermədi. Çarığı tikib qurtardı, şirincə gərnəşib bərkdən əsnədi. Ayağını qurulayıb çarığın bir tayını geydi. Elə bu vaxt yarğanın qaşından onu səslədilər. Kişi əlinin üstə qoyub baxdı. Dikdirdə dayananların içində qardaşı oğlu Osmanı görəndə bir xeyli təəccüb etdi. Mina xala, Əşrəf, Əhməd və kəndin arvad-uşağı da yarğanın qaşında idi. Qoca kişi birdən-birə hər şeyi başa düşdü. Çarığı soyundu. Cütləyib kənara qoydu. "Deyəsən qocalıq məni yaman üstələyib, uşaqların uşkola gedəcəyini lap yadımdan çıxartmışam. Gərək Osmanın yoluna bir şey tapaydım".

Dəstə sahilə endi. Qoca kişi gəmidən düşüb onları qarşıladı. Osman kənardaca dayandı. Mina xala nə qədər çalışdısa da, gözünün yaşını saxlaya bilmədi. Üzünü yana çevirib donunun ətəyi ilə gözünü sildi. Osman da doluxsundu. Axşamdan bəri getməyə tələsən, heybəsini bir gün qabaqdan hazırlayıb səbirsizliklə bu anı gözləyən oğlan birdən-birə qəribsədi. Uşaqlar qohumları ilə görüşüb bir-bir gəmiyə atılanda hiss etdi ki, yaş onu boğur, bir az da keçsə hönkürəcəkdir.

Mina xala özünə toxtaqlıq verdi. Yaxınlaşıb oğlunun üzündən öpdü. Əli ilə köynəyinin yaxasını düzəltdi, barmaqlarını düymələrinin üstündə gəzdirdi. Çiynini sığalladı.

– Bax, yadından çıxmasın, dərdin alım, şəhərə çatan kimi özünə paltar al.

– Yaxşı, ana, narahat olma.

Onlar yenidən qucaqlaşdılar. Qoca kişi gəminin ipini açdı. Bir-birindən ayrılmaq istəməyən ana-balaya acıqlandı:

– Di bəsdir, az zövzəklik eləyin.

Osman anasından aralandı. Adəti üzrə şalvarını dartdı, burnunu çəkdi. Bir-iki addım dalı-dalı getdi. Sonra dabanı üstə fırlanıb, quş kimi gəmiyə atıldı. Qoca kişi onun çarığının altındakı deşikləri aydınca gördü.

Mina xalanın ürəyi sakit olmadı. Onun titrək səsi eşidildi:

– Əşrəf, dərdin alım, Osmanı sənə tapşırıram, elə sənin də gözün üstündə olsun, Əhməd qardaş.

– Arxayın ol, ay bacı.

– Bax, Səlim amanatı, məni dilə tutdun, cavabdeh özünsən.

Əhməd gülümsündü:

– Ondan nigaran olma, dəyirmanın gözünə ölü salsan diri çıxar.

Gülüşdülər. Arvadlar gözlərini quruladılar. Kişilər özlərini şax tutmağa çalışdılar.

Uşaqlar gəmiyə doluşub qatarlaşdılar. Qoca kişi gözaltı onların əyninə, ayaqqabılarına, çiyinlərindəki heybələrinə baxdı. Hamıdan pis geyinən, hamıdan sınqın Osman idi. Onun əynində ağ bezdən köynək var idi. Görünür, anası yenicə tikmişdi. Osman elə bil köhnə geyimindən xəcalət çəkirdi. Uşaqların arxasında daldalanmağa çalışırdı. Ayağını xurcunların arasında gizlətmişdi.

Qoca kişi gəminin dal tərəfinə keçdi. Yenicə tikib qurtardığı çarığı cütləyib götürdü. Osmana yaxınlaşdı:

– Al, bala, geyin.

Osman əmisinin əlindəki çarığa baxdı. Onun gözlərində sevinc və təəccüb bir-birinə qarışdı. Ancaq başını bulayıb geri çəkildi:

– Lazım deyil, əmi, çox sağ ol.

– Al.

– Pulum var, şəhərə gedən kimi...

– Bə şəhərəcən ayaqyalın gedəcəksən, a nişanlısı göyçək? – Qoca kişi onun sözünü kəsib gülümsündü, kiçik gözləri daha da qıyıldı. – Tez ol, geyin, özüm sənə tikmişəm.

Osman heybəni çiynindən yerə qoydu. Çarıqları gəmiçidən aldı, aşağı əyilib köhnəni soyundu, təzəni geydi. Çarığın bağlarını bərkitmək istərkən gözü əmisinin yalın ayaqlarına sataşdı. Əli çarığın bağında, bir xeyli dayandı. Gözünü Qoca kişinin suda çox olduğundan ağarıb, qanı qaçmış ayağının qırışlarından çəkə bilmədi.

– Əmi, bəs...

Qoca kişi ona cavab vermədi. Osmanın altı deşik çarıqlarını götürüb Kürə atdı. Sonra üzünü uşaqlara tutdu:

– Ə, a nişanlısı göyçəklər, kimi gözləyirsiniz, düşün gəmini yuxarı çəkək.

Uşaqlar hərəkətə gəldilər. Gülüşdülər. Səlim dil altında qalmadı:

– Qoca dayı, yol üstündəyik, bizə sataşma.

– Söz güləşdirmə, a nişanlısı göyçək, sonra gecikərik.

Rüstəm kişi qabağa gəldi, əlini uzadıb kəndirdən yapışdı:

– Uşaqlarda işin olmasın, özümüz çəkərik, qoy ayaqları islanmasın.

Sahildəkilər köməkləşib gəmini yuxarı, hündür yarğanın altındakı keçidə çəkdilər. Burada dayanıb uşaqlarla bir də görüşdülər. Qoca kişi çəpi götürüb dal tərəfə keçdi. Əşrəf kürəyi aldı. Qabağa getdi. Sahildəkilər ipi gəmiyə atdılar. Gəmi Kürün axarına düşdü. Bir göz qırpımında sahildən aralandı. Uşaqlar sükut içində dayandılar. Yarğanın divarındakı deşiklərdən bir dəstə göyərçin uçub havaya qalxdı. Onlar Kür yuxarı süzüb kəndə doğru getdi. Sahildəki cələ, kəndə doğru gedən torpaq yol, elə uçurum yarğanlar da fırlandı, kəndin evləri getdikcə kiçildi, uzaqlaşdı.

Osman gözünü anasından çəkmədi. Mina xala sahil boyu, suyun axarı ilə, gəminin bərabərincə qaçır və əlini sinəsinə döyürdü.

**3**

Aleksey Osipoviç yastığa dirsəklənərək qonşu çarpayıda şirin yuxuya getmiş arvadına tamaşa edirdi. Vera əlinin ikisini də cütləyib başının altına qoymuş, dizlərini qarnına doğru azacıq qatlayıb yatmışdı. Yorğan sürüşüb düşdüyündən, çiyninin bir hissəsi və sinəsi açılmışdı. Nəfəsi ipək köynəyinin yaxasındakı tülü yelləndirirdi. Çırağın işığı aşağı çəkilmiş olsa da, arvadın saçlarına düşən dən aydınca görünürdü. Qırışlar onun alnına iz salmışdı. Gözlərinin altı kölgələnmiş, buxağında, sinəsində nazik zehlər əmələ gəlmişdi. Halbuki, beş-altı il bundan əvvəl yanağı, buxağı, elə sinəsi də qəşəng və sığallı idi. Saçları gur və dalğalı idi. Köksü qabarıq olsa da, bədəni nazik və oynaq idi. Hərəkətləri çevik, yerişi quş kimi yüngül idi. Ancaq indi ətə dolub ağırlaşmışdı. Hiss olunurdu ki, Vera yaşlaşmışdı.

Onlar on ildən çox idi ki, evlənmişdilər. Çətin günlərdə bir-birinə həyan olmuş, evdə bir azca soyuqluq hiss edəndə nəfəsləri ilə onu isit-

miş, qəribliyə düşəndə bir-birinə sığınmışdılar: ürəklərindən keçənləri gözlərindən oxumuşdular. Aleksey Osipoviç hələ indiyə qədər Veradan narazılıq, azacıq da olsa bir şikayət eşitməmiş, özü də arvadının könlünə toxuna biləcək bir hərəkət etməmişdi. Onlar bir-birini çox istəyirdilər. Uşaq vaxtı Şamaxı tərəfdə, Çuxuryurd yaylaqlarında bir yerdə böyümüşdülər. Vera ağ bənizli, qırmızı yanaqlı malakan qızları ilə bir yerdə ot biçininə gedəndə, bulaq üstə enəndə, ya da ayaqyalın çəmənlikdə qaçanda, Aleksey onu gözaltı süzərdi. Axşamlar isə tez-tez kəndin ortasına toplaşıb qarmon çalar, səhərə qədər oynayıb-oxuyar, dan qızarana yaxın evlərə dağılışardılar. Aleksey Veranı tez-tez rəqsə çağırar, sonra da kölgəli küçələrlə evlərinə ötürərdi. Onlar belə hallarda kəndin arasındakı yolla asta-asta addımlayar, aylı gecələrdə qoşalaşan kölgələrinə tamaşa etməkdən doymazdılar. Onların kölgələri gah dağın döşünə sərilər, gah dərəni aşar, gah da yenicə ağardılmış kənd evlərinin divarında baş-başa verərdi. Aleksey Veranı ilk dəfə evlərinin yanında, məhz belə aylı gecələrin birində öpmüşdü. Vera onun hərəkətinə əvvəlcə təəccüb etmiş, xeyli Alekseyin üzünə baxmış, sonra özü də bilmədən onun boynunu bərk-bərk qucaqlamışdı. Kəndin alt tərəfindəki çəmənliyin otu biçilmişdi. Tayalar cərgələnmişdi. Vera baş yaylığını açaraq çəmənliyə qaçmışdı. Onlar qurumuş çiçək və otun ətrindən məst olaraq, tayaların birinin kölgəsində gizlənmişdilər.

Bu ünsiyyət, ilk gənclik mehribanlığı, uşaqlıq isinişməsi onlar evlənəndən sonra da davam etmişdi. Bir yastığa baş qoyduqları gündən indiyə qədər aralarında könülə toxunan bir söz olmamışdı. Vera çox təmkinli qadın idi. Aleksey Osipoviç hiss edirdi ki, o, qüssəli olanda, qəlbində gizli bir dərd baş qaldıranda belə, zahiri şadlığını itirmir, dodaqlarından təbəssüm əskik olmur. O həmişə ərinin sakitliyinə çalışır, onu kədərləndirməmək və fikrini dağıtmaq istəyir. Aleksey Osipoviç də arvadını mehribanlıq və qayğı içində saxlayır, onu nəvazişlərə qərq edirdi. Lakin bunların heç biri Veranın ürəyində qubar bağlayan dərdi azalda bilmirdi. Aleksey Osipoviç görürdü ki, arvadı içəridən qovrulur, günü nə qədər xoş keçsə də sarsılır, aybaay, günbəgün qocalır. Vera gündüzlər zahiri təmkinini və şadlığını saxlaya bilsə də, gecələr yuxuya gedən kimi sifətinə qüssə çökür, onun məhzun çöhrəsindən hər şeyi anlamaq olurdu. Aleksey Osipoviç arvadının çox zaman yuxuda çatılan qaşlarına, alnındakı düyünlərə, çöhrəsindəki hüznə ürək ağrısı ilə tamaşa edirdi. O, Veranın yuxuda dəfələrlə uşaq kimi hıçqırıb ağladığını, bəzən də elə bil nəyi isə qucaqlayıb oxşadığını, laylaya bənzər

bir tərzdə zümzümə etdiyini görmüşdü. Aleksey Osipoviç başa düşürdü ki, arvadı övladsızlıq dərdi çəkir, üzə vurmasa da, uşaqlarının olmaması onu acı alma kimi büzüşdürür. Belə hallarda Aleksey Osipoviç yaşarmış gözlərini silirdi. Axı o da övlad istəyirdi. O da istəyirdi ki, axşamlar otaqlar sükuta qərq olmasın, qüssə və kədərdən qulaqlar güyüldəməsin. Hay-harayla qaçışan uşaqlar nəyisə salıb sındırsınlar, yazı masasının üstündəki dəftər-kitabı bir-birinə qatsınlar. Vera hirslənib onlara acıqlansın, uşaqların yumşaq yerinə bir-iki şapalaq çəksin, balacalar xilas olmaq üçün atalarının yanına qaçsınlar, onun arxasında gizlənsinlər.

Aleksey Osipoviç yorğanı çəkdi. Veranın sinəsini və çiynini örtdü. Onun dən düşmüş saçını üzündən geri atdı. Arxası üstə çevrildi. Gözünü tavana zillədi. Çırağın işığı azalmışdı. Bayırda külək əsirdi. Ağacların xışıltısı eşidilirdi. Arabir parovozlar kəsik-kəsik fit verirdi. Kür qıjıldayırdı.

“Mən nahaq kədərlənirəm. Övladsızlıqdan şikayət eləməyə haqqım yoxdur. Bəs tələbələrim? Məgər onlar mənim övladlarım deyilmi? Məgər mən öləndən sonra onların timsalında yaşamayacammı? Müəllim üçün tələbəsini boya-başa çatdırmaq ən böyük səadət deyilmi? Məgər müəllim tələbələrini öz balasından azmı sevir? Əgər belə olmasaydı, Pestalotsi xəstə tələbələrini buraxıb öz oğlunun dəfninə getməzdimi? Ancaq o getmədi. Fikirləşdi ki, oğlum onsuz da ölmüşdür, onu mənsiz də dəfn edəcəklər. Xəstə uşaqları başsız qoysa daha ağır itkilər baş verə bilər. Gərək biz də o cür pedaqoqların yolu ilə gedək. Fədakarlığı ondan öyrənək. Doğrudan da tələbənin ən yaxın adamı, onun sirdaşı müəllimi deyilmi? Elə hallar olmurmu ki, uşaq ata-anasına demədiyi sirri müəlliminə açır. Yox, mən haqsızam. Mən övladsız deyiləm. Mənim balalarımın sorağı bir neçə ildən sonra Azərbaycanın ən ucqar guşələrindən gələcək”.

Aleksey Osipoviç bunları çox yaxşı dərk edirdi. O bütün həyatını məktəbə vermişdi. Səhərdən axşama qədər uşaqlardan ayrılmazdı. Məşğələlərdən sonra onlarla birlikdə yataqxanaya gedər, çarpayıları, yorğan-döşəyi yoxlayar, onları yuxuya verdikdən sonra evə qayıdardı. Başı işə o qədər qarışardı ki, günlərin necə gəlib-getdiyini hiss etməzdi. Bəzən ailəsini, özünü belə unudardı. O hiss etməzdi ki, Vera evdə darıxır, pəncərədən boylanmaqdan yorulur. Ancaq indi, yay tətili günlərində Aleksey Osipoviç sakitlikdən bezmişdi. O özü tək qaldığından, arvadının iztirablarını daha yaxşı dərk edirdi. Sabah uşaqlar gəlməli-

dirlər. Yenə məktəbin həyəti, yataqxana səs-küylə dolacaq. Yenə məşğələlər başlayacaq, tələbələrin min cür tələbi, şikayəti, sualları, etirazı və narazılıqları meydana çıxacaq. Yenə Aleksey Osipoviç səhər gedib axşam qayıdacaq. Bəs Vera nə etsin? Bəlkə onu da məktəb işinə qoşsun? Bəlkə təzə açılacaq hazırlıq kurslarında ona bir məşğələ düzəltsin? Xor və dram dərnəklərinin işini ona tapşırsın? Axı onun yaxşı səsi var. Uşaqlarla çox tez dil tapır. Hansı evə bircə dəfə getsə, balacalarla danışıb-oynasa, ondan əl çəkmirlər.

Aleksey Osipoviçin yuxusunun dağılmasının bir səbəbi də sabahı gözləməsi idi. O iki ay bundan əvvəl Azərbaycanı oymaq-oymaq gəzib Qori müəllimlər seminariyası üçün tələbə axtarmışdı. Otuz adam ona söz vermişdi ki, uşağını oxumağa göndərəcək. İndi görəsən onlar gələcəkmi? Sonradan fikrini dəyişən olmayıb ki? Əgər sözlərindən dönsələr, hazırlıq qrupları açmaq çətin olacaq.

Aleksey Osipoviç yanı üstə çevrildi. Gözünü pəncərəyə zillədi. İçəri toran idi. Bayır isə aydınlaşır, pəncərədən süzülən işıq çırağın şöləsini solğunlaşdırırdı...

Aleksey Osipoviçin gözünə yuxu getməsi ilə ayılması bir oldu. Səksəkəli yatdığından, pəncərədən işıq düşən kimi yerindən dik atıldı. Dərhal da paltarını geyinib arvadını oyatdı:

– Vera, dur, gedirik.

Arvad təlaşla onun üzünə baxdı:

– Hara?

– Vağzala.

– Xeyir ola?

– Uşaqları qarşılamaq lazımdır.

– Məni də aparırsan?

– Tez ol, gecikirik.

Onlar yarım saatdan sonra məktəbin həyətinə gəldilər. Sakitlik idi. Faytonçu atları qoşmuşdu. Kiminləsə söhbət edirdi. Aleksey Osipoviç arvadının qolundan tutub faytona yaxınlaşdı. Elə bu vaxt faytonçu ilə söhbət edən adamı tanıdı. Onlar furajkalarını götürüb salamlaşdılar.

– Cənab Kipiani, bu tezdən hara?

O gülümsündü. Azacıq aşağı əyilib Vera Fyodorovnanın əlindən öpdü və bundan sonra üzünü Aleksey Osipoviçə tutdu:

– İcazə versəniz, sizinlə gedərdim.

– Yoxsa səfəriniz var?

– Yox. Mən də uşaqları qarşılamaq istəyirəm. Ürəyim yaman darıxır. Tələbəsiz məktəb suyu sovulmuş dəyirman kimi yaman qüssəli olur, deyilmi, Aleksey Osipoviç?

– Elədir.

Onlar yanaşı oturdular. Faytonçu qamçını havada oynatdı. Atlar çaparaq həyətdən çıxdılar və döngəni burulub vağzala yollandılar. Şəhər hələ yuxulu idi. Küçələrdə təkəm-seyrək adam var idi. Üfüq qıpqırmızı idi. Vağzalla şəhərin arasındakı düzənlikdə qıvrılıb axan Kürün suları parıldayırdı. Çayın vadisindəki çəmənlik də göz qamaşdırırdı. Elə bil oraya səhər-səhər göydən su çilənmişdi.

Qatar silkələnib dayandı. Çiyni heybəli uşaqlar müvazinətlərini saxlaya bilməyib səndirlədilər. Əşrəf qapının ağzına tərəf getdi. Yuxudan kal ayılmış uşaqları qoymadı ki, basabas salsınlar. Özü hamıdan əvvəl vaqondan yerə düşdü. Yükü ağır olanlara kömək etdi. Əhməd də o biri vaqondakı uşaqları düşürtdü. Tiflisdə dəstə böyümüşdü. Başqa qəzalardan gələn uşaqlar da onlara qoşulmuşdular.

Əhmədlə Əşrəf uşaqları kənara, vağzaldan aralı bir yerə topladılar. Onların çoxu hələ özünə gələ bilməmişdi. Ömürlərində ilk dəfə vaqona mindiklərindən, dəmir yolu gördüklərindən, yad yerə ayaq basdıqlarından, təşviş və təlaşla ətrafa boylanırdılar. Çoxları çiyinlərindəki heybədən bərk-bərk yapışmışdı. Elə bil ki, kiminsə onu oğurlayacağından ehtiyat edirdilər. Osman hamıdan çox həyəcan keçirirdi. Gah qabağa qaçır, gah dəstənin ortasında durur, gah da Əşrəfin yanına gəlib az qala onun ətəyindən yapışırdı.

Osman birdən qabağa çıxdı. Həyəcanla Əşrəfin qolundan dartıb dəmir yolundan o tərəfdəki faytonu göstərdi. Əşrəf dönüb baxdı, Aleksey Osipoviçi gördü.

Vaqondan yenicə düşmüş uşaqlar onlara yaxınlaşdılar. Çernyayevski qollarını açıb Əhmədi qucaqladı. Əşrəfin kürəyinə vurdu.

– Demək belə, hamınız gəlibsiniz.

O, uşaqları bir-bir gözdən keçirdi. Ayaqlarındakı çarığa, yamaqlı paltarlarına baxdı. Onların ürkək baxışlarının arxasında gizlənən həvəs və marağı gördü. Ani olaraq, “Görəsən bunlardan gələcəkdə nə olacaq?” – deyə xəyalından keçirdi. Əlini uzadıb uşaqların bəzisinin papağını, bəzisinin kəmərini düzəltdi. Osmana yaxınlaşanda isə ayaq saxlayıb gülümsündü.

– Sən də gəlmisən?

– Özünüz görürsünüz.

– Bəs, Molla Sadıqla haqq-hesabı kim çürüdəcək?

– Tapılar, – deyə Osman gülə-gülə cavab verdi. – Kəndimizdə dəcəl çoxdur.

– Mixail Keyxosrovoviç, – deyə Aleksey Osipoviç sözə başladı. – Bu yaman dəcəldir. Tütünə barıt doldurub mollanın saqqalını yandırmışdı.

– Yəqin burda da bizim saqqalımızı yandıracaq.

– Siz papiros çəkirsiniz?

Uşaqlar gülüşdülər. Müəllimlər də onlara qoşuldular. Ancaq Əhməd gözünü Kipianidən ayırmadı. Diqqətlə onun üzünə baxdı, bu tanış səsi harda eşitdiyini xatırlamaq istədi.

Aleksey Osipoviç uşaqların hamısı ilə görüşdükdən sonra geri döndü və üzünü Əhmədə tutdu:

– Sevindiyimdən hər şeyi unutmuşam. Heç Sizi tanış da eləmədim. Bu bizim seminariyanın müəllimi Kipianidir.

Kipiani əlini uzatdı və birdən qaşlarını çatıb dayandı:

– Axı, deyəsən biz tanışıq.

– Dayan, dayan, – deyə Əhməd nəyi isə xatırlayıb susdu və birdən qollarını açıb Kipianini qucaqladı. – Mişa, sən salamatsanmı?

Hamı təəccüblə onlara baxdı.

## 4

Uşaqlar və Olqa Konstantinovna qonşu otaqda yatdıqdan sonra, Semyonov yazı masasının arxasına keçdi. Şalvarının yan cibindən təmiz bir dəsmal çıxartdı. Eynəyinin şüşələrini sildi və polisin dünən gecə gətirdiyi məktubu şamın işığında təzədən diqqətlə oxudu. Son sətirlərin üzərində xeyli dayandı. “Kipianinin nələr düşündüyünü öyrənib bizə gizlicə xəbər verəsiniz”. Məktubu kənara atdı. “Gör nə qədər həyasızlaşıblar! İnsanın nələr fikirləşdiyini, onun təfəkkür tərzini belə nəzarət altında saxlamaq istəyirlər. Adamları sərbəst düşünmək hüququndan da məhrum etməyə çalışırlar. Az qalırlar ürəklərə belə xəfiyyələr göndərsinlər”. O bir anlığa Kipianinin hərəkətlərini gözü qabağına gətirdi. Seminariyada işlədiyi müddətdə hələ ondan şikayət olmamışdı. Kipianini yalnız gürcülər deyil, bütün şöbələrin tələbələri sevirdi. O, gözəl müəllim idi. Vətənini dərin məhəbbətlə sevən bu adam həmişə onun taleyini düşünür, keçmişindən və gələcəyindən böyük ehtirasla danışırdı. Kipiani bütün vardığı ilə məktəbə və tələbələrə bağlı idi. O

özü ədəbi gecələr təşkil edir, şer oxuyur, uşaqları dram dərnəyinə toplayır, ekskursiyalara aparır. İki il idi ki, tarix dərnəyi təşkil etmişdi. Belə bir adamı nə üçün gözüm-çıxdıya salmışdılar? Onu yenidən Sibirəmi göndərmək istəyirdilər? Axı mən ondan nə yaza bilərəm?

Semyonov ayağa durdu. Küncdəki seyfdən iri bir qovluq çıxardıb masanın üstünə qoydu. Asta-asta vərəqlədi. Əvvəlcə əlinə qəzet səhifəsinə bənzər iri bir kağız keçdi. Mətbəədə çap olunmuş bu vərəq qara haşiyəyə alınmışdı. Bu, inqilabi iş üstündə Peterburq, Moskva, Kazan, Kiyev ali məktəblərindən qovulmuş müəllim və tələbələrin siyahısı idi. Daxili işlər nazirliyinin əmri ilə həmin adamlar polis nəzarəti altında saxlanılır və məktəblərdə işləmək hüququndan məhrum edilirdi. Son vaxtlar bu cür gizli siyahıları tez-tez göndərirdilər. Semyonov xırda hərflərlə yazılmış vərəqi nəzərdən keçirdi. Siyahıda özünün bir neçə tanışlarının da adına rast gəldi. Nəhayət, Kipianinin familiyasını tapdı. Onun adının qarşısında qələmlə işarə qoydu. Bir xeyli beləcə, əlində qələm, dayandı. Fikirli-fikirli saqqalını qaşıdı. "Demək, ondan hələ əl çəkməyiblər. Peterburq Texnoloji İnstitutundan qovulduqdan və Sibirdə cəza çəkdikdən sonra belə onu gözdən qoymurlar. Bəlkə elə doğrudan da Kipiani burada da gizli işlərlə məşğul olur, hökumət əleyhinə təbliğat aparır? Axı bu təbliğat nədən ibarətdir? Məgər ölkənin vəziyyətini düşünmək, onun ağır hal keçirdiyinə dözməmək, qurtuluş yolu axtarmaq hökumət əleyhinə çıxmaqmı deməkdir? Məgər hər bir namuslu vətəndaş vətəninin, millətinin səadətinə çalışmamalıdırmı? Gördüyü ədalətsizliklərə qarşı öz etiraz səsini ucaltmamalıdırmı? Bu ki, hökumət əleyhinə işləmək deyil, əksinə, onun işinə kömək etmək deməkdir. Bəs belə isə, nə üçün bir balaca sərbəst düşünmək istəyənləri təqib edirdilər. Qollarını qandallayıb elindən, obasından didərgin salırlar? Məgər biz buraya, Qafqazın ucqar yerlərinə bundan ötərimi gəlmişik?"

Semyonov iki il bundan əvvəl Kipianinin onun yanına iş üçün gəldiyini xatırladı. O, ucaboy, arıq bir adam idi. Azacıq axsayırdı. Yeriyəndə sağ ayağını möhkəm basa bilmədiyindən, əsaya dirənirdi. Gülümsər çöhrəsi ağarmışdı. Zil qara saçları və saqqalı qıvrım idi. O, bığını qafqazlılar kimi burmamışdı. Uzadıb saqqalına qatmışdı. Boynuna ala-bəzək şal bağlamışdı. Rusca təmiz danışsa da, tələffüzündən gürcü olduğu dərhal sezilirdi. Semyonov onun ərizəsini diqqətlə oxudu. Sonra müsahibinin üzünə baxdı:

– İndiyə qədər harda işləyirdiniz?

– Sürgündən əvvəl Tiflis və Kutaisidə olmuşam.
– Sürgündə də olmusunuz?
– Bəli, ancaq indi azadam.
– Evlisinizmi?
– İki uşağım var.
– Sibirdə evlənmisiniz?
– Yox, burda, ancaq onlar da Sibiri görüblər.
– Niyə, onları da sürmüşdülər?
– Xeyr, arvadım məni tək buraxmaq istəmədi. Mənim etirazıma baxmayaraq, dalımca Sibirə gəldi.

Semyonov gördü ki, müsahibi ağır günləri xatırladıqca əzab çəkir. Onun yaralarını təzələməmək məqsədi ilə söhbəti dəyişdi:

– Deməк, bizim seminariyada gürcü dilindən dərs demək istəyirsiniz?
– Bəli, cənab direktor, müsaidə etsəniz, Sizinlə bir yerdə işləyərdim.
– Yaxşı, məsləhətləşərik.
– Çox sağ olun.

Kipiani ayağa durdu. Nəzakətlə təzim edib otaqdan çıxdı.

Semyonov elə həmin günü Qafqaz maarif müvəkkilinin adına bir məktub göndərdi. Kipianinin seminariyada işləməsinə icazə istədi. Onun xahişini rədd etdilər...

Semyonov bunları xatırladıqdan sonra qovluğu yenidən qabağına çəkdi. Kipianinin ərizəsini, ona verilən cavabı axtarıb tapdı. Gözləri sətirlərin üzərində gəzdi.

*"Quberniya dəftərxanasındakı sənədlərdən aydın olur ki, Peterburq Texnoloji İnstitutunun sabiq tələbəsi M.K.Kipiani Tiflis və Kutaisi quberniyalarında cinayətkar təbliğatlar apardığına görə, zatialilərinin iradəsi ilə 1878-ci ildə Şərqi Sibir general-qubernatorunun nəzarəti altında sürgünə göndərilmişdir. Oradan isə Orenburq ölkəsinə sürgün edilmişdir. 1880-ci ildə əlahəzrətin mərhəməti sayəsində polis nəzarətindən azad edilmişdir. Bundan sonra onun Tiflisə qayıtmasına icazə verilmişdir.*

*Sizin 4824 nömrəli məktubunuzu oxuduqdan sonra bu yuxarıda qeyd olunanları yadınıza salıram. Məgər, belə bir adamın seminariyaya gürcü dili müəllimi qəbul edilməsini təhlükəli hesab etmirsinizmi?*

*Knyaz Qaqarin*
*22 sentyabr, 1881"*

Semyonov Tiflis qubernatorunun təliqəsini diqqətlə oxuduqdan sonra Qafqaz maarif müvəkkilinin onun adına yazdığı kağızı nəzərdən keçirdi.

*"Zaqafqaziya müəllimlər seminariyasının direktoruna!*

*Sizin sentyabrın üçündə mənə göndərdiyiniz 554 nömrəli təliqəyə qubernatordan aldığım cavabı Sizə bildirməyi özümə şərəf hesab edirəm. Əvvəlcə Şərqi Sibirdə, sonra isə Orenburq vilayətində sürgündə olmuş Kipianinin Sizin seminariyada gürcü dili müəllimi işləməsini qeyri-mümkün hesab edirəm. Sizin təliqənizi və Kipianinin ərizəsini geri qaytarıram.*

*24 sentyabr, 1881, №1161"*

Bu cavabları alandan iki gün sonra Kipiani onun yanına gəldi. Semyonov məsələnin nə yerdə olduğunu demədi, hələ cavab almadığını söylədi. Kipianinin dodaqlarında istehzalı bir təbəssüm oynadı. Semyonov başa düşdü ki, Kipiani hər şeyi anlayır, ancaq üzə vurmur. Çox böyük səbir və mətanətlə susur. Onun bu qüruru, mənəvi cəhətdən əziyyət çəksə də özünü şax tutması Semyonovun daha da xoşuna gəldi. Kipianini yola saldıqdan sonra maarif müvəkkilinə təkrar müraciət etməyi qərara aldı və bir neçə gündən sonra Tiflisə məktub göndərdi. Nəhayət, belə bir cavab gəldi:

*"Zaqafqaziya müəllimlər seminariyasının direktoruna!*

*Sizin mənim adıma oktyabrın birində göndərdiyiniz 602 nömrəli təliqəyə əsasən yenidən Qafqaz valisinə müraciət etdim və zadəgan Mixail Kipianinin Sizin seminariyada gürcü dilindən dərs deməsinə icazə aldım, bu şərtlə ki, Siz Kipianiyə nəzarət edəsiniz və onun bütün hərəkətlərinin cavabdehliyini öz öhdənizə alasınız. Bütün bunları Sizin nəzərinizə çatdırmağı özümə borc bilirəm.*

*27 oktyabr, 1881, №93"*

Semyonov qovluğu örtüb kənara itələdi. Elə bil otaqda hava çatışmırdı. Köynəyinin yaxasını açdı. Nəfəsliyi itələdi. Sərin, adamı üşürgələndirən bir hava axını içəri doldu. Yarpaqların xışıltısı ilə bərabər çəmən otlarının qoxusu da otağa yayıldı. Kürün o tayındakı balaca dəmiryol stansiyasından kəsik-kəsik fit eşidildi. Semyonov divara dir-

səklənərək, bir xeyli ötüb keçən qatarların yeknəsəq taqqıltısını dinlədi. Qorinin qatı qaranlıqda mürgüləməsi, işıqların tamam sönməsi onu qüssələndirdi. Semyonov səhrada tək qalmış bir qərib kimi yalqızlıq hiss etdi. Vağzaldan ötüb keçən qatarın taqqıltısı getdikcə azaldı, döngələrdə eşidilməz oldu. Onun xəyalı təkər taqqıltısının arxasınca lap uzaqlara getdi. Qafqazı aşdı, Mərkəzi Rusiyanı keçdi və Sibirə doğru yollandı: Semyonova elə gəldi ki, çovğunlu, qarlı Sibirin qalın meşələri arasında tövşüyə-tövşüyə gedən qatarı, vaqonların pəncərələrindən boylanan solğun çöhrələri, əl-qolu qandallı dustaqları, heç nə anlamaq istəməyən, ucu nizəli tüfəngin qundağı ilə dustaqları vurub, söyüş söyən soldatları görür. Bu pəncərələrdən qadınlar, dodaqlarının qanı qaçmış uşaqlar da boylanırdı, aclıq və susuzluq onları taqətdən salmışdı. Külək vıyıldayır, qarı burub-bükür və şüşəsiz pəncərələrdən içəri doldururdu. Semyonov Kipianini, onun uşaqlarını və arvadını həmin vaqonların pəncərəsindən boylananların içərisində təsəvvür etdi. Ona elə gəldi ki, Kipiani gözlərini süzdürüb istehza ilə gülümsünür. Sanki, bu təbəssümlə onu məzəmmət edir və "sənin polis xəfiyyələrindən fərqin nədir, nə üçün mənim haqqımda elə pis şeylər yazdın?" – deyir.

Yaxındakı həyətlərdən birində qanad şaqqıldadı. Tara çıxan xoruz bərkdən banladı. Bu səs Semyonovu uzaq xəyaldan ayırsa da, kişi bir müddət yerindən tərpənə bilmədi. Sahildəki çinarların yarpaqları bərkdən xışıldadı. Səhərin yaxınlaşdığını xəbər verən səba nəsimi pəncərədən içəri doldu. Semyonov nəfəsliyi bağladı. Aralanmış qapıdan yataq otağına nəzər saldı. Yazı masasının üstündəki şamın işığı zolaq kimi çarpayıların üstünə sərilmişdi. Semyonov qapıya yaxınlaşıb uşaqlarının üzünə baxdı. Lidiya anasının qolu üstündə yatmışdı. Sarı, qıvrım saçı daha da pırpızlaşmışdı. Yuxuda da anasının boynunu qucaqlamışdı. O dayana bilmədi. Barmaqlarının ucunda yataq otağına keçdi. Oğlunun, böyük qızının, sonra da arvadının mışıltısına qulaq asdı. Onların bu məsum yuxusuna tamaşa etməkdən ləzzət aldı. "Yəqin bu saat, bəlkə, elə Kipiani də onun kimi dayanıb uşaqlarının mışıltısını dinləyir? Bəlkə də onun özü ağır və şirin yuxuya gedib? Bu saat onu nələr gözlədiyindən xəbərsizdir? Yəqin heç ağlına gətirmir ki, haqqında sorğu-sual gedir. Mən onun barəsində məlumat verməliyəm".

Semyonov uşaqlarının üstünü örtdü. Arvadının yastığını düzəltdi. Üzlərinə işıq düşməsin deyə, qapını çəkdi. Ancaq bir balaca aralı qoydu ki, bir şey olsa eşitsin. Yazı masasının arxasına keçib kağız-qələm

götürdü. Maarif müvəkkilinə cavab yazmağa hazırlaşdı. Qələmi mürəkkəbə batırdı. Məktubun birinci cümləsini yazdıqdan sonra əl saxladı. "Bəlkə mənim yazdıqlarıma inanmadılar? Üstəlik mənim özümü də ittiham etdilər, bəs onda nə olsun? Mən öz həyatımı, uşaqların gələcəyini təhlükə altında qoymarammı? Maarif müvəkkili "bu işlərin bütün məsuliyyəti Sizin öhdənizə düşür" sözlərini nahaq yerə yazmamışdı ki? Elə Kipianini sən özün işə götürdün, görünür, onunla həmfikirsənmiş, – deyə məni də polis idarələrinə çəkə bilməzdilərmi? Bəs mən nə edim, nə cavab yazım?"

Semyonov bu cür tərəddüd içində xeyli dayandı. Dilbilməz, sözanlamaz polisləri gözü qarşısına gətirdi və qələmi mürəkkəbə batırıb qətiyyətlə yazmağa başladı:

"Kirill Petroviç həzrətlərinə!

Siz mənim adıma göndərdiyiniz 40 nömrəli məktubunuza cavab olaraq aşağıdakıları bildirməyi özümə borc hesab edirəm. Mən bizim gürcü dili müəllimi Kipianinin bütün hərəkət və danışıqlarına olduqca ciddi nəzarət yetirmişəm. Mən Kipianinin istər dərsdə, istər yoldaşları arasında, hətta şəxsi söhbətlərində heç bir zərərli fikir söylədiyini eşitməmişəm. Onlar maddi cəhətdən çətinlik çəkdiklərinə görə kasıb güzəran keçirirlər və heç kəsə qarışmırlar. Mən Kipianinin evində yığıncaqlar düzəldib hökumət əleyhinə təbliğat apardığı barədə heç nə eşitməmişəm və belə bir işin olmasına inanmıram. Kipiani seminariyanın ən intizamlı və sevimli müəllimlərindəndir. Tələbələr arasında böyük hörməti var. Öz fənnini ustalıqla keçir. Bütün bunlarla bərabər qeyd etməliyəm ki, aldığım məlumatlara görə, Qoridə axşamlar gürcülər evlərə toplaşaraq, gürcü dilində ədəbi əsərlər oxuyurlar. Bu barədə yerli qəzetlərdə rəsmi məlumatlar belə dərc edilmişdir. Bundan başqa gürcü dili həvəskarlarının nizamnaməsi tərtib edilmiş və qubernatora göndərilmişdir. Mən bütün bu işlərdə təhlükəli bir şey görmürəm. Mən onun hərəkətlərinə nəzarət yetirəcəyimə söz verdiyimi və bütün məsuliyyəti öhdəmə götürdüyümü inkar etmirəm".

Semyonov məktubu bitirib imza etdikdən sonra şamları söndürdü və yataq otağına keçdi. Paltarını soyunub rahatca yerinə uzandı. Ağır yük altından çıxmış adam kimi asudə nəfəs alıb gərnəşdi. Gözünü pəncərəyə zillədi. Artıq dan yeri ağarırdı.

## 5

Onlar dərin sükut içində, asta addımlarla qədim Qori qalasının yerləşdiyi təpəyə yollandılar. Cığırları ot basmışdı. Bəzi yerlərdə qalanın divarından yuvarlanıb düşən daşlar yolu kəsmişdi. Kipiani azacıq axsadığından dalda qalır, bir az irəlidə gedən Əhməd tez-tez dayanıb onu gözləməli olurdu. Nəhayət, qala divarına yaxın bir yerdə, otları azacıq saralmış göylükdə oturdular. Kipiani dərhal pencəyini çıxardıb yerə atdı və arxası üstə uzandı. Əhməd isə gözünü üfüqə zillədi. Qarşıdakı dağlar baş-başa vermişdi. Meşənin ətəklərində kəndlər, bir az bəridə isə vağzal görünürdü. Göytəpənin yanında burulğanlı və hikkəli olan Kür burada quzu kimi sakit idi. Liaxva çayı ilə birləşəndən sonra belə halını dəyişmir, çəmənliyin ortası ilə qıvrıla-qıvrıla axırdı. Çayın vadisində suya yaxın yerlər yamyaşıl olsa da, ətraf saralmışdı. Əhməd xeyli üfüqlərə qədər uzanıb gedən sulara baxdıqdan sonra üzünü qayalara tərəf çevirdi. Gözünü saralmış daşlara, uçuq-sökük yerlərə, hörgülərin arasında bitən quru otlara zillədi. Hər şey beləcə dəyişir, dağılıb sökülür və köhnəlirdi... Onlar da belə idilər. Peterburqda ilk dəfə tanış olduqları zaman Kipianinin üzünə ülgüc dəyməmişdi. Elə Əhmədin özünün də bığ yeri yenicə tərləmişdi. Onlar Peterburq ali məktəb tələbələrinin gizli yığıncaqlarına birgə gedir, birgə də nümayişə, küçəyə çıxardılar. O zaman tələbələrin ən çox sevdiyi və pərəstiş etdiyi adamlar dekabristlər idi. Heç nədən qorxmurdular. Hətta bəzən gənclik ehtirası və marağı ilə nə isə tezliklə bir iş görməyi, çevriliş etməyi, həbsxanalara, zindanlara belə düşməyi arzu edirdilər. Onlarda həm coşqun bir ədalət hissi, həm də gəncliyə xas olan macəraçı bir cəsurluq vardı. Lakin tələbələrin bu coşqunluğu uzun sürmədi. Xəfiyyələr dərnəklərin gizli fəaliyyətindən xəbər tutdular, uşaqların bəzilərini həbs etdilər, qalanlarını isə məktəbdən qovdular. O zaman Kipiani ələ keçdi. Əhmədi isə məktəbdən xaric etdilər. Aradan illər ötdü. Dostlar indi təsadüfən Qoridə görüşdülər. Kipiani yorğun və məhzun kimi görünürdü. Deyəsən, əvvəlki coşqunluqdan əlamət qalmamışdı. Yoxsa onun qürurunu sındırmışdılar? Yoxsa sürgün illəri onun iradəsini sarsıtmışdı? Məgər Əhməd özü də dəyişməmişdimi? O da ağır və təmkinli olmamışdımı? Bəlkə də bunlar acizlik və qorxaqlıq əlaməti idi? Bəlkə də ağır maddi vəziyyət, arzuların ilğım kimi əlçatmazlığı onları süstləşdirmişdi? Bəlkə Kipiani taleyinə boyun əyərək ömrünü başa vurmaq istəyirdi?

Kipiani də eyni ilə bu cür düşünür, Əhmədi gözaltı süzüb, söhbəti hardan başlayacağını müəyyənləşdirirdi. Onun deməyə sözü çox idi. O bilmək istəyirdi ki, Əhməd təkdirmi, keçmiş yoldaşlarından kiminlə əlaqəsi var? Yenə əvvəlki əqidəsindədirmi? Yoxsa gənclik xəyallarından uzaqlaşmışdır?

Kipiani durub oturdu. Ayağının ucundakı daşı götürüb atdı. Daş əvvəlcə astadan, sonra isə sürətini artırıb dərəyə dığırlandı. Əhməd də gözünü daşa zillədi.

– Sən bilən bizim dərnəyimiz nə üçün tez dağıldı?

– Çünki, istinad nöqtəsini tapmadan Yer kürəsini özülündən oynatmaq istəyirdik.

Kipiani qaşlarını dartdı. Təəccüb və maraq dolu baxışlarını müsahibinin üzünə zillədi:

– Nəyi nəzərdə tutursan?

– Şüurların oyanmasını.

– Şüurların oyanması müxtəlif cür ola bilər.

– Mənə ədalət və vicdanla dolu şüur lazımdır.

– Bu mücərrəd oldu.

– Nə üçün?

– Çünki ədalət və vicdan məfhumu nisbidir.

– Bilirəm, sən yenə sinfi təfriqədən danışacaqsan.

– Bəs necə?

– Mən milləti parçalayıb qarşı-qarşıya qoymağın özünə şübhə ilə baxıram. Ehtiraslar qızışıb keçəndən sonra baş verə biləcək peşmançılıq məni dəhşətə gətirir.

– Bəs təklifin nədir?

– İnsanların şüurunu oyatmaq, vicdanı hərəkətə gətirmək bizim birinci vəzifəmizdir. Gərək bu sahədə hər bir kəs öz millətinə kömək eləsin.

– Bəs millətlərin həmrəyliyi?

– Bunlar bir-birinə mane olmur. Zənnimcə, gərək əvvəlcə millətin özünü oyadasan. Əgər bir xalq özünü dərk edə bilmirsə, ləyaqət və qüdrətini anlamırsa, nə özünə, nə də başqalarına kömək edə bilər.

Kipiani susdu. Gözləri yol çəkirmiş kimi fikirli-fikirli dostunun üzünə baxdı. Qəlbində ona qismən haqq verdi. Əslinə baxsan, onun özü də bu yolla gedirdi. Seminariyaya dərs deməyə də bu məqsədlə gəlmişdi. O çalışırdı ki, tələbələrinə azadlıq ruhunu aşılasın. Onları qürurla yaşamağa, ədalət və haqqı müdafiə etməyə alışdırsın. Onun ən

çox nifrət etdiyi hiss zülmə boyun əyməyi təbliğ edən mütilik fəlsəfəsi idi. İnsanı insanlıqdan uzaqlaşdıran, qorxaq və aciz bir varlığa çevirən bu fəlsəfənin düşməni olan Kipiani Əhmədin sözlərini eşitdikdə sevindi. Demək, onlar ən ucqar yerlərə səpələnsələr belə, amallarından dönməyiblər. Bir qığılcım kimi parıldayırlar. Lazım olarsa, alovlanmağa hazırdırlar. Əhməd öz mülahizəsində millətə, öz xalqına köməyi ön plana çəkirdi. Bəlkə indiki vəziyyətdə bu fikir daha doğru idi? Bəlkə kiçik millətlər, sayca az olan xalqlar əvvəlcə birləşməli, inkişaf etməli, yüksək şüurlu bir vəziyyətə gəlməlidirlər? Onların daxili ziddiyyətlərini qabartmaq o qədər də məqsədəuyğun deyil?

– Sən millətə kömək üçün hansı yolu əsas götürürsən?

– Maarifi. Əvvəlcə buradan başlamaq lazımdır. Elmi, mədəniyyəti artırmaq lazımdır. Hər millətin özünün düşünən beyni olmalıdır. Elə adamı olmalıdır ki, millətin sabahını görə bilsin. Millətinə başçılıq etməyi bacarsın, onu zamanın dolaşıq və çalpaşıq yollarından salamat çıxartmağı bacarsın.

– Mən sənə şərik. Lakin de görüm, belə bir şəraitdə dediyin adam yetişə bilərmi?

– Çətin.

– Demək, mənim fikrimi təsdiq edirsən ki, bununla kifayətlənmək olmaz. Nə isə daha ciddi bir iş görmək lazımdır. Nə isə dəyişməlidir. Nəyi isə vurub dağıtmaq lazımdır.

Əhməd gülümsündü. Bir az bundan əvvəl Kipiani haqqında nə qədər yanlış fikrə düşdüyünü anladı. Demək, o, ömrünü sakitcə başa vurmaq istəyənlərdən deyildi. O, yenə əvvəlki kimi döyüşməyə hazır idi. Onun sifətindəki süstlük və yorğunluq fəaliyyət üçün geniş meydan tapa bilməməsindən idi.

– Görünür yenə tələsirsən, əziz dost. Gərək şəraitlə də hesablaşasan. Bu saat biz tam hüquqsuzuq. Qubernatorun biri Bakıda əyləşib, biri də Tiflisdə, ətrafında da kazakları. Hər şeyi nəzarət altına alıblar. Ucqar bir kənddə balaca bir məktəb açmaq üçün gərək birbaş padşahın özünə yazasan. Onun icazəsi olmadan bir daşı da yerindən tərpədə bilməzsən. Hünərin var, bir balaca əl-qolunu tərpət, o saat siyirməqılınc töküləcəklər üstünə.

– Demək, burada fikrimiz birləşir. Onlar bizi dili-ağzı bağlı hala salmaq istəyirlər. İradələrinə tabe olmayanları isə silahla qorxudur, ya qandallayıb Sibirə göndərir, ya da el-obasından qaçaq salırlar. Sən də deyirsən bunlara dözək.

– İstəsən də dözə bilməzsən.
– Bəs nə edək?
– Ordu toplamaq lazımdır.
Kipiani yerində dikəldi. Təəccüblə Əhmədin üzünə baxdı. O çox sakit idi. Lakin onun son sözü bir az bundan əvvəl dedikləri ilə düz gəlmirdi.
– Niyə təəccüb edirsən? – deyə Əhməd dostunun çiynini qucaqladı. – Məgər sənin dərs verdiyin uşaqlar bir ordu deyilmi? Aleksey Osipoviç kəndbəkənd, şəhərbəşəhər gəzib ordu toplamırmı? Mənim gətirdiyim ayaqyalın, yamaqlı uşaqlar həmin ordunun əsgərləri olmayacaqlarmı? Niyə susursan? Məgər bunlar gələcəkdə böyük bir maarif ordusu olmayacaqmı?
Kipiani gülümsünüb çiynini çəkdi:
– Yenə əvvəlki kimi xəyalpərvər və şairanəsən.
– Xəyal olmasa, adamın qüssədən ürəyi partlayar. Bir də, mənim xəyalım real xəyaldır. Bir təsəvvür et, biz bu uşaqların qəlbində məşəl yandırsaq, həmin məşəllər hər yerə səpələnsə, yurdumuz çıraqbana dönər.
– Əgər çar kazakları onları vaxtından əvvəl söndürməsə.
Bu dəfə Əhməd dinmədi. Dostunun sifətindəki kədər ona da sirayət etdi. Bir anlığa olub-keçənləri, Göytəpə kəndini, axır vaxtlar kazakların tez-tez atlanıb gəlməsini, meşəni qoruğa çevirmələrini, camaatı sıxışdırmalarını xatırladı. Kür sahilindəki son toqquşmanı yadına saldı. Nədənsə Cahandar ağa bütün əzəmət və qəzəbi ilə gözünün önündə dayandı. Elə bil onun tunc kimi bozarmış sifətini, qan sağılmış gözlərini, qıllı çatma qaşlarını və həmişə tüfəngin tətiyində oynayan barmaqlarını gördü. Elə bu an Molla Sadığın təsbehinin şaqqıltıları da qulağında səsləndi. Elə bil müridlər onu bürüdülər. Əhməd qeyri-ixtiyari qara damları, Qoca kişinin güzəranını, uşaqları yola salmağa gələrkən sahilə toplaşan kənd adamlarını yadına saldı. Osmanın anası oğlunun ayağına çarıq da tapmamışdı. Sinəsinə döyüb ağlamaqdan başqa əlindən heç nə gəlmirdi. Vəziyyət çox çətin və qarışıq idi. Biri kənddə ağalıq edir, o biri isə doyunca quru çörək də tapmırdı. Bəlkə Kipiani düz düşünürdü? Belə vəziyyətdə hansı birlikdən danışmaq olardı?
Qalanın kölgəsi uzanıb onların üstünə düşmüşdü. Kürün suyu qızarmışdı. Ləpələr pullu balıq kimi işıldayırdı. Vadidə mal-qara otlayırdı. Uşaqlar sahil boyu at çapırdılar.
– Gedəkmi?

Ayağa durdular. Gəldikləri kimi də cığırla asta-asta aşağı endilər. Şəhərin tozlu küçələri ilə dinməzcə irəlilədilər. Əhməd sabah yola düşməli idi. Onun gətirdiyi uşaqları seminariyaya qəbul etmişdilər. Bir həftədən çox idi ki, dərs keçirdilər. Direktor da, Çernyayevski də Əhməddən razı qalmışdı. Əhməd sevinirdi. Bir də ona görə ki, köhnə dostu Kipianiyə rast gəlmişdi. İndi o tək deyildi. Həmişə əlaqə saxlayacaqdılar. O, Tiflisdə də bir neçə gün qalmalı idi. Maarif müvəkkilini görməli, Göytəpədə təzə məktəb binası tikilməsi üçün sərəncam almalı idi. Çernyayevski özü bu işə qarışmışdı. İcazə vermişdilər. İndi bu məsələni rəsmiləşdirmək lazım idi.

Yataqxananın bərabərində uşaqları görüb ayaq saxladılar. Osmanla Səlim tanınmaz olmuşdu. Onların başında furajka var idi. Pencəklərinin düymələri və toqqaları parıldayırdı. İkisi də bir qaydada geyinmişdi. Çəkmələrini silib işıldatmışdılar. Seminarist libası onlara yaman yaraşırdı. Əhməd cəmi bir neçə gün bundan əvvələ qədər əyinləri təzə paltar tanımayan bu uşaqların sevincinə şərik oldu. Osman indi daha şən görünürdü:

– Əhməd lələ, kəndə nə vaxt qayıdırsınız?

– Sabah. Sözünüz var?

Osman cavab vermədi. Qaça-qaça yataqxanaya getdi və beş dəqiqə keçməmiş, əlində bağlama, geri qayıtdı.

– Deyəsən, anana sovqat göndərirsən?

Osman köksünü ötürdü və sirli adamlar kimi Əhmədin qolundan yapışıb kənara çəkdi:

– Əhməd lələ, inciməyin, əziyyət də olsa, bunu anama çatdırın. Atamın çuxasıdır. Gələndə zorla vermişdi. İndi görürəm lazım olmayacaq, məktəbdən hər şey verəcəklər. Anama de, qoy sandıqda saxlasın.

– Bəs o nədir?

– Bu da çarıqdır. Onu da əmimə çatdırarsınız. Axı onun özünün ayağı yalın idi.

Əhməd bu çarıqları Qoca kişinin Osmana necə verdiyini yaxşı xatırlayırdı. Kişinin yalın ayağı, suda çox olduğundan ağarıb qırışmış barmaqları indi də gözünün qabağında idi. Elə gəmi ilə keçəndə Əhməd başa düşmüşdü ki, bu çarıqları Qoca kişi özünə tikib, ancaq qardaşı oğlunu ayaqyalın görəndə ürəyi dözməmişdi, uşağa qıymamışdı. Osmanın bu cür həssaslığı Əhmədin qəlbini riqqətə gətirdi. Bağlamanı aldı. Uşağın kövrəldiyini hiss etdi. Bir az keçsə onun gözləri yaşla dolacaqdı. Əhməd söhbəti dəyişmək üçün araya söz saldı:

– Yeriniz necədir?

Osman dikəldi, əlinin dalı ilə gözünü silib gülümsündü:

– Lap yaxşıdır. Təzə çarpayı və əməlli-başlı yorğan-döşək veriblər, amma yata bilmirəm.

– Niyə?

Səlim gülə-gülə söhbətə qarışdı:

– Qorxur ki, yıxılsın.

– Axı neyləyim, evdə bişməyib, qonşudan gəlməyib, bir balaca tərpənəndə elə bilirəm çarpayı altımda yatacaq.

Uşaqlar gülüşdülər. Kipiani Osmana yaxınlaşıb əlini onun çiyninə qoydu:

– Eybi yoxdur, öyrəşəcəksən.

Əhməd xeyli söhbətdən sonra onlarla xudahafizləşdi və Kipiani ilə birlikdə yataqxanadan uzaqlaşdı.

Evə çatdılar. Ev sahibi qabağa keçdi. Qapını açdı. Əhmədi içəri dəvət etdi. Mənzil yarıqaranlıq idi. Kipiani pəncərənin taxtasını açdı. Otağa işıqla bərabər yaxınlıqdan axan Kürün şırıltısı doldu. Sərin hava vurdu. Əhməd evi nəzərdən keçirdi. Küncə yazı stolu qoyulmuşdu. Divara nimdaş gəbə vurulmuşdu. Orta stolun üstündəki müşəmbəli örtük bir neçə yerdən bıçaqla kəsilmişdi. Mürəkkəbdən ləkə-ləkə idi. Sağ tərəfdə bir qapı var idi. Deyəsən, qonşu otağa açılırdı.

Kipiani otaqda bir xeyli fırlandı. Bir neçə dəfə dəhlizə çıxdı, çay qaynatdı, süfrəni səliqəyə saldı, yemək gətirdi, üz-üzə oturdular.

– Təksənmi?

– Yox.

– Bəs uşaqlar...

– Kəndə göndərmişəm.

Kipiani özünə şərab tökdü. Əhməd çayı qabağına çəkdi.

– Bəs sən?

– Təkəm.

– Saçlarına dən düşüb.

– Bilirəm...

Əhməd qurtum-qurtum çayını içdi. Gözaltı dostuna baxdı. Onun da saçlarına dən düşmüşdü.

– Deyəsən, qocalırıq.

– Elə məni darıxdıran da odur. Ömür keçir, heç nə edə bilməmişik.

– Səbir lazımdır.

Otağa qaranlıq çökürdü. Kipiani durub çırağı yandırdı. Əhməd ev sahibinin sıxıldığını hiss etdi. Getmək istədi.

– Yox, bu gecə bizdə qalacaqsan; həm də səni dostlarımla tanış edəcəyəm. Bir azdan gələcəklər.

Əhməd dostunun mənalı gözlərinə baxdı. Dodaqları astadan tərpəndi:

– Yoxsa...

– Bəli. Dərnəyimiz işləyir.

**6**

Cahandar ağa atı tövlədən çıxardıb talvarın altına gətirdi. Sağrısını, yalını sığalladı. At astaca oxranıb kişini iylədi, qulaqlarını qırpıb dayandı. Cahandar ağa dərindən köksünü ötürdü və yəhəri atın belinə qoydu. Qarınaltı qayışları möhkəm çəkdi, üzəngini, yüyəni yoxladı, dal tərəfə keçib atın quyruğunu düydü. At pis ata oxşamırdı. Boynu gözəl, qaməti uca idi. Dərisinin rəngi tünd-qırmızı idi. Bəzi yerləri şabalıdı rəngə çalırdı. Qaçmağı da pis deyildi, ancaq Cahandar ağanın ürəyinə o qədər də yatmırdı. Nə qədər çalışırdısa da, Qəmərdən sonra bu ata isnişə bilmirdi. Elə bil at da bu soyuqluğu duyurdu. Sahibini görəndə Qəmər kimi çəçiyi ilə yeri eşib kişnəmir, şahə qalxıb oynaqlamırdı. Bu atla Qəməri müqayisə etmək olmazdı. Qəmər elə bil başa düşürdü, sevincini, kədərini bildirir, lal baxışları ilə sahibinin ürəyindən keçənləri oxumaq istəyirdi.

Cahandar ağa atın ətrafına bir də dolandı, sonra sakit addımlarla evə doğru getdi. İçəri girib divardan asdığı tüfəngini götürdü, çalın-çarpaz bağladı. Ağ yundan toxunmuş qotazlı başlığını göy buxara papağının üstündən geyib boynuna doladı. Xəncəri yana çəkdi. İçəri gəldiyi kimi də sakit addımlarla getmək istədi. Ancaq qapıya yaxınlaşanda ayaq saxladı. Dönüb geri, otağa baxdı, gözünü divara vurulmuş xalçaların üzərində gəzdirdi. Tavandan asılmış otuzluq çırağa, baş tərəfdə divara mıxlanmış qollu-budaqlı iri maral buynuzuna baxdı. Qoşa taxtı, döşəkcələri, zər baftalı, qotazlı mütəkkələri gözdən keçirtdi. Elə bil evindəki hər şeyi görmək, onları hafizəsində həkk etmək istəyirdi. Özü də hiss etmədən köksünü ötürdü. Darağı tüfəngin xəzinəsinə basdı. Çaxmağı hərləyib şaqqıldatdı, dabanı üstə fırlanıb otaqdan çıxdı. Həyətdəkilərin üzünə baxmadı. Əli qoynunda, təlaş və təşviş içində

dayanıb gözünü ona zilləyən Məleyi görmədi. Qonşu otaqda pərdəni azacıq aralayıb gözündən bulud kimi yaş tökən Salatın tərəfə dönüb baxmağı ağlına belə gətirmədi. Ağır, lakin qəti addımlarla talvara yaxınlaşıb atı kənara çəkdi. Quş kimi sıçrayıb yəhərə qalxdı. Yüyəni qəsdən dartdı. At sahibinin iradəsinə tabe olub dal ayaqları üstə qalxdı və yuxudan ayılmış kimi yəhərin altında oynadı. Yorğa yerişlə doqqaza sarı yollandı. Darvazaya çathaçatda qanad şaqqıldadı. Cahandar ağa qeyri-ixtiyari dönüb geri baxdı. İri, kəkilli sarı toyuq tara çıxıb hövllə qanadlarını şaqqıldadırdı. Kişi təəccüb etdi. Toyuq birdən boğazını irəli uzadıb xoruz kimi ucadan banladı. Cahandar ağanın bədənini soyuq tər basdı, iri həbəşi dodaqları kipcə bağlandı. Qızarmış gözlərinə qan sağıldı. Tüfəngi hərləyib tətiyi çəkdi. Qanadını çırpıb bir də banlamaq istəyən toyuq yumaq kimi havaya qalxıb çəpərin o üzünə düşdü. Lələkləri göydə oynadı. Cahandar ağa atın boynuna yataraq dördnala çapdı. Kənddən aralanıb Kürün sahilində görünməz oldu.

Hava tutqun idi. Çöllər çoxdan bozarmışdı. Dəmyələrdəki kövşənlərə od vurulduğundan, düzənlər, təpələr ala-tala olmuşdu. Elə bil əkin yerlərinə əyrim-üyrüm qara zolaqlar çəkmişdilər. Meşə də bomboz idi. Qovaq ağacları saralmış yarpaqlarını tökmüşdü. Sahildəki cələ də çılpaqlaşmışdı. Kür isə yenə əvvəlki kimi burula-burula axır, aşağılarda şaxələnib vadisini genişləndirirdi.

Cahandar ağa atı xeyli çapdıqdan sonra cilovu çəkdi, qutusunu çıxardıb papiros eşdi. Yandırdı. Sümürməyə başladı. Kişinin sinəsi körük kimi qabarıb boşaldı. Burun pərələrindən fısqırıb çıxan bozumtul tüstü layları onun sifətini görünməz etdi. Bu boz-bulanıq tüstü dumanı arasında közərən papirosun işıltısı getdikcə gücləndi. Cahandar ağa papirosu sümürdükcə az qalırdı ki, müştüyü tənbəki qarışıq çeynəyib udsun. Onun əlləri titrəyirdi. Elə bil sinəsini basıb sıxırdılar, nəfəsi darıxırdı. "Səhər-səhər bu toyuq niyə banladı? Yola çıxdığım yerdə bu nəhs əlamət nəydi? Yoxsa evimizin başında bir qaranlıq var? Axı deyirlər toyuq banlayanda bədbəxtlik üz verir? Görəsən indi nə olacaq? Yoxsa mənim özümün başına bir iş gələcək?" Cahandar ağa titrəyən müştüyə baxdı. Hiss etdi ki, əlləri də əsir. "Mənə nə olub? Yoxsa canımdan qorxuram? Atalar deməyibmi ki, bir ovuc qanından qorxan namərddir? Bəs niyə ürəyim döyünür?"

Bu gün hər şey həll olunmalı idi. Özü də təkbətək, qabaq-qabağa. Cahandar ağa onu çox axtarmışdı. Neçə dəfə kəndə gizlicə adam yollayıb, Allahyarın yerini öyrənmək istəmişdi. O isə yağlı çörəyə dönüb,

yoxa çıxmışdı. Şəhərə qaçıb gizlənmişdi. Cahandar ağa and içmişdi ki, düşmənindən intiqam almayınca camaat içinə çıxmayacaq. Beləliklə, düz iki ay gözləmişdi. Evdəkilərin üzünə baxmamış, ağzı üstə döşənib yatmışdı. Dünən isə ona xəbər vermişdilər ki, Allahyar gəlib. Cahandar ağa bir gün də gözləyib onu arxayın saldıqdan sonra yola düşməyi qərara almışdı. O özü ilə heç kəsi götürməmişdi. Fikri təkbaşına, mərd-mərdanə döyüşmək idi. Onu bircə şey qorxudurdu: düşmənindən əvvəl ölmək!

Cahandar ağa papirosu dalbadal sümürüb atdı. Kəhəri mahmızladı. At yerişini artırıb cələni ortadan iki bölən cığırla irəlilədi. Yarğanların dibi ilə xeyli getdi. Cahandar ağa özünü sakitləşdirmək üçün papirosu papirosun oduna yandırdı. At döngələri burulub dikdirə çıxdı. Uca yarğanın qaşında fınxırıb dayandı. Kişi fikirdən ayrılıb gözünü Kürə zillədi. Su boz-bulanıq idi. Sahil boyu mal-qara otlayırdı. Bir az bəridə atlar gəmirişirdi. Bir dəstə qız cığırla suya enirdi.

Kişi gözünü axar suya zillədi. Mələyi götürüb qaçdığı yerin bərabərində bir gəlin dizə qədər suya girmişdi. O da eynilə Mələk kimi donunu bürmələyib paçasının arasına yığmışdı. Deyəsən, soyuq suyun təmasından ləzzət alırdı. Dönə-dönə ovuclayıb üzünə çırpırdı. Cahandar ağa bir anlığa hər şeyi unutdu. Ona elə gəldi ki, aradan aylar keçməyib, illər dolanmayıb: suda yuyunan elə Mələkdir. O bu saat atı çapıb irəli cumacaq, gəlinin biləyindən yapışıb, yəhərin qucağına alacaq və birbaş Kürü yarıb o tərəfə keçəcəkdir.

Kişi yaxasını açıb sinəsi dolusu nəfəs aldı. Gözünü Kürün şaxələnmiş qollarına zillədi. Elə bil su yorğunlaşmışdı. Həmişəki kimi qıjıldayıb kükrəmir, sahilə çırpıb yarğanları oymur, əksinə, qayalara toxunan kimi ağır-ağır geri çəkilirdi. Meşə də yuxulu kimi idi. Hər şey süstləşmişdi. Cahandar ağanın qəlbində bircə an bundan əvvəl baş qaldıran gənclik coşqunluğu yox oldu. Suda üzünü yuyan gəlin də, sahildə mal otaranlar da, Mələk də yadından çıxdı. Ürəyində bir ağırlıq, beynində yorğunluq hiss etdi. Hər şeyi unudaraq Kürün sakit qıjıltısına qulaq asdı. Kimsə bu qıjıltıya həmahəng şəkildə astadan, ancaq yanıqlı-yanıqlı oxuyurdu:

Titrəyir əllərim, tor görür gözüm,
Mənmi qocalmışam, ya zəmanəmi?
Dolaşmır cahanda söhbətim, sözüm,
Mənmi qocalmışam, ya zəmanəmi?

Tutulur məclisdə igidin yası,
Kar görmür qılıncı, polad libası,
Gəlib bic əyyamı, namərd dünyası,
Mənmi qocalmışam, ya zəmanəmi?

At, sahibinin yüyəni boşaltdığını hiss edib, cığırla sahilə endi. Cilovu dartıb suya girdi. Cahandar ağa ona mane olmadı. Doyunca, şorultu ilə su içməsinə imkan verdi. Özü də yenidən papiros eşib yandırdı. Yenə mahnıya qulaq asdı:

Belə zaman hara, qoç igid hara,
Mərdləri çəkirlər namərdlər dara.
Baş əyir laçınlar, tərlanlar sara,
Mənmi qocalmışam, ya zəmanəmi?

Onun iri, həbəşi dodaqlarında təəssüf qarışıq bir məyusluq duyulurdu. Kişi uşaq kimi dərindən köks ötürdü. Mahnının sözlərini astaca təkrar etdi: "Mənmi qocalmışam, ya zəmanəmi?"

Sahildə ayaq tappıltıları eşidildi. Bayaq gəmirişən atlar bir-birini qovub Kürə tökülüşdü. Cahandar ağanın da atı başını qaldırıb bərkdən kişnədi və yüyəni çeynədi. Kişi elə bil yuxudan ayıldı. Papirosu sümürüb bir-iki nəfəsə qurtardı və cilovu dartıb sudan çıxdı. Kəhərin başını qanırıb qarşıdakı kəndə doğru çapdı... Cahandar ağanın özünə acığı tutdu. Axır vaxtlar tez-tez zəiflik etdiyinə görə ürəyində özünü danladı. Elə bil birdən-birə onu dəyişdilər. At kəndin arasına girəndə o, başlığını bir az da möhkəm doladı. Tüfəngi yəhərin qaşından götürdü. Çaxmağı hərləyib gülləni lüləyə verdi. Barmağını tətikdən çəkmədi. At əyri kənd yollarına buruldu, döngələrdən keçdi. Ətrafı çəpərli iri bir darvazaya çatanda Cahandar ağa cilovu birdən-birə dartdı. At yerində fırlanıb dayandı. Cahandar ağa darvazanın arasından həyətə baxdı. Cod, bir qədər də heybətli səslə dilləndi:

– Ay ev yiyəsi?!

İtlər hürüşdü. Cahandar ağa barmağı tətikdə, gözünü qapıya zillədi. Əvvəlcə nökərlər, sonra da Allahyar özü həyətə çıxdı. Elə bil Cahandar ağanın içərisində bir şey şişib partladı. Onun beynini, sinəsini daxildən sıxdılar. Ürəyi az qaldı köksünü partladıb çıxsın, daxili gərginlikdən qulaqları ağrıdı. Cahandar ağa fərqinə varmadan tüfəngi dərhal üzünə qaldırdı. Allahyar səksəkəli halda darvazaya yaxınlaşdı:

– Kimsən?

Cahandar ağa onun yaraqsız olduğunu və heç nədən şübhələnmədiyini görüb tüfəngi aşağı saldı.

– Kişi kişinin qabağına belə çıxmaz. Get atını yəhərlə, tüfəngini götür.

Bu sakit, güclə seziləcək dərəcədə titrəyişli və amiranə səs Allahyarı diksindirdi. O indiyə qədər göydə axtardığı adamın öz ayağı ilə qapıya gəldiyinə sevindi və hər şeyi unudaraq irəli atılmaq istədi. Ancaq əliboş olduğunu görüb ürəyində özünü danladı. Hirsindən dişini-dişinə sıxıb dayandı. Onun bu halı Cahandar ağanın gözündən qaçmadı:

– Tez ol!

Allahyar tərəddüd içində dayandı. Cahandar ağa hiss etdi ki, düşmən qorxur, geri dönməyə, ona arxasını çevirməyə cürəti çatmır. Cahandar ağa çaxmağı hərlədi. Tüfəngin dabanını açıb xəzinədəki gülləri boşaltdı və Allahyarın ayağının altına atdı.

– Qorxma, arxadan vurmaram.

Allahyar addım-addım geri çəkildi. Bayaqdan söhbətə qulaq asan nökərlərdən biri atı tövlədən çıxartdı. Allahyar evə girdi. Bir göz qırpımında evdən güllə kimi çıxıb atın belinə atıldı. Tüfəngi hərləməyi ilə tətiyi çəkməsi bir oldu. Darvazanın taxtası deşildi. Qəzəbdənmi, yoxsa qorxudanmı, nədənsə var səsi ilə bağıraraq, atı darvazaya doğru çapdı.

Cahandar ağa çiyninin göynəməyinə fikir vermədi. Atı çəpərin üstündən sıçradıb həyətə düşdü. Qolu ağrısa da, birtəhər nişan aldı, düşmənindən qabaq tətiyi çəkdi. Allahyarın tüfənginin qundağı parçalandı. At təntiyib kişnədi. Cahandar ağa bir göz qırpımında onun üstünü aldı. Xəncəri siyirməsinə macal vermədi. Barıt tüstüsü, qorxunc, heybətli səslər və it zingiltisi bir-birinə qarışdı. Cahandar ağa qoca bir qarının dizinə döydüyünü və həyətin ortasında vurnuxub ağladığını gördü. Əl saxladı. Onun boğuq səsi yenidən eşidildi:

– Arvad-uşağı qorxutma, həyətdən çıx.

Atlar baş-başa dayandılar. Sahibləri kimi nəfəsləri bir-birini vurdu. Birdən Allahyarın xəncəri göydə parıldadı. Cahandar ağa bir azca gec tərpənsəydi, çiyni üzüləcəkdi. Ancaq o, Allahyarın biləyini havada tutub qanırdı. Atlar bir xeyli dövrə vurdular. Cahandar ağa var gücü ilə ayağını üzəngiyə basıb Allahyarı yəhərdən araladı və yerə saldı. Özü də atılıb düşdü. Allahyar səndirlədi, sonra özünü tarazlayıb durdu. Dalı-dalı çəkilib darvazaya yaxınlaşdı. Cahandar ağa ağrıdan bir çiyni üstə əyilərək irəlilədi və onu darvazaya sıxışdırdı. Allahyar tərpənə bilmədi. Kürəyini qapıya söykəyib dayandı. Gözlər bir-birinə sancıldı. Bir neçə saniyə beləcə dayandılar. Ancaq Cahandar ağaya elə gəldi ki,

aradan illər keçdi. Üzünə zillənmiş gözlərdə qəzəb, nifrət qarışıq bir məzlumluq vardı. Allahyar elə bil onu məzəmmətləyirdi. Lakin bu hal çox çəkmədi. Şimşək kimi çaxıb keçdi və Allahyar sıçrayıb irəli atıldı. Cahandar ağa tətiyi çəkdi.

Allahyar qıvrıldı. Özünü tarazlayıb qamətini düzəltdi. Hədəqədən çıxmağa başlayan gözlərini Cahandar ağanın üzünə zilləyib irəli yeridi. Cahandar ağa tətiyi bir də çəkdi. Allahyar yıxılmadı. Addımladı. Kişi geri çəkildi. Üstünə gələn adamın zəhmi onu basdı. Bədəni çim tərə batdı. Çaxmağı bir də hərlədi. Ancaq gülləni lüləyə verə bilmədi. Allahyarın sinəsi tüfəngə dirəndi. Bir xeyli beləcə üz-üzə dayandılar. Cahandar ağa gördü ki, onun gözləri tərpənmir. Kirpikləri oynamır. Bəbəkləri şüşə kimi soyuq və cansızdır. Ayaq üstə dursa da, çoxdan ölmüşdür. Cahandar ağa ömründə ilk dəfə vahimələnib geri çəkildi. Allahyarın cəsədi kökündən kəsilmiş ağac kimi gurultu ilə yerə sərildi.

**7**

Aleksey Osipoviç çayını təzələyib yenidən dəftərləri vərəqlədi. Əlinə Osmanın yazısı keçdi. Sərlövhəni oxuyan kimi ciddiləşdi. Çaydan bir-iki qurtum içib, stəkanı nəlbəkiyə qoydu. Qələmi qırmızı mürəkkəbə batırdı. İnşa yazısını təkrarən, diqqətlə oxumağa başladı. “Mənim anadan olduğum Göytəpə kəndi Kürün sahilində yerləşmişdir. Ətrafı uca təpəliklərlə əhatə olunmuşdur. Bizim əkin sahələrinin bir ucu qonşu erməni kəndlərinə qədər uzanıb gedir. Qərb tərəfimiz isə Gürcüstan torpağı ilə həmsərhəddir. Kürün hirsli ləpələri az qalır ki, evlərin divarını yalasın. Sol sahildə böyük bir meşə var. Bu meşə Kürün yaxası boyu uzanıb üfüqlərə qədər gedir. Burada hər nə desən tapmaq mümkündür. Kənd uşaqları çox vaxt üzə-üzə Kürü adlayıb meşəyə keçir, almadan, armuddan dərir, tut yeyir, ciblərini alça ilə doldurub geri qayıdırlar. Bizim meşədə yüzillik palıd, fıstıq və qarağaca da rast gəlmək mümkündür. Buranın hələ ayaq dəyib iz düşməmiş qalın yerləri var. Hər axşam-səhər talalarda qırqovul qaqqıldayır, meşə xoruzları banlaşır. Bura səfalı və zəngin ov yeridir. Qışda qazın, ördəyin, yayda, payızda isə turacın əlindən tərpənmək olmur. Qabanlar sürü ilədir, boz ayılara, canavara, çaqqala, tülküyə hər addımbaşı rast gəlmək mümkündür. Kürə su içməyə gələn marallara tamaşa etməkdən adam doymur. Vəhşi heyvanlar və quşlarla zəngin olan bu meşənin içində gözəl çəmənliklər, yamyaşıl talalar var. Bizim göytə-

pəlilər sentyabr ayından ta mayın axırına qədər burada, binədə olurlar. Bu meşənin camaata çox xeyri dəyir. Ancaq indi buranı qoruq ediblər. Atlı kazaklar gecə-gündüz keşik çəkir, heç kəsi yaxına buraxmırlar. Deyilənə görə, buranı Qafqaz valisi böyük knyazdan ötəri saxlayırlar. Onun kefi istəyəndə Tiflisdən buraya ova gələcəkdir. Kim o tərəflərə hərlənsə güllə ilə vururlar. Məgər bu düzdürmü? Kür yanımızdan axsa da, sulu yerimiz yoxdur. Camaat dəmyələrdə taxıl əkir. Bizim qolumuzdan tutan meşə idi, onu da əlimizdən aldılar. Bir parça torpağın həsrətini çəkib qarın dolusu çörək axtaranların halına heç kəs qalmır. Görəsən bu niyə belədir? Axı, deyirlər insanlar bərabərdir. Əgər belədirsə, hamı təbiətin övladıdırsa, nə üçün biri kasıb, o biri varlıdır?"

Aleksey Osipoviç son sətirləri bir də oxudu. Qırmızı mürəkkəblə altından xətt çəkdi. Yavaşca ayağa durub otaqda gəzindi. O, yazı işinə nə qiymət verəcəyindən çox, Osmanın ağlına bu cür fikirlərin haradan gəlməsini bilməyə çalışırdı. Axı, müəllimlərdən heç kəs onlara Fransa maarifçilərindən danışmırdı. Bəs o, Russonun fikirlərini kimdən öyrənmişdi?

Aleksey Osipoviç pəncərənin qabağında dayandı. Seminariyanın həyətinə, sonra müsəlman şöbəsinin yataqxanasına baxdı. İşıqlar sönmüşdü. Ətraf sükuta qərq olmuşdu. Yalnız yataqxana otaqlarının birində, pəncərənin önündə zəif işıq titrəyirdi. Aleksey Osipoviç dönüb çarpayıda yatan arvadına baxdı. Onu yuxudan oyatmamaq üçün ehmalca, barmaqlarının ucunda dəhlizə çıxdı. Paltarını geyinib həyətə düşdü. Asta addımlarla yataqxanaya getdi. "Yoxsa intizam pozulmuşdur. Uşaqlar dərsdən sonra başqa yerlərə gedirlər? Gecələr yataqxanada da olmurlar? Bəlkə onları oxumaqdan ayırıb başqa işlərə cəlb edənlər var?"

Aleksey Osipoviç yataqxananın qapısını açıb sakitcə içəri girdi. Dəhlizdə, pəncərənin qabağında oturub çırağın solğun işığında kitab oxuyan növbətçi tələbəyə yaxınlaşdı. Aleksey Osipoviç onun çiyninin üstündən kitaba baxdı.

– Hamı yataqxanadadırmı?

Növbətçi dik atıldı. Hələ də kitabın təsirindən ayrıla bilmədiyinə görə müəllimin sualına ləng cavab verdi:

– Bəli, cənab inspektor, hamı yatır.

– Gecikən olmamışdı ki?

– Dərnəyə gedənlərdən başqa hamı vaxtında gəlib.

– Nə dərnək?

– Vətənşünaslıq dərnəyi.

Aleksey Osipoviç susdu. O belə bir dərnəyin olduğunu bilirdi, ancaq onların gecə də bir yerə toplaşdıqlarından xəbərsiz idi. Növbətçiyə oturmasını işarə etdikdən sonra içəri keçdi. Uşaqlar şirin-şirin yatırdılar. Pəncərədən süzülüb düşən solğun işıq onların çarpayısının üstündə oynayırdı.

Aleksey Osipoviç ayaq saxladı. Bir xeyli tələbələrin mışıltısına qulaq asdı. Onlar paltarlarını səliqə ilə qatlayıb dolabçaların üstünə qoymuşdular. Bəzilərinin başının altında kitab var idi. Küncdə çarpayı cırıldadı. Uşaqlardan biri sayıqlamağa başladı. Aleksey Osipoviç ona yaxınlaşdı. Sürüşüb yerə düşmüş yorğanı qaldırıb uşağın çiynini örtdü. Pəncərənin bir tayını açıb havanı dəyişdi. Bir xeyli otağın ortasında dayanıb yuxuda belə gülümsünən tələbələrinə baxdı. Hamının yatdığını və öz yerində olduğunu yəqin etdikdən sonra səs salmadan, ayaqlarının ucunda çıxıb getmək istədi. Qapının ağzına yaxınlaşarkən gözü Əşrəfin çarpayısına sataşdı. O, arxası üstə uzanmışdı. Qolunun biri sallanıb yerə düşmüşdü. Aleksey Osipoviç Əşrəfin qolunu ehmalca qaldırıb yorğanın altına qoydu. Başının altındakı yastığı düzəltdi. Qanrılıb getmək istədiyi vaxt ayağının altında bir şey qaldığını hiss edib dayandı. Yerə düşmüş kitabı götürdü və pəncərənin qabağına atmaq istədi. Ancaq saralmış vərəqlər onun diqqətini cəlb etdi. Bir xeyli əlində hərlədikdən sonra işığa yaxınlaşdı. Əzilmiş cildin üstündəki yazıları oxudu. Heyrətlə qaşlarını çatıb sözləri ürəyində təkrar etdi: "Radişşev, Peterburqdan Moskvaya səyahət". O, yerindən tərpənə bilmədi. Elə bu vəziyyətdə, kitab əlində, gözlərini Əşrəfin üzünə zilləyib dayandı. Əvvəlcə onu oyatmaq, bu kitabı hardan aldığını soruşmaq istədi, amma fikrindən daşındı. Keçirdiyi həyəcanı növbətçiyə sezdirməmək üçün jiletinin cibindən zəncirli saatını çıxardıb baxdı və astaca addımlarla dəhlizə yaxınlaşdı. Astanada şlyapasını geyib bayıra çıxdı.

Göyün üzü tərtəmiz idi. Ay şəhərin ortasındakı uca təpənin zirvəsində aydınca görünən qədim Qori qalasının daş qüllələri üzərinə əyilmişdi. Onun solğun işığı qalanın ətrafındakı çınqıllıqların, bəzi yerləri uçub tökülən daş hasarın üzərinə çilənmişdi. Qalanın iri və qalın kölgəsi sürünüb yaxındakı evlərin üstünə sərilmişdi. Aleksey Osipoviç yatmış şəhərin boş küçəsi ilə hara getdiyini özü də bilmədən, fikirli-fikirli irəlilədi. Daş səkilərdə, torpaq yollarda gediş-gəliş azalmışdı. Bu sükutu onun ayaq səslərindən başqa heç nə pozmurdu. "Demək, bu cür qadağan olmuş kitablar bizim seminariyaya da gəlib çıxmışdır. Onu mənim rəhbərlik etdiyim müsəlman şöbəsinin tələbələri də

oxuyurlar. Kim isə onlara dekabristlərdən danışır, onların nə üçün ölümə getdiklərini izah edir. Hətta fransız maarifçilərindən belə mənim tələbələrimin xəbəri var. Belə olmasaydı, Osman öz inşa işində o cür suallar ortaya atmazdı. "Hamı bərabərdir, hamı təbiətin övladıdır". Doğrudan da belə deyilmi? Bəs nə üçün biri kasıb, o biri varlıdır? Məgər mən özüm bunları düşünmürəmmi? Yoxsul kəndli balalarının vəziyyəti mənə məlum deyilmi? Özüm "Qafqaz" qəzetində dəfələrlə çıxış edib kəndli uşaqları üçün pulsuz təhsilə imkan yaradılması fikrini ortaya atmamışammı? Pulsuz məktəb açılmasını və uşaqların tədris ləvazimatı ilə təchiz edilməsini lazım bilməmişəmmi? Bəs Osmanın yazısı, Əşrəfin Radişşevi oxuması məni nə üçün bu qədər həyəcanlandırır? Məgər bizim tərbiyə etdiyimiz uşaqların açıq fikirli olması pisdirmi? Məgər biz onları öz milləti və vətəni üçün yararlı adamlar kimi böyütmək istəmirikmi?"

Aleksey Osipoviç döngəni buruldu. Qarşı tərəfdən əsən sərin meh onun üzünə vurdu. Gözünü qıyıb şəhərin kənarındakı çəmənliyə baxdı. Kürün suyu bu yaşıl düzənliyin ortası ilə qıvrıla-qıvrıla axırdı. Ay işığında onun qırçınlı səthi parıldayırdı. Aleksey Osipoviç köks dolusu nəfəs aldı və lap aşağılarda, baş-başa verib bir-birinin üstünə kölgə salan dağların arasında yox olan sulara baxdı.

Qonşu səkidən ayaq səsləri eşidildi. Aleksey Osipoviç evlərin kölgəsi ilə irəliləyən adamı yerişindən tanıdı. Gələn Kipiani idi. O, şlyapasını alnının üstündən geri itələmişdi. Köynəyinin yaxası ağarırdı. Aleksey Osipoviç onu gözlədi. Kipiani isə fikirli olduğundan onu görmədi. Yanından ötüb keçmək istədi. Aleksey Osipoviç azacıq irəli keçib onu saxladı:

– Axşamınız xeyir, cənab Kipiani, gecə vaxtı hardan gəlirsiniz?

O diksindi. Səksəkəli halda başını qaldırıb qarşısında dayanan adamın üzünə baxdı və Aleksey Osipoviçi tanıdıqdan sonra gülümsündü:

– Axşamınız xeyir, Aleksey Osipoviç, dostlarımın yanına getmişdim. Bəs siz haradan gəlirsiniz?

– Yataqxanadan. Uşaqlara baş çəkirdim.

– Necədirlər, yaxşıdırlarmı?

– Yatışırlar.

– Deyəsən, Sizin də mənim kimi yuxunuz qaçıb.

Onlar yanaşı addımladılar. Kipianinin əsasının taqqıltısı ayaq səslərindən seçilir və boş küçədə daha bərkdən eşidilirdi.

– Yəqin gələn il şöbəniz daha da böyüyəcəkdir.

– Bəli, əlavə bir neçə sinif açmalı olacağıq.

– Böyük işdir, Aleksey Osipoviç, Qori müəllimlər seminariyası bizim Qafqaz xalqlarına çox kömək edəcəkdir.

– Bizim də məqsədimiz qafqazlılara kömək etmək, onlardan milli ziyalılar yetişdirməkdir. Elmli adamlar çox olsa, maarif inkişaf etsə, cəmiyyətdəki ədalətsizlik və haqsızlıqlar da yox olar.

– Siz buna əminsinizmi?

– Bəli. Bəs Siz şübhə edirsiniz?

Kipiani dayandı. Cibindən papiros çıxartdı. Külək kibriti söndürməsin deyə, pencəyinin yaxasını azacıq qaldırıb boynunu qısdı. Papirosunu alışdırdı. Aleksey Osipoviç onun sıx qara saqqalına baxdı. Kipianinin gicgahlarındakı ağ tüklər aydınca göründü. O, papirosu hərisliklə sümürüb bir-iki dəfə dərindən nəfəs aldıqdan sonra müsahibinin sualına cavab verdi:

– Bu, məsələnin yalnız bir tərəfidir. Elm və maariflə hər şeyi həll etmək mümkün deyil. Nə isə daha ciddi bir iş görmək lazımdır.

– Daha ciddi iş deyərkən nəyi nəzərdə tutursunuz?

Kipiani söhbətin gözlənilmədən daha kəskin şəkil aldığını hiss edib dayandı. Mövzunu dəyişdirmək məqsədi ilə gülümsünərək çiynini çəkdi:

– Düzü, bunu heç özüm də aydın təsəvvür edə bilmirəm. Ancaq onu hiss edirəm ki, həyat belə qala bilməz.

– Əlbəttə, qala bilməz. İndi yeni bir dövr başlayır. Elm, maarif inkişaf edir. Bu, insanların şüurunu da dəyişdirəcəkdir. Zənnimcə, bizim tarixi borcumuz da buna xidmət etməkdən ibarətdir.

– Siz haqlısınız, Aleksey Osipoviç, camaatın gözünü açmaq lazımdır. Məktəb və maarif geniş yayılmasa, bu mümkün deyil.

Aleksey Osipoviç hiss etdi ki, Kipiani başladığı mövzunu qəsdən davam etdirmədi. Öz fikrini axıra qədər söyləmədi. Düşündüklərini açıq-aşkar deməkdən çəkindi. Aleksey Osipoviç Semyonova göndərilən məktubu, Kipianinin hərəkətlərinin nəzarət altında olduğunu xatırladı. Xalqçılara qoşulduğuna görə sürgünə göndərilən bu adamın indi də öz əqidəsindən dönmədiyi ona yəqin oldu. Bu ucaboy, arıq adam onun nəzərində daha da böyüdü. Lakin Aleksey Osipoviç onun fikirləri ilə razılaşmırdı. Onun zənnincə, cəmiyyəti yalnız maarifin köməyi ilə islah etmək mümkün idi. Başqa bir yolun olmasına, bunun insanlara xeyir verməsinə Aleksey Osipoviç inanmırdı. Ona görə də Kipiani kimilərinin halına acıyırdı. Bundan başqa, onların öz ideyalarını gənclərə aşılamasına yol vermək istəmirdi.

– Siz dekabristləri xatırlayırsınızmı?

Kipiani bu gözlənilməz sualdan diksindi:

– Necə məgər?

– Onların taleyini unutmamısınız ki?

– Məgər azadlıq qurbanlarını unutmaq olarmı?

– Siz bu cür qurbanlar verilməsini qanunauyğunmu hesab edirsiniz?

– Siz nə üçün mənə bu cür suallar verirsiniz, Aleksey Osipoviç?

– Gələcək taleyinizlə maraqlandığıma görə.

– Məgər mən təhlükəli bir iş görürəm?

– Bəli, həm özünüzü, həm də məktəbi pis vəziyyətə salırsınız. Tələbələrə də lazım olmayan fikirlər aşılayırsınız.

– Sizə...

– Mənə inanın. Sizin yenidən sürgünə göndərilməyinizi istəmirəm.

– Axı, buna əsas yoxdur. Mən qanundan kənar heç bir iş görmürəm.

– Ancaq aramızda olan danosbazlar yuxarılara yazmağa söz tapırlar.

Onlar küçənin döngəsinə qədər susdular. Şəhərin işıqları tamam sönmüşdü. Daxmaların sakinləri yorğun olduqlarından və ala-torandan işə gedəcəklərindən axşamdan qapılarını bağlayıb yatmışdılar. Ətraf sakit idi. Kürün qıjıltısından və sahildəki uca çinarların yarpaq xışıltısından başqa bu sükutu heç nə pozmurdu. Ay lap aşağı enmişdi. Aleksey Osipoviçlə Kipianinin kölgəsi uzanıb alçaq daxmaların üstünə sərilir, bəzən divarların dibi ilə sürünür, bəzən də küçənin ortası ilə irəliləyirdi.

Aleksey Osipoviç tində ayaq saxladı. Yataqxanadan götürdüyü kitabı Kipianiyə uzatdı. O, bir xeyli gözünü Aleksey Osipoviçin üzünə zilləyib tərəddüd içində dayandı. Kitabı tanısa da, götürmək istəmədi.

– Alın, ancaq ehtiyatlı olun.

Aleksey Osipoviç ondan aralandı. Kipiani onun addım səsləri kəsilənə qədər yerindən tərpənmədi

## 8

Əşrəf yuxudan ayılan kimi əlini sinəsinin üstünə apardı. Kitabı tapmadıqda yorğanı atıb yerindən sıçradı. Yastığını qaldırdı, döşəyin altını yoxladı, gözünə heç nə dəymədi. Rəngi kağız kimi ağardı. Çarpayının dörd yanına fırlandı, əyilib aşağı baxdı, pəncərənin qabağını axtardı. “Bu necə ola bilər?” – deyə düşündü. Yoldaşlarını oyatmaq, onlardan bir-bir kitab görüb-görmədiklərini soruşmaq istədi. Ancaq

ürək eləmədi. Axı bu kitabı ona gizlincə vermişdilər, özü də tapşırmışdılar ki, heç kəsə göstərməsin.

Uşaqlar oyanana qədər Əşrəf yataqxananı bir də dolaşdı, gümanı gəldiyi yerlərin hamısını yoxladı. "Mən yerimə uzananda kitab əlimdə idi, axırıncı səhifələrini oxuyurdum. Görünür, yuxu məni aparıb, haçan yatdığımdan xəbərim olmayıb – deyə öz-özünə düşündü. – Kitab əlimdən düşsə yerin içində olardı, ya da çarpayının ətrafında. Bəs bu necə oldu? Yoxsa uşaqlardan biri götürüb? Bəlkə Firidun bilir, axı o bu gecə növbətçi idi?"

Əşrəf dostunun yanına qaçmaq və itirdiyi kitabı ondan soruşmaq istədi. Elə bu vaxt Firidun uşaqları səhər yuxusundan oyatdı. Tələbələr hay-küylə ayağa qalxdılar. Tələsik çarpayıları sahmana saldılar, dəsmal götürüb üzlərini yumağa qaçdılar. Əşrəf Firiduna yaxınlaşa bilmədi. Uşaqları duyuq salmamaq üçün o da dəsmalını götürüb bayıra çıxdı. Yoldaşlarının zarafatına könülsüz cavab verdi. Qəsdən ləngiyib onların yataqxanadan getmələrini gözlədi. Əşrəf tələbələr məktəbə yola düşəndən sonra hər yeri bir də nəzərdən keçirmək fikrində idi.

Uşaqlar pətəyindən hürküdülmüş arı kimi xeyli çaxnaşdıqdan sonra yataqxanadan uzaqlaşdılar. Əşrəf çarpayıların altını, dolabçaların üstünü təzədən axtardı. Heç yerdə heç nə gözünə dəymədi. Kitabın qəsdən götürüldüyünü yəqin etdi. Qollarını sallayıb dayandı. Elə bu vaxt kimsə onun qulağının dibində nəfəs aldı. Əşrəf geri döndü. Firidun dəsmalla üzünü qurulayırdı:

– Gecə Aleksey Osipoviç gəlmişdi. Bir kitab apardı, deyəsən sənin idi.

Əşrəf yavaşca çarpayının üstündə oturdu. Firidun onun halının birdən-birə dəyişməsinə təəccübləndi:

– Sənə nə oldu, rəngin-ruhun niyə qaçdı?

– Kişini xataya saldım.

– Hansı kişini?

– Kipianini. Kitabı o mənə vermişdi. Yəqin məsələ direktora çatacaq. Mən cəhənnəm, onu işdən çıxardacaqlar. Bəlkə də başına oyun açacaqlar. – Əşrəfin səsi titrədi. Gözlərini Firiduna zillədi. – Ağlın nə kəsir, Aleksey Osipoviç mərdimazarlıq eləyərmi?

– İnanmıram.

– Mən bu saat onun yanına gedəcəm, üzr istəyəcəm, yalvarıb kitabı geri alacağam. Belə yaxşı deyilmi, ay Firidun, məndən ötəri o kişinin başı niyə ağrısın?

Firidun Əşrəfin qolundan tutub qaldırdı:

– Tez ol, üst-başını düzəlt. Səhər ibadətinə geciksən, daha da pis olar. Sabah məsləhətləşərik.

Onlar yataqxanadan uzaqlaşdılar.

Tələbələr seminariyanın həyətinə toplaşmışdılar. Onlar adətləri üzrə səhər ibadətindən əvvəl dərslərini təkrar edirdilər. Kimi kitabı əlində tutub əzbər şer deyən yoldaşını yoxlayır, kimi sual-cavab edir, kimi bir tərəfə çəkilib narın torpağın üstündə misal həll edirdi. Həyəti ümumi bir uğultu bürümüşdü. Əşrəfgil gələndə xristian şöbəsinin uşaqlarından biri eyvana çıxıb ucadan şer deyirdi. Əşrəf bu qara qıvrımsaçlı gürcü balasını tanısa da ona yaxınlaşmadı. Öz şerlərini oxuyan dostuna qulaq asmağa indi onda həvəs yox idi. Əşrəfə elə gəlirdi ki, hamı onun gizli kitab oxuduğunu bilir, bu saat uşaqlar, verilən əmanəti yaxşı saxlaya bilmədiyinə görə onu danlayacaqlar. Ona deyəcəklər ki, bizim seminariyanın ən sevimli müəllimlərindən birini niyə xataya saldın? Sən bilmirsənmi ki, onun dalınca düşənlər var? Onu gözdən qoymurlar, hər yerdə izləyir, hər sözünə diqqət yetirirlər. Bəlkə elə sən qəsdən o kitabı vermisən ki, Kipianini işdən qovub tutsunlar? O kişi sənə etibar edib, sənsə belə. Əşrəf darıxdı. Elə bil havası çatmadı. Yaxasını açıb ətrafına boylandı. Ona elə gəldi ki, Kipiani buralardadır. Hardasa dayanıb ona baxır. Başını bulayıb onu məzəmmətləyir: “Məni niyə ələ verdin, mən səni kişi bilirdim”, – deyir. Əşrəfin bədənini soyuq tər basdı. “Mən onun üzünə necə baxacam, gözünə necə görünəcəm? – deyə düşündü. – Görək ona heç nə bildirməyəm. Bu gün, dərsdən qabaq kitabı Aleksey Osipoviçdən geri istəyəm. Bəlkə vermədi? Bəs onda nə olsun?”

Məktəbin həyətindəki uğultu getdikcə gücləndi və Əşrəfə elə gəldi ki, onun başı ağırlaşdı, qulaqları tutuldu, hətta gözləri də torlandı, heç nə fikirləşə bilmədi. Keyimiş kimi həyətin ortasında dayandı.

Uşaqlardan biri “diqqət!” deyə qışqırdı. Bu xəbərdarlığı eşidən kimi hamı səsini kəsdi və gözünü yola zillədi. Ortaya çökən sükut Əşrəfi özünə gətirdi. O da cığıra baxdı və hələ uzaqdan gələn Kipianini dərhal tanıdı. Uşaqlar onun qabağına yüyürdülər. Əşrəf bir anlığa hər şeyi unudub yoldaşlarına qoşulmaq istədi. Lakin bir-iki addım atdıqdan sonra ayaq saxladı. Onun gözünə görünməmək üçün daldalanmağa yer axtardı.

Tələbələr zəncir kimi qatarlaşıb Kipiani ilə salamlaşmağa hazırlaşdılar. Onun qəribə xasiyyəti var idi. Salamlaşanda mütləq şlyapasını çıxardırdı. Uşaqlarınsa bundan xoşu gəlirdi. Ona görə də yolun

kənarında qatarlaşıb dayanar, Kipiani birinci uşağın verdiyi salamı alıb şlyapasını geyməmiş ikincisi, üçüncüsü salam verərdi. O da təkrar-təkrar şlyapasını çıxartmağa məcbur olardı. İndi də elə etdilər. Ancaq Kipiani bu dəfə uşaqların qatarlaşıb onu gözlədiklərini başa düşdü və hələ uzaqdan şlyapasını çıxardıb qolunun üstünə aldı. Salamlara ancaq yüngülcə təzimlə cavab verdi. Lap axıra çatandan sonra gülümsünüb şlyapasını geydi və bununla da "ay kələkbazlar, daha məni aldada bilməzsiniz, bundan sonra şlyapamı bircə dəfə çıxardacağam" demək istədi. Tələbələrlə müəllimin arasında baş verən bu üstüörtülü zarafat hamının əhval-ruhiyyəsini düzəltdi. Uşaqlar bir də ona görə sevindilər ki, bu gün Kipiani gəlmişdi. Əgər o, növbətçi müəllim olsaydı, nahardan sonra şəhərin kənarına, Kürün sahilinə gəzməyə getmək arzusu baş tutacaqdı. Kipiani məktəb həyətinin ortasına çatan kimi tələbələr onu əhatə etdilər. Kim isə gülə-gülə:

– Nə yaxşı oldu, – dedi.

– Yaxşı olan nədir?

– Sizin növbətçi olmanız.

– Yox, səhv edirsiniz. Bu gün mən növbətçi deyiləm.

– Bəs kimdir?

– Bu saat bilərsiniz.

Birdən o, sözünə ara verdi. Kənardaca, Firidunun yanında dayanan Əşrəfi yanına çağırdı. Əşrəf qızardı, sonra rəngi avazımağa başladı. Firidun gördü ki, dostu ayağını güclə sürüyür. O da həyəcanlandı. Müəllimin bu saat Əşrəfi bir yana çəkəcəyini, onu möhkəm danlayacağını, bəlkə də bir-iki acı söz deyəcəyini gözlədi. Əşrəf başını yuxarı qaldırmadı. Kipianinin qarşısında ayaq üstündə güclə dayandı.

– Niyə qaş qabaqlısan?

O, çiynini çəkib susdu. Kipiani tələbəsinin çənəsinin altından tutub yuxarı qaldırdı. Əşrəf yalnız indi onun sifətinə baxa bildi. Zəhmli, qəzəbli baxış əvəzinə gülümsər gözləri gördükdə bir azacıq sakitləşdi. Onun əlindən yapışıb üzr istəmək və "müəllim, məni danlamayın, özüm gedib kitabı geri alacağam. Ölsəm də Sizin adınızı vermərəm" – demək istədi.

Məktəbin zəngi aram-aram danqıldadı. Uşaqlar tərpənənə qədər Boris Mixayloviç Petrovun cır səsi eşidildi:

– Xristianlar sağ tərəfə, müsəlmanlar isə sol tərəfə, ikibir düzlənin!

Bu zəhmli səs tələbələrin arasına çaxnaşma saldı. Onlar bir-birini itələyə-itələyə öz yerlərini tutdular. Cərgələr düzələndən sonra Petrov çəliyinin əyri tərəfini qolunun bükülücəyinə keçirdi. Əlini pencə-

yinin yaxasından içəri saldı. Köksünü qabardıb irəli verdi. Səhər günəşinin maili şüaları onun qızılı haşiyəli eynəyini, tərtəmiz silinmiş qara çəkmələrini parıldatdı. Uşaqlar səslərini içəri salıb onun nə deyəcəyini gözlədilər. Petrov cərgələrin arası ilə hər tələbənin üzünə baxa-baxa, astaca addımlarla axıra qədər getdi. Müsəlman şöbəsinin uşaqları dayanan cərgənin önündə ayaq saxladı. İkrah edirmiş kimi üz-gözünü turşutdu. Əsasını əlinə aldı. Onun ucu ilə gah bu, gah da başqa bir tələbənin sinəsinə vurdu, “kəmərini düzəlt”, “yaxanı düymələ”, – deyə qışqırdı. Hətta arada kiminsə şapkasının günlüyündən yapışıb aşağı çəkdi. Hazırlıq qrupunun uşaqlarına yaxınlaşdı. Səlimi cərgənin önünə çağırdı. Çəkmələrinin bağını açdırıb yenidən bağlatdırdı. Osmanı isə görəndə qışqırdı:

– Bu nədir, pinti tatar balası?!

Osman geyimini nəzərdən keçirdi. Hər şey yerində idi. O, təəccüblə çiynini çəkdi. Yenidən müəllimin üzünə baxdı.

– Çəkmələrin niyə belə parıldayır?

Osman həmişəki kimi hazırcavablıq etdi. Gülümsündü:

– Bəs Sizinki niyə parıldayır, cənab müəllim, kərə yağı sürtübsünüz?

– Kəs səsini, vəhşi!

O, əsasını yuxarı qaldırdı. Osmanın çiyninə endirmək istədi. Elə bu vaxt Əşrəf qabağa keçdi. Petrovla döş-döşə dayandı:

– Mən qoymaram ki, Siz balaca uşaqları döyəsiniz.

Petrov əsasını aşağı endirdi. Qəzəblə Əşrəfin üzünə fısıldadı:

– Vəhşilər!

– Özünüzə hörmət edin.

– Tatar!

– Mən Sizi təhqir etmirəm.

– Cərgədən çıx.

– İbadətdən sonra.

Petrovun əlləri titrədi. Nə isə demək istədi, ancaq udqunub dayandı.

Əşrəf yerinə keçdi.

Petrov əvvəlki vəziyyətini aldı. Əsasının əyrisini qolunun büküləcəyinə keçirdi. Üzünü müsəlman şöbəsinin tələbələri dayanan tərəfə tutdu:

– Ey, tatarlar, parçalanın. Sünnülər sağ tərəfə, şiələr isə sol tərəfə keçsin.

Uşaqlar ortadan iki ayrılıb aralandılar. Osmanla Əli ləngidi. Onlar bir-birinin əlindən yapışıb dayandılar. Bayaqdan bunlara göz qoyan

Kipiani gülümsəyə-gülümsəyə onlara yaxınlaşdı. Petrovdan qabaq dilləndi:

– Niyə dayanmısınız, ayrılın. Axı sünnü ilə şiə bir yerdə ibadət edə bilməz.

Petrovun cır səsi yenidən eşidildi:

– Xristianlar birbaş kilsəyə, müsəlmanlar isə öz ibadətxanalarına, marş!

– Cənab Petrov, üzr istəyirəm, bircə dəqiqə.

Tələbələr ayaq saxladılar. Petrov isə boynunu əyib, eynəyinin altından tərs-tərs Kipianiyə baxdı. O buna əhəmiyyət vermədi və üzünü uşaqlara tutdu:

– Tarix dərnəyinin üzvləri ibadətdən sonra yanıma gəlsinlər. Məşğələmiz və bir balaca gəzintimiz olacaq.

Petrov etiraz etdi:

– Bu gün heç bir gəzinti və məşğələ olmayacaq.

Kipiani astadan, tələbələrin eşitməməsi üçün az qala pıçıltı ilə ona cavab verdi:

– Narahat olmayın, cənab, direktor və inspektorla razılaşmışam.

– Mənə məlum deyil.

– Burada mübahisə etməyimiz namünasibdir.

Petrov acığını uşaqların üstünə tökdü:

– Tez olun, səhər duasının vaxtı keçir.

Tələbələr nizami əsgər kimi iri addımlarla həyətdən çıxdılar. Xristian şöbəsinin uşaqları kilsəyə, müsəlmanlar isə yataqxananın yanında onlar üçün düzəldilmiş ibadətxanaya yollandılar. Petrov daldan Əşrəfi səslədi:

– İbadətdən sonra dərsə getməyəcəksən.

– Nə üçün?

– Direktorun yanında olmalısan.

Əşrəf dinmədi və uşaqlara qarışdı. Döngəyə çatan kimi dəstədən aralandı. Sinə-sinə, divarın dibi ilə geri qayıtdı. Petrovun məktəbin həyətindən çıxmasını gözlədi. Nəhayət, növbətçi müəllim darvazanın yanından ötdü. Onun addım səsləri küçədən gəldi. Əşrəf rahat nəfəs alıb divarın dibindən çıxdı.

– Hara qaçırsan?

Əşrəf ilan çalmış kimi dik atıldı. Başının üstünü kəsdirən Kipianinin gülümsədiyini görmədi, onun səsindəki mehribanlığı duymadı. Dili, dodağı təpidi.

– İşim var.
– Bəs şəriət müəllimindən qorxmursan?
– Yox.
– Bəs inspektordan necə?
– Ondan da qorxmuram.
– Bəs məndən?

Əşrəf udqundu. Gözlərini zilləyib müəlliminə baxdı. Onun dediklərinin ciddimi, yoxsa zarafatmı olduğunu bilmək istədi. Bu saat Kipianinin onun haqqında nələr düşündüyünü öyrənməyə çalışdı. Onun arzusu bu idi ki, müəllimi ona inansın, onu xain, xəbərçi hesab etməsin. Kipiani də öz növbəsində Əşrəfin baxışlarından onun nələr düşündüyünü öyrənməyə çalışırdı. O başa düşdü ki, uşaq həyəcanlıdır, narahatdır. Gözlərindən oxudu ki, peşmançılıqla xəcalət hissi bir-birinə qarışmışdır. Əşrəf iztirab çəkir, səhv bir iş tutduğundan utanır, həm də qorxur. Özü də onu narahat edən odur ki, başqasını fəlakətə sala bilər. Kipiani onu da başa düşdü ki, Əşrəf buraxdığı səhvini düzəltmək üçün hər şeydən keçməyə hazırdır.

Aralığa çökən bu adi sükut Əşrəfə bir il qədər uzun göründü və o heç nə söyləmədən, heç nə danışmadan geri dönüb Kipianidən aralanmaq istədi. Ancaq müəllim onun qolundan tutub saxladı:

– Kitabı oxuyub qurtardınmı?

– Yox. – Əşrəfin dodaqları əsdi. – Az qalıb. Axıra çıxmağıma bir neçə səhifə var.

Onun səsi titrədi. Elə bil bir şey tıxanıb boğazında qaldı.

Kipiani onun biləyindən tutdu. O, hiss etdi ki, Əşrəfin əzaları səyriyir. Bütün bədəni uçunur. Bir azca da belə getsə, oğlan ya qolunu çıxardıb qaçacaq, ya da hönkürtü ilə ağlayacaq.

Kipiani sakitcə qoltuq cibindən bir kitab çıxardıb Əşrəfə uzatdı.

– Al.

Əşrəf lap burnunun ucundakı kitabın cildinə baxdı, hərflər onun gözlərində böyüdü, sonra kiçilib öz qaydasına düşdü. O, tanış sözləri oxudu. Bir xeyli tərpənmədi. Əvvəlcə cəsarətsizcəsinə, sonra isə inamla altdan-yuxarı, Kipianinin üzünə baxdı. Kipiani onun nə isə soruşmaq istədiyini başa düşdü, ancaq imkan vermədi:

– Kitabı oxu, qurtar. Amma çalış ki, bu işdən pis adamlar xəbər tutmasınlar.

## 9

Semyonov üstünə göy mahud çəkilmiş iri yazı masasının arxasından durub küncdəki saata yaxınlaşdı. Jiletinin cibindən açarı çıxardıb qapağını açdı. Adam boyda olan saatın iri kəfgiri ətalətlə sağa-sola hərəkət etdikcə otağa ahəngdar bir çıqqıltı yayılırdı. Semyonov ağ siferblatın üstündəki naxışlı rəqəmlərə, qızıl suyuna çəkilmiş əqrəblərə baxdıqdan sonra zənciri dartdı. Elə bil saatın çıqqıltısı gücləndi. Əqrəbin böyük tayı on birin üstünə çatdı. Direktorun otağına hardasa, lap uzaqlarda çalınan kilsə zənginin səsini xatırladan bir danqıltı yayıldı. Bu səs bir neçə dəfə təkrar olub dalğalandı. Semyonov adəti üzrə döş cibindən gümüş saatını çıxardıb şaqqıltı ilə qapağını açdı və vaxtı yoxladı. Dalbadal vurulan zəngin dalğalı sədası susana qədər gözünü əqrəblərdən çəkmədi. Düz on bir tamamda hər iki saatın qapağını örtdü və asta addımlarla eyvana çıxdı.

Məktəbin həyəti bomboş idi. Hamı dərsdə idi. Sinif otaqlarının pəncərələri açıq idi. Müəllimlərə cavab verən tələbələrin yeknəsəq səsi eşidilirdi. Bu yeknəsəqliyi arabir müəllimlər kəsirdi. Onlar dərs söyləyən uşaqları dayandırıb nə isə soruşur, sonra özləri əlavələr edirdilər. Buradan, direktorun otağının qarşısındakı eyvandan hər şeyi görmək mümkün idi. Semyonov hava xoş olanda, elə indiki kimi, buradaca dayanar və yazı taxtasının önündə dərs söyləyən uşaqlara tamaşa edər, onların verdikləri cavablara qulaq asardı. Onun lövhədə məsələ həll edən riyaziyyat müəllimlərinin, ya da onlara cavab verən tələbələrin rəqəmləri tabaşirlə güllə kimi yazmasından xoşu gələrdi. O, tabaşir taqqıltısından xüsusi zövq alardı. Semyonov lövhədə tabaşirin saat mexanizmi kimi ahəngdar şəkildə taqqıldamasından dərsin necə keçdiyini müəyyənləşdirərdi.

O, indi də sakitcə dayanıb sinif otaqlarına göz gəzdirdi. Hər şey öz qaydasında idi. Bu gün məşğələlər öz vaxtında başlamış, ötən gecə isə heç bir hadisə olmamışdı. Tələbələr də, müəllimlər də böyük həvəslə dərsə başlamışdılar. Semyonov bir xeyli eyvanda dayandıqdan sonra yeməkxananı və yataqxanadakı işləri yoxlamaq məqsədi ilə eyvandan enmək istədi. Ancaq şəhərə daxil olan atlı kazakları görüb ayaq saxladı. At nalının şaqqıltısı divarları cingildətdi. Torpaqdan qalxan toz havada laylandı. Səhər sükutunu pozan bu atlı dəstəsinin hay-küyü camaatı sərsəm etdi. Kimi pəncərəni açıb səhər şəfəqlərində poqonları və qılınclarının dəstəsi parıldayan kazaklara təəccüblə tamaşa etdi,

kimi də qorxudan qapı-bacanı daha da möhkəm bağladı. Atlılar dar küçələri, əyri döngələri keçib, seminariyanın yanına qədər gəldilər. Burada azca dayandıqdan sonra iki yerə ayrıldılar. Bir hissə məktəbin ətrafını kəsdi, o biri hissə yataqxananı mühasirəyə aldı. Atdan düşdülər. Üst-başlarının tozunu çırpıb papiros yandırdılar. Səhərin şəffaf havasında daha aydın görünən göyümtül tüstülər burula-burula yuxarı qalxıb laylandı.

Rəis darvazanın yanındakı xidmətçiyə etina etmədən irəli keçdi. Arxasınca gələn polislərlə birlikdə pilləkəni taqqıldada-taqqıldada yuxarı qalxdı. Eyvanda Semyonovla qarşılaşdı:

– Sabahınız xeyir, cənab direktor.

– Sabahınız xeyir, cənab.

Rəis Semyonovun sual dolu baxışlarına fikir vermədi. Qabağa keçib, bir-iki addım atdıqdan sonra geri döndü:

– Kabinetinizə getmək olarmı?

– Buyurun, cənab... Müsaidə edin...

Rəis özü qapını açdı. Ev sahibi kimi irəli keçdi. Polis nəfərləri də onun dalınca otağa girdilər. Yalnız bundan sonra Semyonova yol verdilər. Dmitri Dmitriyeviç təmkinini pozmadan keçib öz yerində əyləşdi. Polislər keşik çəkirlərmiş kimi qapının yanında dayandılar. Semyonov gözaltı otaqda gəzinən rəisi süzdü. Sonra da bir az bundan əvvəl qurduğu saatın yanında daş kimi quruyan polisə baxdı. Onun qılıncı yerə dəyirdi. Farağat vəziyyətində dayansa da, qılçaları yana əyilmişdi. Semyonov susdu. Otaqda gəzinən rəisin çəkməsinin nallı dabanının taqqıltısı və polislərin fısıltısı onu hövsələdən çıxartsa da dinmədi. Rəis bu qayda ilə bir xeyli gəzindi. Sonra kürsünü çəkib direktorla üz-üzə oturdu:

– Kipiani burdadırmı?

– Dərsdədir. Necə məgər?

– Onu aparmalıyıq.

– Haraya?

– Lazım olan yerə.

– Bunun üçün əlinizdə rəsmi sərəncam varmı?

Rəis Semyonovu qıyqacı baxışlarla tərs-tərs süzdü. Sonra Kipianinin həbs olunması barədəki sənədi süni bir nəzakətlə direktora təqdim etdi. Semyonov kağızı oxumağa tələsmədi. Yenə əvvəlki kimi təmkinlə rəisi süzdü. Eynəyini taxdı. Kağızı stolun üstünə qoydu. Onun hər kəlməsini diqqətlə nəzərdən keçirdikdən sonra qaytarıb rəisə

verdi. Bir xeyli fikirli-fikirli susdu. "Bu niyə belə olsun? – deyə düşünməyə başladı. – Axı mən onlara yazmışdım ki, Kipianidə heç bir şübhəli hərəkət görməmişəm. Yoxsa mənə inanmırlar? Axı biz bir yerdə işləyirik. Mən Kipianini xəfiyyələrdən yaxşı tanıyıram".

Rəis direktorun bu işdən narazı qaldığını sifətindən oxudu. Dodaqları azacıq qaçdı. Onun gülüşündəki istehza Semyonovun gözündən yayınmadı.

– Zəhmət çəkin, onun yerini göstərin.

– Siz onu dərsdən sonra öz evindən apara bilməzdinizmi?

– Mən verilən əmri yerinə yetirirəm.

– Zənnimcə, Siz tələsirsiniz. Mən lazımi yerlərə yazmışam ki, Kipianidə heç bir şübhəli hərəkət müşahidə etməmişəm.

– Görünür, Sizin yazdıqlarınızı əsassız saymışlar. Hər halda biz adamları Sizdən yaxşı tanıyırıq, cənab direktor, hətta Sizin özünüzə özünüzdən yaxşı bələdik.

– Bu nə deməkdir?

– Fikrim aydındır. Sizə məsləhət görürəm ki, bir az da özünüz haqqında düşünəsiniz.

– Cənab, Siz...

– Əsəbiləşməyin. Gedək, Kipianinin yerini göstərin.

Semyonov başa düşdü ki, mübahisə etmək faydasızdır. Onun etirazına heç kəs əhəmiyyət verməyəcək, Kipianini həbs edəcəklər. Ancaq o bu işi ləngitmək istədi. Tələbələrin gözü qarşısında müəllimin dustaq edilməsi pedaqoji qaydaların ciddi pozulması demək idi. Belə hərəkət müəllimi ən güclü, müqəddəs və toxunulmaz bir insan hesab edən pərəstişkar şagirdlərin təsəvvürünü alt-üst etməyə, onların gözəl arzularının, həyat amallarının tapdalanmasına, ideal bir əlçatmazlığın məhvinə bərabər idi. Pedaqoji müəssisədə buna yol vermək olmazdı.

– Mən dərsi dayandıra bilmərəm, cənab, yaxşı olar ki, məşğələdən sonra...

– Sizin məşğələniz məni maraqlandırmır.

– Sözümü kəsməyin, cənab rəis, bu məktəbin sahibi hələlik mənəm.

– Ona görə də bu işi Sizin iştirakınızla görəcəyik.

– Mən belə bir ədalətsiz həbsdə iştirak etmərəm.

– Etməlisiniz.

– Siz məni məcbur edə bilməzsiniz.

– Məcbur yox, məsləhət bilirik.

– Minnətdaram. Ancaq bu işdən qəti imtina edirəm.

– Elə isə bu işi sizsiz görərik.
– Sizin buna səlahiyyətiniz yoxdur.
– O bizim işimizdir.
– Mən buna icazə vermirəm.
– Buna ehtiyacımız yoxdur.

Rəis ayağa durdu. Qapının ağzını kəsdirən polislər qamətlərini bir az da düzəltdilər. Onlar gəldikləri kimi hay-küylə aşağı endilər. Növbətçi müəllim Petrov həyətin ortasında onların qarşısına çıxdı:

– Cənab rəis, Sizə kim lazımdır?
– Siz kimsiniz?
– Mən növbətçi müəlliməm. Tanış olaq, Boris Mixayloviç Petrov.
– Boris Mixayloviç? – deyə rəis təkrar etdi və səsini alçaldıb pıçıldadı. – Siz... Siz... növbətçi müəllimsiniz?
– Bəli... Mən...
– Lap yaxşı. Bizə Kipianinin yerini göstərin.
– Məmnuniyyətlə. Ancaq əvvəlcə direktor...
– Onunla görüşmüşük.
– Aydındır... Gedək.

Boris Mixayloviç belinin əyrisini düzəldib sinəsini qabağa verdi və əlini pencəyinin yaxasından içəri saldı. Çəliyini qolunun büküləcəyinə keçirtdi. Özünü şax tutaraq, rəsmi keçid qəbul edən adamlar kimi dabanlarını yerə vura-vura sinif otaqlarının qabağından ötdü. O həmişə növbətçi olanda qəsdən, uşaqları vahiməyə salmaq üçün cırıldayan çəkmə geyinərdi. Bu gün də həmin çəkmələr ayağında idi. İndi polislərin önündə irəlilədikcə onun çəkmələri daha ucadan cırıldayırdı. Rəis və onun dalınca gələn polislər isə təhlükəli bir ovu qaçıracaqlarından qorxurlarmış kimi əllərini naqanın qoburundan çəkmir və pəncələri üstündə yeriyirdilər.

Sinif otaqlarından səslər kəsildi. Müəllimlər əllərində tabaşir dayandılar. Uşaqlar pəncərələrin qabağına toplaşdılar. Müsəlman şöbəsində dərs deyən Çernyayevski sözünə ara verib qapıya yaxınlaşdı. Çərçivəyə dirsəklənərək başını əlinə söykədi. Hamıdan əvvəl Əşrəf pəncərəyə yaxınlaşdı. Bütün məktəb nəfəsini içəri çəkib susdu. Boris Mixayloviçin bələdçilik etdiyi dəstənin harada dayanacağını gözlədi. Növbətçi müəllim ayaq saxladı. Gözü ilə Kipianinin dərs dediyi otağı göstərdi. Polislərdən bir neçəsi pəncərənin qabağında dayandı. Rəis isə astanada durub içərini dinşədi. Kipianinin səsi gəlirdi. O, ucadan Puşkinin şerini oxuyurdu:

Пока свободою горим,
Пока сердца для чести живы,
Мой друг, Отчизне посвятим
Души прекрасные порывы!

Rəis qapını döymədən, dərs deyən müəllimdən icazə almadan içəri girdi. Tələbələr gələn adama hörmət əlaməti olaraq gurultu ilə ayağa qalxdılar. Kipiani sözünü kəsmədən rəisə baxdı və əli ilə uşaqlara işarə etdi ki, otursunlar. O başa düşdü ki, onun fikrini, fəaliyyətini yarımçıq kəsmək, sözünü ağzında qoymaq üçün gəliblər. Bu onun son dərsi olacaq. Tələbələrlə indiki kimi bir daha üz-üzə dayanıb, ürək sözlərini deyə bilməyəcək. Öz fikrini onlara çatdırmağa bir daha imkanı olmayacaq. Kipiani özünü itirmədi. Rəisin işarəsinə əhəmiyyət vermədi və şerin son misralarını oxudu:

Товарищ, вер, взойдёт она,
Звезда пленительного счастья,
Россия вспрянет ото сна,
И на обломках самовластя
Напишут наши имена!

Rəis hövsələdən çıxıb səsini ucaltdı:

– Cənab Kipiani, dərsi dayandırın!

– Niyə?

– Siz dustaqsınız.

Kipiani dönüb təlaş və həyəcandan yanaqları qızarmış tələbələrin gözlərinə baxdı. Onların baxışları alışıb-yanırdı. Kipiani başa düşdü ki, məktəb skamyasının arxasında oturan bu uşaqlar bu saat qəzəbli pələng balaları kimi aşağı siniblər. Onlar rəisin üstünə atılmağa hazırdılar. Kipiani yazı taxtasının yanında təkəbbürlə dayanan Petrova da gözaltı baxdı və istehza ilə gülümsündü:

– Hələ zəng vurulmayıb. Dərsi yarımçıq kəsmək olmaz. Elə bilirəm ki, növbətçi müəllimimiz də buna razılıq verməz. Elə deyilmi, Boris Mixayloviç?

Petrov quyruğu basılmış ilan kimi çəmbərlənib fısıldadı. Rəis Kipianinin istehzasını başa düşdü, səsini bir qədər ucaltdı:

– Qurtarın, cənab!

Polislər qapını açdılar. Kipiani başa düşdü ki, onlar balaca bir işarəyə bənddirlər. Bir şey olsa, naqanlarını çıxardıb irəli atılacaqlar.

– Dəstəniz nə yaman böyükdür, zati-aliləri, bu qədər adama niyə əziyyət vermisiniz?..

Kipiani yenə istehza ilə gülümsündü, sonra əsasını götürdü, kitablarını yığdı, sinif jurnalına əl uzadarkən Petrov irəli yeridi:

– Ona dəyməyin.

– Son məşğələni qeyd etməliyəm. Siz ki, rəsmiyyət sevənsiniz, cənab Petrov.

– Cənab Kipiani...

– Əsəbiləşməyin.

Kipiani qarşısındakı adamın qızarmış çöhrəsinə baxdı. Təmkinini pozmadan qələmi götürüb jurnalı yazdı. Bir xeyli gözünü yazıdan çəkmədi. Elə bil öz xəttinə həsrətlə baxırdı. Artıq getmək vaxtı olduğunu başa düşdü. Başını qaldırıb tələbələrini bir daha süzdü. Əlini qapının dəstəyinə uzatdı. Uşaqlar gurultu ilə ayağa qalxdılar. Petrov onların qabağını kəsdi:

– Yadınıza salıram, bu gün dərsdən sonra heç bir gəzinti və məşğələ olmayacaq.

– Olacaq, cənab Petrov, bu gün də, sabah da bu işlər davam edəcək. – O qanrılıb tələbələrin üzünə baxdı. – Mən buna əminəm. Əziz balalar, salamat qalın!

Kipiani qapını açıb cəld bayıra çıxdı. Rəislə Petrov onu təqib etdilər. Bayaqdan heç nə başa düşməyən və key kimi dayanan uşaqlar qapının zərblə vurulmasından diksinib sanki yuxudan ayıldılar. Gurultu ilə qapıya doğru cumdular. Polislər onların sinəsindən vurub geri qaytardılar. Qapı uşaqların üzünə örtüldü. Tələbələr pəncərənin qabağına yüyürdülər. Polislər oranı da kəsmişdilər.

Həyətə düşən kimi Kipianini araya aldılar. O, darvazaya qədər dinməz-söyləməz getdi. Orada ayaq saxladı. Dönüb həsrətlə məktəbə baxdı. Uşaqlar pəncərələrdən boylanırdılar. Müəllimlər qapının ağzında dayanmışdılar. O gördü ki, Semyonov əllərini sinəsində çarpazlayaraq, eyvanın dirəyinə söykənmişdir. Hamı qəzəb və təmkinlə susur, yalnız Petrov həyətin ortasında təkcə dayanmışdır. Kipiani saatını çıxartdı. Zəngə hələ on beş dəqiqə var idi. O, başa düşdü ki, tələbələri və müəllim yoldaşları ilə vidalaşmaq ona müyəssər olmayacaqdır. Hər səhər onun şlyapasını çıxardıb salam almasından xoşlanan dəcəl tələbələri gözünün önündə dayandı. Kipiani qeyri-iradi gülümsündü və şlyapasını çıxardıb azacıq təzim etdi.

Birdən kim isə ucadan “Biz Sizi heç vaxt unutmayacağıq, əziz Kipiani müəllim!” – deyə qışqırdı. Əşrəf səs gələn tərəfə boylandı. Gürcü tələbələrindən Luka pəncərənin qabağına çıxmışdı. Papağını havada yelləyirdi. Polislər onun ətəyindən dartıb aşağı salmaq istəyirdilər. Tələbələr onlarla dartışır və özlərini pəncərədən həyətə atmağa çalışırdılar. Əşrəf gördü ki, bir az keçsə Kipianini aparacaqlar. Xristian şöbəsinin tələbələri isə polislərlə əlbəyaxa olacaqlar. Əşrəf pəncərədən atılıb həyətə düşdü. Birbaş zəng asılan eyvana yüyürdü. Kəndirdən yapışıb var gücü ilə dartdı. Zəng təlaşla, kimi isə köməyə çağırırmış kimi həyəcanla səsləndi. Zərbələr bir-birinə qarışdı. Bütün məktəb, az qala bütün şəhər silkələndi. Əşrəf zəngin danqıltısından başqa heç nə eşitmədi, heç nə görmədi. Əsasını havada oynadıb onu hədələyən, var gücü ilə qışqıran növbətçi müəllimə əhəmiyyət vermədi. Hirslə, qəzəblə zəngi çaldı. Qapılar taybatay açıldı. Tələbələr qabağı kəsilən və birdən-birə özünə yol açan sel kimi gurultu ilə həyətə axışdılar. Polislər onların qabağını saxlaya bilmədilər. Uşaqlar qasırğa kimi burulub-büküldülər, hər şeyi yollarından süpürdülər və axırda burulğan təkin burulub Kipianini araya aldılar. Yalnız bundan sonra Əşrəf əlini kəndirdən çəkdi. Petrov əsasını onun başına endirmək istədi. Əşrəf ağacı havada qapıb Petrovun qolunu burdu. Kişi təngildədi. Əsa göydə fırlanıb kənara düşdü. Növbətçi müəllim onu saxlamağın mümkün olmayacağını anlayıb geri çəkildi. Əşrəf tələbələrin axınına qoşuldu. Uşaqları yara-yara qabağa keçdi. Kipiani ilə üzbəüz dayandı. Uşaqlar onları üzük qaşı kimi araya aldılar. Əşrəf bu saat özünü parçalamaq istəyirdi, elə zənn edirdi ki, bütün bu məsələlər həmin kitabla bağlıdır. Kipianinin həbs olunmasına bais o özüdür. Onun nəfəsi darıxdı. Bütün bunlar Kipianinin nəzərindən yayınmadı. O hiss etdi ki, Əşrəf qışqırmaq, nə isə bir şey demək istəyir. O, bu sadəlövh gəncin sonralar da iztirab çəkəcəyini duydu. Başa düşdü ki, Əşrəf özünü müqəssir sayır. Kipiani onu sakitləşdirmək və şübhələrdən xilas etmək üçün bir addım irəlilədi. Əli ilə işarə etdi ki, susmaq lazımdır. Əşrəf dinmədi. Yalnız bundan sonra o, tələbəsinə yaxınlaşıb, əli ilə Əşrəfin başını sığalladı. Az qala pıçıltı ilə ona təskinlik verdi:

– Səndə heç bir taqsır yoxdur. Məni başqa iş üstündə, başqa adamların xəbərçiliyi ilə həbs edirlər, – dedi.

Əşrəfin gözü yaşardı. Uşaqlar əl verib bir-bir Kipiani ilə görüşdülər.

Rəis darvazanı açdı. Atlı kazaklar gurultu ilə içəri doluşdular. Uşaqları arakəsməyə aldılar. Şallaqlar bir göz qırpımında havada oy-

nadı. Hətta kazaklardan qılıncını siyirib hazır dayananlar da oldu. Hər şey tükdən asılı qaldı. Bircə işarə aləmi bir-birinə qata bilərdi. Semyonovdan əvvəl Çernyayevski özünü irəli atdı. Uşaqlar ortadan iki bölünüb direktorla inspektora yol verdilər. Lap qabaqdakı kazakın atının cilovundan yapışıb Kipianini geri çəkdilər. Semyonov rəislə döşdöşə dayandı:

– Fikriniz nədir?

– Uşaqları dağıdın!

– Siz də kazakları geri çəkin.

– Mən əmrimi geri götürmərəm.

– Bir hadisə baş versə, cavabdeh siz olacaqsınız.

– Mən dustağı aparmalıyam.

– Mən heç yana qaçan deyiləm, cənab rəis, sizin sürgünləri və qandalları çox görmüşəm. Əmr verin atlılar kənara dursun. Uşaqları qorxutmaq kişilik deyil.

Kipiani hündür bir yerə çıxdı. Əlini yuxarı qaldırıb tələbələri sakit etdi:

– Salamat qalın, əziz balalar, mən sizdən çox razıyam. Əminəm ki, bizim zəhmətimiz hədər getməyəcəkdir. Siz igid, gözüaçıq və namuslu vətəndaşlar olacaqsınız. Siz heç nədən qorxmadan xalqınız və millətiniz üçün fədakarlıq edəcəksiniz. Bu həbslər sizi sarsıtmasın. Oxuyun, hər yerdə maarif məşəlini ucaldın. Sizə minnətdaram, mənim müəllim yoldaşlarım, salamat qalın.

Kipiani nə qədər gülümsədisə də gözləri doldu. Şlyapasını çıxardıb hamıya baş əydi və bundan sonra darvazaya doğru getdi. Uşaqlar xeyli onun ardınca baxdılar. Kazaklar atlarını nizama düzüb Kipianinin ətrafını kəsdilər. Rəis qabağa düşdü. Siyirmə qılıncların polad tiyəsi havada parıldadı. Daş küçə at nalının şaqqıltısı ilə doldu. Bu şaqqıltı uzun zaman uşaqların qulağından getmədi.

## 10

Qurğuşun kimi ağır və qatı bir qaranlıq qanad gərib seminariyanın üzərinə çökmüşdü. Sinif otaqlarında yanan işıqlar gecənin qaranlığını boğa bilmir, solğunlaşıb pəncərələrdə öləziyir, duman arxasında imiş kimi güclə görünürdü. Məktəbin həyəti bomboş idi. Pəncərələrdə titrəşən kölgələrdən başqa seminariyanın binasında canlılıq əlaməti yox

idi. İnsanı qurğuşun kimi əzib, qüssə və kədərə qərq edən bu ağır sükutdan adamın qulağı güyüldəyirdi. Ancaq Petrov heç nəyə fikir vermədən bir kabus kimi sinif otaqlarının qabağında dolaşırdı. O hər şeyi bilmək, hər pıçıltını dinləmək və hər sözü eşitmək istəyirdi. O, bu dəfə adəti xilafına ayağını yerə astaca basır və çalışırdı ki, çəkmələri səslənməsin.

Petrov xeyli dolaşdı, pəncərələrin önündə ayaq saxladı və nəhayət, müsəlman şöbəsinin otaqlarına yaxınlaşdı. Qapıların dalında ayaq saxlayıb içərini dinşədi və axırda Əşrəf oxuyan qrupun pəncərəsinə yaxınlaşdı. Özünü göstərməməyə çalışaraq, ehtiyatla içəri boylandı.

Sinif nümayəndəsi Firidun qapı tərəfdəki stolun arxasında oturmuşdu. Qalan uşaqlar ikibir-ikibir əyləşib dərs oxuyurdular. Firidun hərdən mütaliəsinə ara verib uşaqlara baxır, onların nə ilə məşğul olmasına göz qoyurdu.

Petrov az qala burnunu şüşəyə yaxınlaşdırdı və uşaqların içində Əşrəfi axtardı. O lap dalda əyləşmişdi. Yanında da heç kəs yox idi, nə isə ciddi bir şey oxuyurdu. Petrov pəncərədən nə qədər boylandısa da, Əşrəfin oxuduğu kitabı görə bilmədi. Daha da şübhələndi və gurultu ilə içəri girdi. Hamıdan əvvəl Firidun diksinib ayağa qalxdı. Onun "diqqət!" deməsi ilə stolun üstündəki çırağın sönməsi bir oldu. Otağa qaranlıq çökdü. Uşaqlar yerlərində qurdalandılar. Petrovun cırıltılı səsi otağa yayıldı:

– Heç kəs yerindən tərpənməsin! Tez ol, çırağı yandır!

– Bu saat, cənab müəllim, – deyə Firidun ona cavab verdi və qaranlıqda nəyi isə axtarmağa başladı. Petrov xeyli gözlədi və onun ləng tərpənməsinə qəzəbləndi:

– Nə oldu?

– Bu saat, cənab müəllim, təqsir özünüzdə oldu. Qapını birdən-birə açmasaydınız, külək çırağı söndürməzdi. Kibriti tapa bilmirəm.

Petrov daha da əsəbiləşdi. Pencəyinin cibindən kibrit çıxardıb Firiduna verdi:

– Al, ancaq əlli ol.

Onların əli qaranlıqda bir-birinə toxundu. Petrov bu təmasdan diksinib əlini geri çəkdi. Firidun kibrit qutusunu açdı. Petrov qutunun və kibrit çöplərinin şaqqıltısından hiss etdi ki, Firidunun barmaqları titrəyir.

– Ver bura, fərsiz.

– Sizə zəhmət olar, müəllim, özüm yandıraram.

– Ver, deyirəm.

Elə bu vaxt Firidun kibriti əlindən yerə saldı. Qutu açıldı, çöplər döşəməyə səpələndi. Firidun dərhal aşağı əyildi. Stolun altında xeyli ləngidi. Petrov daha da qəzəbləndi:

– Orada nə eşələnirsən?

– Bu saat, cənab müəllim, kibrit dağılıb.

Firidun otaqda bir hərəkət başlandığını duydu. Skamyaların altında dəftər-kitab xışıldadı. O, hiss etdi ki, yoldaşları nə isə gizlədirlər. Firidun vaxt qazanmaq üçün bir az da ləngidi. Kibrit qutusunu ovcunda sıxıb gözlədi. Birdən stolun altından onun əlinə bir əl toxundu. Firidun barmaqlarının altındakı kitabı götürüb dikəldi. Onu tələsik, heç kəsə sezdirmədən, stolun siyirtməsinə atdı. Petrov bir şey duymuş kimi ayağını döşəməyə çırpıb qışqırdı:

– Tez ol, yaramaz, məni ələ salıbsınız?

– O nə sözdür, cənab müəllim, Allah eləməsin, bu dəqiqə.

Firidun kibriti çəkib çırağı yandırdı. Bir anda divarda kölgələr oynadı, hər şey sakitləşdi. Petrov dərhal Əşrəfin üstünə atıldı:

– Oxuduğun nə idi?

– Kitab.

– Nə kitab?

– Hesab.

– Hanı?

– Budur.

Petrov kitabı bir xeyli əlində hərlədi, sonra Əşrəfin dəftərlərinin arasını axtardı. Bir şey tapmadıqda daha da əsəbiləşdi:

– Dur, sinifdən çıx!

Əşrəf könülsüzcəsinə ayağa qalxdı. Qapının ağzındaca dayanıb Petrova baxdı:

– Mən hara getməliyəm, cənab müəllim?

– Direktorun yanına.

Qapı örtüldü. Petrov uşaqları qəzəblə süzdükdən sonra ağır-ağır otaqdan çıxdı. Onun çəkmələri indi bərkdən cırıldadı. Onlar həyətin ortasında dayandılar. Petrov Əşrəfi qabağa saldı. Özü isə gözünü pilləri çıxan oğlanın kürəyinə zillədi. Onun dişləri sıxıldı, çənəsinin əzələləri oynadı.

Əşrəf direktorun otağının qarşısında dayandı. Qanrılıb bir kölgə kimi onu təqib edən növbətçi müəllimə baxdı. Petrov qamətini düzəltdi və icazə istəmədən qapını açdı. Əşrəfi qabağa saldı. Çəkmələrini cırıldada-cırıldada irəliləyib Semyonovun yanında dayandı.

Əşrəf yerindən tərpənmədi. Divar saatının böyründə ayaq üstündə durdu. O, Çernyayevskinin də burada olduğunu gördükdə gözünü qaldırıb heç kəsə baxmadı. Furajkasını çıxardıb əlinə aldı və özü də hiss etmədən onu didişdirdi. Otağa ağır sükut çökdü. Əşrəf saatın çaqqıltısından da güclü olan ürək döyüntüsünü eşitdi. Onun qulaqları cingildədi. Əşrəfə elə gəldi ki, qolları uzanıb ağırlaşır, kimsə çiyinlərindən basıb, onu əzmək istəyir. Boynundakı damarlar guppuldamağa, beyninin içi güyüldəməyə başladı. Qulaqlarının ucuna qədər isindi. Tavandan asılmış çilçıraqdakı şamların hamısı yansa da, gözlərinə qaranlıq çökdü. Direktorun yazı masasının üstündəki şamdanlar da dumana bürünən kimi oldu. Əgər Çernyayevski bircə dəqiqə gec dillənsəydi, bəlkə də müvazinətini itirib yıxılacaqdı.

– Mən səndən heç gözləməzdim, bu nə işdir, tutmusan?

Əşrəfə elə gəldi ki, bu səs hardansa lap uzaqdan eşidilir. Kimsə onu çağırır, yarıbihuş haldan geri qaytarmaq istəyir. O azacıq silkələndi. Gözlərini hürkəkcəsinə qaldırıb, ondan bir-iki addım aralı dayanmış müəlliminin üzünə baxdı və gördü ki, Çernyayevskinin baxışlarında qəzəb və nifrətdən çox məzəmmət var. Əşrəf gülümsəmək istədi, hətta onun dodaqları azacıq aralandı, gözlərində yaş parıldadı, ancaq Petrovun əsəbi səsi onu daş kimi dondurdu.

– Mən onunla bu cür nəzakətlə danışılmasını yox, seminariyadan xaric olunmasını tələb edirəm, cənab direktor, bu vəhşi tatar dərhal məktəbdən rədd edilməlidir!

Semyonov əlindəki qələmi masanın üstünə atdı və əsəbiliklə dilləndi:

– Bir az səbir edin, cənab Petrov, sözlərinizə də nəzarət yetirin. Siz müəllimsiniz.

– Elə ona görə də bu cür yaramazın bizim seminariyada qalmasına dözə bilmirəm.

Bir az bundan əvvəl başı gicəllənib yıxılmağa hazır olan Əşrəfin taqətdən düşmüş dizlərinə elə bil qüvvət gəldi. Gözünün önündən tor çəkildi. O hiss etdi ki, bədəni buz kimi keyidi, ürəyinin çırpıntısı azaldı, ayağının altındakı döşəmə möhkəmləndi:

– Sizin məni təhqir etməyə haqqınız yoxdur, qanun üzrə nə cəzam varsa, onu verin.

– Səsini kəs!

Semyonov əlini masaya çırpıb var gücü ilə bağırdı və dərhal yerindən sıçrayıb ayağa qalxdı. Onun qışqırtısından divar cingildədi. Di-

rektorun belə gözlənilməz qəzəbindən Petrov da, Çernyayevski də çaşıb qaldılar. Semyonov nə qədər çalışdısa da, əllərinin titrəməsini gizlədə bilmədi. Dəsmalını çıxardıb eynəyini silərkən az qaldı ki, onu salıb sındırsın. Çernyayevski onu ilk dəfə bu cür hirsli görürdü.

– Məktəbin intizamını pozduğun, dərs gedişinə mane olduğun bəs deyil, hələ mənim hüzurumda müəllimə də cavab qaytarırsan? Nə üçün zəngi çaldın? Sənə kim icazə vermişdi?

Əşrəfin utancaqlığı, xəcalət çəkməsi bir anda yox oldu. Yeniyetmələrə xas olan bir dəliqanlılıq qəlbini bürüdü və qərara gəldi ki, heç nədən qorxmasın, suallara şax cavab versin.

– Heç kim!

– Səncə, buralar dərəbəylikdir? Kim nə istəsə, edə bilər?

– Elə deyilsə, bəs nə üçün bizim müəllimimizi atın döşünə salıb apardılar?

– Onun sənə dəxli yoxdur.

– Var, cənab Petrov, biz onun nə üçün tutulduğunu bilmək istəyirik.

– Axı siz kimsiniz?

– Bəs siz kimsiniz?

– Əşrəf, həddini aşma!

– Siz də adamları kölgə kimi izləməyin, cənab Petrov.

– Bu nə deməkdir?

Petrovun boynundakı damarlar şişdi. Rəngi çuğundur kimi oldu. Kəkələməyə başladı:

– Gö-görürsünüzmü, cənab direktor, mən belə yaramazla heç danışmaq belə istəmirəm.

– Müəllim...

– Səsini kəs! Cənab Çernyayevski, Sizin şöbənin tələbəsi Əşrəf Göytəpəli məktəbin daxili intizam qaydalarını kobudcasına pozduğuna görə yeddi gün həbsə salınsın. Təkcə su və yavan çörəkdən başqa heç nə verilməsin. Bir ay məktəb ərazisindən çıxmaq hüququ əlindən alınsın. Aydındırmı?

Çernyayevski qapını açıb Əşrəfi bayıra çıxartdı. Semyonov başını əllərinin içinə alıb bir xeyli hərəkətsiz halda yazı masasının arxasında oturdu. Petrov onun yanını kəsdirdi:

– Cənab direktor, mən bu işlə razılaşa...

– Bəs deyilmi, daha nə istəyirsiniz?

– Onu mütləq məktəbdən qovmaq lazımdır. Mənə qalarsa, hətta başqa cəzadan da çəkinməmək gərəkdir.

Semyonov başının üstünü kəsdirmiş Petrova altdan-yuxarı xeyli baxdıqdan sonra ayağa durdu. Sinəsini irəli verib, düz onun gözünün içinə baxdı, kürsünü geri itələyib irəli yeridi:

– Axı siz kimsiniz ki, mənə göstəriş verirsiniz, cənab Petrov, söyləyin görüm, ora-bura soxulmağa sizi vadar edən nədir?

– Cənab direktor, mən əlahəzrət imperatorumuza xidmət edirəm.

– Danosbazlıqla?

– Cənab Semyonov...

– Otağı tərk edin.

– Siz mənimlə belə danışmayın, mən sizin üçün tatar uşağı deyiləm.

– Mən də sizin üçün amalsız bir xəfiyyə deyiləm.

– Siz məni təhqir edirsiniz.

– Siz isə böyük bir milləti ləkələyirsiniz.

– Çox baş aparırsınız, cənab Semyonov, bir sıra məsələlər indi mənə aydınlaşır...

– Mənə də aydınlaşır. Gedin, sizinlə çox danışmağı özümə həqarət sanıram.

* * *

Əşrəfin kəmərini açdılar, şapkasındakı nişanı sökdülər və elə həmin gecə qaranlıq, rütubət zirzəmiyə saldılar. O, bir xeyli susdu. Ayağının altındakı saman xışıltısından başqa heç nə eşitmədi. İrəli yerimək istədikdə başı divara dəydi, əli nəm daşlara toxundu. Əşrəf tərpənmədi. Gözü qaranlığa alışana qədər gözlədi. Hər yer sakit idi. Hardasa su damcılayır, arabir siçan civildəyirdi. Onun əti çimçəşdi, bu rütubətli zirzəmidə qalmağı şəninə sığışdırmadı, ayağa durub qapını sındırmaq və birbaş yataqxanaya yollanmaq istədi. Bayırda səs eşidib susdu. Nə danışıldığını öyrənməyə çalışdı. Növbətçi müəllim Petrov keşikçi tələbəyə göstəriş verirdi. "Bu tərəfə bir adam hərlənsə, ona bir parça çörək verilsə, səni bu çəliklə ölüncəyə qədər əzişdirəcəm, özünü də məktəbdən qovduracam, eşitdinmi? Qapıya qıfıl vur, özüm bir azdan gəlib hər şeyi yoxlayacam".

Əşrəfin dişi bağırsaqlarını doğrasa da dinmədi. Petrovun çəkmələrinin cırıltısı kəsənəcən susdu.

Onun keşiyini çəkən İvan adlı bir tələbə idi. Xristian şöbəsində oxuyan bu uşaqla Əşrəf bir-iki dəfə Kipianinin dərnəyində rastlaşmışdı. Araları açıq deyildi. Ona görə də bir söz deməkdən çəkinirdi. Bir də ona deyiləsi sözü də yox idi. Direktorun əmri ilə onu cəzalandır-

mışdılar. Bir həftə bu qaranlıq zirzəmidə siçanlarla birlikdə yatacaq, sonra isə uşaqların yanına qayıdacaqdı.

Əşrəfin gözü qaranlığa alışdı. O gördü ki, bura darısqal bir yerdir. Döşəməyə küləş tökülmüşdür. Küləşin ortası yapıxmışdır. Görünür ondan qabaq burada cəzasını çəkən uşaqlar yerlərini rahatlamaq üçün hardansa bu küləşi tapıb gətirmişlər.

Əşrəf yeni mənzilini nəzərdən keçirdikdən sonra yerini rahatlamaq istədi. Pencəyinin yaxasını qaldırdı, küləşin üstünə uzanıb gözlərini yumdu. O, hər şeyi unutmaq, qarışıq fikirlərdən yaxasını qurtarmaq üçün yatmağa çalışdı. Siçanlar onun tərpənmədiyini görüb cəsarətləndilər. Əvvəlcə onun ətrafında fırlandılar. Bığlarını oynada-oynada Əşrəfin əllərini, sifətini qoxuladılar. Hətta onun üstündə gəzişdilər. Siçanlardan biri Əşrəfin qulağına yaxınlaşdı. Bu təmasdan oğlan dik atıldı. Siçanlar civilti ilə ətrafa səpələndilər. Əşrəf bir xeyli gözünü qaranlığa zilləyib dayandı. Artıq bayırda səs-səmir kəsilmişdi. Uşaqlar axşam məşğələlərini qurtarıb yataqxanaya getmişdilər. “Yəqin məni heç yada salan da yoxdur. Bu saat şirin-şirin yatırlar. Görəsən, gecədən çoxmu keçib?”

Qapı astadan döyüldü.

– Kimsən?

– Mənəm.

– Sən kimsən?

– Səs salma, qapıya yaxın gəl. Əlini taxtanın arasından bəri sal, götür, uşaqlar göndərib. Yəqin lap acmısan. Bunları ye, sənə süd də gətirəcəklər.

– Vanya, bəs qorxmursan?

– İşində ol, səhərdən başımdan əkə bilmirdim, indicə getdi.

– Kim?

– Cənab növbətçi müəllim.

Əşrəf çörəyi aldı. Soyumuş olsa da, kotleti iştahla yedi.

– Əşrəf!

– Nədi?

– Mən səni belə bilmirdim, qoçaq oğlansanmış, Petrovu yerində yaxşı oturtdun. Bizim hamımız sənə aşiq olmuşuq. Heç nədən qorxma. Səni məktəbdən qova bilməzlər. Hamımız sənin dalında durmuşuq. Öldü var, döndü yoxdur. Çörəyi yedinmi? Deyəsən səs gəlir, geri çəkil.

Əşrəf zirzəminin küncünə qısıldı. Ürəyi döyünə-döyünə bayırı dinlədi. Vanya kiminləsə xısın-xısın danışdı və aradan on dəqiqə keçəndən sonra yenidən Əşrəfi səslədi:

– Ala, bu südü də iç. Firidunla Luka göndəriblər. Sən Lukanı tanıyırsanmı? Bizim şairimiz. Özləri gələ bilməyiblər. Petrov indi də yataqxanada fırlanır. Süpürgəçi ilə göndəriblər.

– Çox sağ olsunlar.

Əşrəf südü başına çəkdi.

– Vanya!

– Nədi?

– Axı yata bilmirəm.

– Niyə?

– Siçanlar qoymur, özü də yaman nəmişlikdir.

– Bilirsən nə var, Əşrəf, zirzəminin aşağısında balaca bir taxta var, başa düşdünmü? Oranı axtar... Tapdınmı? Onu qaldır, qabağına nazik bir pilləkən çıxacaq. Orada balaca otaq kimi yer var. Səhərəcən uzan yat, sonra yenə düşərsən aşağı. Bax, gecikmə ha, sonra sirrimizi açarsan.

– Sən bunları haradan bilirsən, Vanya?

– İki-üç dəfə özüm orda yatmışam.

– Nəyin üstündə?

– Elə bilirsən qoçaq tək sənsən? Di get, gecən xeyrə qalsın.

Əşrəf əlləri ilə qaranlığı yoxlaya-yoxlaya pilləkəni tapdı. Taxtapuşdakı balaca otağa qalxdı. Kiçik pəncərədən təmiz hava onun üzünə vurdu. Əşrəf sinəsi dolusu nəfəs alıb yanağını şüşəyə söykədi. Göyün üzü tərtəmiz idi. Ulduzlar civə kimi titrəşirdi. Kür astadan qıjıldayır, mürgüləyən şəhərin ətrafına dolanırdı.

## 11

Axşam məşğələləri çoxdan qurtarmışdı. Tələbələr xörəklərini yeyib yataqxanaya getmişdilər. Uşaqların yatmasını xəbər verən zəng də çoxdan vurulmuşdu. Amma Dmitri Dmitriyeviç evinə getməmişdi. O, kabinetində təkcə oturmuşdu. Kipianinin tələbələrin gözü qarşısında həbs edilməsi, atlı kazakların axışıb seminariyanın həyətinə doluşması, nəhayət, polis rəisinin özbaşınalığı onu hövsələdən çıxartmışdı. Onun icazəsi olmadan rəhbərlik etdiyi məktəbdə görülən işləri Semyonov pedaqoji təlimə zidd hesab edirdi. O, bir direktor kimi bu barədə Qafqaz maarif müvəkkilinə, eləcə də qubernatora raport göndərmiş və tələb etmişdi ki, bu cür özbaşınalıqlara son qoyulsun. Semyonov belə zənn edirdi ki, onun sözü eşidiləcək, hətta Kipianini də azad edəcək-

lər. Lakin o, tələbələrindən arxayın deyildi. Uşaqların əhvali-ruhiyyəsi onu yamanca narahat edirdi. Semyonov görürdü ki, tələbələr sarsılıblar, daha əvvəlki kimi dərslərə can yandırmırlar. Hətta müəllimlərin dərs deməsinə belə tez-tez mane olurlar. Onlar Kipianinin nə üçün tutulduğunu soruşur, bu işin səbəbini bilmək istəyirdilər. Hətta bir neçə dəfə gəlib Əşrəfin azad olunmasını belə tələb etmişdilər. Semyonov isə sözünün üstündə möhkəm dayanmış, bir direktor kimi verdiyi əmri geri götürməmişdi. Bu gün isə vəziyyət daha da ciddiləşmişdi. Uşaqlar Kipianinin ailəsini Qoridən sürgün olunması xəbərini eşidən kimi dərsi yarımçıq qoyub onun evini əhatə etmişdilər. Hətta xristian şöbəsinin tələbələri polislərlə savaşmışdılar. Onların bir neçəsi indi də qəza dəftərxanasının zirzəmisində dustaq idi. Bütün bunlar Semyonovu darıxdırırdı. O hiss edirdi ki, rəhbəri olduğu məktəbin sükanı əlinin altında ağırlaşır, onu idarə etmək getdikcə çətinləşir. İndi Semyonov adamlara ehtiyatla yanaşır, hər işi şəxsən özü yoxlamamış arxayın ola bilmirdi.

Yarım saat bundan əvvəl növbətçi müəllim tələbələrin yataqxanada olduğunu və yuxuya getdiklərini direktora xəbər vermişdi. Hətta gündəlik qeydlər dəftərində də imza atıb evinə getmişdi. Semyonov isə bir qədər də gözləməyi, yatmağa getməzdən əvvəl yataqxananı yoxlamağı qərara almışdı.

Saat yeknəsəq bir ahəngdarlıqla danqıldadı. Semyonov düşüncələrdən ayrılıb ayağa durdu. Şlyapasını və qara frakını asılqandan götürdü. Elə bu vaxt qapı ehmalca döyüldü. Semyonov “kimdir?” – deyə soruşdu. Ucaboy, nazik bir adam içəri girdi. Direktor heç nə soruşmadan bu adamın çərkəzi paltarına, belindəki gümüş xəncərinə baxdı. Gələn adam da özünü itirmiş kimi bir xeyli dinmədi. Yan-yörəsinə boylandı. Otaqda direktordan başqa heç kimin olmadığını yəqin etdikdən sonra döş cibindən bir zərf çıxartdı.

– Bu sizə çatacaq.

Semyonov zərfi aldı. Şamın işığına tutub diqqətlə nəzərdən keçirdi. Kağızın üstündə nə poçt möhürü vardı, nə də surğuc.

– Kimdəndir?

– Bilmirəm. Xahiş etdilər, Sizə çatdırım.

– Bəs siz kimsiniz?

– Tanımazsınız, Dmitri Dmitriyeviç, ancaq mən sizi tanıyıram. Siz gimnaziyada mənim qızıma dərs deyirsiniz. Məni bağışlayın, tələsirəm. Salamat qalın.

O gəldiyi kimi də sakitcə qapını örtüb getdi. Semyonov bir xeyli heç nə düşünmədən sükut içində dayandı. Sonra zərfi açdı. Onun içində bir balaca kağız vardı. Kim isə qələmlə tələsik bir neçə söz yazmışdı. "Cənab direktor, sabah səhər tezdən Tiflisdən gələn kazaklar Sizin seminariyanı mühasirəyə alacaq və məktəbdə axtarış aparacaqlar. Ehtiyatlı olun. Sizin və bütün xeyirxah adamların dostu olan bir nəfər".

Semyonov çaşıb qaldı. Frakını və şlyapasını stolun üstünə atıb kürsünü altına çəkdi. Şamdanı lap yaxına gətirdi. Məktubu dönə-dönə, diqqətlə təkrar-təkrar oxudu. Bir müddət gözünü kağıza zilləyib dayandı. Xeyli vaxt müəyyən bir qərara gələ bilmədi. İndi o neyləsin? Məktubda yazılanlara inansınmı? Dərhal hamını ayağa qaldırıb polislərdən qabaq özü məktəbdə axtarış aparsın, yoxsa buna əhəmiyyət verməsin? Bəlkə bu məktubu pis niyyətlə yazıblar? Bəlkə bu, xəfiyyələrin qurğusudur?

Kişi lap darıxdı. Yataqxanaya getmək istədiyini, Çernyayevskini gözlədiyini unutdu, ayağa durub fikirli-fikirli otaqda gəzindi. Saat on ikiyə az qalırdı. Yəqin indi uşaqların hamısı yatır. Əgər bu xəbər doğrudursa, kazaklar səhər tezdən burada olmalıdırlarsa, indi Tiflisdən yola düşüblər. Onlar bütün gecəni yatmayacaq, məktəb yuxuda ikən üstümüzü almağa çalışacaqlar. Görəsən bu kimin qurğusudur? Yoxsa mənim özümü də ləkələmək istəyirlər? Yoxsa bizim seminariyanı da şübhəli məktəblər cərgəsinə qatmaq istəyirlər? Bizim uşaqların əlində nə ola bilər?

O bir qədər sakitləşdi və təşvişə düşməyi yersiz saydı, hətta bu barədə heç kəsə bir söz deməməyi qərara aldı. Yenidən şlyapasını və frakını götürdü. Qapıya çatmamış bayırda ayaq səsi eşidib dayandı. Aleksey Osipoviç içəri girdi və azacıq əyilib direktora təzim etdi.

– Üzr istəyirəm, gecikdim.

– Eybi yoxdur.

Onun səsi titrədi. Aleksey Osipoviç diqqətlə direktorun üzünə baxdı:

– Niyə həyəcanlısınız?

Semyonov susdu. Hətta ən yaxın dostuna belə, bir az bundan əvvəl aldığı məktub barədə heç nə deməməyi qət etdi. İri addımlarla qapıya yaxınlaşdı. Əlini cəftəyə apardı. Ancaq qapını açmadı. Qanrılıb Aleksey Osipoviçin üzünə baxdı:

– Məyər həyəcanlanmamaq olurmu?

– Nə üçün, yenə təzə xəbər var?

– Var, özü də lap qəribəsi. Buyurun.

Aleksey Osipoviç kağızı alıb işığa yaxınlaşdı. Semyonov isə arxasını qapıya söykəyib dayandı və dostunun məktubu oxuyub qurtarmasını gözlədi.

– İndi nə edək, Aleksey Osipoviç?

– Uşaqlara məsələni açmaq lazımdır.

– Yəni onlarda qadağan olunmuş bir şey tapılar?

– Meşə çaqqalsız olmaz.

Onlar susdular. Aleksey Osipoviç zahirən özünü təmkinli aparsa da, direktordan çox təlaş keçirirdi. O, Əşrəfin çarpayısından həmin kitabı tapdıqdan sonra şübhə etmirdi ki, uşaqlarda buna bənzər başqa kitablar da var. Əgər bunlar ələ keçsə, seminariyanı boykot edər, bütün müəllim heyətini dəyişdirər, bəlkə də məktəbi lap birdəfəlik bağlayardılar.

– Necə məsləhət bilirsiniz, gedəkmi?

– Gedək. Özü də bir az tələsmək lazımdır.

Aleksey Osipoviç qabağa düşdü. Ancaq astanada dayandı:

– Az qalmışdı ki, unudum, Dmitri Dmitriyeviç, tələbələrdən bir neçəsi sizi görmək istəyir.

– Kimdir, hardadırlar?

– Burdadırlar. Eyvanda dayanıblar.

– Nə olub, yenə vuruşublar?

– Bilmirəm. Nə qədər soruşdumsa demədilər.

Semyonov qapını açıq qoyub iti addımlarla eyvana çıxdı.

– Kimdir məni görmək istəyən?

– Bizik, cənab direktor.

Semyonov eyvanınküncünə, səs gələn tərəfə döndü:

– Siz kimsiniz, bəri, işığa çıxın.

Pəncərədən süzülən işıq döşəməyə sərilib onu zolaq-zolaq etmişdi. Uşaqlar qaranlığı yaran bu işıq zolağına yaxınlaşdılar. Semyonov Lukanı, İvanı dərhal tanıdı. Sonra da dönüb onlardan bir az kənarda dayanan Firiduna baxdı:

– Nə üçün indiyə qədər yatmamısınız?

– Vacib işimiz var.

– Nə olub, yenə dalaşmısınız? İndi kim-kimə hücum edib, xristianlar, yoxsa müsəlmanlar?

Luka yoldaşlarının əvəzində cavab verdi:

– Heç kəs dava eləməyib, cənab direktor, biz başqa iş üçün gəlmişik.

– Yoxsa yenə tələb edəcəksiniz ki, Əşrəfi buraxım, Firidun, elədir?

– Ondan başqa da tələbimiz var.

– Elə isə, buyurun içəri.

Semyonov qabağa düşdü. Keçib öz yerində, kürsüdə əyləşdi. Tələbələrə də oturmağı təklif etdi. Çernyayevski kənarda, pəncərənin önündə dayandı. Semyonov onları bir qədər gözlədikdən sonra yarızarafat dilləndi:

– Buyurun, mən diplomatik danışıqlara başlamağa hazıram, cənablar.

Xristian şöbəsinin tələbəsi İvan direktorun danışıq ahəngindən xoşlanmasa da, özünü itirmədi və dərhal sözə başladı:

– Cənab direktor, Kipianinin və onun ailəsinin vəziyyətindən yəqin ki, xəbərdarsınız. Biz tələbələr onlara yardım etmək məqsədilə pul toplamışıq, hətta müəllimlərdən də bəziləri bu işə qoşulublar. Elə bilirik ki, siz də bu işə tərəfdar çıxıb, bizim səsimizə səs verəcəksiniz.

Semyonovun qaşları çatıldı. Sifətindəki qəzəb bir an içində yox oldu. Uşaqların bu cür qayğıkeşliyini o heç gözləmirdi. Hətta belə bir işin nə üçün əvvəlcə onun ağlına gəlmədiyinə hirsləndi də. Onun keçirdiyi bu hal tələbələrin nəzərindən yayınmadı. Semyonov bir xeyli fikirli-fikirli barmağı ilə stolu taqqıldatdı və səsini alçaldıb mülayimliklə soruşdu:

– İndi tələbiniz nədir?

– Bir qədər də Siz pul verin, sonra da həmin pulların cənab Kipianiyə çatdırılmasına kömək edin.

Otağa ağır sükut çökdü. Saat kəfgirinin tıqqıltısı daha da gücləndi.

– Nə qədər pul yığmısınız?

– Bizim şöbə iki yüz əlli manat.

– Müsəlman şöbəsi də bir o qədər toplayıb.

– Yaxşı iş görmüsünüz, bala, sizin alicənablığınızdan xoşum gəldi. Pulları verin mənə. Sabah müəllimlərdən də toplayarıq, lazımi yerlərlə özüm danışaram. Çalışaram ki, siz deyən kimi olsun. Siz necə məsləhət görürsünüz, Aleksey Osipoviç?

– Bu barədə müəllimlərlə danışmağı mən öhdəmə götürürəm. – Gərək məbləği heç olmasa min manata çatdıraq.

– Başqa sözünüz yoxdur ki?

– Var, – Firidun dilləndi. – Əşrəf...

– Gəlin o barədə danışmayaq. Əmr geri götürülməz.

– Biz başqa şey tələb edirik, cənab direktor, – deyə Firidun ötkəmliklə sözünə davam etdi. – Əşrəfə bundan əlavə cəza verilməməlidir. Əks təqdirdə, bütün tələbələr işə qarışacaq.

– Məni hədələyirsiniz?

– Yox, xəbərdarlıq edirik.

Semyonov hüzurunda dayanan bu dəliqanlı uşaqlara ürəyindən keçənlərin heç birini demədi. Əşrəfi nə üçün cəzalandırmalı olduğunu açıb söyləmədi. Bunu qüruruna da sığışdırmadı. Həm də bu söhbəti kəsməyi qərara aldı. Bir də, bu saat o, tikan üstündə oturmuş kimi narahat idi. Gecə keçirdi. Uşaqlar direktorun nələr fikirləşdiyini anlamasalar da, hiss etdilər ki, o çox qayğılıdır.

Semyonov fikrini topladı və astaca dilləndi:

– O barədə sonra danışarıq. İndi isə daha vacib məsələ var. Madam ki, diplomatik danışığa başlamışıq, onda gərək mənə də qulaq asasınız. Aldığımız məlumata görə, sabah, səhər tezdən polislər məktəbimizdə axtarış aparacaqlar.

– Məqsədləri nədir?

– Məlum deyil, hər halda ehtiyatlı olmaq lazımdır.

– Deyin görək, biz nə etməliyik?

– Bu saat gedin yataqxanaya, şübhə doğura biləcək kitabınız varsa gizlədin. Silahınız varsa, onu da gizlədin. Elə edin ki, ələ bir şey keçməsin, aydındırmı?

Uşaqlar əmr almış əsgər kimi ayağa durdular:

– Getmək olarmı?

– Gedin, ancaq bu işi səssiz-küysüz görün, mən sizə arxayınam, əziz balalar.

Uşaqlar direktorun otağından çıxdılar.

## 12

Yataqxananın qapısı açılan kimi uşaqlar yorğanı üstlərinə çəkib gözlərini yumdular. Otağa xorultu yayıldı. Kənardan baxan onların çoxdan ağır yuxuya getdiklərini zənn edərdi. Əslində isə özlərini yatmış göstərən bu uşaqlar, bir az bundan əvvəl çarpayıların üstündə oturub Osmanın nağılına qulaq asırdılar. İndi isə nəfəslərini içəri salıb susur, gələnin kim olduğunu bilmək istəyirdilər. Əgər müəllimlərdən biri içəri girsəydi, onlar yerlərindən tərpənməyəcəkdilər.

Firidun çarpayıların arası ilə irəlilədi. Uşaqlar gələnin öz yoldaşları olduğunu bilən kimi yorğanı üstlərindən atdılar və yerin içində dik oturdular. Hamının gözü ona zilləndi:

– Hə, nə oldu, Əşrəfi buraxdılar?

– Yox.

– Niyə?

– Dedilər ki, əmr geri götürülməz.

– Biz onları məcbur edərik. Uşaqlar, geyinin, gedək birbaş direktorun evinə.

Firidun onlara mane oldu:

– Dayanın.

– Yenə təzə xəbər var?

– Sabah polislər məktəbimizdə axtarış aparacaqlar.

Yataqxanaya bir anlıq sükut çökdü. Heç kəs dinmədi. Hamı bir-birinin üzünə baxdı.

– Qoy axtarsınlar, nə tapacaqlar?

– Necə nə tapacaqlar? – deyə Osman cavab verdi. – Bəhanə eləməyə nə var? Bir xəncər tapsalar, hay-harayları dünyanı götürəcək.

– Gəlin, belə eləyək, – deyə Firidun yoldaşlarını sakitləşdirdi, – kimin nəyi varsa, gətirsin, hamısını bir yerdə gizlədək. Sonra yenə götürərik. Xristian şöbəsinin uşaqları da belə məsləhət etdilər. Əvvəlcə kitablarınızı yoxlayın.

Uşaqlar çarpayılarından düşdülər. Hər kəs öz yerini yoxladı. Əllərinə keçən kitabları vərəqlədilər. Kim nədən şübhələndisə gətirib ortaya qoydu. Burada Puşkin də var idi, Füzuli də. Firidun da döşəyin altında gizlətdiyi kitabı çıxartdı. Hardansa bir sandıq tapdılar. Kitabları səliqə ilə ora yığdılar.

– Daha bir şeyiniz yoxdur ki?

– Var, – deyə Osman Əşrəfin döşəyinin altındakı xəncəri gətirdi. Sandığın içinə qoymazdan əvvəl tiyəni qınından siyirib baxdı. – Kürə çimməyə gedəndə lazım olurdu. Bir-iki dəfə şəhərdə köməyimizə çatıb. Özün bilirsən ki, adam hərdənbir yumruq davasına da çıxır. Firidun xəncəri alıb kitabların altında gizlətdi. Osmandan sonra bir-iki xəncər də gətirdilər. Hətta bir tapança da verən oldu. Sandığın ağzını bağladılar. Elə bu vaxt Aleksey Osipoviç içəri girdi. Uşaqlar dərhal çarpayıya uzanıb yorğanı başlarına çəkdilər. Aleksey Osipoviç heç nə demədi. Astaca addımlarla çarpayının arasını dolaşdı, açıq qalan dolabçaların ağzını bağladı, sonra Firidunun üzünə baxdı:

– Bir şey qalmadı ki?

– Yox.

Tələbə ilə müəllim bir neçə saniyə sükut içində dayandılar. Onların baxışları bir-birinə zilləndi. Bu lal danışıqla ürəklərindən keçənləri anladılar.

– Arxayın olun, cənab inspektor.

Pəncərə astaca döyüldü. Firidun alnını şüşəyə söykəyib bayıra baxdı. İvanla Luka onu gözləyirdi.

– Aleksey Osipoviç, icazə versəniz biz gedərdik.

– Bu şeyləri hara aparırsınız?

– Məktəbin yanında, hasarın dibində tut ağacı var, orada basdıracağıq.

– Yer hazırdırmı?

– Lukagilin adamları oradadırlar.

Uşaqlar başlarını yorğanın altından çıxardıb söhbətə qulaq asırdılar. Aleksey Osipoviç bunu duysa da, özünü elə aparırdı ki, guya heç nədən xəbəri yoxdur.

Firidun astadan Osmanı çağırdı. Onlar köməkləşib sandığı götürdülər. Səs salmadan həyətə çıxdılar. Aleksey Osipoviç həyətdə onlardan aralandı:

– Sonra mənə məlumat verərsiniz.

Uşaqlar yataqxanadan aralandılar. Ay qərbə doğru əyilsə də, ətraf işıqlı idi. Evlərin kölgəsi yolların ortasına sərilmişdi. Uşaqlar nəzərə çarpmamaq üçün divarın dibinə qısıldılar. Bu minvalla bir-iki döngə keçib məktəbin hasarına yaxınlaşdılar. Birdən Luka ayaq saxladı. Bir kölgə küçəni sürünə-sürünə keçdi. Ayaq səsləri yaxınlaşdı. Uşaqlar nəfəslərini içərilərinə salıb susdular. İvan astaca dilləndi:

– Odur.

– Kimdir?

– Petrov.

– Nədən bildin?

– Çəkməsinin cırıltısından.

– Deyəsən izimizə düşüb.

– Bəs nə edək?

Osman sandığı çiynindən düşürüb Firiduna verdi.

– Siz işinizdə olun, mən onun öhdəsindən gələrəm.

Kölgə lap yaxınlaşdı. Uşaqlar bir az da divarın dibinə qısıldılar. Osman dəstədən aralandı və küçəni o taya keçdi. Petrov səs eşidib dayandı və Osman gedən tərəfə boylandı, sonra divarın dibinə sinə-sinə onu təqib etdi. Osman gah dayanır, gah da az qala yerə yatır, gah da bir anlığa işıqda görünürdü. Petrov da kölgə kimi onu izləyirdi. Firidun başa düşdü ki, Osman onu yataqxanaya doğru aparır.

Luka dilləndi:

– Dayanmayın, gedək.

Onlar yenidən yola düzəldilər.

## 13

Zər paqonlu cavan bir zabit meşin çəkilmiş qapını açıb Semyonovu içəri saldı və dabanlarını cütləyib təzim etdikdən sonra geri çəkildi. Dmitri Dmitriyeviç böyük zalın astanasında dayandı. Bir xeyli hansı tərəfə gedəcəyini müəyyənləşdirə bilmədi. Qubernatorun kabineti o qədər böyük idi ki, özünün harada oturduğunu dərhal görmək mümkün deyildi. Həm də küçəyə baxan pəncərələrin çoxunun taxtası bağlandığından, yuxarı başa qaranlıq çökmüşdü.

Kim isə öskürdü. Semyonov astaca addımlarla küncə doğru irəlilədi. İri yazı masasının önünə çatanda kürsüdə əyləşən qubernatoru gördü və azacıq əyilib təzim etdi. Qubernator ona başını tərpətməklə cavab verdi və əli ilə işarə etdi ki, əyləşsin. Semyonov yumşaq stullardan birində oturdu və qarşısındakı kağızlara baxan qubernatora göz qoydu. Onun boyu balaca idi. Qıvrım saçları ağarmışdı. Hətta bəzi yerlər papiros hisinə düşmüş kimi saralmışdı. Çiynindəki paqonun zərli saçaqları astaca tərpənirdi. Qubernatorun bakenbardı az qala uzun bığlarına qarışmışdı. O sakit və qaraqabaq adama oxşayırdı.

Semyonov qubernatoru süzdükdən sonra gözünü onun üzündən yayındırıb divara baxdı. Hər yer yağlı boya ilə rənglənmişdi. Həm də fırça elə işlədilmişdi ki, adam divara suvaq yox, palıd ağacından qabıq çəkildiyini zənn edirdi. Qubernatorun başı üstündə imperatorun tavandan döşəməyə qədər divarı tutan iri şəkli asılmışdı. Həmin şəklin önündə qubernator lap balacalaşır və iri masa arxasında əyləşən bir oyuncağa dönürdü.

Döşəməni neftlə sildiklərindən hava ağırlaşmışdı. İçəridəki bu kəsif qoxu və ağır sükut adamı darıxdırırdı. Üstəlik, küncdən iri saatın ahəngdar tıqqıltısı otağa hüznlü bir səs yayırdı.

Qubernator kağızları xışıldadıb kənara qoydu və kürsüdə yayxandı. Əllərini qarnının üstündə çarpazlayıb, əsnəməyini güclə saxladı:

– Hə, cənab direktor, mən Sizi dinləyirəm.

Semyonov stulunu azca irəli çəkdi və dirsəyini masanın üstünə qoydu. Qovluqdan bir kağız çıxardıb qubernatora uzatdı:

– Bu raportda bütün vəziyyəti yazmışam.

Qubernator kağıza ötəri bir nəzər salıb kənara itələdi:

– Şifahi danışın, görüm tələbiniz nədir?

– Zati-aliləri, son zamanlar seminariyada elə bir vəziyyət əmələ gəlmişdir ki, işləmək qeyri-mümkün olmuşdur.

– Doğrudur, doğrudur, – deyə qubernator başını tərpədib Semyonovun dediklərini təsdiq etdi və səsini ucaldıb dirçəldi. – Kimdir müqəssir?

– Elə mən də bunu aydınlaşdırmaq istəyirəm, cənab qubernator, axır vaxtlar bizə işləməyə imkan vermirlər. Hər cür pedaqoji qaydanı pozurlar.

– Məsələn?

– Məsələn, – deyə Semyonov bir az duruxdu, – tələbələrin gözü qarşısında sinifdən müəllimi çıxardıb həbs edirlər.

Qubernator halını pozmadan ağzını marçıldatdı:

– Daha sonra?

– Yataqxanada və məktəbdə axtarış aparırlar. Zənnimcə, polis idarəsi bizim aramıza xəfiyyələr də göndərmişdir. Məgər bunlar qanunsuzluq deyilmi, zati-aliləri? Mən bizə qarşı göstərilən bu etimadsızlığı böyük həqarət sayıram. Axı bu inamsızlıq nədən irəli gəlir?

Qubernator heç nə demədi. Mizin üstündəki qovluqlardan birini götürüb vərəqlədi:

– Həbs olunmuş müəllimin familiyası, gərək, Kipianidir, eləmi?

– Bəli. Onun heç bir günahı yoxdur. Mən Sizə raport göndərmişdim və xahiş etmişdim ki, bu işə özünüz qarışasınız. Məsələyə ədalətlə yanaşılsa, o, mütləq azad edilər. Ancaq yerli polislər nədənsə çox tələsirlər. Kipianinin ailəsini də Qoridən köçürtdülər. Deyilənə görə onları sürgün etmək istəyirlər. Bütün bunlar seminariyanın uşaqlarına pis təsir edir, zati-aliləri, onlarda bizim imperiyaya qarşı etimadsızlığın və qəzəbin artmasına səbəb olur.

– Gərək ki, mən onu işə götürmək istəmədikdə israr edən yenə Siz idiniz?

– Bəli. Mən yenə də bu fikirdəyəm ki, Kipiani ən yaxşı vətəndaş və müəllimdir.

– Maraqlıdır... Sizin mülahizələriniz çox maraqlıdır. Təklifiniz nədir?

– Kipianini azad etmək haqqında sərəncam verəsiniz. Daha sonra, tələbələr və müəllimlər ona və ailəsinə yardım göstərmək məqsədi ilə pul toplayıblar. Qori qəza polis rəisi bu pulu məhbusa çatdırmaqdan imtina edir. Xahiş edirəm, bu barədə Siz özünüz sərəncam verəsiniz. Onun vəziyyəti çox ağırdır.

– Sizin mərhəmətli bir şəxs olmanız mənim qəlbimi az qalır riqqətə gətirsin, cənab Semyonov, daha nədən narahatsınız?

– Mənə bir direktor kimi etimad edilməməsindən. Mən xahiş edirəm, göstəriş verəsiniz, bundan sonra bir daha tələbələrin və müəllimlərin izzət-nəfsinə toxunmasınlar. Elə bilirəm biz nə iş tutduğumuzu polislərdən yaxşı başa düşürük.

Qubernator kürsüdə bir az yayxandı və gözünü qıyıb müsahibinə baxdı. Dmitri Dmitriyeviç də gözünü ondan çəkmədi. O nə qədər çalışdısa da, sifətinin bircə əzası belə tərpənməyən, soyuq baxışlı qubernatorun nə düşündüyünü, onun dedikləri ilə şərik olub-olmadığını müəyyənləşdirə bilmədi. Qubernator yenə əvvəlki kimi sakit və təmkinli idi. Ona görə də onun verdiyi sual Semyonov üçün çox gözlənilməz oldu.

– Peterburqdan çoxdanmı çıxmısınız?

– On ildir. Necə məgər?

– Heç, elə-belə soruşdum. Buralarda darıxmırsınız ki?

– Öyrəşmişəm. Bir də iş çoxdur.

Qubernator ayağa durdu. Asta addımlarla pəncərəyə yaxınlaşıb taxtanı araladı. Şiddətli işıq zolağı qaranlığı qılınc kimi kəsdi və mizin üstünə sərildi. Divarın bir tərəfi işıqlandı. Şəkildəki imperatorun paqonu, ordenləri və qızıl düymələri işığa qərq oldu. Qubernator əllərini geri yanında çarpazlayıb bir çiyni üstündə döndü və Semyonova çəpəki nəzər saldı. Semyonov onun azacıq donqarlanmış belini və qövsşəkilli əyri qıçlarını aydın gördü. Onun dizinin kündəsinə qədər çəkdiyi çəkməsi, dabanlarındakı mahmızlar par-par parıldayırdı.

– Sizi Qafqaza kim göndərib?

– Mənimi? – deyə Semyonov təəccüblə soruşdu və çiyinlərini çəkdi. – Heç kim.

– İstəsəniz Peterburqda qala bilməzdinizmi?

– Qala bilərdim, ancaq elə zənn edirəm ki, mən burada daha çox fayda verirəm.

– Kimə?

Semyonov bu gözlənilməz sualdan sonra bir az duruxdu və gördü ki, qubernator yenə əvvəlki kimi dayanıb, çəpəki nəzərlə ona baxır.

– Qafqaz xalqına və öz millətimə.

– Maraqlıdır... Çox maraqlıdır. – Qubernator gəlib öz yerində əyləşdi və mizin üstündəki zəngi çaldı. Bayaqkı cavan zabit qapının ağzında göründü. Qubernator üzünü Dmitri Dmitriyeviçə tutdu. – Bir fincan qəhvə gətirsələr, imtina etməzsiniz ki?

– Çox sağ olun.

– Buyuracaqsınız.

Zabit heç iki dəqiqə keçməmiş gümüş sinidə qəhvə gətirdi. Fincanlara süzdü və dinməz-söyləməz çıxıb getdi. Qubernator fincanın birini Dmitri Dmitriyeviçin qabağına qoydu, birini də özü götürüb qaşıqla qarışdırdı:

– Cənab Semyonov, Siz burada kimi təmsil edirsiniz?

– Sualınız çox mürəkkəbdir, zati-aliləri!

– Burada mürəkkəb bir şey yoxdur, – deyə qubernator gülümsündü. – Məsələn, mən əlahəzrət imperatorumuzu, böyük rus imperiyasını təmsil edirəm. Bəs Siz?

– Mənmi? – Semyonov da gülümsündü, – mən olsa-olsa rus ziyalılarının bir nümayəndəsiyəm.

– Unutmayın ki, rus ziyalılarının çoxu imperiyanın məmurudur. Elə Siz özünüz də Qafqaza gəlmiş bir məmursunuz.

– Zati-aliləri, rəsmi vəzifədən başqa bir də hər insanın vətəndaşlıq borcu var. Mən rəsmi məmurlardan daha çox öz vətəndaşlıq borcumu yerinə yetirməyə çalışıram. Elə Qafqaza da bu məqsədlə gəlmişəm.

– Maraqlıdır... Çox maraqlıdır... Lütfən söyləyin görüm, Siz vətəndaşlıq borcunu nədə görürsünüz?

– Öz millətimin və vətənimin şərəfini ucaltmaqda. Zənnimcə, hər bir namuslu vətəndaş çalışmalıdır ki, öz hərəkətləri ilə mənsub olduğu xalqın yaxşı keyfiyyətlərini nümayiş etdirsin. Bəzən bir adamın timsalında bütün xalq haqqında təsəvvür yaranır.

– Ona görə də buralarda məktəb açıb yerlilərin uşaqlarına dərs deyirsiniz, eləmi? Həm də bu işin rus millətinə xeyri olduğunu söyləyirsiniz. Məni başa salın görüm, yerli millətlərin savadlanmasının ruslara nə kimi xeyri dəyə bilər?

Dmitri Dmitriyeviç elmin, maarifin hamıya lazım olduğundan, savadsızlığın nəinki ucqarlarda, hətta Rusiyanın mərkəzində də bəlalar törətməsindən, hər bir namuslu ziyalının bu bəlalarla mübarizə aparmağa borclu olduğundan danışmaq istəmədi. Hiss etdi ki, qubernator qəsdən, hansı bir gizli niyyətləsə bu cür sual verir. Ona görə də onun rəsmi sualına rəsmi cavab verməyi qərara aldı:

– Xeyri olmasaydı, əlahəzrət imperator özü yerlilər üçün məktəb açılması haqqında fərman verməzdi.

Qubernatorun sol qaşı azacıq səyridi. Gözünün qarası bir neçə saniyə titrədi. Ancaq bunlar çox çəkmədi. Onun sifəti yenə əvvəlki kimi soyuq ifadə aldı. Dodaqlarında anlaşılmaz bir təbəssüm oynadı:

– Əlahəzrət imperatora yerlilərdən rus dilini bilən məmurlar lazımdır, cənab direktor, amma Siz, deyəsən, bu vəzifəni unudub, maarif məşəli yandırmaq istəyirsiniz.

– Bu bizim tarixi borcumuzdur. Millətlər gərək bir-birinə kömək etsinlər, şüurlar oyansın.

– Borc... millət... şüurlar oyansın. Çox maraqlıdır, çox maraqlıdır.

Qubernator siyirtməni çəkdi. Xeyli eşələndikdən sonra iri bir şəkil çıxardıb, astaca Semyonova doğru itələdi:

– Bunu tanıyırsınızmı?

Dmitri Dmitriyeviç şəkli götürdü. Jiletinin döş cibindən eynəyini çıxardıb gözünə taxdı və diqqətlə baxdı:

– Tanıyıram. Müəllimdir. Bizim seminariyaya tələbə gətirmişdi. Göytəpədəndir. Adı Əhməddir.

– Bəlkə tələbələri bəhanə edib Kipiani ilə görüşməyə gəlmişdi?

– Mən Sizə təəccüb edirəm, cənab qubernator, nə üçün hamıya şübhə ilə yanaşırsınız?

– Bəs bu necə? – deyə qubernator təzə bir şəkli qəzəblə masanın üstünə atdı.

Semyonov şəklə baxdı. Təəccüblə çiyinlərini çəkdi. Sonra ayağa durub otaqda hirslə gəzinən qubernatora baxdı. O, elə bil bir az bundan əvvəlki sakit adam deyildi. Dabanlarının zərbindən döşəmə titrəyir, mahmızlarının cingiltisi otağı doldururdu.

– Bunun oğlu Sizin seminariyada oxuyur. Özü isə meydanda at oynadıb bizim kazaklarla döşləşir. Heç kəsi tanımaq istəmir. Başa düşdünüzmü bunlar nə deməkdir, cənab Semyonov? Əgər onları vaxtında əzməsək, bizə qan uddurarlar. Unutmayın ki, biz buraya qoşunla, ordu ilə gəlmişik. Süngülər, kazak qılıncları, qalalar olmasa, bircə gün də hakimiyyəti əldə saxlaya bilmərik. Aydındırmı? Bizə Sizin maarif ordunuz yox, əli qılınclı kazak lazımdır.

Qubernator dabanı üstə qalxıb bir-iki dəfə ləngər vurduqdan sonra keçib yerində əyləşdi. Dərhal əvvəlki kimi balacalaşdı və sakitləşdi:

– Qəhvənizi için.

Semyonov soyumuş qəhvəni dodaqlarına yaxınlaşdırdı. Qurtum-qurtum içməyə başladı. Onun hülqumu qalxıb-endi, nə qədər çalışdısa da, qurultunu kəsə bilmədi. Özü də hiss etdi ki, əlləri əsməyə başlayıb. Qubernator qaşığı sakitcə fincanın içində hərlədi. Gözünü qapıya doğru zillədi:

– Sizin neçə yaşınız var?
– Əlli tamam olmuşdur.
Ortaya sükut çökdü. Qubernator kiçik qurtumlarla fincanı boşaltdı, siniyə qoyub geri itələdi. Təzədən kürsüyə yayxandı və gözünü qıyıb Semyonovu süzdü:
– Çox yorğun görünürsünüz, deyəsən, Qafqaz Sizi əldən salıb.
Semyonov fincanı dodaqlarında saxladı və təəccüblə qubernatorun üzünə baxdı. Son qurtumunu içmədən fincanı siniyə qoydu. Dəsmalla ağzını quruladı:
– Hələlik yorğunluqdan şikayət etmirəm.
– Siz gizlətsəniz də qayğınıza qalmaq bizim borcumuzdur. – O xeyli dayandı və birdən irəli əyilib iki əlini mizin üstünə qoydu. Bu dəfə onun qaşları qalxdı, alnı düyünləndi və gözləri hiyləgərcəsinə qıyıldı. – Necə bilirsiniz, Sizin istirahət vaxtınız çatmayıbmı?
Dmitri Dmitriyeviç dəhşətli və zəhərli bir varlıqla qarşılaşmış kimi diksindi. Qubernator yenə əvvəlki vəziyyətində dayanıb, qıyıq gözlərini ona zillədi. Aşkarca fısıldamağa başladı.
– Siz mənə istefaya çıxmağımı təklif edirsiniz?
– Xeyr, cənab direktor, məsləhət görürəm.
Qubernator ayağa durdu. Pəncərənin taxtasını örtdü. Qaranlıq ağız-ağıza qovuşub işığı uddu.

* * *

Semyonov qubernatorun yanından çox pərt çıxdı. Ondan vəsiqə soruşanlara cavab vermədi, həyətdə keşik çəkən kazakların yanından dinməz-söyləməz ötdü, arxasınca deyinən qorodovoyların səsini belə eşitmədi. Darvazadan çıxan kimi birbaş küçəyə endi, axışıb gedən izdihama qarışdı. Günortaüstü idi. Tiflis elə bil od tutub yanırdı. Daş səkilər, kərpic divarlar qızmışdı. Adamlar sərin yer axtarır, mümkün qədər evlərin kölgəsinə qısılmağa çalışırdılar. Faytonçular qamçılarını havada oynadırdılar. Qan-tərə batan atlar dördnala çapdıqca divarlar nal şaqqıltısını əks etdirib cingildəyirdi.
Semyonov əyri-üyrü küçələrdən, dar dalanlardan keçdi və özü də hiss etmədən şəhəri ortadan bölən Kürün sahilinə endi. Suyun nəfəsi onun üzünə vurdu. Kişi dayanıb dərindən köksünü ötürdü. Qalstukunu açdı, köynəyinin yaxasını boşaltdı, pencəyini soyunub qolunun üstünə aldı. Külək onun islaq köynəyini bədəninə yapışdırdı. Semyonov

dəsmal çıxardıb boynunu quruladı. Hirsdən və pərtlikdən od tutub yanan bədəni bir azca sərinlədi, ancaq ürəyi sakit olmadı. Qubernatorun son sözləri yenidən qulaqlarında səsləndi: "Sizin neçə yaşınız var? Necə bilirsiniz, artıq istirahət vaxtınız çatmayıbmı? Bu nə demək idi? O mənim qayğımamı qalırdı?" Semyonov təzədən həyəcanlandı. Sulara baxa-baxa körpüyə addımladı. Hər iki tərəfdən sıxışdırılıb yatağı daraldan Kür sanki burada, şəhərin ortasında sərbəst əl-qol ata bilmədiyindən, qəzəblənib özünü sahil daşlarına çırpır, onun boz-bulanıq suları burulub fırlanır, nəriltisini içəri salıb boğuq-boğuq uğuldayırdı. Elə bil o da insanlar kimi bu dar keçidlərdən çıxıb getmək və haysız-küysüz səhralarda asudə nəfəs almaq istəyirdi.

Semyonov suyun axarı ilə xeyli irəlilədi və Metex qalasının bərabərində ayaq saxladı. O birinci dəfə görürmüş kimi qarşıdakı sahilə gözünü zillədi. Hündür yarğanın lap üstündə iki, üçmərtəbəli evlər tikilmişdi. Eyvanlar süzüb Kürün üstünə gəlmişdi. Külək dirəklərə bağlanmış iplərin üstünə sərilən paltarları havada oynadırdı. Adama elə gəlirdi ki, bu saat yarğanın torpağı axıb töküləcək, evlərin divarları qarınlanıb gurultu ilə suya düşəcək. Orada yaşamaq bir yana qalsın, kənardan tamaşa etmək insanı vahimələndirir. Ancaq bu evlərin sakinləri heç nəyi veclərinə almırdılar. Əksinə, suya baxan pəncərələri açıb qurşağa qədər sallanır, qonşularını səsləyib nə isə deyirdilər. Uşaqlar eyvanlarda qaçışırdılar.

Semyonov bir xeyli sıldırım qayalıqlardakı qartal yuvalarını xatırladan bu evlərə baxdıqdan sonra gözünü Metex qalasına zillədi. Kilsəyə oxşayan bu bina nəhəng bir qayanın üstündə tikilmişdi. Sal daşların ətəyini Kürün ləpələri yalayırdı. Sular özünü həmin qayaya çırpır, sonra da burnu əzilmiş kimi geri çəkilib yatağına qısılırdı. Qala divarlarının üstündə keşikçilər dolaşırdılar. Onlar açıq səmanın fonunda xırdaca qarışqalara bənzəyirdilər. Semyonov istər-istəməz Kipianini xatırladı. Ona elə gəldi ki, o, buradadır. Bəlkə dar barmaqlıqların arasından şəhərə boylanır? Bəlkə o da Semyonov kimi gözünü Kürün burulğanlı sularına zilləyib həsrətlə sahili seyr eləyir? Semyonov xəyalında yarğanın hündürlüyünü ölçdü: "Yəqin altmış arşın olar. Yox, lap çoxdur. Bəlkə də lap yüz arşındır? Görəsən, oradan atılıb suya düşmək olarmı? Adam qayalara dəyib parçalanmazmı? Yox, çətin işdir. Bu zindandan yaxa qurtarmaq heç ağlasığan iş deyil". Semyonov köksünü ötürüb yenidən qalanın zirvəsinə baxdı. Qüllənin arxasında səmanın açıq-maviyə çalan bir parçası görünürdü. Orada iki

qartal qanad çalıb süzürdü. Onların kölgəsi bəzən qalanın üstünə düşür, bəzən də bərilərə gəlirdi.

Körpünün altından bir qayıq çıxdı. Suyun axarı ilə irəlilədi. Semyonov onların geyimindən başa düşdü ki, gələnlər kintolardır. Qayıq qalanın bərabərinə çatanda kintolardan biri çaxır tuluğunu havaya qaldırdı. Balabançılar neyi inildətdilər. Qayıqdakılar xorla oxudular. Onların səsi sal daşlara toxunub parçalandı. Köpüklü sular qayığı bura-bura uzaqlaşdırdı.

Semyonov qubernatorun sözlərini yenidən xatırladı: “Biz buraya qoşunla, ordu ilə gəlmişik. Süngülər, qalalar olmasa, bircə gün də hakimiyyəti əldə saxlaya bilmərik. Yoxsa öz maarif ordunuzu bizə qarşı qoymaq istəyirsiniz? Məsləhət görmürəm, cənab”. Qubernator düz başa düşmüşdü. O, qəlblərdə yandırdığı maarif məşəlinin sönəcəyini heç cür ağlına gətirə bilmirdi. Onun idealı insanlığa xidmət etmək idi. O, elmi, maarifi bir işıq, bir nur hesab edirdi. Bunu söndürmək yox, daha da gücləndirmək lazım idi. Bu yolda çətinliklər də olacaq. Qoy olsun. Məsləkə dönük çıxmaqdansa, namusla ölmək yaxşıdır. Semyonov öz yolundan qayıtmayacağını, yenə əvvəlki kimi işləyəcəyini qət etdi. Lakin Kipiani yadına düşdükdə yenə sarsıldı. Onu müdafiə edə bilmədiyinə görə xəcalət çəkdi. Əslində o, bu gün qubernatorla görüşə gedəndə inanırdı ki, hər şeyi knyaza başa salacaq və sübut edəcək ki, Kipiani günahsızdır. O, ümid edirdi ki, müəllimi həbsxanadan azad etdirəcəkdir. Ancaq qubernator bu barədə danışmaq belə istəmədi. Hətta onun özünü günahlandırdı. Üstəlik, çox incə eyhamla başa saldı ki, istefaya çıxmaq lazımdır. Ona ən çox təsir edən də bu idi. Neçə ildən bəri zəhmət çəkib məktəbi sahmana salmışdı. Müəllimlər kəndbəkənd düşüb tələbə yığmışdılar. Yeni şöbə açmışdılar. Bunları qoyub hara getsin? Seminariyadan başqa Qoridə qız gimnaziyası da açmışdılar. Müəllimlər orada könüllü olaraq dərs deyirdilər. Bütün bu zəhmətləri hədərmi getsin? Yox, mən geri çəkilməyəcəyəm. Peterburqa yazacam. Maarif Nazirliyinə, lap imperatorun özünə müraciət edəcəm. Bəlkə bu işdə mənə Uşinskinin dostları da kömək etdilər. Axı, o mənim qayınatam olmaqdan başqa böyük pedaqoqdur. Mənim müəllimim olmuşdur. Onun tələbələrinin çoxu indi nazirlikdə işləyir.

Semyonov bu cür qarışıq fikirlərlə xeyli gəzdikdən sonra sahildən aralandı. Meydançaların birində fayton saxlatdı. Vağzala sürməsini xahiş etdi. Daş döşəmədə nal şaqqıldadı. Atlar yeknəsəq addımlarla irəlilədilər. Qədim daş körpüdən keçəndə kilsə zəngləri çalındı. Sem-

yonov dönüb şəhərə baxdı. Boz daşdan tikilmiş kilsələr şəhərin evlərindən seçilirdi. Onların sivri qülləsi qılınc kimi sıyrılıb göyə ucalırdı. Qızılı xaçlar parıldayırdı. Kilsə zəngləri ara verən kimi müsəlman hissəsindəki məscidin göy kərpicdən tikilmiş qoşa minarəsindən müəzzinin səsi eşidildi.

**14**

Gecədən xeyli keçmiş Göytəpənin kənarında bir dəstə atlı göründü. Səs salmamaq üçün xır yolundan çıxdılar. Təpələrin arasında cilovu çəkib dayandılar. Bir xeyli, nəfəs belə almadan ətrafı dinşədilər. Xır yolu bomboş idi. Kəndin arasındakı cığırlarda da bir tərpəniş sezilmirdi. Sükutdan qulaq batırdı. Sahil boyu səpələnmiş daxmaların işığı çoxdan sönmüşdü. Göyün üzü tutqun olduğundan, kəndin üstünə çökən qaranlıq daha da qatılaşmışdı. Yalnız Kür daxili bir qəzəbdən titrəyirmiş kimi boğuq-boğuq uğuldayırdı. Hardasa kəsik-kəsik it hürürdü.

Atlılar xısınlaşdılar. Astadan fit çalındı. Bu işarədən sonra Acı dərə tərəfdən qatar-qatar qaraltılar axışıb gəldi. Onlar da təpələrin arasında dayandılar. Kimi isə gözlədilər. Nəhayət, axırıncı dəstə də onlara qarışdı. Yalnız bundan sonra hissələrə bölündülər. On-on beş atlı da xır yolunu keçib kəndin alt tərəfinə doğru irəlilədi. Sahilə yaxınlaşanda cığırdan çıxıb Cahandar ağanın evinə doğru getdilər. Yarğanın kənarında seyrəlib zəncir kimi uzandılar. Suvadağa gedən yolu kəsdilər. O biri dəstə boz kolların arası ilə kəndin üst tərəfinə doğru yollandı. Yenidən hər şey sakitləşdi. Üçüncü dəstə isə torpaq yolla irəlilədi. “Zayej”in bərabərinə qədər səssizcə getdilər. Burada dönüb xır yoluna keçdilər. Birbaş həyətə doluşdular. Cilovu çəkib dayandılar. Kim isə qaranlıqda əli ilə işarə etdi. Atlılar iki bölünüb evi arakəsməyə aldılar. Bir xeyli gözlədikdən sonra üç nəfər atdan düşdü. Çaxmaq səsləndi. Sinə-sinə eyvana çıxdılar. Otaqda adam olub-olmadığını yəqinləşdirmək məqsədilə qapının dalında dayandılar. Susdular. Heç nə eşidilmirdi. Bəlkə onu duyuq salmışdılar? Bizdən fənd tərpənib aradan çıxmışdır? Bəlkə hər şeydən xəbərsizdir, yorğan-döşəkdə şirincə yatır? Bəlkə də içəridə, əlində tüfəng, dayanıb gözləyir?

Qapının dalındakılar bir-birinin üzünə baxdılar. Xeyli susdular. Sonra onlardan biri tüfəngin qundağı ilə taxtanı döyəclədi, dərhal da geri çəkilib divara qısıldı. İçəridə nə isə şaqqıldadı və hövlnak ayılmış adamın həyəcanlı səsi eşidildi:

– Kimsən?

Bir anlığa heç kəs dillənmədi. Astananı kəsdirənlərin fısıltısı daha da gücləndi. Əhməd bir də soruşdu:

– Ay adam, səsini çıxart.

– Qapını aç, pristav gəlib.

Əhməd dinmədi. Hiss olundu ki, qapının arxasındadır. Zirəzə səsləndi. Bayırdakılar tüfəngi hazır tutub gözlədilər. Əhməd isə geri çəkilib pəncərəni açdı, sakitcə eyvana düşdü. Qapıda dayananların geri yanını kəsdi. Qaranlıq da olsa, eyvandakıların geyimindən bildi ki, gələn kazaklardır. Gözünü hərləyib həyətə də baxdı. Dörd tərəfi kəsmişdilər.

– Nə istəyirsiniz?

Kazaklar diksinib geri atıldılar. Boğuq bir səs eşidildi:

– Tüfəngi yerə at!

Əhməd astadan, təmkinlə dedi:

– Qorxmayın, mən qonağa əl qaldırmaram.

– Gəl qapını aç.

– Açıqdı, keçin içəri.

– Əvvəlcə sən keç.

Əhməd qapıya yaxınlaşdı. İtələyib taybatay açdı. Kibrit çəkib çırağı yandırdı. Kazaklar otaq işıqlanan kimi hər yeri gözdən keçirdilər. Əhmədin tək olduğunu bilib sakitləşdilər. Əhməd geri dönüb onların üzünə baxdı və dərhal, bir neçə ay bundan əvvəl pristavla Göytəpəyə gələn yekəpər kazakı tanıdı:

– Xoş gördük, köhnə dost, sənsən, gecə vaxtı haradan gəlirsən?

Kazak stola yaxınlaşdı. Çırağın fitilini qaldırdı və bundan sonra Əhmədin üzünə baxıb fısıldadı:

– Bilərsən.

Pristav bir neçə kazakın müşayiəti ilə içəri gəldi. Otağı xeyli süzdü, sonra üzünü barmağı tətikdə olan kazaklara tutdu:

– Nə olub, ev sahibini niyə qorxudursunuz?

Kazaklar geri çəkildilər. Pristav irəli yeriyib Əhmədlə köhnə dost kimi görüşdü:

– Hə, işlərin necədir, təzə məktəb tikintisinə haçan başlayırsınız?

Əhməd onun səsindəki süni mehribanlığı duysa da, üstünü vurmadı. Dodaqaltı gülümsünüb pristava stul təklif etdi:

– Deyəsən, mənə köməyə gəlibsiniz?

Pristav dönüb onun üzünə baxdı. Gözlərində oynayan qəzəb qığılcımlarını boğub güclə gülümsündü:

– Bacardığımı edəcəm.

O oturdu. Kazaklar qapının ağzını kəsib dayandılar. Əhməd hiss etdi ki, bunlar gecə vaxtı xeyirliyə gəlməyiblər. Onların nə isə gizli bir planları var: kiminsə üstünü qaranlıqkən almaq, kimisə kəməndə salmaq istəyirlər.

Əhməd kürəyini divara söykədi. Əllərini qoynunda çarpazladı. Pristav bir müddət susdu. Sonra üzünü Əhmədə tutdu:

– Molla Sadığı buraya çağıra bilərikmi?

Əhməd bu suala nə cavab verəcəyini dərhal müəyyənləşdirə bilmədi. Pristavın gecəyarısı kəndi basa-basa gəlib mollanı soruşması onu çaşdırsa da, təəccübünü gizlətməyə çağırdı:

– Molla Sadıq indi çoxdan şirin yuxudadır.

– Eybi yoxdur, oyadarıq. Sən bizim uşaqlara onun evini göstər.

– Mən indiyə qədər onun qapısına hərlənməmişəm.

– Söz güləşdirmə.

Əhməd pencəyini geyindi və tüfəngini götürmək istədi. Ondan qabaq kazaklardan biri əlini irəli uzatdı. Pristavın sakit səsi eşidildi:

– Sən silahsız da keçinə bilərsən, yanındakılar yaraqlıdır.

Əhməd kazakların müşayiəti ilə kəndə doğru addımladı.

Atlılar iki yerə bölündülər. Bir hissəsi yolun altı ilə getdi, o biri hissəsi arxada qaldı. Kəndin girəcəyinə çatdılar. Sərvaxt yatan itlər ağız-ağıza verib hürüşdülər. Şirin yuxuda olan kəndə hay düşdü. Əhməd əyri cığırlarla getdikdən sonra dayandı. Molla Sadığın evini uzaqdan kazaklara göstərdi. Atlılardan biri Əhmədin yanında qaldı. Qalanlar qabağa keçdilər. Molla Sadığın itləri ağız-ağıza verdi. Əhməd zəncirdən açılmış itlərin bu saat atlılara hücum edəcəyini gözlədi. Ancaq itlər həyətdən bayıra çıxmadılar. Elə Molla Sadığı da yuxudan oyatmaq lazım gəlmədi, səs eşidən kimi özü həyətə çıxdı. İkicə dəqiqə keçməmiş kazaklarla bərabər doqqazda göründü. Dəstə sakitcə geri qayıtdı.

Əhməd yol boyu mollanın üzünə baxmadı. “Bu necə olan işdir? Deyəsən, Molla Sadıq geyinicəkli oturub kazakların yolunu gözləyirmiş? Yoxsa bunların əvvəlcədən danışıqları olub? Yoxsa Molla Sadıq yenə bir kələk qurub? Belə olmasaydı, gecənin bu vaxtı pristav onu yanına çağırardı? Bəlkə molla öz düşmənini bu yolla aradan götürmək istəyir? Bəlkə bunlar Cahandar ağanın dalınca gəliblər?” Əhməd istədi ayaq saxlasın, kazakları və mollanı “Zayej”ə ötürüb geri qayıtsın, bir bəhanə ilə gözdən yayınıb kəndə girsin. Cahandar ağanı xəbərdar etsin. Əhməd onları yoxlamaq məqsədi ilə xır yoluna çatanda ayaq saxladı.

Dərhal kazaklardan biri atını sürüb onu itələdi. Əhməd ehtiyatlanmağa başladı. Deyəsən, onun özünü də gözdən qoymaq istəmirdilər.

“Zayej”in həyətinə girəndə Molla Sadıq qabağa keçdi. Kazaklara fikir vermədən irəli yeridi və birbaş otağa girib pristavla görüşdü. Əhməd yenə əvvəlki yerinə gəldi. Kürəyini divara söykəyib əllərini köksündə çarpazladı. Molla ilə pristav bir xeyli bir-birinin üzünə baxdılar. Əhməd onların gözündəki mənanı oxudu və başa düşdü ki, pristavla molla məsləhətləşmək, gizli bir məsələ barədə söhbət etmək istəyirlər. Pristav ondan nə soruşacaq, molla isə əvvəlcədən şərtləşdikləri üzrə, ona müəyyən məsələləri açıb deyəcəkdi. Ancaq Molla Sadıq indi Əhmədin hüzurunda danışmaqdan ehtiyat edirdi. Birdən Əhmədin ağlına bir fikir gəldi: bəlkə elə bunu bəhanə edib birtəhər otaqdan çıxsın, onları tək buraxsın? Sonra da kazakların gözündən yayınıb heç olmasa beş-on dəqiqəliyə kəndə qaçsın?

Otaqdakı sükut xeyli çəkdi. Molla Sadıq gözucu Əhmədə baxanda, o sakitcə qapıya doğru addımladı. Eyvana çıxdı. Ancaq kazaklar Əhmədə həyətə düşməyə imkan vermədilər. Pristav molla ilə üzbəüz qaldıqdan sonra dərhal sözə başlamaq istədi, elə buradaca başa düşdü ki, molla ilə heç nə danışa bilməyəcək. Nə molla onu başa düşəcək, nə də o, mollanı.

Əhmədi geri çağırdılar. Pristav mollanın sifətindəki həyəcanı oxudu. Gülümsünərək üzünü Əhmədə tutdu:

– Mollanı başa sal ki, mən sənə etibar edirəm. Səndən gizli söhbətimiz ola bilməz. Çünki sən də qulluqçusan, hökumət adamısan. Qoy ürəyində nə varsa, hamısını desin. Səndən ehtiyat etməsin. Əvvəlcə soruş gör, Cahandar ağadan nə bilir, bu saat evindədir, ya yox?

Əhməd üz-gözünü ikrahla turşutdu və mollaya sarı döndü. Molla Sadıq onun kəskin baxışlarından diksinib yerində fısıldadı. Əhməd isə hirsindən dişini-dişinə qısdı:

– Pristavın dediklərini başa düşdünmü, molla cənabları? İndi də satqınlığa başlamısan? İndi də xəfiyyəlik eləyirsən? Adamları ələ verib yerini xəlvətləmək istəyirsən? Buyur, de görək Cahandar ağa haradadır? Dillən, niyə susursan? Camaatı gecə vaxtı töküb gətirmisən, tez ol, düş qabağa, göstər onun evini. De ki, yaralıdır, evdə xəstə yatır.

– Artıq-əskik danışma. Hökumət nə iş tutduğunu bizdən yaxşı bilir. Cahandar ağa gündə bir adam öldürüb gəzəcək, biz də susacağıq?

Əhməd iki addım irəli gəldi. Molla ilə üzbəüz dayandı. Onların nəfəsi bir-birini qarsaladı.

– Taqsır Cahandar ağadadır. O gərək əvvəlcə səni susduraydı ki, satqının biri azalaydı.

Molla Sadıq dik atıldı. Onun boynunun damarları şişdi:

– Cənab pristav, əvvəlcə bu kafirin dilini kəsmək lazımdır. Mən onun yanında sizə heç nə deməyəcəyəm.

Pristav dili başa düşməsə də, anladı ki, molla həddindən artıq qəzəblənmişdir. Elə Əhmədin özü də tir-tir əsir. Pristav gördü ki, Əhmədin əlacı olsa bu saat mollanı əlləri ilə boğar, dişləri ilə parçalayar. Pristav onu da başa düşdü ki, əvvəlcə Əhməddən istifadə etmək, sonra qollarını sarıyıb atın qabağına qatmaq fikri baş tutmayacaq. Əhməd onlara heç nə tərcümə etməyəcək. O istəyirdi ki, Əhməd onu tutmağa gəldiklərini hələlik bilməsin, arxayın olsun. Ancaq deyəsən Əhməd o qədər də sadəlövh deyildi. Elə ilk dəqiqələrdən hər şeyi hiss etmişdi. Pristav qərara aldı ki, oyun oynamasın, elə birbaşa işə keçsin. Hirslə ayağa durdu. Əhmədlə qabaq-qabağa dayandı:

– Cənab Peterburq studenti, deyəsən, səninlə də haqq-hesabı çürütməyin vaxtı çatıb. Səni də dostun Kipianinin yanına göndərmək lazımdır. Mən səninlə adam kimi rəftar etmək istəyirdim, amma başa düşmədin. – O, üzünü kazaklara tutdu. – Bağlayın qollarını!

– Sizin məni tutmağa əsasınız yoxdur.

– Tapılar. Axtarın bunun evini!

Kazakların ikisi irəli keçib Əhmədin qollarını arxadan tutdu. Yekəpər kazak dərhal qabağa yeridi. Qıllı papağını qıllı qaşının üstündən geri çəkdi. Ağzını qulağının dibinəcən açıb istehza ilə güldü:

– İndi bildinmi nədən ötrü gəlmişəm, cənab uçitel!

– Bildim, ancaq xeyri yoxdur. Zaman öz bildiyini tutacaq.

Əhmədi həyətə çıxartdılar. Evin altını üstünə çevirdilər. Dəftərləri, kitabları dağıtdılar. Pəncərənin önündəki qlobusu yerə saldılar. Yorğan-döşəyi döşəməyə atdılar. Yastıq tükləri ətrafa səpələndi.

## 15

Cahandar ağa oyanıb mütəkkəyə dirsəkləndi. Yerin içində hərəkətsiz dayanıb bir xeyli ətrafı dinşədi. Hamı yatmışdı. Qonşu otaqdan səs-səmir gəlmirdi. Elə həyətdə də sakitlik idi. O, pəncərənin taxtasını araladı. Kürün o tərəfindəki dağların arxasında üfüq azacıq ağarsa da, hələ qaranlıq idi. Səhər zülməti ətrafı bürümüşdü. Kişi taxtanı

örtdü. Əli ilə döşəyin yanını yoxladı. Tüfəng də, xəncər də öz yerində idi. Qoltuqaltısı başının altında idi.

Cahandar ağa şalvarını tapdı. Tütünqabını çıxardıb papiros eşdi. Müştüyə taxıb yandırdı. Arxası üstə uzanıb gözünü tavana zillədi. Otuzluq lampanın fitili aşağı çəkildiyindən, ev yarıqaranlıq idi. Ancaq bu solğun işıqda burula-burula havaya qalxıb, tavanda laylanan tüstü aydınca görünürdü. Tavanın taxtaları qaralmışdı.

Cahandar ağa gözünü tavanın qaralmış yerinə zillədi. "Deyəsən yaram sağalır. Ayağa duran kimi gərək uşağın dalınca adam göndərim, gətirsin. Mən özümdən arxayınam. Düşməndən də hayıf almışam. Daha heç nədən qorxum yoxdur. Bircə Molla Sadıq qalıb, onunla da haqq-hesabımı çürüdəcəm. Amma bu uruslar əl-ayağıma yaman dolaşırlar. Qorxuram axırda kişiliyimizi də əlimizdən alalar. Bir balaca tərpənən kimi başının üstünü kəsdirirlər ki, qanun buna yol vermir, elə oturmayın, belə oturmayın. Axı deyən gərəkdir ki, sizə nə var? İndiyə qədər qanunsuz pismi dolanırdıq? Hər kəsin öz kişiliyinə və adına görə dolanması var idi. Qanlı da qanını özü alırdı, nə divan var idi, nə dərə. İndi bu nədir? Saatda bir pristav atını çapıb gəlir ki, niyə başınızı qaşıyırsınız? Yox, mən belə dolana bilmərəm. Mənim öz ağlım var, istədiyim kimi yaşamışam, istədiyim kimi də öləcəm. Bəs uşaqlar? Şamxal tərsdir, tüpürdüyünü yalayan deyil, dediyindən dönməzdir, amma özümə oxşayır. Ordan-burdan eşidirəm ki, məndən küsmüş olsa da, yenə qeyrətimi çəkir. Amma Əşrəf deyəsən zənnimi itirəcək. Küçük biz tərəfə yox, südünə çəkdi. Heç kin-küdurət-zad bilmir. Bilmirəm ürəyimi yumşaqdır, yoxsa, oxumaqmı onu xarab eləyib? Elə deyir, hamıya yaxşılıq eləmək lazımdır. Sözə də baxmaq istəmir. Deyəsən onu məktəbdən biryolluq qaytarmalı olacam. Yoxsa uşaq əldən təmiz çıxar. – Cahandar ağa yerin içində çevrildi. Papirosu acgözlüklə sümürüb burun deşiklərindən fısıldatdı. – Dünya işidir, bəlkə mənim başıma bir bəla gəldi, onda nə olsun? Yurdum boş qalmalıdır? Bu arvad-uşağın içində bir başıpapaqlı hərlənməməlidirmi?".

O, papirosunu axırıncı dəfə sümürüb atdı. Qalxıb yerin içində oturdu. Hiss etdi ki, yaman narahatdır. Nə qədər çalışırdısa, elə axşamdan gözünə yuxu getmirdi. Gecəyarısı kəndin ucqarında itlər hürüşdükdən sonra isə heç dincələ bilmirdi. Qorxmurdu. Bilirdi ki, onun evinin həndəvərinə hərlənən olmaz. Allahyarı günün günortaçağı öz evində öldürdükdən sonra kənd adamları dalınca düşsələr də Kürün sahilində, cələdəki ağacların arasında ona yaxın gələn olmadı. Cahan-

dar ağa özünə dalda yer seçib arxaya bir-iki güllə atdıqdan sonra gördü ki, gələnlər dayandılar və geri qayıtdılar. Cahandar ağa yəqin etdi ki, Allahyargilin kəndində qoçaq adam yoxdur. Onun dalınca axıra qədər gəlməyəcəklər. O, atını yarğanların dibi ilə rahatca sürdü və girməyə çatanda Kürü üzüb meşəyə keçdi. Birbaş Göytəpəyə qayıtdı. Bir neçə gün evdə qaldıqdan sonra kəndin arasına çıxdı. Gözü ilə Molla Sadığı axtardı. O, Molla Sadıqla birdəfəlik haqq-hesabı çürütmək istəyirdi. Fikirləşmişdi ki, bəlkə divan-dərə adamları tökülüb gəldilər, məni qamarlayıb araya aldılar, ya tutdular, ya da başıma bir iş gəldi. Molla Sadıq sağmı qalsın? Ancaq xoşbəxtlikdənmi, yoxsa bədbəxtlikdənmi, nədənsə, o günü molla gözə dəymədi. Cahandar ağa kəndin arasında bir xeyli hərləndikdən sonra evə qayıtdı. Kişi bir şey hiss etdi ki, camaat ona əvvəlki kimi baxmır. Elə bil ondan çəkinirlər. Onunla üz-üzə gəlmək istəyənlər azalıb. Kişi baxışlardan oxudu ki, onu məzəmmət eləyənlər də var. Axı, mən nə etmişəm? Hansı haqsız iş tutmuşam ki, məni qınayırlar?

Cahandar ağa evə qayıtdıqdan sonra heç kəsin üzünə baxmadı. Yer saldırıb yatdı. Titrəməli adamlar kimi yorğanın altında əsdi. Nə qədər çalışdısa da, Allahyarın son anını, gözlərindəki axırıncı ifadəni unuda bilmədi. Cahandar ağa düşmənini öldürdükdən sonra hər şeyi unudaraq bir neçə saniyə onun üzünə baxmışdı. Kişinin yazıq görkəmi qəlbini riqqətə gətirmişdi. Ani olaraq düşünmüşdü ki, bunun günahı nəydi? Mənə nə pislik eləmişdi ki, öldürdüm? Hər nə eləmişdimsə, mən eləmişdim. Əgər mən onun arvadını götürüb qaçmasaydım, heç məni tanımazdı da!

Cahandar ağa papiros eşdi. Yandırıb tüstülətdi. Sonra paltarını geyindi. Adəti üzrə əvvəlcə xəncərini bağladı. Qoltuqaltısını boynundan aşırdı. Tüfəngini yoxlayıb xəzinəyə güllə verdi və bundan sonra həyətə çıxdı. Hava hələ qaranlıq idi. Çisələyirdi. Yer sürüşkənləşmişdi. Toyuqlar tarda qığıldaşırdılar. Arabir torağaylar pırıltı ilə havaya qalxırdı. Xırman yerində gölməçələr var idi. Cahandar ağa talvarın altına getdi. Son vaxtlar gecələr belə, yəhərli saxladığı ata baş çəkirdi. At sahibini görən kimi qulaqlarını şəkləyib astadan tırıldadı. Kişi onun yalını tumarladı, axurundakı otu, arpanı yoxladı. Samanlığın üstünə doğru getdi. Kür tərəfdən əsən sərin hava onun üzünə vurdu. Qaşına, kirpiklərinə çisək qondu. Cahandar ağa istidən çıxmış adamlar kimi bu sərinlikdən, üzünü yalayan narın yağışdan ləzzət aldı. Sinəsini qabardıb Kürə doğru baxdı. Ala-toran yaxşı seçilməsə də, kişi suların necə

buruldluğunu, ləpələrin sahil torpaqlarını necə yaladığını uğultudan təyin etdi. O başa düşdü ki, su daşıb. Neçə gündən bəri yağan yağış Kürü yenə yerindən oynadıb. Sular köhlən at kimi cilovu gəmirir, yatağına sığmır.

Azacıq işıqlandı. Beş-altı addımlıqdakı quru otlar, xırdaca kətyən kolları, sahilə enən boz cığırlar göründü. Kişi donmuşdu. Tüfəngini dizinin üstünə aldı. Yenə papiros eşdi. Gözünü isə samanlığın üstündə bitən kətyənə zillədi. Çiskin onun quru şaxlarında tumurcuqlanmışdı. Qoşabuynuz bir ilbiz qabığından çıxıb budağın üstü ilə süründü. Cahandar ağa ikrahla üzünü yana çevirdi. Elə bu vaxt talvarın altındakı at qulaqlarını şəkləyib kişnədi. Kişi hövlnak dönüb baxdı. Gördü ki, atın gözləri oynayır. Yalının tükləri pırpızlanıb. At yerində vurnuxub dartınır və təlaşla fırlanır.

O, ayağa durdu. Samanlığın üstündən enmək istədi. Haradasa lap yaxında, suvadağın bərabərində at kişnədi. Cahandar ağa tüfəngini hərləyib barmağını tətiyə uzatdı. Darvazadan səs gəldi. Nökərlər doqqaza çıxana qədər iki atlı kazak siyirməqılınc həyətə girdi. İtlər irəli atılıb onları yəhərdən salmağa çalışdı. Nökərlər araya keçdilər. Kazaklardan biri acığını Tapdığın üstünə tökdü:

– Ağan hanı?

Tapdıq onun dediklərini başa düşmədiyindən çiyinlərini çəkdi. Kazak isə daha da hirsləndi:

– Çağır gəlsin, pristav gözləyir!

Cahandar ağa başa düşdü ki, pristav onu ala-qaranlıqda boş-boşuna yanına çağırmır. Özləri qəsdən qaranlıqkən gəliblər ki, yuxulu-yuxulu üstünü kəsdirsinlər. Yəqin ki, bacarsalar Cahandar ağanı tutub qollarını bağlayacaq və atın qabağına salıb aparacaqlar. O bir anlığa özünü siyirməqılınc altında təsəvvür etdi. Kazaklar onu atın döşü ilə vurur, tez-tez tüfəngin qundağı ilə itələyirdilər. Yüyəni çeynəyən atların nəfəsi onun kürəyini yandırırdı.

Kişi birdən-birə silkələnib titrədi. Beyninə qan sıçradı. Gözü heç nə görmədi. Dünya başına hərləndi. Kür də, meşə də, sahildəki çəmənlik də, evlər də, cığırlar da fırlanıb gözünün önündən keçdi. Tətiyi çəkdi. Dalbadal güllə şaqqıldadı. Atlar kişnədi. Kazakın ikisi də yəhərdə ləngərləndi. Qılınclar yerə düşdü. Hürkmüş atlar doqqazdan aralanıb xır yoluna qədər çapdı. Cahandar ağanın başının üstündən vıyıltı ilə iki güllə keçdi. Yarğan şaqqıldadı. Yenə at kişnədi. Cahandar ağa yerə yatdı. Sonra sıçrayıb samanlığın yanına getdi. Yarğanın qarşı-

sındakı qaraltıları gördü və başa düşdü ki, yolları kəsiblər. Çox fikirləşmədi. Samanlığın dal tərəfindəki çuxuru özünə səngər edib, qaraltılara doğru dalbadal güllə yağdırdı. Ona cavab verdilər. Kəndə səs düşdü. İtlər ağız-ağıza verdilər. Cahandar ağanın nökərləri ora-bura qaçışdılar. Onlar da tüfəng götürüb samanlıq tərəfə gəldilər. Atışma yenidən qızışdı. Cahandar ağa güllələrin səsindən boşa çıxıb-çıxmadığını təyin etdi.

Suvadağ tərəfdən atılan güllələr azaldı. Ancaq gözlənilmədən xır yolu tərəfdən də güllə yağdı. Cahandar ağa gördü ki, onun evini arakəsməyə salacaqlar. Belə getsə, evdə arvad-uşaq da qırılacaq, özü də ələ keçəcək. Kişinin bədəni gizildədi. Birdən yerindən atılıb talvarın altına getdi. Sıçrayıb atın belinə qalxdı. Bir göz qırpımında çəpərdən atılıb, sahilə doğru çapdı. Dərəyə enərkən arxaya bir-iki güllə atdı. Kazaklar onun aradan çıxacağını duyub atın belinə qalxdılar. Ancaq onun sərrast güllələrindən ehtiyatlanıb ətrafa səpələndilər. Yalnız yekəpər kazak qıllı papağını gözünün üstünə basıb atın yalına yatdı. Atlar dabanbasaraq çapdılar. Cahandar ağa nə qədər çalışdısa da, yüyəni nə qədər boşaltdısa da, hiss etdi ki, kazak onu haqlayır. Bir neçə dəqiqədən sonra arxadan yetişəcək. Kişi "ax Qəmər" – deyə xəyalından keçirdi. Ancaq əl-qolunu boşaltmadı. Sahilə az qalırdı. Artıq kazakların səfini yarıb aradan çıxmışdı, bir az keçsə, Kürə çatacaqdı. O, atı bir də mahmızladı. Ona elə gəldi ki, bütün kənd ayağa qalxmışdır. Damların üstünə çıxıb onlara tamaşa edirlər. Cahandar ağanın necə qaçdığına, düşmənin arxadan ona necə çatdığına və onu qılıncla necə parçalamaq istədiyinə tamaşa edirlər. Birdən o hər şeyi unutdu. Cilovu çəkib qəfildən atın başını geri qanırdı. At bu gözlənilməz təkandan dik qalxdı, dal ayaqları üstə fırlandı. Kazak qılıncını havaya qaldırıb endirdi. Cahandar ağa tətiyi çəkdi. Qılıncın parçaları göydə oynadı. Atlar döş-döşə toxundular. Kazakla Cahandar ağanın gözü ani olaraq bir-birinə sancıldı. Hər ikisinin qıllı qaşı qan sağılmış gözünün üstünə endi. Burun pərələri körük kimi genişləndi. Fısıltıları atların fınxırtısını batırdı. Kazakın dodaqları kipcə bağlandı. Cahandar ağanın həbəşi dodaqları isə titrədi. Hər şey bircə andan, kimin tez tərpənməsindən asılı idi. Birdən nərilti qopdu. Güllə açıldı. Xəncər havada oynadı. At kişnədi. Qışqırıq iniltiyə qarışdı. Kazak sinəsini tutub yəhərdə qıvrıldı və gurultu ilə atın dırnaqlarına düşdü. Cahandar ağanın köksü yandı. O bircə dəfə cilovu çəkə bildi. At kişnəyib şahə qalxdı. Sahilə doğru çapdı. Arxadan ayaq tappıltılarının gəldiyini hiss edib bütün gücünü topladı. Cahandar ağa dumanlanmış gözlərini axar suya zillədi. Kür

əvvəlcə sakit göründü. Elə bil sular mürgüləyirdi, hələ səhər yuxusundan ayılmamışdı. Ancaq bu sükut uzun sürmədi. Kür sanki birdən diksinib çalxalandı. Cahandar ağaya elə gəldi ki, ləpələr baş-başa qalxıb toqquşdu. Çayın sinəsi qabarıb qalxdı, qollar ağız-ağıza qovuşdu, adalar yox oldu. Su daşıb hər yeri, o taydakı meşəni, sahildəki cələni, yaxındakı kənd evlərini ağzına aldı, yarğanları vurub dağıtdı, hər yer suya qərq oldu. Kişi yəhərin üstündə dikəlmək istədi. Bacarmadı. Ağırlaşdı. Müvazinətini itirdi. Atın boynuna yıxıldı. Elə bil at da hər şeyi anladı. Başa düşdü ki, ayaq saxlamaq, Kürün bu üzündə qalmaq və arxadan gələnlərin əlinə keçmək olmaz. Var gücünü topladı. Qarşısına yarğan çıxdı. Dayanmadı. Atıldı. Onunla bərabər yarğan da uçdu. Kür çalxalandı. Ləpələr döş-döşə gəldi. Suyun üzünə duman çökdü. Kür qəzəblə uğuldayıb özünü yarğanlara çırpdı...

## 16

Kürün o tayından əsən qəfil külək sahildəki biçənəyin üstündən adlayıb kəndin arasını dolaşdıqdan sonra kövşənliyi xışıldatdı, xır yolu tərəfə gəldi və gözlənilmədən yana burulub təpədəki qəbristanlığa doğru döndü. Qədim qəbir daşlarının başına dolandı, burulğan kimi fırlanıb qurumuş otları, boz kətyən kollarını, keçən ildən qalmış çör-çöpü süpürdü, qabağına qatıb təpədən aşağı tökdü. Elə bil son bahar nəfəsi ilə cana gəlib cücərən qəbristanlığa süpürgə çəkdilər, hər yer tərtəmiz oldu. Azacıq sonra isə göyün üzünü seyrək, qara bulud bürüdü. Hara isə tələsən bu duman kəndin bərabərində aşağı çökdü, ətəyini sallayıb torpağı yaladı, onun soyuq nəfəsi qəbristanlığa qədər gəlib çıxdı. İri yağış damcıladı. Qəbirlərin torpağı xal-xal oldu.

Əşrəf ayağa durdu. Dizini çırpıb köksünü ötürdü. Boyun-boyuna verən dərin bir hüzn içində mürgüləyən qəbir daşlarına xeyli baxdı. Təpənin lap yuxarısında az qala iki adam boyu ucalığında olan çəhrayı rəngli başdaşılarının üstünü mamır basmışdı. Onların naxışları, yazıları güclə seçilirdi. Köhnə, batıq qəbirlər torpağın altında qalmışdı. Yanlarında tüfəng, xəncər, at çəkilmiş başdaşılarının bəzisi böyrü üstə əyilmişdi. İzi tamam itən qəbirlər də var idi.

Əşrəf sükut içində, başdaşılarından seçilməz halda xeyli dayandıqdan sonra atasının hələ torpağı yapıxmamış qəbrinə baxdı. Onu Şahnigarla yanaşı basdırmışdılar. Bacı-qardaş qoşa yatırdı. Əşrəfin bir az əvvəl əli ilə sığallayıb, yan-yörəsini düzəltdiyi qəbri iri yağış damcıları

döyəcləməyə başladı. Balaca təpəciyə oxşayan bozumtul torpağın üstündəki qara nöqtələr çoxaldı. Şahnigarın qəbri yapıxdığından, yağan damlalar gilələnib süzüldü və Cahandar ağanın qəbrinə doğru gəldi. Elə bil kim isə qəsdən bu qəbrin yanında dayanıb gözündən gilə-gilə yaş axıdırdı.

Əşrəf əlini islanmış saçına çəkdi. Furajkasını başına qoydu. Asta addımlarla qəbristanlıqdan uzaqlaşdı. Xır yoluna çıxdı. Hara getdiyini özü də bilmədən bir xeyli irəlilədi. "Zayej"in bərabərində ayaq saxladı. Döndü. Sürüşkən cığırları ot basmışdı. Pilləkəni ehtiyatla çıxıb eyvanda dayandı. Qapılar bağlı idi. Pəncərə şüşələrinin bəzisi sınmışdı. Yağış həyətə səpələnmiş kağızları döyəcləyirdi. Əşrəf qapıya yaxınlaşdı, paslı qıfılı yoxladı. Pəncərədən içəri boylandı. Dəftərlər döşəməyə səpələnmişdi. Kitablar cırılıb tapdalanmışdı. Xəritə küncə atılmışdı. Qlobus otağın ortasına düşmüşdü, külək onu tərpədib dığırladırdı. Əşrəf dözmədi. Zərblə çəkib qıfılı qopartdı. İçəri girdi. Dəftərləri, kitabları yığdı. Səliqə ilə pəncərənin qabağına qoydu. Qlobusu götürdü. Xəritəni əvvəlki yerindən, divardan asdı. Stulları qaldırdı. Çiliklənmiş şüşələrin içindən Əhmədin ən çox sevdiyi şəkli götürdü. Baxdı. Əhmədin atası ilə anası yanaşı oturmuşdular. Balaca Əhməd isə onların çiyninin üstündən boylanırdı. Əşrəf kövrəldi. Pəncərənin önünə gəldi. Çiynini divara söykəyib qollarını sinəsində çarpazladı. Kəndə doğru baxdı. Sərin-sərin yağış yağırdı. Damlalar "Zayej"in kirəmitlərini döyəcləyirdi. Trubalardan süzülən yağış şırıldayırdı. Köpüklü su zolaqlanıb həyətə axırdı.

Pəncərənin şüşəsi elə bil tərlədi. Çisək şüşədə birləşib giləlləndi. Süzülüb damla-damla axdı. Əşrəfə elə gəldi ki, pəncərəyə baxmır. Qarşısındakı güzgüdür. Orada gilələnən yağış damlaları yox, özünün göz yaşlarıdır. O, əlini yanağına apardı. Ovcu islandı. Bayırda yenə sərin-sərin yağış yağırdı.

– Səhərdən haradasan?

Əşrəf diksindi. Dönüb qapının ağzında dayanan qardaşına baxdı. Şamxal çərkəzi çuxasının ətəyini belinə sancmışdı. Sallamalı gümüş kəmərinə yaraşan xəncər bağlamışdı. Başdan-ayağa geyindiyi qara paltar onun rəngini boğmur, əksinə bir az da açırdı. Qaşqabağı tökülmüşdü. Əlində tüfəng var idi. Şamxal hiss etdi ki, qardaşı dönüb ona baxsa da, hələ tamam özünə gəlməyib, fikrini cəmləşdirə bilmir.

Bir az əvvəl ürəyində coşan hirsini boğdu. Əşrəfi tapdığına sevindi və içəri keçib stulun birində oturdu. Tüfəngini dizinin üstünə qoyub,

papiros qutusunu çıxartdı. Əşrəf onun eyni ilə atası kimi təmkinlə papiros eşdiyinə, barmaqları əsə-əsə müştüyə keçirib yandırdığına və asta-asta, ancaq hərisliklə sümürüb, tüstünü necə ciyərinə çəkdiyinə baxdı. Əşrəfə elə gəldi ki, gözünün qabağındakı Şamxal yox, atasıdır. Ona heç nə olmayıb, əksinə bir az da cavanlaşıb.

Pəncərədən aralandı. Stul götürüb Şamxalla yanaşı oturdu:

– Qutunu mənə ver.

Şamxalın qaşları çatıldı. Təəccüblə qardaşının üzünə baxdı və qutunu çıxardıb dinməzcə ona uzatdı. Əşrəf naşılıqla papiros eşdi. Ehtiyatla çəkməyə başladı.

– Gedəkmi?

Qalxdılar. Xır yolunun daşları yuyulmuşdu. Yağış kövşənləri döyəcləyirdi. Torağaylar pırıltı ilə havaya qalxır, yolun ortasına düşüb dazıyırdılar.

Şamxal arxada qaldı. Ətrafa boylandı. Xəndəklərə göz gəzdirdi. Sonra qardaşının paltarına baxdı. Əşrəfin şalvarının balağı açıq idi. Qara çəkməsi palçığa batmışdı. Pencəyinə narın yağış qonmuşdu. Başında furajka var idi. Şamxala elə gəldi ki, gözünün qabağındakı doğma qardaşı yox, tamamilə yad bir adamdır. O, Əşrəflə bərabərləşdi. Gözaltı onun sifətinə, pencəyinin düymələrinə baxdı. "Atam sağ olsaydı, onu urus paltarında gəzməyə qoymazdı. Elə vağzalda, vaqondan düşməmiş soyundurub, ayrısını geyindirərdi. Bə Əşrəf atamın nəyi xoşlayıb-xoşlamadığını nə tez yadından çıxartdı? Bilmirmi ki, hələ kişinin nəfəsi üstümüzdədir? Yoxsa özünü böyük hesab eləyir?" Şamxal əsəbiləşdi. Papirosunu axırıncı dəfə sümürüb, hirslə yolun kənarına atdı:

– Paltarını niyə dəyişməmisən?

Əşrəf qardaşının nə demək istədiyini başa düşdü:

– Daha mən bu paltarı əynimdən heç vaxt çıxartmayacağam.

– Bizi biabır eləmək istəyirsən?

Susdular. Bir dəstə sığırçın başlarının üstündən pırıltı ilə uçub kəndə doğru getdi, orada bürülüb-büküldü və Kürün vadisində gözdən itdi.

– Atamı nə vaxt basdırdınız?

– Atışmadan iki gün sonra.

Əşrəf ayaq saxladı. Şamxal da dayandı. Üz-üzə durdular. Şamxal qardaşının gözlərindən oxudu ki, o hər şeyi bilmək istəyir. Bilmək istəyir ki, at yarğanla bərabər Kürə uçduqdan sonra nələr olub? Atasının son nəfəsinə özünü çatdıran tapılıbmı? Kazaklar nə yaxşı onlardan

əl çəkiblər? Şamxal hamısını danışa bilərdi, ancaq susdu. İstəmədi ki, qardaşı atasının necə öldüyünü bilsin. Şamxalın kazaklar kənddən getdikdən sonra özünü Kürə atdığını, cələləri gəzdiyini, meşəyə gedib atasını axtardığını, nəhayət, kiçik bir adada yulğun kollarının arasında tapdığını bilsin. Atın baldırı sınmışdı. Kişininsə hələ nəfəsi vardı. Dili söz tutmasa da, ürəyindən keçənləri gözlərindən oxumaq olurdu. Şamxal atasının son anda, onu görəndə, əvvəlcə diksindiyini, sonra isə arxayınlıqla gülümsəməyə çalışdığını indi də unuda bilmir. Elə bil kişi demək istəyirdi ki, sən ki bu ağır günümdə məni axtarıb tapdın, bütün günahlarından keçirəm. Sonra Şamxal onu gecə ikən Kürü keçirib evə gətirdi. Kişini bir gün sonra dəfn etdilər. Şamxal bunların heç birini qardaşına danışmadı. Fikirləşdi ki, qardaşım atamın dəfninə çatmadı, onun ölüsünü görmədi, qoy elə axıracan kişinin diri vaxtı gözünün önündə dayansın. Əşrəf onu həmişə at oynadıb, tüfəng atan şəkildə yadında saxlasın.

– Bə sən nə üçün gec gəldin?

– Buraxmadılar.

– Niyə?

– Dustaq idim.

– Nəyin üstündə?

Əşrəf çiynini çəkdi. O da seminariyada baş verən əhvalatları danışmağı yersiz bildi. Ancaq Şamxalın sifətindəki təşviş, gözlərindəki təəccüb və maraq onu dillənməyə məcbur etdi:

– Oralarda da sakitlik deyil. Müəllimimizin birini tutdular. Direktorumuzu da işdən çıxartdılar. Adını da qoydular ki, qocalıbsan, get istirahətə. Əvəzinə təzəsi gəldi. Elə faytondan düşməmiş bizi asıb-kəsməyə başladı:

– Bə, cavabını vermədiniz?

– Verdik. Sözü bir yerə qoyduq. Dərsə getmədik. Tələb etdik ki, təzə direktor qovulsun.

– Qovdularmı?

– Yox, bizi qovdular. Məktəbimizi iki aylığa bağladılar.

Yenidən susdular. Şamxal bu dəfə təəccüb və heyrətlə, bir qədər də heyranlıqla Əşrəfi süzdü. Qardaşının söylədiklərini o qədər anlamasa da, başa düşdü ki, deyəsən, dinc oturmur. O, böyük olduğuna görə bir az ehtiyatlandı. Qayğıkeşliklə , "uşağın başına bir iş gələ bilər", – deyə xəyalından keçirdi. Eyni zamanda düşündü ki, deyəsən xəmir yeyənin fağırı olmaz. Şamxal bir az qürurlandı da.

Kəndin kənarına gəldilər. Uşaqlar yağış başladığından, mal-qaranı örüşdən qaytarırdılar. Daxmaların bacalarından tüstü çıxırdı. Ayaqyalın arvadlar cığırlarda ora-bura qaçırdılar. Kişilər məscid tərəfə gedirdilər. Azan çəkilirdi. Əşrəf gördü ki, Şamxalın rəngi qaçdı. Tüfəngin qundağını bərk-bərk sıxdı. Atasının dodaqlarını xatırladan qalın dodaqları səyridi.

– Atamı kazaklar niyə tutmaq istəyirdilər?

– Onu gözaltı elədiyin Pakizə xanımın atası Molla Sadıqdan soruş.

Əşrəf köksünü ötürdü. Bildi ki, bu saat Şamxalı başa salmaq çətin olacaq. Ona desə ki, Kürün qırağında atamın kazaklarla toqquşduğunu, pristavla olan söhbəti yadına sal, meşənin qoruq edilməsini xatırla, səbəbi burda axtar, inanmayacaq. Ona görə susdu.

Yarğanın qaşına çatdılar. Kürün boz-bulanıq suları qabarmışdı. Ləpələr yarğanı döyəcləyirdi. Şaxələnmiş qollar bəzi yerdə ağız-ağıza qovuşmuşdu. Adaların çoxunu su basmışdı. Çiləkənlərin ətrafındakı burulğanlar uğuldayırdı. Sahildə mal-qara otlayırdı. Atlar kişnəyib bir-birini qovurdu. Bir dəstə qız, çiynində səhəng, sürüşkən cığırla suya enirdi. O tayda, meşənin bərabərində gəmini yuxarı çəkirdilər.

Əşrəf hiss etdi ki, qardaşı ondan aralanmaq, cığırla öz daxmasına doğru getmək istəyir. Qabağa keçdi. Hər ikisi ayaq saxladı. Əşrəf pəncərələri Kürə açılan evlərinə, sonra da Şamxalın üzünə baxdı. Onun səsi titrədi:

– Qayıt evə.

– Bə sən?

– Mənim yolum başqadır.

Susdular. Yenə də narın-narın yağış yağırdı. Kürün uğultusundan başqa heç nə eşidilmirdi.

*1957-1967*

## MÜNDƏRİCAT

DƏLİ KÜR

